# R E D A K T O R D A N

VII Yüzilliliyin abidəsi olan Albaniyanın Kalankatuk kəndindən olan Moisey Kalankatlunun "Albaniya tarixi" əsəri üç hissədən ibarətdir və mütəxəssislər belə hesab edirlər ki, ikinci və üçüncü kitablar X əsrdə yazılmışdır. Əlbəttə, VII əsrdə yaşayıb-yaratmış müəllif X əsrə qədər, üç yüz il yaşaya bilməzdi. Deməli, üç kitabdan yalnız birinin,yaxud X əsrdə yazılması zənn edilən ikisinin müəllifi Moisey Kalankatuklu ola bilərdi. İkinci müəllif barəsində fikirlər çalpaşıqdır. Bəs bu kitablardan hansının müəllifi Moisey Kalankatukludur?Kitabların üçünün də bir müəllif tərəfindən yazılması fikrini söyləyənlər də var. Şübhəsiz ki, kitablar müəllifin ana dilində yazılmışdır.

O vaxt Albaniyada yaşamış müxtəlif dilli və ləhcəli 26 alban qəbiləsinin artıq vahid bir dildə birləşməsi, hələ V əsrdən Aran dilinin Azərbaycanın şimal torpaqlarında vahid dil olması indi tarix ədəbiyyatında şübhə doğurmur.

Məlum olduğu kimi, VII yüzilliyin sonlarında Azərbaycan ərazisi Ərəb xilafəti tərəfindən zəbt olunmuş, yerli xristian albanların çoxu müsəlmanlığı qəbul etməli olmuş, indiki Dağlıq Qarabağda-Arsaxda yaşayan albanlar isə öz dinlərində qalmış, xristian ermənilərin əhatəsində olduqları üçün getdikcə öz dillərini itirmiş, erməniləşmişdi. Alban kilsəsini özünə tabe edə bilmiş erməni kilsəsi albanlara məxsus olan abidələri erməni abidəsi elan etmiş, yazılı abidələrin isə qədim erməni dilinə -qrabara tərcümə etməyə cəhd

göstərmişdir. Eyni fəlakət haqqında söhbət gedən "Albaniya tarixi" kitabının başına gəlmiş və ulularımızın bu abidəsi qədim erməni dilində çatmışdır. "Albaniya tarixi" bir neçə dəfə erməni dilində, həmçinin rus və xarici dillırdə nəşr olunmuş, hamısı da Moisey Kalankatuklunun müəllifliyi ilə. Burada oxucu yenə baxışlarına heyrətedici sual doldurub soruşa bilər: Necə? Alban abidəsi, ulularımızın abidəsi neçə dəfə müxtəlif dillərdə nəşr olunduğu halda, bəs albanların xələfləri niyə öz ulularının bu gözəl abidəsinə biganə olublar, onu ana dilimizdə nəşr etməyiblər? Çox düz sualdır, amma bilmirəm necə cavab verim. Yalnız təssüf. Bir də bu kitabı Azərbaycan dilinə tərcümə edib öz xalqına çatdırmaq təşəbbüsünü öz üzərinə götürmüş akademik Z.Bünyadova minnətdarlıq etmək qalır.

Oxucunun yuxarıda qeyd olunmuş suallarına, ola bilsin ki, kitabla tanış olarkən meydana çıxa biləcək başqa sualları içərisində bir həqiqət də ortaya çıxacaqdır. Bu, ondan ibarətdir ki, bu kitabda ulularımızın yaratdığı dövlətlərdən biri olan Albaniya çarlığının həm siyasi, həm sosial-iqtisadi, həm də ictimai quruluşu tarixinin məsələləridir. Bu tarixi məsələlər V əsrdən başlayaraq VII əsrə qədər, yəni Albaniya çarlığının süqutuna qədərki dövrə kimi öz əksini tapmışdır.

Burada verilən məlumat, xüsusən Mehranilər sülaləsinin Albaniya çarlığında hakimiyyətə gəlməsindən başlayaraq, Albaniyanın görkəmli çarı Cavanşirin hakimiyyəti düvrünün tarixi, Cavanşirin çarlıq fəaliyyəti, onun həyatına qəsd edilməsi və s. bəzi

əfsanəvi məlumatlar nəzərə alınmasa, çox dolğun və qiymətlidir. “Albaniya tarixi ”ndə gətirilən dəlillər o qədər əhatəlidir ki, hətta orada Albaniyanın ictimai quruluşu haqqında olan materiallar əsasında tarixçi Fəridə Məmmədova “Moisey Kalankatuklunun”Albaniya tarixi” ilk orta əsrlər Albaniyasının ictimai quruluşuna dair mənbə kimi”müvzusunda 1977-ci ildə monoqrafiya nəşr etdirmişdir. Heç şübhə yoxdur ki, “Albaniya tarixi”Albaniyanın bilavasitə istehsalçıların, siniflərin və sosial təbəqələrin, torpaq sahibliyi və torpaqdan istifadə formaları və s. mühüm problemləri tədqiq edən tədqiqatçılar üçün də qiymətli tarixi qaynaq rolunu oynamış, gələcək tədqiqatçılar üçün də oynayacaqdır.

Moisey Kalankatuklunun oxucuya çatdırılan “Albaniya tarixi”əsərində hadisələr X yüzilliyə qədər davam etdirilir. Albaniyanın sonrakı, XI-XII əsrlər tarixini salnamə halında Gəncə şəhərində anadan olmuş və ömrünü orada keçirmiş Mxitar Qoş yazmışdır. Qoşun “Alban salnaməsi”akademik Z.Bünyadov tərəfindən hələ 1960-cı ildə Azərbaycan dilinə tərcümə olunmuş və Azərbaycan SSR Elmlər Akademiyasının “Xəbərlər”ində (İctimai elmlər seriyası, №3,1960) nəşr edilmişdi. Kitab tərtibatçısı onu. Yəni “Alban salnaməsi”ni bu kitabın sonuna əlavə etməyi lazım bilmişdi. Tərtibatçı bununla oxucuda Albaniyanın sonrakı iki əsr tarixi haqqında təsəvvür yaratmaq istəmişdir, belə ki, salnamə yarımçıq, bitməmiş qalsa da, onda cəmləşmiş material çox maraqlı və qiymətlidir.

# M Ü Q Ə D D İ M Ə

Azərbaycanın X əsrə qədərki vəziyyəti haqqında fikir söyləməyə imkan verən yeganə yerli mənbə Moisey Kalankatuklunun "Albaniya tarixi" əsəridir.

"Albaniya tarixi"nin adına ilk erməni katolikosu Ananiyanın (943-967-ci illər) Xaçına gəlməsi ilə əlaqədar rast gəlinir. O, Xaçına Albaniya katolikosu Qaqikin (948- 962-ci illər) dəvətilə 958-ci ildə gəlmişdir.[1] Qaqik xəbər verir ki, "elə əvvəldən olduğu və "Albaniya tarixi"ndə yazıldığı kimi ( orpes ev er i skzbane leal ev karqeal i patmutean Aquantis) "o, Albaniya katolikosluğuna müqəddəs Qriqori adından seçilmişdir. Qaqik bu tarix kitabına müraciət etməyi təklif edəndə -o eşitmişdi ki, Albaniya xristianlığı Erməniyyədən qabaq qəbul etmişdi.- Ananiya buna icazə vermədi və dedi ki, bu kitab səhih deyil, çünki "Albaniya- baş yepiskopluq, Erməniyyə isə - katolikosluqdur". Bundan sonra "Albaniya tarixi" erməni katolikosunun əlinə düşür və o tələb edir ki, "albanların xristianlığa qəbul olunması haqqında orada yazılıb bizə lazım olan (yəni bizə əlverişli olan),bizim görmək arzusunda olduğumuz məlumatı(zor sireak orum ev sanqordn eak tesutean) həmin "Tarix"dən tapsınlar". Sonra Ananiya bu tarixdən aşağıdakı parçanı oxudu:"Havari Bartolomey

---

[1] X.Datean. Nivter usumnasirutean Aqunatis Patmuten. Ararat, 1896,s 22-25;N. Akinean.Movses Dasxurantsi ( koçuats Kaqankatuatsi) ev İr Patmutivn Aquanits. Handes Amsorea , Vyana, 1958,s.13-15.

və Havari Faddeydən 266 il sonra, erməni çarı Trdatın 17-ci ilində və Albaniya çarı Urnayrın (hakimiyyəti günlərində) Surean Pəhləv Arşakuni nəslindən olan Erməniyyənin maarifçisi müqəddəs Qriqori həmin havarilər tərəfindən taxta çıxarıldı;Erməniyyə və Albaniya çarları olan Trdat və Urnayr isə bu zaman hələ də bütpərəstlikdə qalmaqda davam edirdilər"[1].

Bildiyimiz kimi, bu, "Albaniya tarixi"ndə yoxdur.

Stepannos Orbelian eyni hadisələri təsvir edərək deyir ki, Ananiyanın məsləhəti ilə "Albaniya tarixi "nə son dərəcə diqqətlə təyin olunmuşdu; onlar (albanlar) 440 il ərzində erməni kürsüsünə müti olublar; Albaniya katolikosları bu dini rütbəyə ermənilərin əli ilə çatırdılar, bu erməni ( baş keşişləri) patriarx, onlarınkı (albanlarınkı) isə - arxiyepiskop idi: bu vəziyyət erməni 25 katolikosunun hakimiyyəti ərzində, ta katolikos Avramadək (davam etmişdir).[2]

Bu parça (əlavə izahatlarla) "Albaniya tarixi"ndə (I, 11 və II, 7)verilmişdir: lakin bütün bunlar "Albaniya tarixi"nə əlavə edilmiş uydurma və qondarmadan başqa bir şey deyildir. Ananiya "tarix" in mətnində heç oxunmamışdı ki, "Albaniya xristianlığı ermənilərdən 270 il qabaq qəbul edib" (bax: II, 6, qeyd 21 və 22) və "Albaniyanın ( katolikos) taxtı Erməniyyədəkindən qabaq təsis olunub"( qeyd 29). Beləliklə, aydındır ki, əgər ermənilər xristianlığı 327-ci il

[1] Yenədə orada, s. 25.
[2]Bax: M.F.Brossenin Orbelianın "Sünikin tarixi"əsərinin fransızca tərcüməsinə (I, Peterburq, 1861, s.161).

xristianlıqda idilər və bu tarix eramızın 54-cü ilinə müvafiqdir. Xaçpərəstliyi İsanın şagirdləri Havarilər Faddey, Yelisey vəVarfolomeydən qəbul etdiyi üçün Albaniya kilsəsi birinci Havari kilsəsidir ( pervo- apostolskaya).

Sonralar “Albaniya tarixi” nin adı Uxtanesin X əsrin sonlarında tərtib edilən “Gürcülərlə ermənilər arasında kilsə əlaqələrinin kəsilməsi tarixi” əsərində çəkilir.[1] Bu əsərdə həqiqətən mətnlər uyğun gəlir. Uxtanes 64-cü fəsildə yazır ki, öz mətnini o, “ başqa bir tarixdən (yaylme patmutene )” götürmüşdür, həm də Uxtanesin mətni “ Albaniya tarixi”nin II kitabının 6 –cı fəsli ilə [2] kəlmə- kəlmə düz gəlir: burasını da qeyd etmək lazımdır ki, “Albaniya tarixi”ndə Avramın məktubunun təkcə şərhi verildiyi halda, Uxtanes həmin məktubu daha tam şəkildə iqtibas edir ( 70-ci fəsil). Bu isə yalnız onu göstərir ki, Uxtanes eyni mənbədən daha tam şəkildə istifadə etmişdir.

Uxtanes 65-ci fəsildə[3] qeyd etdiyi bəzi təfərrüatlar “Albaniya tarixi”-ndən “i patmutene ivreants ( daha doğrusu – albanits)”, yaxud Albaniya tarixçilərindən ( patmaqratsn Albanits) götürülmüşdür. Çox ehtimal ki, bu təfərrüat “Albaniya tarixi” nin II kitabının 6-cı fəslindən götürülmüşdü.[4] Yenə də aydın olur ki,

---

[1] Uxtanes. Patmut`ivn bajanman, II, s.122; M.Brosse. İki erməni tarixçisi,s.338.
[2] Uxtanes. Patmut`ivn bajanman, II,s.122.
[3] Yenədə orada; M.Brosse, s. 345-346.
[4] Uxtanesin bu sözündən görünür ki, “Albaniya tarixi” tək bir müəllif tərəfindən tərtib edilməmişdir. Bu barədə daha dəqiq məlumat üçün bax: Fəridə Məmmədova”Alban tarixi”.Bakı,1977.

Uxtanes də, Moisey Kalankatuklu da eyni bir mənbədən istifadə etmişlər.

XIII əsr müəllifi Stepannos  Orbelian əsərinin 25 və 26-cı fəsillərində "A lbaniya tarixi" ndən danışması həmin tarixin müvafiq yerlərinin birbaşa öz əsərinə köçürülməsindən başqa bir şey deyildir; onun 25-ci fəsli isə tamamilə "Albaniya tarixi"nin " orta ( yəni ikinci) kitabını"xatırladır (Albanits Patmuteani i mijin hatori). [1]

"Albaniya tarixi"nin tərtib edildiyi təxmini vaxtı güstərən ilk tarixçi Anili Mxitar olmuşdur. O,"Albaniya tarixi" nin Sebeosla (VII əsr)  Gevand (VIII əsr) arasında yazıldığını  qeyd  edir,[2]amma Şapuh Baqratunidən (IX əsr) başlayaraq həmin tarixin Sebeosldan qabaq olduğunu göstərirlər. Lakin "Albaniya tarixi" öz məzmununa görə orta əsr mənbələri sırasında  başqa bir mövqe tutmalıdır. Bir qayda olaraq, " Albaniya tarixi "nin müəllifliyi iki Moiseyə - Moisey Kalankatuklu və Moisey Dasxuranlıya isnad edilir. Lakin indiyədək bu məsələ qəti həll edilməmişdir, çünki həmin "Tarix"in müəllifinin, yaxud müəlliflərinin adı barəsində bir söz deyən olmamış, bu haqdakı mülahizələr isə son dərəcə ziddiyyətli olmuşdur. Bu barədə fikirlər əsas etibarilə " Tarix"in öz mətninə əsaslanır. Orada deyilir: "Uti vilayətində yerləşən ana yurdum olan böyük Kalankatuk kəndi" ( II, 10). H.Manandyan belə hesab edir ki, müəllifin " Kalankatuklu" təxəllüsü " Tarix"in mətninin yanlış şərh edilməsi nəticəsində sonrakı müəlliflər tərəfindən uydurulmuşdur, odur ki, H.Manandyan

---

[1] M.Brosse.Sünik tarixi,s.63.
[2] Anili Mxitarın " Tarixi"nin K. Patkanovun nəşri, Peterburq.1879.s.15.

müəllifi " Utili Moisey"- deyə adlandırır.[1] Bu ənənəyə riayət edən M.Abeyqan belə güman edir ki, " Tarix" in müəllifi " özünün yazdığı kimi, Uti vilayətindəki Kalankatuk kəndindən olan " [2] Moiseydir.

İlk dəfə Kalankatuklunun ( Albanits - Albaniyalı) " Tarix "in müəllifi adlandıran Ayrivanklı Mxitar olmuşdur.[3] Həm Mxitar, həm də ondan sonra gələn müəlliflər Kalankatuklunu " Tarix "in hər üç kitabının müəllifi hesab edirdilər. Bu cəhətə diqqət yetirən K.Patkanov yazır ki, " əsgər erməni müəlliflərindən biri " Albaniya tarixi"nin iki kitabdan ibarət olduğunu demiş olsaydı, mən onun müəllifinin VII əsr tarixçisi olduğunu qəbul edərdim, çünki " Tarix" in üçüncü kitabı, şübhəsiz, X əsrin əsəridir".[4]

"Tarix" də şərh edilən VII əsr aid hadisələr bunların şahidi olan bir şəxsin dilindən nəql edilir ki, bu da İravandakı Mətnidaranın 667 (18550) nömrəli əlyazmasının sonundakı əlavədən aydın görünür: " Bu tarix erməni təqviminin 74-cü ilində ( 625-ci il), vardapet Moisey Kalankatuklu tərəfindənyazılmış" Albaniya tarixi" adlanan surətdən köçürülmüşdür". [5] Lakin buna baxmayaraq, Z.İ. Yampolski haqlı olaraq göstərdi ki, həmin qeyd,"Moisey Kalankatuklu adının səhih məlum olduğu " şübhəni də əsla

---

[1] H. Manandyan. Alban tarixinin oçerki, s.22.
[2] M. Abeyqan. Qədim erməni ədəbiyyatının tarixi, s. 521.
[3] M. Brosse. Mxitar Ayrivanklının xronoloji tarixi, Peterburq, 1869, s. 25,88.
[4] K. Patkanovun " Albaniya tarixi" nə müqəddiməsi, s. VII- IX.
[5] Bu deyilənlər X əsr hadisələrini şərh edən mətnə də aiddir.

qaldırmır.[1]

"Tarix" in ən qədim əlyazması 1279 cu ilə aiddir.[2] Buna görə də onun müəllifinin – VII əsr hadisələrinin şahidi olan Moisey Kalankatuklunun adının səhihliyi yalnız Ayrivanklı Mxitarın şəhadətinə əsaslanır. Həmin adamın əsl adı isə bizə məlum deyildir. " Tarix"in ikinci müəllifi və Moisey Kalankatuklunun davamçısı olan adamın da adı yenə Moisey olaraq göstərilir. Mxitar Qoşun ( Gəncəli Kirakosun müəllimi) şagirdi Vanakan bu ikinci Moiseyin təxəllüsü məsələsini aydınlaşdırır. O, " Albaniya tarixçisi kimdir?" sualına özü cavab verib deyir: " Moiseydir, özü də Dasxuran kəndindəndir( Moisey ev qelji Dasxuran)".[3]

Beləliklə, təsdiq olunur ki, iki Moisey olmuşdur. Mxitar Qoş yazır ki, " Tarix"in müəllifi Dasxuranlı Moiseydir və o, " Alban sülaləsi haqqında mükəmməl ( ayrılma mənimdir- Z.B.) hesabat yazmışdır".[4] Gəncəli Kirakos Moisey Kalankatuklu X əsr müəllifi hesab edir.[5] Görünür ki, N. Akinyan son məlumata əsaslanaraq bu nəticəyə gəlmişdir ki, " Tarix "in müəllifi yalnız bir Moisey olmuşdur. O, yazır ki, " XII və XIII əsrlərdə tarix oxucuları bu naməlum müəllifin kim olduğunu bilmək istədikdə, təbii olraq, belə

---

[1] Z.İ.Yampolski. Qafqaz Albaniyası salnaməsinin öyrənilməsinə dair, s.150. Təfsilatlar üçün bax: F.Məmmədovanın 1977 –ci ildə nəşr olunmuş kitabına.

[2] K. Patkanov. Müqəddimə, s. IV.

[3] Q. Əlişan. Hayatpatum, s. 175;T.İ. Ter- Qriqoryan. К вопросу, vər. 90.

[4] Mxitar Qoş. Mətnin ikinci cümləsi; Ç. Dovset. Mxitar Qoşun " Albaniya salnaməsi", s. 475.

[5] Kirakos. Tarix, s. 15. Çox qəribədir ki, Vanakanın şagirdi Dasxulının adını çəkmir. O ümumiyyətlə, ad çəkmir, sadəcə olaraq, " Alban tarixi" ni yazan deyir.

bir nəticəyə gəldilər ki, alban tarixçisi yalnız Albaniya katolikosudur. Əgər belədirsə, onda həmin tarixçi sonuncu katolikos " Movses ola bilər." ( "Albaniya tarixi " nin sonuna bax. – Z. B.)[1] Ç. Dovset belə hesab edir ki, " Kalankatuklu təxəllüsü Kalankatukdakı Moisey naminə monastırın adından götürülmüşdür. Beləliklə, biz belə bir nəticəyə gələ bilərik ki, Moisey Kalankatuklu və Moisey Dasxuranlı eyni bir adamdır". [2]Lakin sonralar Ç. Dovset Dasxuranlı təxəllüsünə üstünlük verir.[3]

T.İ.Ter – Qriqoryan bu fikirdədir ki, " Tarix" in müəllifi ikidir: " Biri VII əsrə qədər baş vermiş hadisələri təsvir edir, daha doğrusu, " Tarix" in ilk iki kitabının müəllifi olan Moisey Kalankatuklu, biri də ona üçüncü kitabı əlavə edən Moisey Dasxuranlıdır ".[4]

Z.İ.Yampolski " Tarix"in N.Akinyan və Ç.Dovsetin hesab etdikləri kimi eyni bir Moisey (Kalankatuklu -Dasxuranlı) tərəfindən tərtib edildiyi, yaxud Moisey adlı iki başqa – başqa müəllif olduğu məsələsindən bəhs edərək yazır ki, gətirilən dəlillər həqiqətdən uzaqdır, çünki bu vaxta qədər "Tarix" in tədqiqatçılarından heç biri əsərin əvvəlinə yaxşı diqqət yetirməmişlər. Halbuki əsərin əvvəli onun müəlliflərinin adını dəqiq göstərir.[5] Z.İ.Yampolski "Tarix"in VII əsrədək məlumat olan hissəsinə istinad edir və deyir ki, həmin

[1] N. Akinyan, s. 30.
[2] Ç.Dovset. Yenə orada.
[3] Ç. Dovset. " Albaniya tarixi" nə müqəddimə , s. XIX.
[4] T.İ.Ter-Qriqoryan, vər.91.
[5] Z.İ.Yampolski, s. 150 -151.

hissədə hadisələrin şahidi olan adamın belə bir qeydi vardır: “Bu sözləri qələmə alan mən, Adrian, dua edirəm ki, mənim oxucularım məni, ən ləyaqətsizi, yad etsinlər ”(II,2). Z.İ.Yampolskinin fikrincə, yazının üzünü köçürən adam “Tarix”in ilk fəsillərindən birinə Adrianın sözlərini heç cürə artıra bilməzdi:deməli, Adrian “Tarix”in ən mötəbər müəlliflərindən biridir.[1] Z.İ.Yampolski öz nəticəsini əsaslandırmaq üçün Adrianın özü haqqında danışdığı hissədən yuxarıda gətirdiyimiz ifadəni xatırladır:”Uti vilayətində yerləşən ana yurdum olan böyük Kalankatuk kəndi (İ nmin yUti qavari yorme ev es) və sonra da “Bizim Albaniya ölkəmizdə”.[2]

Zənnimcə, Z.İ.Yampolskinin gətirdiyi dəllilərin əlavə sübutlara ehtiyacı vardır, çünki, “bu sözləri qələmə alan mən,Adrian” yalnız əsərin üzünü köçürmüş, daha doğrusu, surətçıxaran olmuşdur. V.Henninq və Ç.Dovset hesab edirlər ki, “Tarix”in müəllifi bir şəxs Dasxuran kəndindən anadan olan (Dasxuranlı) və Kalankatuk kəndində yerləşən Moisey naminə monastırda qalan (Kalankatuklu) Moisey idi.[3] Buna bənzər Mxitar Qoş ana yurduna görə Gəncəli, qaldığı Qetik monastıra görə Qetikli və saqqalsız olduğuna görə Qoş idi. T.İ.Ter-Qriqoryan qeyd edir ki, Moisey Kalankatuklunun əsəri öz əvvəldəki şəklində bizə gəlib çatmamışdır və onun üzünü köçürənlər erməni rahibləri olduqlarına görə əsərin üzünü köçürəndə erməni katolikoslarının göstərişi ilə mətndə qəsdən təhriflərə yol vermişlər.

---

[1] Yenə orada.
[2] Yenə orada.
[3] Bax: Ç.Dovset. Mxitar Qoşun “Albaniya salnaməsi”,s. 476,qeyd I.

T.İ.Ter-Qriqoryan "Albaniya tarixi" əlyazmasında erməni kilsə xadimlərinin münasibətini göstərən maraqlı faktlar gətirir. Məsələn, Üç Müəzzin katolikosu Simeon əlyazmasının kənarlarında bu sözləri yazmışdır: "Yalnız "Albaniya tarixi"ndə (deyilir ki,)- buna bütün nüsxələrdə deyil, ancaq bəzi nüsxələrdə rast gəlmək olar- guya Yeliseydən sonra (74-cü il) müqəddəs Qriqoriyədək (340-cı il) Albaniya katolikos kürsüsündə başqa albanlar da oturmuşlar; lakin bu yalandır və bunlar sonradan əlavə edilmişdir". Başqa bir yerdə: "Bizim dırnaqla işarə etdiyimiz yerlər- yalandır və sonralar şöhrətpərəstlər tərəfindən öz xeyirlərinə əlavə edilmişdir, çünki digər tarixlərdə ("Albaniya tarixi"əlyazmalarında.-Z.B.) bu əsla yoxdur. Belə güman edirəm ki, bunu katolikos Ananiyadan sonra (958-ci il)"Alban rahibləri etmişlər".[1]

İ.P.Petruşevski haqlı olaraq göstərir ki, erməni kilsəsi Albaniyada "ölkəni erməniləşdirmək aləti olmuşdur. Onun bu rolu VIII əsrin başlanğıcından etibarən xüsusilə nəzərə çarpır, yəni o zamandan sonrakı erməni monofizit katolikosu İlya xalkedonçuluq edən Albaniya katolikosu Nersesi (Babur) ərəb xəlifəsinin köməyi ilə devirmişdi və Albaniyada ruhanilər və knyazların bir hissəsinin, Alban kilsəsinin erməni kilsəsindən müstəqilliyini qorumaq cəhdini əks etdirən xalkendonçuluq (pravoslav) hərəkatı ermənipərəst monofizitlər tərəfindən yatırılmışdır".[2]

N.Y.Marr da vaxtilə göstərmişdi ki, Albaniya ərəb

---

[1] Erməni tarixinin arxivi,1864,s.399. T.İ.Ter- Qriqoryandan sitat gətirilib,vər.4-5.
[2] И.П.Петрушевски. Dağlıq Qarabağ kəndlərinin imamları,s.8.

xəlifələrinin köməyi ilə "Ermәniyyənin antixalkedon kilsəsinin əlinə keçmişdir".[1]

Albaniya katolikoslarının təyinatı hüququ Albaniya kilsəsindən erməni keşişlərinin əlinə keçdi və bundan sonra Albaniyada xalkendonçuluğa rəğbət bəsləyənlər " qılıncla və əsarətlə məhv edilməli" idi.[2] Erməni tədqiqatçılarının arasında indi geniş yayılan " erməni Albaniyası", "erməni albanları" və s.kimi adlar elə buradan törəmişdi (son zamanlar öz evimizdə bəslənmiş "tarixçilər" üzə çıxıb albanları türk və daha "yaxşı" ayrum olmasının iddiasındadırlar).

Beləliklə, aydındır ki, nə Arsax və nə də əhalisi erməniləşdirilmiş albanlardan, hazırda isə erməni sayılan digər vilayət və rayonlar " heç bir zaman erməni mədəniyyəti mərkəzlərinə mənsub olmamışdır.Erməni kilsəsi heç olmazsa Sünikdə (Zəngəzurda ) Orbeli knyazları dövründə və ondan sonra gösterdiyi təsiri Albaniya xalqlarının erməniləşmiş nəsilləri arasında göstərə bilməmişdir".[3] Erməni kilsəsi "Albaniyanın bütün kilsələrində sülh"ü

---

[1] Н.Й.Марр. Arkaun, s.7.
[2] Bax: M.Kalankatuklu. III, 5-11-ci fəsillər.
[3] И.П.Петрушевски, s. 13.Bax: N.Adons Yustinian dövründə Ermәniyyə, s.223:"Arsaxın kantonları Albaniyaya məxsusdur". Belə fikir söyləndiyi halda, başa düşmək olmur, nə səbəbə görə A.L.Yakobson, iddia edir ki, Arsax (və Xaçın) qədim erməni vilayətləridir (və ya knyazlıqlarıdır), halbuki onun özü Alban Qandzasar məbədindən ( monastırından deyil!) bəhs edərkən təsdiq edir ki, bu məbəd " XIX əsrədək Albaniya katolikosunun kürsüsü olmuşdur"(bax: А.Л.Якобсон.Из истории, с.144). Qandzasarın və Amaras- Ağ Oğlanın erməni kilsəsi tərəfindən mənimsəmə niyyətlərinin qabağını almaq üçün Respublika P rezidentinin fərmanı elan edilib.

yalnız yadelli işğalçıların köməyi ilə bərqərar edirdi,[1] erməni katolikosluğunun mənafeyi hər dəfə tələb etdikdə erməni kilsəsi həmişə yadelli işğalçıların köməyinə əl atır, " xaç bayrağı ilə öz yolu üzərində tarixi Albaniya və onun bir hissəsi olan Qarabağ (Arsax) xalqlarını" yox edirdi.[2]

N.S.Vartapetovun qeyd etdiyi kimi, erməni kilsəsi "həmişə özü üçün yeni şəraitə bacarıqla uyğunlaşdırdı və siyasi vəziyyətdən asılı olaraq, səfəvilər sonra da rus çarına qulluq göstərdi; necə ki, vaxtilə həmin qaydada hərəkət edib, Bizans imperatorları, İran Sasani şahları, ərəb xəlifələri, monqollar və digərləri qarşısında baş əymişdi".

Son zamanlar erməni kilsəsi yenə də öz əsassız və uydurma iddialarına qayıdaraq Albaniya kilsəsinin birinciliyini mənimsəyir. Uydurub, bu uydurmaya inanıb, başqalarını da bu uydurmaya inandırmağa çalışan erməni kilsəsi bu uzunəsrli vərdişlərini indi çaxnaşmada olan erməni ziyalılarının canlarına da yeritməyə çalışır. Respublikamızın Prezidentinin bu yaxında elan edilmiş fərmanı məhz Qandzasar və Amaras-Ağ Oğlan alban məbədlərinin erməni kilsəsi tərəfindən mənimsənilməsinə qarşı yönəldilmişdir. "Alban tarixi " Azərbaycan dilinə çox çətinliklə tərcümə olunurdu. Xaçpərəst məfhum və istilahların lüğətlərimizdə qarşılıqları olmadığı üçün tərcümə çox ağır gedirdi. İndi hər şey arxada qaldı və oxucular

[1] M. Kalankatuklu. III, 11-ci fəsil.
[2] Н.С.Вартапетов. Христианские памятники Карабаха, vər.9; Yenə orada. К вопросу, vər. I.

özləri bu yazıya qiymət verə bilərlər. Hər halda tərcümə və şərhlər maraq göstərənlərə azacıq da olsa kömək edə bilsə, öz vəzifəmi yerinə yetirilmiş hesab edərəm. Kitabın fəsilləri xronoloji çərçivəyə salınmışdır.

Bakı, 1990-1991.

# B İ R İ N C İ K İ T A B

## BİRİNCİ FƏSİL
## Albanlar tarixinə giriş

Allahın yaratdığı ilk insan- ulu babamız Adəm – 230 il[1] yaşamış və Sifi dünyaya gətirmişdir. Sif 205 il[2] yaşamış və Enosu dünyaya gətirmişdir. Enos 190 il[3] yaşamış və Kainanı dünyaya gətirmişdir. Kainan 170 il[4] yaşamış və Maleleil dünyaya gətirmişdir. Maleleil 165 il[5] yaşamış və İaredi dünyaya gətirmişdir. İared 162 il[6] yaşamış və Enoxu dünyaya gətirmişdir. Enox 165 il yaşamış və Mafusaili dünyaya gətirmişdir. Mafusail 167 il[7] yaşamış və Lamehi dünyaya gətirmişdir. Lameh 168 il[8] yaşamış və Nuhu dünyaya gətirmişdir. Nuhun 500 yaşı tamam olanda üç oğul – Sam, Ham və Yafəsi dünyaya gətirmişdir.[9] Və Samın dünyaya gəlməsindən yüz

---

[1] İncildə (Kövn, V,3)- 130 il.
[2] Yenə orada (V,6) – 105 il.
[3] Yenə orada (V, 9) – 90 il.
[4] Yenə orada ( V,12) – 70 il.
[5] Yenə orada ( V, 15) – 65 il. Patkanovda – 167 il.
[6] Yenə orada (V, 21 ) - 65 il
[7] Yenə orada (V, 25) - 187 il
[8] Yenə orada (V, 28) - 182 il. Patkanovda – 180 il.
[9] Yenə orada (V,32)

il sonra – Nuhun 600 yaşı tamam olanda – Tufan qopdu.[1] Adəmdən isə Tufana qədər 2242 il və on nəsil keçmişdir.

# İKİNCİ FƏSİL

## Yafəs nəslinin şəcərəsi

Burada sən Yafəsin soyu və onun nəslinin məskun etdiyi hüdudları haqda məlumat tapacaqsan – hərəsinin özünə aid yerind

Qardaşlar Nuhun təkidi ilə bir – birini qarət etməyəcəkləri haqda and içəndən sonra. Nuhun Yafəsə təyin etdiyi sahə şimalda Midiyadan Qadirona[2] qədər uzanıb, Midiyanı Babildən ayıran Dəclə çayının aşağı axınına qədər idi.

Yasəfin oğullar budur: Homer – hamirlər[3] onun nəslindəndir; Məcuc – keltlərin və Halatların cəddidir; İavan[4] - yunanların cəddidir; Fuval[5]- fessalların cəddidir; Mədəh[6]-illiriyalıların cəddidir; cəddidir; Firas[7] - frakiyalıların cəddidir; Kittim[8]- makedoniyaların cəddidir. Firasın oğulları bunlardır: Əşkinaz – sarmatların cəddidir; Rifat –savramatların cəddidir; Foqarma- ermənilərin cəddi.[9] İavanın oğulları bunlardır: Elisa [1] -

---

[1] Yenə orada (V,VII,10 – 24,VIII, 1 - 14)
[2] İspaniyada Kadiks şəhərin adı idi.
[3] Kimmerilər.
[4] Patkanovda İunandır.
[5] Patkanovda Tobeldir.
[6] Patkanovda Mosoxdır.
[7] Patkanovda Tiramdır.
[8] Kittim – İavanın oğlu, Yafəsin nəvəsidir. bax: İncil, Kövn, X,24.
[9] Bunlar hamısı Homerin oğullarıdır. Bax: İncil, Kövn, X, 3.

siciliyalilərın və afinalıların cəddidir; Farsis – gürcülərin və turanlıların cəddidir;[2] Kittim- romalıların, latınların və rodeylərin cəddidir.[3] Cəmisi 15 xalqdır. Bunların üçü yerlərini atıb, bütpərəst adalarına səpələndilər. Bunların Yafəsin oğullarından olan ketarilərin nəslindən olan kiprlilər və şimalda ketarilərlə qohum olan xalqlar idilər və albanlar da məhz bunların nəslindəndir. Yunanlar (ellinlər) torpağında yaşayan xalqlar isə Afinada yaşayan və ionitlərin mərdlər ölkəsindən gəlmiş aetlər və Agenor oğlu Kadmosun törəməsi olan sidonilər də buraya köçənlərdəndir. Karfagenlilər isə Tirdən[4] gəlmişdilər.

Dillərin qarışdığı zaman Yasəfin soyundan on beş xalq gəlmiş və bunlar Okyanusa qədər və şimala tərəf uzanan Midiyadan Hesperiyaya qədər torpaqlarda sakin olmuşlar. Onların torpaqları budur:Atropatena, Albaniya, Amazoniya, Böyük və kiçik Ərməniyyə, Kappadokiya, Həlatiyə, Kolxida, Hindistan, Bosporiya, Meotis, Deris, Sarmatiya, Torinis, Sevromatiya, Skifiya, Frakiya, Makedoniya, Dalmasiya, Molxiya, Fessaliya, Lokriya, Beotiya, İtaliya, Attika, Aheya, Peleniya, Akarnes, Huniristim, İlliriya, Liquriya, Adriaka ( Adriatik dənizinin adı bu adla bağlıdır), İspanohalliya, İberiya, Böyük İspaniya. Burada Yafəs nəslinin

---

1 Patkanovda Əvlişadır.
2 Patkanovda tursilərdir.
3 İavanın dördüncü oğlu- Dodanim buraxılıb.
4 Tir- Luvanın cənubunda şəhərdir. Digər adı Surdur.

torpaqlarının hüdudları Britaniya adalarında axıra çatır və bunların hamısı şimala tərəf baxır.

# ÜÇÜNCÜ FƏSİL

## Hansı xalqlar yazıya malikdir.

Yazıya malik olan xalqlar bunlardır: yəhudilər, romalılar (bunların yazısından bizanslılar da istifadə edirlər), ispanlar, yunanlar,midiyalılar, ermənilər və albanlar. Bunlar Midiyadan şimalda və Qadironun hüdudlarına, yəni Parqamitos çayından başlayaraq Şərqə tərəf sayılan Mastotisa qədər uzanan torpaqlarda yaşayırlar.

Siciliya, Evbeya, Rodos, Xios, Zakintos, Kefaloniya, İtaka, Kerkira (Korfu) və Kiklad adaları, İoniya adlanan Asiyanın hissəsi və Midiya ilə Babil arasında axan Dəclə çayı – bütün bunlar Yafəs nəslinin torpaqlarıdır.

Sam dünyanın şərq hissəsini, həm cənub hissəsini, Yafəs isə qərb və albanlar yaşayan hissəsini və Xəzər dənizi yerləşən şimal hissəsini almışlar. Dünya dağlarının zirvələri şərqdədir, qərbdə isə bu xalqların yaşadığı yerləri Trabzona qədər uzanır. Yafəsdən Tiqrana[1] qədər qırx dörd çar olub və 450 il daxilində Arşakdan Attabana qədər on dörd İran şahı olub.[2] İstəhrdən[3] olan Sasanilər nəslinin nümayəndəsi Ərdəşir şah Artabanı öldürür[4] və 252 il ərzində, xilaskarımız Xristos gələnə qədər və yəhudilərin Babil əsarətindən

qayıtmalarından 270 il sonra farslarla assurilərə hakim olan Parfiyanın mülkünü ləğv etmişdir. Həmin parfyanların nəslindən 620 il ərzində erməniləri Vologezdən Ərdəşirə qədər 24 çar[1] idarə etmişdir. Sonra mülk Arşakilərin əlindən alınır, müqəddəs riqorun patrikliyi isə ləğv olunur. Və əgər Baqratilərin nəsli haqda bir şey öyrənmək istəsən, bil ki, erməni çarı Paruyr oğlu Hraçe Babil çarından Şmavon adlı yəhudinin ona verilməsini xahiş etmişdi. Özüylə aparıb, onu böyük hörmətlə Ermənyyədə yerləşdirdi. Bax, Baqratilər həmin Şmavonun törəmələridir.

# DÖRDÜNCÜ FƏSİL

## Albaniya ölkəsinin bolluğu və bərəkətliliyi. Bu torpaqdan insanlar necə faydalanırlar.

Uca, Böyük və Kiçik Qafqaz dağlarının qoynunda yerləşən Alban ölkəsi öz saysız- hesabsız təbii sərvətləriylə həddindən artıq gözəl və heyranedici bir məmləkətdir. Böyük Kür çayı sakit-sakit bu ölkənin düz ortasından axır və iri və xırda balıq gətirib, sularını Xəzər dənizinə tökür. Çayın sahilləri boyu münbit çöllərində külli miqdarda taxıl və üzüm,neft və duz, ipək və pambıq və çoxlu zeytun ağacları var. Onun dağlarında qızıl, gümüş, mis və oxra çıxarılır. **Vəhşi heyvanlara isə gəldikdə,burada şir, bəbir, panter, çöl**

[1] Patkanovda 26 çar.

eşşəyi,çoxlu quşlardan isə qartallar, qırğılar və bunlara bənzərlər var. Ölkənin paytaxtı əzəmətli Bərdə şəhəridir.

# BEŞİNCİ FƏSİL

## Vologez albanlara hökmdar təyin edir.

Burada Alban dövlətinin tarixi başlanır. Dünyanın yaranması ilə çar Vologezin[5] dövrünə Böyük Qafqaz dağları arasında hansı xalq yurd salıb- bu haqda oxucularımıza heç bir aydın məlumat verə bilmərik. Vologez öz hakimiyyıtini şimal tayfaları üzərində bərqərar edəndə o, yanına şimal düzənliklərində və Qafqaz dağları ətəklərində, dağlardan cənubdakı dərələrlə çöllərdə və düzənlik başlanan yerlərdə yaşayan vəhşi qəbilələrin başçılarını çağırıb, onlara qarətlərlə qətllərdən əl çəkib, çarın vergilərinin itatətlə ödənməsini əmr etdi. Çar qəbilələr üzərində hakim və canişinlər təyin edir və onun əmrilə Yafəs nəslindən və Sisakan (Sünik) soyundan olan Aran onlara hakim təyin olunur.

Aran Araz çayından başlayaraq Hunan qalasına[6] qədər uzanan Alban ölkəsinin düzənliklərini və dağlarını miras olaraq almışdır. Onlar öz ölkələrinə Ağvan (Alban) adını ona görə vermişlər ki, Aranın özünü, yumşaq xasiyyətinə görə,"ağu"("Mehriban") deyə çağırırdılar. Deyilənə görə, həmin Aranın nəslindən olan məşhur və cəsur ərlərin çoxunu çar Vologez özü hakim təyin etmişdir. Uti, Girdiman, Tsovd və Qarqar knyazlıqlarda yaşayan xalqlar da həmin

Aranın oğullarının nəslindəndir.

Müxtəlif nəsil şəcərələrini biz buraya qədər izah etdik.

# ALTINCI FƏSİL

## İlahinin biz Şərq xalqına zühur etməsi.

Aranın bu Alban evinı hakim təyin olunmasından Alban torpaqlarını idarə edən Cəsur Vaçaqanın[7] vaxtına qədər keçən dövr haqqda daha mötəbər məlumatları tapa bilmədik.Lakin Ədalət Günəşinin zühur olan günlərində və bizim xilaskarımız, Dərkedilməz Varlığın şöhrət və mahiyyəti olan Atamızın[8] zühur edib, bütün insanların qeydinə qalmaqla və heç bir zaman ayrılmadığı Öz varlığının şöhrətinə sahib olması zamanda O, öz müqəddəs və sevimli şagirdlərini (havarilərini bütün dünyaya təbliğatçı kimi göndərir və biz Şərq xalqına müqəddəs havari Faddey[9] təyin olunmuşdu. Faddey Artaz vilayətinə[10] gəlir və burada erməni çarı Sanatrukun[11] əlilə şəhid olur. Faddeyin şagirdi müqəddəs Yelisey Qüds şəhərinə qayıdıb öz dindaşı havarinin həsəd oyadan şəhidliyi haqda söhbət edir. Bundan sonra Yelisey Qüdsün birinci batriki Ağamızın[12] qardaşı müqəddəs Yakovun (Yaqub ) tövsiyəsiylə müqəddəs Ruh naminə Şərqə təyin edilir.

Yelisey öz sərəncamına Şərqi (Albaniyaı) alır. Qüdsdən ayrılıb İrana gedir və oradan ermənilərin gözündən qaçaraq Məskut[13] elinə keçir.Öz təbliğini o, Çolada[14] başlayır və müxtəlif

yerlərdə şagird toplayaraq, onlara xilaskarı (İsanı) andırmağa çalışırdı.

Oradan o, üç nəfər şagirdi ilə Uti vilayətində olan Srxana[15] gedir.Lakin şagirdlərin bəzi qohumları onları izləyib arxalarına düşürlər və şagirdlərin birini şəhid edirlər. Digər ikisi müqəddəs Yeliseyi atıb, qatillərlə çıxıb getdilər.

Müqəddəs batrik Gisa[16] gəlir, burada kilsə tikir və qansız qurban verir.

Bu yer Şərqin bütün kilsələri və şəhərlərin başlanğıcıdır və biz şəqrilərə xristianlığın qəbul etdirilməsinin mənbəsidir.

Buradan Yelisey Zərqun dərəsinin[17] keçib cahil bütpərəstlərin müqəddəs səcdəgahlarının olduğu yerə gedir və oradaca şəhid olur. Və bu cinayəti kim edib – bilinmir! Qatillər müqəddəs cənazəni Qomenk[18] adlanan yerdə bir xəndəyə atdılar və uzun müddət onun qaxımış cəsədi gizli qalır.

# YEDDİNCİ FƏSLİ

## Şərqin maarifpərvəri

## Müqəddəs Yeliseyin cəsədinin tapılması.

Lakin nə həqiqəti gizlətmək olar, nə də zülmətdə işığı saxlamaq! Uzun müddət keçəndən sonra müqəddəs Yelisey dindar kişinin röyasına girir. Adamlar dəstəylə o yerə yüyürdü və xəndəyə çatanda bir yığın sümük görürlər. Bir qədər məyus qalaraq, onlar yenə də sümükləri xəndəkdən çıxarıb, bütün gecəni ibadət edirlər.

Səhərə yaxın bərk zəlzələ oldu və orada duranların hamısı yerə yıxıldı. Çöl tərəfdən sərt külək əsdi, murdar sümükləri o tərəfə bu tərəfə səpələdi və həmin yerdə ancaq havarinin sümükləri qalır. Elə bu an Urekan adlı kəndin[19] Stepannos adlı dindar keşişi sümüklərin içindən kəlləni oğurlayıb ata minir və aradan çıxır.

Camaat onun dalınca yüyürür, lakin bu dəmdə göydən qapqara bulud enir və bunlar ondan qorxub, evlərinə qayıtdılar.Röyalarında gördükləri müqəddəs Yeliseyin sümüklərini götürüb, dindar keşiş onun kəlləsini apardığı yerə, yəni Urekan kəndinə apardılar və oradaca qoydular. Sonralar bizim qüdrətli İlahimiz eşqinə sümükləri oradan müqəddəs Nersmehr adına (indi onun adı Cırvişdikdir) kilsəyə apardılar. Çox illər keçəndən sonra alban çarı Mömin III Vaçaqan[20] şəhidin sümükləri tapılan xəndəyin üstündə bir rukn tikir. Bu ruknu müqəddəsləşdirirlər və çarın fərraşı onun üstünə çıxıb,ömrünü orada bitirdi.

# SƏKKİNCİ FƏSLİ

## Yafəs və Arandan başlayaraq III Vaçaqana qədər Albaniyada hakim olan hökumdarların siyahısı.

Yafəs, Homer,Firas, Foqarma, Hayık, Armeneak, Aramans, Amasiya, Qelam, Harma, İbrahimin həmdövrü Aran, İshaqın həmdövrü Aray, Ənuşavan, Parət, Ərbaq, İsanın həmdövrü Zavan,

Pərnas, Sur, Həvəng, Vaştaq, Əmbək, Ərnək, Şəvərş, Horay, Vəstamkar, Həraq, Hiran, Əncaq, Dalaq, Huray, Zərmehr, Davudun həmdövrü Borc, Ərbun, Bəzək, Xoy, Yusaq, Qaynaq, Sqayordu (bu öz tacını Babil çarından almışdı), Paruy, Pərnəvaz, Pəçuç, Kornaq, Pavus, az yaşamış Yeruand və Tiqran.

Aran həmin şəcərə cədvəlinə əsasən albanlar üzərinə təyin olunməşdu. Arandan əzəmətli Arşakilər nəslindən olan Cəsur I Vaçaqan, I Vaçe, Urnayr, II Vaçaqan, Mehravan, Satoy, Asay, Arsvagen, II Vaçe və ondan sonra Alban çarı Mömin III Vaçaqan.

Bunların çoxu səxavətli həyat keçirib, hərəsi öz vaxtında vəfat edib.Ancaq bunların sonuncusuna, Alban çarı Mömin III Vaçaqana belə bir ilahi sərvət zühur edib və bu sərvət yalnız ona təqdim olnunmuşdur.

Firuzabad kimi də əzəmətli şəhəri İran şahı Firuzun[22] əmri ilə ikinci II Vaçe tikdirmişdir. İndi bu şəhərin adı Bərdədir.

# DOQQUZUN FƏSİL

## Arandan Alban çarı Urnyra[23] qədər ölkədə cərəyan edən hadisələr haqda ardıcıl izah edilmiş məlumatları tapa bilmədik. Amma hər nə bilmək lazımdırsa, burada xülasə şəklində verilir.

Yaxşı olardı ki, Aranın çarlığı vaxtından başlayaraq bizim dövrə qədər olmuş hadisələr xronoloji hesabatlar tapılaydı. Lakin Şərqdə mövcüd olan müxtəlif xalqların çoxluğu, kitab və əhdlərin yandırılması ilə əlaqədar olaraq izah edirlər ki, niyə görə mümkün deyil.Amma buna baxmayaraq, burada bizim köməyimizə Artavazdın[24] romalılarla müharibələri haqda bəhs edən birici salnaməçi Moisey[25] gəlir. Artavaz Atropatenadan çoxlu qoşun yığıb, Qafqaz dağlarından güclü xalqları və Albaniyanın və İveriyanın ordularını dəvət edib, onlarla Mesopotamiyaya gedir, bunların köməyi ilə romalıları oradan çıxarır.

Artakses[26] Yervanda[27] hücum edəndə, Yervand Albaniyanın Uti vilayətində idi. Ordusunu orada saxlayıb, Artakses öz şəhərinə qayıdır. Orada Alban ordularını yanına dəvət edir, onlarla Göyçə (Sevan) gölünün sahilinə gəlib və onların köməyi ilə Yervandan qovub, Erməniyyəni işğal edir.

Elə bu vaxtlarda albanlar[28] bütün dağlı qəbilələri və gürcülərin bir qismi ilə ittifaq yaradıb, nəhəng qoşun toplayır və erməni torpağına hücum edirlər. Artakses də öz ordusunu yığır və onlara qarşı çıxaraq, Kür qırağında düşərgə salır.

Ağır döyüş başlanır və Alban çarının oğlu Artaksesin əlinə əsir düşür. Çar oğlunun əvəzinə o, bacısını, Satinik adlı çar qızını alır və sülh bağlayaraq Erməniyyəyə qayıdır.

Az bir vaxtdan sonra Satinikin atası vəfat edir və taxtını bir qəsbkar tutub, qızın qardaşını ölkədən qovur. Artaksesin Sibat adlı

mürəbbisi qəsbkarı qovub, taxtı Satinikin qardaşına qaytarir, özü isə böyük qənimətlə və çoxlu əsirlərlə Ermənniyyəyə qayıdır. Artaz vilayətindən olan əsirləri o, Savarşan vilayətində yerləşdirir. Şərqin (Albaniyanın ) nahararları[29] Satinikin nəslindəndir. Bu nəsil Tiridatın atası Xosrovun[30] vaxtında Basil ölkəsindən[31] gəlmiş bir mərd adamla qohum olmuşdur.

# ONUNCU FƏSİL

## Ermənniyyənin maarifçisi Müqəddəs Qriqori və onun səadətli oğulları: Müqəddəs Qriqorinin nəvəsi Vrtanesin oğlu Müqəddəs Qriqorisin Albaniyanin və İveriyanın katolikosu vəzifəsinə təyin edilməsi; onun Albaniyaya gəlməsi və burada xristianlığı yayması; onun şəhidliyi və qaxımış cəsədinin aparılması haqqında qısa xəbər

Dediyimiz kimi, İsanın Faddey adlı şagirdi Ermənniyyənin bir yerindən keçir və Şərq vilayətlərinin bəzilərindən oralara yüksək- şan və üç qat müqəddəs Qriqori gələnədək, xristian dinini təbliğ edirdi.

Qriqorinin atası – parfiyalı Anak tərəfindən xaincəsinə öldürülən erməni çarı Xosrovun ölümündən və Anakın qaçdığı zaman Arazın suyunda boğulmasından sonra[32], Xosrovuv bəzi mürəbbiləri Qriqorini xilas edib Yunanıstana aparırlar.

Bu əhvalat Uca Allahın əməllərindən idi və pozğun Firon onun əməllindən qamış səbətin içində Nil çayının sularında xilas olan birinci peyğəmbər Musanın əhvalatına bənzəyirdi.[33] Və xilas olan Musa sonralar öz xalqını ağır Misir əsarətindən və işgəncələrindən qurtarmışdı.[34] Bunlara bənzər erməni canilərini qılınclarından xilas olan ən müqəddəs Qriqori də Allah tərəfindən yunanlar ölkəsində ona görə gizlində saxlanırdı ki, gələcəkdə Şərq ölkələrini xilas etsin və qalxanda gizlənən, seçilmiş ox kimi gözə görünməyən düşməni sonralar öldürsün. O, Allah tərəfindən hələ anasının bətnində seçilmişdi, hələ bətndə ikən o, müqəddəs şəhid və havari kimi adlanmışdı və dünyaya gəldikdən sonra xristianlığı yaymaq üçün Əşkinazın nəsillərinin yanına göndərilmişdir.

Və xristian dinidə böyümüş və tərbiyə almış səadətli Qriqori havarilərə xas olan cəsarətlə erməni çarı Tiridatın hüzuruna gəlir ki, müqəddəs havari Pavelin kiməsə dediyi” hər şeydə öz cisminizdən olan aöalarınıza qorxu və həyəcanla, ürəyimizin sadəliyi ilə elə bil İsaya tabe olunuz; zahirən insana yaxşılıq kimi qulluq göstərməklə yox, ancaq İsanın oğulları kimi, Allahın əmrini səmimi-qəlblə yerinə yetirməklə tabe olunuz”[35] – sözlərinə inam bağlayaraq, çara həvəslə və itaətlə xidmət etsin. Burada onun oğlu- Aristakes və Vrtanes

dünyaya gəlir.

Lakin müxtəlif murdar bütlərə inamla sitayiş edən çar qəddar Əjdahanın köməyi ilə qüdrətli şəhidi məhvedici uçurum içində pozğunluq ilahələrinə sitayiş etməyə məcbur edirdi. Müqəddəs Qriqorini çoxlu müxtəlif içgəncələr salmasına baxmayaraq, çar müqəddəs ərin mətin inamını sarsıda bilmədi. Qriqorinin çara müqaviməti gündən- günə artıb güclənirdi və o, gözə görünməyən və görünən düşmənlər üzərindəki qələbəsinə görə mükafat alırdı.

Çar comərd ərin İsaya həqiqi inamını sındırmağa yol tapa bilmədiyi üçün, Şeytan öz nökərlərinin ürəklərinə şər saldı və bunlar müqəddəs Qriqorini Artaşat[36] şəhərində ilanla dolu çox dərin bir quyuya atırlar və o orada otuz il qalır. Elə o vaxt həmin çar məhşur şəhidlər Ripsime və Qayane və onların otuz büş rəfiqələrini[37] öldürüb, onların meyilərini çölə atmışdı.

Bundan sonra əzəmətli Allah şəhidlər Qriqorini, Ripsi dəhşətli cəza endirir.Lakin bu cəza deyil, yalnız böyük mərmeni və onun rəfiqələrini ziyarət edir və Erməniyyə üzərinə həmətin əlaməti idi və bu mərhəmət atanın istəkli oğluna nəsihət verməsinə və yad oğulluğuna nifrət etməsinə bənzəyirdi.

Həmin cinlər ki, onlara çar və yaxınları qurbanlar və hədiyyələrlə sitayiş edirdilər, üzlərinə dönüb onlara hücum edir və dəli hala gətirib özləri öz ətlərini yeməyə məcbur edirdilər.Bundan başqa Allah onların çarını donuza döndərib, onu qalın qamışlığa qaçmağa məcbur edir. Onlara elə dəhşətli qorxu gəldi ki, onlar

qiyamət gününün gəlməsini düşündülər.

Və o zaman ki, bütün insanlar- böyüyündən kiçiyinə kimi- dəhşət və lərzələr içində idilər, Allah yer üzünə mərhəmət mələyini göndərir. Bu mələk erməni çarı Tiridatın Xosrovduxt adlı bacısının yuxusuna girir və ona deyir:" Bu zərbələrdən sizi yalnız müqəddəs Qriqori xilas edə bilər. Odur ki, gedin və onu dərin quyudan çıxardın!"

Xosrovduxt oyanaraq yuxusunu danışdı, lakin hamı onu danladı və susmağı tələb etdi. Onlar dedilər: " Demək sən də dəli olmusan? Çoxdan ölüb gedəni sonra mürtədlər, yeni bəlaların gəlməsindən qorxaraq, quyuya tərəf gedib, Allahın sözlərini təkrar edərək dedilər: " Əgər sağsansa- çıx bayıra!"[38] Və elə bu anda Qriqori xəbər verir ki, sağ- salamatdır.

Onlar böyük sevinclə onu yuxarı qaldırır və erməni çarının iqamətgahı olan Yeni Qalaya (Vaqarşapata) aparırlar. Cinlər əzəmətli Qriqorinin yanına dəli divanələri, sayıqlayanları və öz ətlərini didənləri gətirirlər. Cinlər onun yanına qamışlıqdan böyük əzablar çəkən çarı da gətirdilər və müqəddəs Qriqori diz çöküb və göz yaşlarını tökərək mərhəmətli Allaha yalvarır ki, o, bədbəxt xalqın günahından keçsin. Və elə bu an, müqəddəsin duaları ilə, xalq öz cismani xəstəliklərdən sağalır və canları da bəd əməllərindən xilas olurdu.

Əgər orada şəhid olmuş müqəddəs qadınlar haqda heç kəs söhbət açmadısa, Qriqori öz quyusunun dibində onların şəhidliyinin

röyasında görübmüş və buna görə də soruşdu: “Müqəddəslərin qaxımış cəsədləri haradadır?” Xalq təəccübləndi və ondan soruşdular ki, o, hansı müqəddəslərdən danışır. Və ondan şəhidlərin adlarını eşidəndə camaat başa düşdü ki, kimdən söhbət gedir və ona müqəddəs və ehtiramlı cəsədləri göstərdilər. Qriqori onları götürüb elə onların yırtılmış libaslarına bükür və heç kəsə müqəddəs suda pak olmayana qədər o cəsədlərin yanına gəlməyə icazə vermirdi. O, cəsədləri şəhid olduqları yerdə qurulan kilsəcikdə qoydu.

Sonra Qriqori bütün Erməniyyəyə öyüd-nəsihət verir, hamını xaç suyuna salır.Onların hamısını həyatverici İlahinin cisminin və qanının dadına baxaraq müqəddəs Ruhun mərhəmətinə layiq edir. Əzəmətli Qriqori patriax  taxtını qəbul etmək istəməyəndə, onun yanına Allah mələyi gəlib deyir:” Etiraz etmə və öz itaətinə inad göstərmə, ürəkli ol və Allah tərəfindən sənə verilən ikiqat əbədi şöhrəti qəbul et!” Və o, patriarx mənsəbini qəbul edib gürcülər və albanlar ölkələrinə xristianlığı yaymağa gedir.[39]

Haband vilayətinə gələrək o, yerli əhalinin Allah Oğlunun vəsiyyətlərini qorumağa çağırırdı. Amaras şəhərində[40] o, kilsənin təməlini qoyub, onu tikmək üçün fəhlələr və ustalar cəlb edir.

Sonra Qriqori Erməniyyəyə qayıdır və orada oğlu Vrtanesi öz yerinə təyin edib, onu patriarx taxtına qaldırır. Oğlu atası kimi mərhəmətli idi və tamamilə onun sərancamlarına bağlı olub, namuslu və səxavətli həyat sürür və bütpərəst küfründə olanlara öyüd- nəsihət verirdi. Çarın arvadını da çirkin pozğunluğuna görə

məzəmmətləndirirdi.

Bir gün Vrtanes Taron vilayətində[41]kilsəyə dini mərasimi[42] mədh etmək üçün girəndə çarın arvadının təhriki ilə çoxlu qəzəbli bütpərəstlər və Şeytana sitayiş edənlər onu öldürmək üçün üzərinə hücum etmişdi. Lakin onlar kilsə daxilinə soxulan kimi Allah əmrilə elə o an əl-ayaqları bərk-bərk bağlanıb buxovlandı,boyunları da üzüldü. Müqəddəs ər Allahın kəlamlarını bitirənə qədər onlar pis niyyətlərindən və çarın arvadının arxusundan danışdılar. O,dua oxudu və hər birinə əliylə toxunaraq,onlara şəfa verdi və bundan sonra pislik görməkdən tövbə edərək  Allahın mərhəmətini qazanmağa nəsihət verdi.

Onun iki oğlu var idi. Birinin adı İusik[43] idi. Onun səxavətli və məsum xasiyyəti var idi. O da şəhid oldu, çünki atasının patriarxlıq taxtına qalxaraq  pozğun çara qarşı durdu və çarın əmri ilə kilsənin içində dəyənəklərlə döyülüb öldürülmüşdü.

Digər oğlunun adı babasınkı kimi Qriqoris[44] idi.O, babasına oxşayır və onun kimi də hər cəhətdən səxavətli idi. O, heç evlənməyib və atasının mənəvi mirasına ehtirasla çatmaq istətirdi. Hələ gənc yaşlarında o, müqəddəs kitabları oxumağa çalışırdı, şəhvət hisslərini dualar və orucluqla boğur,ruhunu dinə məhəbbətlə bəsləyirdi. Qısa müddətdə babasının - müqəddəs Qriqorinin ikiqat yüksək mənsəbin – taxtla patriarx tacını və saleh əməllərinə görə şəhidliyin ən yüksək mərtəbəsini qəbul edir.

Hələ on beş yaşında ikən gənc Qriqoris Gürcüstan və

Albaniyanın yepiskopluq mənsəbinə layiq görülmüş[45] və oralara gedib,hər iki ölkədə xristianlığı təbliğ və oralarda onu bərqərar edir. Dinin nizamına və şəhərlərin mövqeyinə görə o, kilsələr tikdirir, keşişləri təyin edib, onları müqəddəs yerlərə xidmət etməyə və müqəddəs adamları yada salanda can yandırmağa çağırırdı. Ən xoş səylərlə o, havarilərin ardınca gedir, canlı Allah Oğlunun (İsanın) hökmlərini həyata keçirir və bütpərəstlər arasında dolanaraq, onlarıAta,Oğul və Müqəddəs Ruhun naminə xaçpərəst edib, onları Allah kəlamına riayət etməyi və özləri ilə "nə qızıl, nə gümüş, nə mis, nə torba, nə paltar, ayaqqabı, nə də əl ağacı"[1] götürməməyi öyrədirdi.

Qriqoris özü də bütün bunlardan çəkinirdi və buna görə də o, özü ilə ən vacib və ən qiymətli mükafat kimi İoannın atası əzəmətli birinci baş kahin və şəhid Zaxariyyanın[46] təmiz qan parçasını və İsanın gözəl dininə inanan və Nikomediya şəhərində[47] şəhid çələnginə layiq görünən müqəddəs Pantaleonun qaxımış cəsədini aparmışdı. Həmin şəhidlərin qaxımış cəsədlərini Qriqoris Albaniyanın böyük şəhəri İriyə[48] aparır, orada yerləşdirib, Daniyel adlı bir keşişi təyin edir ki,həmin müqəddəs cəsədlərə Xristos naminə qulluq etsin.

Özü ilə əxlaqlı və Xristosun (İsanın) əmrlərinə sadiq olan şagirdləri və müqəddəs Zaxariyyanın və şəhid Pantale onun qaxımış cəsədlərinin qalmış hissələrini götürərək Qriqoris Məskutlar

[1] İncil. Əhdi Cədid Matfeydən, X, 9-10.

ölkəsinə[49] gedib, orada Arşakilərin qohumu olan məskutlar çarı Sanesanın[50] hüzuruna gəlir. Orada Qriqoris sözlə təsvir edilə bilməyən vahid yaratdığı Üç Uqnumun[1] qüvvəsini və İlahi Kəlamın təcəssümünü təbliğ edir, yer üzündə İsa tərəfindən yaradılmış çoxlu müxtəlif möcüzələrdən, onun çarmıxa çəkilməsindən, ölümündən və iki gündən sonra dirilməsindən, bütün vücudu ilə Səmaya ucalmasından və sağlarla ölülər üzərində muhakimə etmək üçün Qiyamət günü qayıtması haqda danışırdı.

Əvvəlcə məskutlar onun təbliğini böyük sevinclə qəbul edirdilər. Lakin qəlblərinə Şeytan daxil olur və onları Allahın xilasedici kəlamlarını rədd etməyə təhrik etdi. Onlar müqəddəs həqiqətdən ibrətamiz sözlərlə, yəni mərhəmətli Allahın əzmi olan: qarət etməmək, oğurlamamaq, öz əllərilə çörək qazanıb insan kimi zövq almaq və Allahı razı salmaq – bütün bunlara məskutlar böhtan atdılar və dedilər:" Bütün bunlar erməni çarının hiyləsidir, çünki o, özünün ölkəsinin bizim qarətimizdən xilas etmək istəyir.Əgər biz qarət etməsək və oğurlamasaq, onda biz nə cür dolana bilərik?"sonra onlar öz çarlarını yoldan edib öz hiylələrinə təhrik etdilər. Onlar gənc Qriqorisi xam atın quyruğuna bağlayıb onu Vatnean adlı çölə buraxdılar. Müqəddəs Qriqoris belə şəhid oldu.[51]

Onun şagirdləri meyitini tapıb Haband vilayətinin Amaras şəhərinə gətirdilər[52] və o, oradakı kilsənin şimal tərəfində yerləşən sovməədə əbədi rahatlığını tapdı. Bundan sonra Zakariyyanın

---

[1] Xristianlıqda olan Ata Allah, Oğul Allah və Müqəddəs Ruh Allah lüğətimizdə Üç Unqum kimi izah olunur.

müqəddəs qanını bir şüşəyə və şəhid Pantaleonun qaxımış cəsədini o biri şüşəyə qoyub, bu şüşüələri Qriqorisin müqəddəs cəsədi ilə bir yerdə basdırıb qaçdılar, üz qoyub Ermənyyədə gizləndilər, çünki bu vaxt Sanesan saysız – hesabsız hunların qoşunları ilə Erməniyyəyə basqın etmişdi.[53]Lakin ilahi iltifat Erməniyyə naxararlarına[54] əlavə qüvvət verdi və onlar gənc və müqəddəs Qriqorisin qanının intiqamını aldılar.Bütün hücumda olan nəhəng ordu qılıncdan keçirildi və onlardan biri sağ qalmadı ki, bi bəd xəbəri məskutlar ölkəsinə çatdırsın.

Elə bu zaman müstəhkam Tsri şəhəri Alban çarının əleyhinə üsyan edib, İran şahına kömək etməyə başlayır və bundan istifadə edən Ərgeslər[55] gəlib şəhəri əllərinə keçirirlər. Onlar şəhərin gənc Qriqorisin  şagirdi olan Daniel adlı keşişi tapıb, onun özünü və yanındakı oğlanı öldürürlər. Keşişin yanında qalan gənc çilb[56] idi. Bu oğlan xristanlığa meyl göstərirdi və xaçpərəstliyi dərindən öyrənmək üçün keşişin şagirdi oldu.

Ərgeslər bunların ikisini də zəncirləyib incitdilər  və külə və iyrənc divlərə baş əyməyə məcbur edirdilər. Güclə onun iradəsini sındıra bilməyib, onlar gənci dilə tutdular:” Axı, sən bizim ölkənin adamısan! Bizim dediyimiz kimi etsən, ölkəmizdə  şan – şöhrətli olarsan!” Amma oğlan:”Pozğunlar arasında yaşamaqdansa mənə bu keşişdən qabaq ölmək daha xəşdur”- dedi. Və ərgeslər elə o saat onların boyunlarını vurdular. Onların hər ikisi səadət tacınə qəbul edib, dini ataları gənc Qriqoris kimi gözəl şəhidlik qələbəsinin

təntənəsinə layiq görüldülər. Bəzi suriyalı keşişlər onların meyitlərini Haku kəndinə aparıb müqəddəs bir guşəyə qoydular və sonra üzərində bir vəng tikdirdilər. Deyilənə görə onların qaxımış cəsədləri bu günə qədər oradadır.

Bütün bunlar Alban çarı şanlı II Vaçenin dövründə olub.[57] Alban çarı Mömin adlanan III Vaçaqanın hakimiyyət illərinə qədər[58] şəhidlərin müqəddəs qaxımış cəsədləri gizlin və sirr altında qalırdı. Və cəsur Vaçaqandan çar II Vaçeyə qədər doqquz Alban çarı gəlib getmişdir, onuncusu isə mömin və dindar Alban çarı Vaçaqan idi.

# ON BİRİNCİ FƏSİL

## Urnayr Müqəddəs Qriqorinin vasitəsilə xaçpərəst olur və xristianlığı qəbul edir və bütün Albaniya xristianlığı Urnayrdan qəbul edir.

Müqəddəs Yelisey öz havari vəzifəsinin yer üzünün uzaq guşələrindən başlayandan sonra o, Şimalın bəzi xalqlarını[59] həqiqi imana gətirir, amma hamısını yox. O, gözəl cəhdlər göstərib öz xalqının səadəti uğrunda səylə vuruşurdu. Allah insan nəslinin ziyarət etdiyi günlərdə, böyük imperator Konstantinin hakimiyyəti[60] altında qərbi tərəqqiyə çağıranda və Erməniyyəni çar Trdat vasitəsilə

xristianlığa çevirəndə O, həqiqi Xalis Günəşinin təzahürü haqqında azacıq bilən Şərq ölkələrini də imana gətirir və albanlara əla – Həzrət Urnayr vasitəçiliyi ilə yenidən xristianlığı qəbul etdirir.[61]

Bütün bu ilahi mözücələr eyni vaxtda olmuşdur.

Alban çarı Urnayr İran şahı II Şapurun bacısının əri idi.[62] O, cəsarətli insan idi vəçoxlu döyüşlərdə parlaq şöhrətlər qazanıb, ermənilər arasında da bayrağını sancmışdı. Müqəddəs Qriqorinin vasitəsilə o, təzədən dünyaya gəlmiş, Müqəddəs Ruhla örtülmüş və albanları imana gətirmişdir. O,əbədi işığın oğlu kimi yaşamış və axırda insan həyatını tərk etmişdir.

Onun vəfatından sonra albanlar özlərinə katolikos gənc Qriqorisi seçdilər, çünki hələ çarımız Urnayr müqəddəs Qriqoridən xahış etmişdi ki, onu öz ölkəsinə yepiskop təyin etsin. Ona görə yox ki, buna ehtiyac var idi və ona görə yox ki, ermənilər albanlara nisbətən daha böyük idilər. Albanlar bu qərarı şüurlu qəbul etdilər, çünki, müqəddəs Qriqorinin varisini Albanaya çağırmaqda onu bu vəzifəyə layiq görürdülər.

# ON İKİNCİ FƏSİL

## III Trdatın Barsil[63] çarı ilə Albaniya ölkəsində müharibəsi.[64]Sanatruk Albaniyanın çarı olur və

**ermənilərin üzərinə səfərə çıxır.[65] Xosrov ordusu ilə onun köməyinə gəlir. Albaniyanı alır və vergi toplayır.**

Erməniyyənin böyük çarı Trdat ordusunu sıraya düzərək Qarqar çölünə[66] enir və sərt bir döyüşdə şimallılarla üz – üzə gəlir. Barsillərin çarı onun ilə çarpışdı və üstünə  ip atdı. Lakin onu yerə yıxa bilməyib özü də ikiyə parçalandı. Trdat onları hunların ölkəsinə qədər təqib etdi və erməni ordususnun qabağında onların çoxu məhv edildi. Erməni sərkərdəsi Artavazd Mandakuni də həlak oldu.[67] Orda Trdat çoxlu girovlar alır və şimallıları öz ordusuna əlavə edib İran şahı II Şapurun[68] üzərinə hücum edir.Trdat öldükdın sonra[68] Paytakaran şəhərində[70]adı tanınmış Sanatruk albanlara hökmdarlıq etməyə başlamışdı.Buradan o, Erməniyyəyə basqın etdi. Trdatın oğlu Xosrov köməyinə Antioxu və onun yunan ordusunu, Baqratı qərb qoşunları ilə və gürcülərin hakimi olan Mihranı çağırır və onlarla birlikdə Albaniyaya hücum edir. Qoşunun böyük hissəsini Paytakaran şəhərində[71] qoyub, Sanatruk qalan alban ordusu ilə tələsik İran şahı Şapurun yanına gedir. Antiox böyük qənimət və çar vergisini toplayıb öz imperatorunun[72] yanına qayıdandan sonra , Sanatruk əlverişli məqam seçərək Şapurun  əmrilə otuz minlik alban ordusunu toplayıb Erməniyyənin mərkəzinə basqın edir. Keçədən paltar geymiş və nizəylə silahlanmış Sanatruk nəhəng sərkərdələrindən biri Avşakan adlı dağlıq yerdə düşmən üzərinə qəhrəmancasına hücum edir. Ona düşmən oxları dəyəndə onu yalnız

cırmaqlayırdı və zədə verməyib yerə düşürdü. Belə olanda cəsur Vahan Amatuni katolik kilsəyə[73] baxıb ondan kömək diləyir və nizəsini atına tuşlayıb nəhəng sərkərdəni yerə yıxır.

# ON ÜÇÜNCÜ FƏSİL

## Şapur Tiranı çar edib.[74]Onu şimal xalqlarından xilas edir. Arşakın ölümü[75] və Panın hakimiyyəti.[76] Həmin müharibədə Mehricanın həlakı və çar Urnayrın yaralanması.

Tiran Erməniyyənin çarı olduqdan sonra iranlılarla sülh bağlayır və Şapura kömək edərək, onu dörd il ərzində Albaniyada qalıb Erməniyyəni təlaşa salan Şimal xalqlarının basqınlarından xilas edir. Soralar Şapur Tiranın zalım olduğuna görə gğzünü çıxarır və çarlıq oğlu Arşaka keçir.

Eyni vaxtda  şimalm xalqları Şapuru ağır vəziyyətə salırlar və o, Vifiniyaya[77] gedir. Orada bir çox aylar qalıb və onlarla[78] heç bir şey edə bilməyib qayıdır. Sonra o, göl sahilində bir sütun tikdirir və üzərinə ayağının altında kitab olan şirin timsalını ucaldır. Şir İranı, kitab isə yunanları təsvir edir.

Arşak ölür,Pap çar olur. Sonra Mehrican Arsruni üsyan qaldırır və Axitofel kimi öz canını həlak edir.[79] Papla Mehrican

arasında şiddətli vuruşma olur.[80] Burada Spandarat Kamsakaranın əlilə leklər (ləzgilər) çarı Şirgir öldürülür. Basak oğlu Müşeq Mamikonyanın əlilə Albaniyanın böyük çarı Urnayr yaralanır. Mehricanı da sərkərdə Smbat öldürülür və müqəddəs Nersesin duası ilə onun başına qızdırılmış dəmirdən tac qoyulmuşdur.

# ON DÖRDÜNCÜ FƏSİL

## Kitablarıma müvafiq tarix.

Göylər ulduzlarla və yer üzü bitkilərlə bəzənən kimi tarixçilərin əsərləri də müxtəlif əhvalatlarla bəzənir.Əsərimizə daxil etmək üçün Şərq vilayətləri haqda elə dəyərli məlumatlar var ki, bunları biz qədim tarixçilərin kitablarında tapmadıq. Bununla əlaqədar biz, İran şahı II Hörmüzün II Şapurun hansı irq və xalqların rütbə və mənsəbləri bilmək niyyətini[81] öyrənmək istədik. O, bütün böyük və qədim yeddi İran naharar nəsillərin[82] naminə böyük və təmtəraqlı qəbul təşkil edir və cam və üzüm tənəyi vasitəsilə onların şahın hüzurunda hərəsi öz dərəcələrinə uyğun rütbələrini və yerlərini təyin etdi.[83] Möbədlər möbədini[84] şah yüksəldib şah süfrəsinin yuxarı başında oturdu və şah öz əyanları ilə məsləhətləşib, dedi:"Mən fars və parfyanlar arasında olan həqiqi pəhləvilərin[85] və başqa azadların[86] nəsil kitablarından çox yaxşı xəbərdaram. Lakin siz erməni əyanların rütbə və böyük – kiçik dərəcələri haqqında məlumatı mən nə şah sələflərimdən, nə də kitablardan öyrənə

bildim. Buna görə siz, erməni nahararlarının iki çıxış yolu var: ya siz mənə qədim kitab göstərməlisiniz ki, onda hər nəslinizdən rütbə və dərəcələri izah olunsun və bunlara görə tərəfimizdən şan – şöhrətləri yenidən alasınız, ya da ki, bütün bunları bizim arilər məclisinin hüzuruna gətirə bilməsəniz biz sizin bütün əmlak, rütbə və dərəcələrinizi, torpaq və suyunuzu öz arilər əyanlarımızın arasında paylayacayıq, sizi isə şan – şöhrətdən məhrum edib qovacağ.

Bu halda Ermənіyyənin əyanları məsləhətləşib şahın hüzuruna Aqafangelosun "Tarixini" gətirdilər. Şah buyurdu ki, kitab oxunsun, fars dilinə tərcümə edilsin və üzü köçürülsün. Biləndə ki, kitabonun öz cəddi Ərdəşirdən başlanır, şah çox sevindi, kitabı təriflədi və göz qabağına qoydu. Sonra kitabdan on yeddi rütbə yerini öyrəndi və buna əsaslanaraq şah öz məclisində olan yerləri dəyişdirdi. Sünik hakimi Andoka on dördüncü yer (rütbə) nəsib olduvə o, acıq edib şahın qonaqlığından imtina etdi. Şaha bu barədə xəbər verdilər, lakin o, buna əhəmiyyət vermədi.

Bundan sonra şahın sarayına xəbər çatdı ki, saysız – hesabsız xəzər qoşunları Çola keçidini[87] aşaraq bizim ölkəyə daxil olub.[88] Şapur Asuristan, xorasan və Xarəzmdən çox miqdarlı qoşun, Atropatenanın vilayətlərindən çoxlu cəsur iranlılar, ermənilərdən, gürcülərdən, albanlardan və Qafqaz dağlarından on iki dildə danışan vəhşi qəbilələrdən misilsiz sayda ordular toplayaraq onların (xəzərlərin) üstünə hücum etdi.

Andoka gəlincə o, özünə və ölkəsinə qəsd edrək şahla bütün

əlaqələri qırıb öz ordusu ilə ona xəyanət etdi. 1700 yorğa atlı əsgəri ilə o, tezliklə Mədain şəhərinə çatır və əsgərlərini şəhərin ətrafında gizlədib, kiçik bir dəstəylə şəhərə daxil olur. Öz həqiqi niyyətlərini gizlədərək o, çoxlu suallara cavab verirdi ki, Şapura qoşulmaq üçün gəlib və buna görə də şəhər əhli ona çox böyük ehtiram göstərdi. Ancaq sübh çağında onun əsgərləri qəflətən şəhərə basqın edib, çoxlu qızıl və gümüş xəzinələrini, qiymətli qaş – daş və saysız – hesabsız müxtəlif mirvari və şah sarayından və əyanların evlərindən nəyi bacardılarsa hamısını götürüb getdilər. Bütün bu böyük miqdarlı qənimət onun əmrilə Balaberd (Kiçik şəhər) qalasına daşıdılar. Bundan sonra əmr etdi ki, bütün əyalətərdə mal – qara üçün yığılmış yemi yandırsınlar. İnsan üşün faydalı olan bütün ərzaq sursatını, silahı, təchizatı və yəhər – qayışları onun əmrilə qalanın içinə yığdılar. Sonra da bütün Sünik əhalisinə əmr etdi ki, evlərini və anbarlarını yandırıb ölkədən qaçsınlar

Əyalətlərdən bütün kilsə bəzəklərini yığıb Balaberdin Şalat kilsəsinə gətirdilər, sonra da kilsəni torpaqla örtüb təpə düzəltdilər və özləri hər tərəfə dağılıb getdilər. O gündən etibarən Sünikin adını heç kəs çəkmədi və bu vilayət 25 il ərzində əhalisiz qalıb viran olmuşdu.[89]

Müharibının sonunda qayıdan şah Şapur Mədainin xarabalarını görəndə bərk qəzəblənir və ordusuna əmr edir ki, Sünika hücuma keçsin və əhalisiylə heyvanlarını əsir etsin. Amma ordu Sünika çatanda orada heç bir şey əldə olunmadı. Ölkəni gəzəndə

onlar altında Şalat kilsəsi gizlənmiş təpəyə rast gəldilər. Təpənin üzərinə çıxan zaman şiddətli zəlzələ başlandı və başda sərkərdə Atəşxuda olmaqla bütün İran ordusu tezliklə o yerləri tərk etdi.

Oradan qayıdanda onlar Balaberdə hücum etdilər, amma mühasirədə olan süniklər qala divarlarından iri qaya parçalarını diyirlədərək iranlılardan çoxlu adam tələf etdilər. Iranlilar ikinci və üçüncü dəfə qalaya hücum etdilər. Lakin heç bir şeyə müvəffəq ola bilmədilər, yalnız yenə də döyüşçüləri qırıldı.

Qəzəbə gəlmiş şah əmr etdi ki, hücumu gücləndirsinlər. Lakin şahım əyənları qabağında səcdə edərək yalvardılar ki, artıq qalaya hücuma keçməyə dəyməz və qalanın ətrafında olan yerləri viran etmək daha əlverişlidir.

Sonradan Andox əlverişli fürsətdən istifadə edib qaladan çıxır və çoxlu qənimətlərlə romalıların ölkəsinə gedib. Orada o, böyük hörmətlər qazanır və öz vaxtında vəfat edi

Onun dördüncü oğlu Babik öz vətəni üçün çox darıxdı – necə deyərlər bizim el- obamız bizim üçün ata – ana kimi əzizdir – və o, şah Şapurun sarayına gedir. Orada bir hərbçiyə rast gəlib onun yanında qalır.

Sonra İran şahlığını qarət edən hunlar ölkəsindən olan Honoqur adlı birisi gəlir.[90] O, şah Şapurun yanına adam göndərib dedi: “Bu qırğın kimə lazımdır? Çıx qabağıma üz – üzə gələk!”

Həmin hun boyu yüksək, demək olar ki, çox nəhəng bir adam idi. O, geniş bədəninə əlli qatlı zireh geyir, iri başını mismarlı

dəbilqə, üç qarış enində olan alnını isə misdən qayrılmış löhvə ilə örtür. Nəhəng nizəsinin sapı hündür ağacdan düzəlmişdi, şimşək çaxan qılıncı isə onu görənlərin hamısını dəhşətə gətirirdi

Bu an şahın yadına Babikin adını saldılar və dedilər ki, həmin hunla yalnız Babik döyüşə girməyi bacarar.Şahlar şahı Babiki yanına çağırıb, ona üzərində qaban təsvir olunmuş möhrü ilə damğalanmış buyruğunu verib deyir:" Əgər sən mənim böyük intiqamımı ala bilsən, sənin üçün misli görünməmiş mükaflar var!"

Babik şahın təklifini qəbul edir və Allahın köməyinə arxalanaraq qışqırdı:" Kömək edin, ey Sünikin kilsələri!" və şapaqan atına minərək düşmənə hücum etdi. Onlar bir – birinə atıldılar və nizələrinin gurultulu zərbələrinin səsi səhərdən axşam saat doqquza qədər eşidilirdi. Qorxunc nəhəng məhkum olunmuıdu. Cəsur Babik öz qılıncı ilə qaniçən heyvanın başını vurub, onu cəhəmmənə vasil etdi.

Şapurun sevinci aşıb daşırdı və o, Babiki çağırıb ona verdiyi vədi yerinə yetirmək istədi. İzn alıb, Babik dedi: " Əmr elə ki, bu bürünc həvəngdəstəni sənin sarayından çıxarsınlar.!" Həmin həvəng kül ilə dolu idi və onun yanından küçən hər bir adam dəstəklə vurub deməli idi:" Qoy Sünik torpağı varıyla, dövlətiylə məhv olub bu külə dönsün!"

Təəccüblənən şah əmr etdi ki, həvəngdəstəni saraydan çıxarsınlar.Bundan sonra Babik şahdan xahiş etdi ki, doğma torpağını ona qaytarsın Şah mülkünü ona qaytardı və əlinə onu

ucaldan fərman verib böyük təmtəraqla yola saldı.

Araz çayını keçən kimi Babik bir kəndin bünövrəsini qoyur və onu Nakorz, yəni “Vətənin torpağına qoyduğu birinci addımı” adlandırır.

Bir dəfə Babik, hakimiyyətinin birinci ilndə ova çıxır və öz virana qalmış torpağını gəzib seyr edir. Şalata çatanda o, bir təpəyə qalxır. Həmin vaxt haradansa bir ceyran çıxır və qaçıb torpaqla örtülmüş kilsənin üstündə durur. Babik onun dalınca gedəndə, ceyran təpənin üstündən yox olur. Babik atını zorla düşdüyü dəlikdən çıxarır. Orada olanların hamısı vahiməyə düşdülər və torpağı qazaraq qaş – daşla dolu qəşəng bir kilsə gördülər.

Bu əhvalat hori ayının birində baş vermiş idi. Həmin gün böyük bayrama çevrildi. Buraya çoxlu adam gəlmişdi və orada olanlardan bir çoxu xəstəliılərindən sağalmışdı. Babiki İrandan müşaiyət edən Qor və Qazan adlı iki qardaşlar öz dinlərini atıb xaçpərəst oldular. Babik püşk atdı və Qorun baxtına Hot kəndi, Qazanın baxtına isə Şalat çıxdı.

Bütün bunlar xaçpərəst dinini məhv edib və bizi zərdüşt dininə bağlamaq istəyən kinli II Yezdəgirdin taxta çıxmasından iyimi il qabaq olub.[91] Həmin Yezdəgirdin əli ilə Vardanın məsləkdaşlarından 1066 tanınmış adamlar öldürülmüşdür. Bu hadisədən erməni tarixinin başlanğıcına qədər 20 il keçmişdi.[92]

Bil ki, bu əhvalat belə olmuşdu.[1]

---

[1] 20-ci fəslə bax.

# ON BEŞİNCİ FƏSİL

## Müqəddəs Mesrob və onun yoldaşları haqda qısa məlumat.

Albaniya katolikosu Qriqorisin şəhid olmasından sonra şərq ölkəsinin[93] barbar xalqları yenə də bütpərəstliyə qərq oldular. Onlar bütxanalarında sitayiş etdikdən sonra xaçpərəstləri təqib etməyə baçladılar.

Müqəddəs Ruhun mərhəmətilə üç xalqa, yəni ermənilərə, albanlara və gürcülərə, əlifba düzəldən birinci vardapertlərdən olan şəxs[94] sonralar Qüds şəhərinə ziyarətə gedir. Öz şagirdlərilə, içində İsa xaçının zərrəcəyi olan qızıla tutulmuş gümüş xaçla Qüdsdən qayıdanda Erməniyyəni keçir və Şərq ölkəsinin Uti vilayətinə gəlir.[95] Burada onlar Gis (Kiş) adlanan kəndin yanında mamırlı və bataqlıq yerdə yaşayırdılar. O, xaçpərəstliyi burada yenidən canlandırıb möhkəmləndir və Udin vilayətində, Albaniya, Lipiniya, Kaspiya, Çola keçidinə qədər uzanan torpaqlarda və vaxtilə Makedoniyalı İskəndər[96] əsir edib, buraya, Böyük Qafqaz dağları yaxınlığına köçürdüyü qarqarlar və kamiçik eftalitlər[97] qəbilləri arasında İncili təbliğ edir. Bunları xaçpərəst edib keçmişdə öyrəndikləri və sonradan yaddan çıxardıqları ibadət qaydalarını öyrədirdi. Elə həmin vaxt dağlar ətəyində yaşayan qəbilər arasında sanballə din təbliğatçısına dönüb bunlar

Müqəddəs Kitabla tanış edirdi.

Oradan qayıdıb rəhmsiz knyazların hədəsindən qorxaraq yenə bataqlıqda gizli yaşayır. Allah kilsəsinin nüfuzunu günbəgün artırırdı. Lakin Şeytan qəddar zalımların baş – beynini aparmış və bunlar qeyzlənərək onu öldürməyə tələsdilər. Maştos isə Müqəddəs Ruhdan xəbərdarlıq alıb tələsik quyu qazır, həmin xaçın zərrəciyini kiçik mücrüyə qoyur və mücrünü quyuda gizlədir. Bundan sonra öz sadiq şagirdlərilə Maştos ibadət edir və iki dəstəyə bölünüb bir – birlərindən ayrıldılar. Birinci dəstə vilayətləri gəzib xaçpərəstliyin təbliğiylə məçğul oldu. Basdırılmış zərrəciyin yanında qalanlar isə bir neçə gündən sonra əzablar tacına layiq oldular. Onların əzab aldıqları yerdə əlamətdar hadisələr və möcüzələr aşkar olundu. Bu, dəfələrlə təkrar olunan möcüzələri görən dinsizlər başa düşdülər ki, hadisələr Allah işidir və Ona inanıb elliklə xaçpərəst oldular.

Bu möcüzələri tez –tez görən yeni xaçpərəstlərdən birisi zərrəciyin basdırıldığı yerin üstündə sovməə tikir və taxta qutu düzəldib, onun içinə əzabla öldürülənlərin qaxımış cəsədlərini yığıb onları hər il yad etməyə and içir. Xəstələrin çoxu bu yerdə əlac tapıb dinə inamları daha da artırdı. Onlar xaçın zərrəciyi üstündə Allahın adına bir kilsə tikirlərki, onu indi Kiş kəndinin Köhnə Kİlsəsi deyə adlandırırlar. Sonralar, uzun illər keçəndən sonra Aranşahlar nəslindən olan nəcib knyaz Varaz Firuz[98] əmin Köhnə Kilsəni bərpa etmək istədi, amma kərpicdən tikilmiş

günbəzin üstünü çəkə bilmədi, çünki xaçın zərrəciyi və qaxıçış cəsədi buna mane olurdular.

# ON ALTINCI FƏSİL

## Mesrobun Albaniyanın çarı Arsvagenin[99] yanına gəlməsi, burada əlifbanı təkmil etməsi, məktəbləri yenidən açması, ölkədə qalmış bütpərəst məzhəblərin kökünün kəsilməsi və Albaniyada xaçpərəstliylin möhkəmlənməsi.

O zaman ki, yunanların imperatoru Kiçik Fedosi idi[100], Ermənilərin çarı Vramşapux idi[101], İran şahı Yezdəgird idi[102], Arsvagen isə Albaniyanın çarı, Albaniyaya, bizim patriarxımız Yeremiya və çarımız Yesvagenin yanına həmin Mesrob gəldi. Onların hər ikisi (Arsvagen və Yeremiya) ona maarifçilik fəaliyyətində kömək etməyə razılıq verib, (o, müqəddəs ruhun köməyilə erməni və gürcülərə əlifba yaradıb) və məmuniyyətlə ona şagirdliyə fərasətli gəncləri təhkim etdilər. Onlar Sünikdən (Zəngəzurdan) Bəncamin adlı tərcüməçini dəvət etdilər və onu Sünikin gənc knyazı Vasaq[103] yepiskop Ananiyanın xahisi ilə Albaniyaya göndərdi. Onlar Mesrobun yanına gəlib, onunla birlikdə qırtlaq, qaba, barbar və çətin səslənən qarqar dilinin əlifbasını yaratdılar. Bundan sonra Maştos burada öz şagirdi Yovnatanı dini qəyyum vəzifəsində qoyub və çar sarayına keşişlər təyin edib, Erməniyyəyə qayıdır. Oradan o, Bizansa, imperator Fedosinin yanına gedir. Qayıdıb öz şagirdlərilə səyahətə çıxır. Sonra xəbər

alır ki, Girdimanda hələ bütpərəstlərdən qalan var. Sünikdən keçərək Girdiman knyazı Xursun yanına gəlir. Onun köməyilə Maştos bütpərəstlərin müstəqim yola döndərir və sonra Gürcüstan (İberiya) valisi Aşuşanın çağırışı ilə (Loriyə) gəlib orada da eyni işlə məşğul olur.[104]

Elə həmin vaxt lənətə gəlmiş Nestor zahir olur və Efes şəhərində iki yüz yepiskop tərəfindən nifrin edilir.[105]

İran şahı II Yezdəgirdin şahlığının birinci ilində[106], navasard ayının axırında müqəddəs Sahaq vəfat etdi[107], altı aydan da sonra Vaqarşapat şəhərində müqəddəs Maştos vəfat edir.[108]

Girdımanın Xosrov adlı bir nahararı Ermәniyyəyə gəlir və qorxaq erməni çarı Şapurun sarayına girməyə imkan tapır.[109] Çarın qonaqlığından sərxoş olub o, bir qadına ehtirasla sataşır və qəzəbə gəlmiş Şapur onun zindana salınmasını əmr edir. Lakin Xosrov əlini qılıncının dəstəsinə qoyub təmkinlə sarayı tərk etdi və heç kəs ona tərəf əlini uzatmadı.

# ON YEDDİNCİ FƏSİL

## Maştosun şagirdləri haqqında hekayə.

Maştosun ölümündən bir az sonra onun Albaniya vilayətlərində olan şagirdləri bir yerə yığışaraq xeyirxah işlər haqda öz istəklərini bir – birinə bildirdilər. “ Bizi maarifləndirən İsa peyğəmbərin yanında əbədi rahatlıq tapandan sonra biz nə etməliyik? Ondan sonra biz yetim qalmışıq. Gəlin, qardaşlar, yola düşək müqəddəs Qüds şəhərinə və orada özümüzə rəhbər diləyək. Axı bizim Şərq ölkəmizin həqiqi maarifi müqəddəs Yeliseyin vasitəsilə Qüdsdə başlanıb.” Onlar hazırlıqlarını və tədarüklərini görüb üç dəstəyə böldülər. Albaniyanı tərk edərək onlar Suriyanın hüdudlarına çatdılar və yollarına davam edərək bir – birinin ardınca Qüdsə çatdılar.

Allah evinə daxil olaraq onlar uzun müddət həyat Ağacına səcdə etdilər. Burada Qüdsün baş keşişinə rast gələrək çox sevindilər. Kilsə keşişlərilə də görüşüb qucaqlaşdılar və keşişlər onlara hörmət göstərdilər. Baş keşiş Maştosun bütün səyləri və işləri haqda və barbar qəbilələri xaçpərəstliyə döndərən zaman olan möcüzələrdən danışdılar. Bütün bunları eşidəndən sonra Qüds keşişləri onları neçə gün daha böyük sevinclə qəbul etdilər. Onlar Qüdsdə üç dindar keşişlə yaxınlıq etdilər. Bunların başçısı Afanasi idi. Ondan xahiş etdilər ki, üçü də qərib olduqları üçün onlara Qüdsdə bələdçi olsun.

Bütün səcdə vədlərini yerinə yetirdikdən sonra onlar böyük sevinclə baş keşişin ayaqlarından öpdülər və o, əmr etdi ki, onları yola salsınlar. Onlara qızıl və gümüşdən qayrılmış kilsə əşyalarından və Allahın bütün müqəddəslərinin qaxımış cəsədlərinin hissəciklərindən veriləndən sonra, onlar həmin üç keşişin müşayətilə yola düşdülər. Pasxa bayramının yeddinci həftəsində müqəddəs qırx günlük pəhrizdə Arsax vilayəyinin meşələri qalın və dərələri dərin Böyük Qouyan dairəsinə gəldilər. Yol ayrıcında onlar iki dəstəyə bölündülər. Dəstənin birisi şimal tərəfdən Ulduzlu təpə deyilən yerdə qaldı, ikincisi isə cənub tərəfə gedən Tərtərçayı keçib Çala adlı meşəli dərədə dayanıb burada Pasxa bayramımı keçirdilər.

# ON SƏKKİZİNCİ FƏSİL

## Şimal tayfaların Albaniya, Ermənniyyə və İveriyaya basqını və Mesrob şagirdlərinin əzabları

Həmin bu vaxt öz ordularını toplayan " rosmosok"ların çarı, Tubal və hunların bütün qoşunlarını çağıraraq[110] Kürün bu sahilinə keçib Uti vilayətinə daxil olur və Xalxal şəhərinin ətrafında düşərgə salır. Burada o, üç sərkərdə seçərək onları böyük qoşunlara başçı təyin edir. Özünün bütün bir ordusunu[111] onlara tabe edib əmr edir ki, üç dəstəyə bölünüb. Almaniya, Erməniyyə və İveriyaya hücum edib oraları talan etsinlər. Üçüncü dəstə Pasxa bayramının əvvəlində

Arsax vilayətinə basqın edib Böyük Qouyanı qarət etməyə başladı.

Basqın haqda xəbər Qüdsdən gələnləri  və Çalada qalanları böyük təlaşa saldı. Müqəddəs cəsədləri bir yerə yığıb, onları iki gümüş sandıqçaya qoyub torpağa basdırdılar. Elə bu vaxt bunların üzərinə insan fəryadı ilə qarışıq və ümidsizliklə  yanaşı məhvedici iblislər yığını töküldü. Həmin yığın dəniz dalğaları kimi tezliklə Ulduzlu təpəyə yetişdi və burada olanların hamısı qılıncdan keçirildi. Qızıl və gümüş kilsə qabları talan olundu, müqəddəslərin qaxımış cəsədləri isə təpə üzərinə dağılıb səpələnmişdi. Sağ qalanları işğalçılar əsir edib elə orada dustaqxanaya saldılar.

Əsirlərin arasında Uti vilayətinin Bağlı kəndindən olan Taquhi adında varlı və adlı – sanlı qadın var idi. Həmin qadın Qüdsdən gələn küşişlərlə tez-tez görüşürdü. Bu qadını əsir düşmüşlərin arasında görən hun sərkərdəsi buna mübtəla olur.Bu qadın o qədər gözəl idi! Qadını özünə arvad etmək istəyən sərkərdə əmr etdi ki, ona hörmətlə yanaşsınlar.

Hun döyüşçüləri həmin gün bütün vilayətdə qarət etdikləri qəniməti və tutduğu əsirlərin həmin Ulduzlu təpəyə gətirdilər. Əsirlərin çoxunu öldürdülər.

Həmin gecə böyük hun sərkərdəsi öz qoşunu ilə Ulduzlu təpənin ətrafında  düşərgə saldı. Ertəsi gün, axşamüstü Tubal qoşununun sərkərdəsi öz ehtirasının  atəşini söndürmək üçün əmr etdi ki, Taquhini gətirsinlər.Lakin İlahi qüvvəsiylə silahlanan qadın onu rədd etdi, ona razılıq vermədi, ona təhqiramiz sözlər dedi və

hətta onu ələ salırdı. O deyirdi:” Allah göstərməsin ki, mən öz toxulmamış bakirəliyimi it oğluna və murdar bütpərəstə verim! İşgəncələrdən qorxub əbədiyyəti bu fani həyatla əvəz etmək olarmı? ” və əllərini göyə qaldıraraq qadın ucadan dedi: “Ya ilahilərin Allahı, ya Padşahlar Padşahı! Sənə bel bağlayan bəndəni rüsvay etmə. Məni bu təhlükədə bakirə və təmiz saxla! Necə ki, Sən məni Səni tanımaq üçün işıq çələngindən dünyaya gətirdin, eləcə də bugünkü  eyibdən məni xilas et və bu rəhmsiz barbarları elə vəziyyətə sal ki, sənin həqiqətinin işığı onların ürəklərinə daxil olsun və Səni də yeganə Allah kimi tanısınlar!”

Bu sözləri eşidən hunlar birbaşa sərkərdələrinin yanına gedərək ona bu əhvalatı danışdılar. Onların arasında bir tərcüməçi də var idi.

Artıq dərəcədə  qəzəblənən və vəhşi heyvan kimi nərildəyən zalım əmr etdi:” Əgər o könüllü  və hörmətlə gəlməsə onu əzab, işgəncə ilə vurun, öldürün!”

Qadının yanına gələn nökərlər onu sərkərdənin arzusuna tabe olmağa məcbur etmək istədilər. Lakin bunu bacarmayan nökərlər baş əyməyən Taquhinin əl – qolunu bağlayıb, saçlarından tutaraq sürükləyir, üz – gözünü tikanlarla parçalayır, bədənini doğrayır  və ən sonunda başını bədənindən ayırdılar. Beləliklə, Taquhi İsanınilahi və heç vaxt solmayan şəhidlər çələnginə layiq oldu.

Elə həmin gecə, həmin tayfanın sərkərdəsi öz döyüşçülərilə birlikdə kefini çəkən vaxtda  Allah tərəfindən fövqəladə möcüzə

zahir olundu. Bütün orada olanlar Taquhinin əzabla öldüyü yerdən güclü işıq gəldiyini və onun yırtılmış libasının hər yanda atılmış parçalarının ulduz kimi işıq saçdığınğ gördülər. Həmin ulduz işığış bütün orada şəhid olanlardan da gəlirdi. Bunu görənlər bu yerə Ulduzlu təpə adını qoydular və bu təpə indi də bu adla məşhurdur. Buna görə sərkərdə həddindən artıq təəccüb etdi və təşvişə düşdü. Əmr etdi ki, yanına keşiş gətirsinlər və onlardan xilas yolunu öyrənərək canlı Allaha (İsaya) inandı. Əmr etdi ki, bütün müqəddəslərin qaxımış cəsədlərini yığıb təmiz kətan parçasına büküb təpədə basdırsınlar. Burada onlar qoyun və keçilərdən qurban kəsib şəhidləri yada saldılar.

# ON DOQQUZUNCU FƏSİL

## Tubal qoşunlarının sərkərdəsi İsaya iman gətirir; onun qoşunlarının, oğullarının və keşişlərin Albaniya ölkəsində öz çarlarının əlləriylə şəhid olunmaları

Mömin knyaz Teofilin[112] qəlbinə həqiqət işığı daqxil olandan sonra o, əsirlərin azad olunması haqqında əmr verir, özü isə Pasxa bayramının ertəsi günündə öz keşişləri, xaçpərəstliyi qəbul edənlərin çoxu, müqəddəs bayraqları altına keçən ordusu ilə Uti vilayətinə gedir. Burada Kür çayının üzərind. Salınmış müvəqqəti körpünün[113] yanında ordugahını qurur.

Elə bu vaxt Rosmosokların böyük çarı əsirlər yığını və böyük

qənimətlə qarətdən qayıdan ordusu ilə şərq tərəfdən Kürü keçərək Teofilin ordugahı ilə üzbəüz öz düşərgəsini salır. Öz bayramlarında olduğu kimi, bu səfər də o, öz ilahilərinə qurban kəsməyi əmr etdi. Buna görən Teofil və döyüşçüləri xaçpərəst dininin qaydalarına görə qurbanı Allah adına kəsib öz bayraqlarını xaçlarla bəzədilər.

Bütün bunlarla əhvalı pozulmuş, ədəbsiz, qanunpozan ifritlərlə hirsləndirilmiş barbarlar çarı əmr etdi ki, müqəddəs sərkərdə Teofili və otuz başqa döyüçünü onun yanına gətirsinlər. Əvvəlcə çar onunla mülayim, sonra da sərt danışıb dedi:"Sən çaldığın qələbələr və şücaətinə görə bizim məmləkətdə nə istəkli adam idin. Biz sənə çoxlu mükafatlar verib başqa sərkərdələrə üstün qoyduq və ordumuzun üçdə birinin başçısı təyin etdik. Bəs nə üçün öz xalqının döyüşlərdə bizə qələbə gətirən ilahələrini atırsan? Nə üçün sən öz döyüşçülərinlə mənim əleyhimə üsyan edib iman gətirmədiyimiz Allaha sitayiş edirsən? Buna görə də, əgər sən bizim ilahələrə qurban verməsən, həm özün, həm də sənin döyüşçülərin edam ediləcəksiniz".

İsaya inam bağlayan cəsur sərkərdə Teofil çara belə cavab verdi:" İnsan halının dərk edilməsi səxavətin mənbəyidir, səxavət isə gözəl işlərlə birlikdə möminliyin anasıdır. Və, əgər şan – şöhrətin artması naminə İsanın miladı bizim varlığımızla sıx – sıx birləşdirilibsə və biz nurun sayəsində Allahı göylərin və yerin yaradanı kimi və bizi iyrənc bütlərə sitayişdən azad etmək istəyən vahid müqəddəs Üç Uqnumu dərk etmişiksə, necə ola bilər ki, sən

bu ilahi bərəkəti bizdən ala biləsən? Yoxsa sən öz müvəqqəti şöhrətini Allahın şan – şöhrətilə müqayisə etmək istəyirsən? Bəlkə sən bizi hədələyib qorxutmaq istəyirsən ki, biz Allahı atıb bu fani həyatı keçirərək lal bütlərə sitayiş edək?"

Bu sözləri eşidən hunlar çarı qeyzə gələrək böyük qəzəblə əmr etdi ki, sərkərdə Teofili və onun otuz silahdaşı və iki keşişini ən əzablı ölümlə cəzalandırsınlar. Onlar bu şıhidlik meydanındakı döyüşü mərdliklə keçirdilər və qaliblər tacını İsanın əlindən aldılar. Beləliklə də, müqəddəs Teofil öz otuz silahdaşı və keşişləri ilə göylərdəki iqamətgahlarına köçdülər.

Bunu görən kimi müqəddəs sərkərdə - Teofilin Moisey və Aneroloqes adlı oğulları, ordusunun döyüşçüləri və başqa xaçpərəstlər atlarına minib qanunpozan çarın əlindən qaçaraq hesab etdilər ki, İsa xatirinə təhqiri atalarının ölçülməz sərvətlərindən daha üstün tutdular.Onlar cənub tərəfə qaçaraq böyük bir dağın zirvəsinə çatdılar. Bu dağlar ölkənin demək olar ki, vilayətlərinin çoxunu əhatə edirdi.

Bu vaxt rəhmsiz çarın əmrilə hun qoşunlarından dəstələr ayrılıb qaçanların dalınca göndərildi. Onlar qaçanlara dağın ətrafında çataraq yalvardılar ki, yenə də bütpərəstliyə qayıdıb çara tabe olsunlar. Lakin qaçanlar inamlarını dəyişmədilər və onların hamısını həmin yerdə doğram – doğram etdilər. Müqəddəs Moisey, qardaşı və xaçpərəstliyi qəbul edən alaylar öz dünyəvi həyatlarını belə başa çatdırdılar. Onlar hamısı İsadan şəhidlik tacını alaraq

şimaldan sönməz nurla paylanıb bütün müqəddəslərlə bərabər əbədi həyatla qovuşdular.

# İYİRMİNCİ FƏSİL

## Albanlar Qanunpozan II Yezdəgird tərəfindən necə təhdid olunur və bundan erməni sərkərdəsi Vardanın köməyilə necə xilas olundular

Günahkar Yezdəgirdin şahlığı dövründə Şeytan onu xristian dinini məhv etməyə təhrik edirdi. Albaniya ondan xristian dinini rədd edib məcus atəşpərəstlərə tabe olmaq haqda ciddi əmr almışdı. Lakin Albaniyanın baş sərkərdəsi[114] və ölkəmizin kilsəsi bu əmrin əleyhinə çıxdılar və ermənilərlə birləşmək niyyətilə tezliklə yaxınlaşmaqda olan şər barəsində xəbər vermək üçün öz ordularını göndərdilər. Onlar belə dedilər: "Hunlar ölkəsində olan İran qoşunları qayıdır və artıq şahın saray atlıları ilə bizim ölkəyə soxulublar. Bundan başqa onlar özlərilə üş yüz din xadimi gətiriblər. Bəzi şəxsləri öz tərəflərinə çəkib, ölkəni bölərək çaxnaşma saldılar və indi əllərini kilsələrə də uzadırlar."[115] Öz şahlarının əmri ilə onlar hamını məcbur edərək deyirlər:"Əgər siz könüllü olaraq dini qəbul edərsizsə, şahımızdan mükafat və mənsəblər alaraq bütün vergilərdən azad olarsınız. Yox, əgər bunu könüllü etməsəniz, biz əmr edərik ki, bütün kənd və obalarda bütxana tiksinlər, içərisində Bəhram atəşini yandırsınlar və dinimizin təbliği üçün kahinlərlə məbədləri təyin etsinlər. Kim buna qarşı müqavimət göstərərsə ölümə məhkum ediləcək, arvad –

uşaqları isə sürgün olunacaqdır".

Bunu eşidən ermənilər heç ruhdan düşmədilər, əksinə, bu bəd xəbər onları daha da birləşdirdi. Onlar alban elçilərinə ürək – dirək verib evlərinə yola salanda dedilər ki, iranlılara qarşı hiylə işlədib vəziyyətdən çıxış tapana qədər onlara kilsəyə əl uzatmağa macal verməsinlər.

Bundan sonra erməni sərkərdələri böyük təhlükənin qarşısını almaq üçün imperator Feodosidən[116] öz sələfinin vədinə sadiq olmadı, çünki o, öz xasiyyəti etibariylə bütpərəstlərlə həmfikir idi.Heç yerdən kömək tapmayan ermənilər öz inamlarını Allahın qadir qüvvəsinə bağlayaraq qoşunlarını üç hissəyə böldülər. Birinci ordunu onlar Nerşapuh Rmboseana həvalə edib, ona Atropatena ilə sərhədin mühafizəsini tapşırdılar. İkinci ordunu ermənilərin sərkərdəsi Vardana[117] tapşırdılar ki, o, gürcü sərhəddini aşıb, Albaniya kilsələrini dağıtmağa gələn Çoladakı İran mərzbanı Mehrsebuxta hücum etsin.

Vardenik adıbatmış satqın Vasakın[118] xəyanətindən xəbərsiz idi. O, Albaniyaya erməni ordusundan qabaq gəlib İran mərzbanına xəbər verdi ki, erməni qoşunu bölünüb və Vardanın özü kiçik bir ordu ilə mərzban olan tərəfə gəlir. Vasakın məsləhəti belə idi:onları qarşəlamağa hazır ol ki, onlar tamamilə darmadağın olsunlar".

Mehrsebuxt bu xəbəri Vasakdan alan kimi[119] Çoğa ətrafında qalmadı və çoxsaylı qoşunlarını nizama salaraq tələsik böyük Kür çayını keçərək Vardanı İberiya sərhəddində, alban çarlarının qış

iqamətgahı olan Xalxal şəhərilə[120] üzbəüzdə qarşıladı. Döyüşə hazırlaşarkən o, geniş düzənliyi mühasirəyə alıb erməni ordusu ilə savaşa hazır oldu.

Cəsur Vardan və onun döyüşçüləri bütpərəs qoşunlarının sayını və öz ordularının azlıöını görəndə, düşmənin böyük üstünlüyündən heç də ruhdan düşmıdilər. Bir yerə yığışıb səmalara üz döndərib səslədilər:" İlahi! Mənimlə çəkişənlərlə çəkişməyə giriş. Yıx mənimlə mübarizə edəni! Qalxanla qılıncı götürüb qalx mənim köməyimə; Siyir qılıncını və məni təqib edənlərin yoluna sədd çək!"[1]

Ermənilərin dualarını bitirib sıralarını möhkəmlədərək hücuma keçdilər, düşmənin sağ cinahını dağıdaraq sol cinahın üstünə atıldılar. Onlar qılınclarını işə salıb, düşməni düzənlikdən qovub Lübnas çayının dərəsindəki meşəliklərə qaçmağa məcbur etdilər. Həmin meşəlikdən hücumda olan ermənilərin qarşısına Balaskan[121] çarının oğulları çıxdılar. Balaskanlılar burada Dimaksean nəslindən olan Muş adlı nahararı atından salıb öldürdülər. Qazrik adlı birisi isə yaralandı. Bunu görən Arşavir Arşaruni göylərə baxıb şir kimi nərildədi və sonra vəhşi donuz kimi hücuma keçib Lbinlər çarının Vurk adlı qardaşını və elə həmin yerdə onun çoxlu döyüşçüsünü öldürdü. Beləliklə, hər döyüşçü özünə bərabər olan düşmənini öldürdü. Bu hücumelə cəsarətli idi ki. Düşmənlərin çoxu qılıncdan yox, suda boğulub ölmüşdü. Öldürülənlərin sayı o qədər çox idi ki,

---

[1] Zəbur. XXXIV, 1-3.

çayın təmiz suyu qan rənginə boyanmışdı və düşmənlərin heç biri xilas ola bilmədi. Onlardan yalnız biri düzənlikdəki qalın meşədə gizlənmişdi. O, silahını atmayıb yorğa bir atın üstündə çayı keçərək və ölümdən yaxasını qurtararaq öz adamlarına ordularının həlakolması haqqında kədərli xəbəri çatdırdı. Bunu eşidən iranlılar qaçıb öz paytaxtlarında gizləndilər.

Bu böyük döyüşü bitirdikdən sonra ermənilər çoxlu qənimətlər əldə edib, qızıla, gümüşə, silaha, döyüş sursatına və minik atlarına malik oldular. Bundan sonra ermənilər iranlıların güclə aldıqları hun Darvazasına ( Dərbəndə) hücum etdilər. Qalanı alıb orada qalan döyüşçüləri məhv etdilər və Dərbəndin mühafizəsini Alban çarları nəslindən olan Vardana tapşırdılar. Bütün bu döyüşlərdə şəhid olanlardan başqa heç kəs həlak olmayıb. Bundan sonra onlar Dərbəndi qoruyan həmin Vardanı hunlar ölkəsinə səfir göndərirlər və ona hunlarla danışıq aparmaq və sarsılmaz ittifaq müqaviləsi bağlamaq haqda tapşırıq verildi. Bütün baş verən hadisələr barəsində xəbərləri eşidən hunlar hər şeyi öz gözlərilə görmək üçün oraya nümayəndə göndördilər və görından sonra səmalardam endirilmiş qanunlara əsaəan and içdilər, xaçpərəstlərin möhkəm ittifaq haqda andlarını qəbul etdilər. Beləliklə də bütün arzularına nail oldular.

Onlar hələ Dərbənddə ikən Erməniyyədən bütün ölkəni talayan xain Basak barəsində bəd xəbəri gətirən elçi gəldi. Bundan sonra Vardan böyük qənimətlə yola düşdü və otuz gündən sonra

Erməniyyəyə çatdı. Cəsur Vardanın təmtəraqlı qayıtması, onun hunlar və albanlarla ittifaq bağlaması xəbərini almış Basak onunla qaqrşılaşmaqdan qorxaraq qaçdı və onun bədxasiyyətliyi üzündən Allahın ona heç rəhmi də gəlmədi.

Bütün bu albanlar və ermənilər arasında Allahın köməyilə baş verən hadisələr şah Yezdəgirdin hakimiyyəti dövründə olmuşdur.

# İYİRMİ BİRİNCİ FƏSİL

## Albaniya çarı Vaçe barəsində bütpərəstlərin eyiblərini rədd edib, o, canlı Allaha necə inanır; İrana qarşı necə döyüşür, sonra da rahib olub müqəddəs həyatını sovməədə necə keçirirdi

Hökmranlığının on doqquzuncu ilində II Yezdəgird öldü. Onun iki oğlu[122] bir- birinə düşmən olub ali hakimiyyət uğrunda mübarizə aparırdılar. Onlar ədavətdə olduğu zaman Albaniya çarı II Vaçe[123] üsyan qaldırdı.[124] II Vaçe II Yezdəgirdin bacısı oğlu idi. Atası kimi II Vaçe Milli ənənəyə görə xristian idi, lakin qanunpozan II Yezdəgird ona zorla məcus dinini qəbul etdirdi. İndi isə, məqamdan istifadə edərək II Vaçe qərara gəldi ki, dönük sifətilə çar olmaqdansa döyüşdə ölmək daha yaxşıdır.

Qardaşlar və ari orduları arasında daxili müharibə uzandığı üçün Yezdəgirdin kiçik oğlunun mürəbbisi Mihr nəslindən olan Rahat şahın böyük oğlunun ordusunu darmadağın edib şahzadəni əsir alır və elə oradaca öldürür. Öldürülən şahzadənin sağ qalan döyüşçülərini onun tərəfinə keçməyə məcbur edir və öz yetişdirməsi olan Firuzu şah elan edir.

Lakin Albaniya çarı ona asılı olmaqdan imtina edir və Dərbənd keçidin aşıb (Dağıstan) maskutları dəvət edir. II Vaçe on bir dağlı çarları ilə ittifaq bağlayaraq İran qoşunlarına hücum edir və onları böyük təlafata uğradır.

Firuz şah ona (Vaçeyə) iki- üç dəfə müraciət edərək tabe olmağa çağırdı, lakin onun boynunu əyə bilmədi. Vaçe onu öz məktublarında ermənilərin torpaqlarını viran etməsinə, əyanlarının öldürülməsinə və əsirlərinin incitməsinə görə məzəmmət edib deyirdi:"sən onların həyatını yaxşılaşdırmaq və vəziyyətlərini firavan etmək əvəzinə daha da qısaltdın. Mənim üçün isə işgəncəli ölüm dönüklükdən daha yaxşıdır".

Biləndə ki, Vaçeni nə güclə, nə də ki inandırma yolu ilə öz tərəflərinə çəkə bilməyəcəklər, iranlılar Haylantürk ölkəsinə[125] çoxlu bəxşişlər göndərib, Alan Darvazasını[126] açıb hunların böyük ordusunu dəvət etdilər və bu ordu Alban çarı ilə bit il müharibə etdi. Vaçenin ordusu zəiflədi, gücdən düşdü və dağıldı da, lakin iranlılar onun öhdəsindən gələ bilmədilər. Əksinə, Vaçe də öz tərəfindən onlara təsirli zərbələr endirdi və bundan başqa İran qoşunlarının

özləri də döyüşlərdə üzülüb haldan düşürlər və cürbəcür xəstəliklərdən qırılmışdılar.

Müharibə uzandı,ölkənin böyük hissəsi dağıldı, amma Vaçeni heç kəs tərk etmədi. Bundan sonra Firuz şah Vaçeyə məktub yazaraq demişdi:" Sənin yanında qalan bacımı və bacım qızını məcus olduqları üçün göndər yanıma, çünki siz onları xristian etməyə çalışırsınız. Ölkən isə qoy sənə qalsın!"Müqəddəs çar Vaçe öz mülkü naminə yox, öz dini uğrunda döyüşürdü. O, anasını və arvadını İrana göndərir, sonra öz ölkəsinin idarəsindən əl çəkir və əlinə hicili alaraq xəlvətə çəkilməyə hazırlaşdı.

Firuz şah bunu eşidəndə çox pərişan oldu və bütün təsiri öz atasının üstünə yıxdı. Andını şəxsi möhür ilə möhürləyib Vaçeyə göndərdi və dedi:" Mən, nə desən etməyə hazıram, ancaq rica edirəm, ölkəni tərk etmə!" Lakin Vaçe yalnız öz şəxsi mülkünü – atasından aldığı min kəndli ailəsini ( evini) götürməyə razı oldu. Vaçe şahdan həmin payını alaraq ömrünü zahidlərlə bir yerdə keçirdi. Allah yolunda belə dərdsiz, qəmsiz həyat sürür və haçansa çar olduğunu heç yadına salmırdı.

Vaçenin hekayəti belədir.

# İYİRMİ İKİNCİ FƏSİL

## Yepiskop Givtin[127] Müqəddəs Vaçeyə ilahi məziyyətlərlə dolu məktubu

Salamlar! O vaxtdan ki, sənin yaxşılığa olan pak məhəbbətin təbliği qəlbimin gizli istəyi oldu, xəyallarım aşıb- daşdı və səmaların qüdrəti gücünə öz fikirlərimi sözlər vasitəsilə izah etməyə imkan əldə etdim. Məni ulu və dəhşətli vahimə basdı və bu vahimə ən yüksək səmalardan uca və yerin təkindən ən dərin idi. Bu vahimə məni yuxarıdan və aşağıdan, qabaqdan və arxadan, sağdan və soldan mühasirəyə saldı. Bundan nə qaça bilirəm, nə də dərinə getməyə qorxuram: havari Pyotr kimi dünyanın girdabına qərq olum. Lakin əgər həzrəti İsa köməyimə gələrək imdada əlini uzatsa[1], bu məni ruhlandırar və mən də dərk edilməyəni dərk edə bilərəm. Axı məndə elə mənəvi cöhvərlər var ki, bunlar mələkləri də təəccübləndirir və yazılı qaydaları olmadan özləri qanuna dönüb heç bir qanuna tabe olmadan Allahı yüksək səmalarda və Onun qanunlarına görə bütün ötəri şeyləri dərk edir və peyğəmbərin və ya səma mələyinin gösrərişi olmadan özləri Allahı görməyə qabildirlər.

Budur, qorxduğum məsələyə mən məhəbbətlə yaxınlaşıram, demək olar ki, ümidlə yanaşıram, heç şeydən qorxmayaraq inamla silahlanıb sözümü o yerdən ki başlanğıc görünür başlayıram: bilindiyi kimi İsa peyğəmbərin məhəbbəti ən əvvəl sənin cəddin Urnayrın zatına daxil olmuşdu və sonra da ilahiyyat şövqü onu erməni çarı Trdatın yanına gətirdi. Urnayr müqəddəs Qriqorinin

[1] İncil. Matfeydən. XIV, 30-31.

erməni torpağında göstərdiyi böyük möcüzə və əlamətdar şeylər haqda eşitməmişdi və bilməmişdi ki, ermənilər çoxlu yanlış cığırlardan həqiqi Allahın yoluna necə gəlib çıxmışlar. Allahı dərk etməklə və Onun mərhəməti sayəsində ermənilər bütpərəstliyin ağır boyunduruğunu, atıb, qanadlarını çırpıb qalxdılar, parıldadılar və səmaya yüksəldilər.

Bütün bunları eşidən Urnayr daha tərəddüd etmədi və heç bir elçi göndərmədən özü, əyanları, nahararları və saysız- hesabsız qoşunları ilə yola düşüb gəldi Trdatın sarayına. Trdat onu qardaş kimi məhəbbətlə və dostcasına qəbul edib müqəddəs Qriqorun və bütün erməni əyanlarının yanında öz niyyətləri haqda danışdı. Çarımız Urnayr Qriqorinin qabağında səcdə etdi, ayaqlarını qucaqlayıb əlindən öpdü və onlara bütpərəstlik səhvlərindən danışaraq keçmiş günahlarının bağışlanmasını xahiş etdi. Müqəddəs Qriqor onu Allah Oğlunun gəlməsiylə ruhlandırıb dedi ki, o mühakimə üçün yox, bağışlamağa, öldürmək üçün yox, xilas etməyə və yer üzündən gedənlərə axirəti vəd etməyə gələcəkdir.

Bunları eşidib çarınız Urnayr özü və bütün yanında olan ordusu qırx gün pəhriz saxlayıb bütün keçmişdəki günahlarından və bəd əməllərindən üz döndərib tövbə etdilər. Şeytanın və onun bütün əməllərindən öz döndərib Müqəddəs Üç Uqnuma iman gətirmələrinin əllinci günündə Urnayr və onun adamları müqəddəs suya girdilər. Sudan da sinələri Müqüəddəs Ruhla dolmuş çıxdılar. Bu münasibətlə albanlara Trdatla Konstantinopoldan gələn keşişi

qoşdular və Urnayr aldığı hədiyyələrlə vətəninə - Albanlar ölkəsinə qayıtdı. Burada o, havarilərin qanunları əsasında əhaliyə dərs verir və xaçpərəstliyə daxil edirdi. Camaat hamılıqla lazım olan mərasimdən keçirildi və adları həyat Kitabına yazıldı. Ölkədə olan iblislər qovuldu, qurbanlar və hədiyyələr yandırılması adəti ləğv olundu, günahlar lənətləndi, həqiqət yüksəldi, gözə görünməyən Nur hökm sürdü, zülmət isə aradan götürüldü. Kilsənin payları və barları müəyyən olundu: xırman və şirəxanalarda, tarla və ərzaq anbarlarından və bütün ev heyvanlarından – onda bir hissəsi, Kilsənin payına torpaqda düşdü və sizin sələfləriniz, sənin dədə - babaların vaxtında hər yerdə nizam – intizam bərqərar olundu və bu nizam sənin əcaib hakimlik dövrünə qədər davam edir

Hələ birinci insan Adəmin vaxtında qoca olan iblis sənin ataların inamından doğulmuş gözəl təbiətinin intibahını birinci görmüş və buna görə də kinli düşmənin canına vəlvələ düşdü və o, şübhələndi ki, bəlkə Albaniyaya xilasedici həqiqət gəldiyi kimi həqiqət başqa Şərq ölkələrinə də daxil ola bilər. Və İblis pak Əyyubun vaxtlnda ümidsiz qaldığı kimi[1] indi daha çox tələsir, daha dərin ümidsizliyə qərq olmuşdu. İblis bütün zülmət qüvvələrini toplayıb onlara onu üzən bəd niyyəti haqda söhbət etdi. Hamı qorxuya düşdü və sarsındı və birləşərək çıxış yolu axtardılar . Onlar dedilər:” Üzmə özünü, ey qəhrəman!Bizim azmağımız onun həqiqətindən daha qədimdir. Zəif heyvanın köməyi ilə sən birinci

[1] İncil. Əyyubun kitabı, I fəsil.

İnsana qalib gəldin. Münkündürmü ki, indi sən onun cocuqlarına böyük çarın vasitəsilə qalib gəlməyəsən?”

Bunu deyib onlar sənin üstünə sahili olmayan dəryanın sularını qaldırdılar:çox şiddətli küləklər əsdi, dəniz dalğalandı və ləpələr göyə qalxdı. Dəniz köpdü, suları qalxdı, aşdı və çöllərlə dağları murdar etdi. Elə həmin vaxt sənin üzərinə vəhşi heyvanlar, müxtəlif rəmzlər, səsli alətlər, şeypurlar, ağac kimi uzun nizələr, şimşək kimi parıldayan qılınclar, qızılı qalxanlar və sərt mizraqlarla müşayiət edilən çox saylı bütpərəst qəbilələr basqın etdilər. Gör bu dünyəvilər siz mənəviləri necə qorxudur, sürüməyə məhkum olanlar siz əbədilərə necə ölüm istəyir və dinsizlər sənin kimi gözəl dini qələmi necə də kəsmək niyyətində idilər. İki, yox üç dəfə onlar məğlub oldular, lakin heç də utanmadılar.

Amma O ki, səmalarda cülus edib bütün dünyaya nəzər salır. O ki, bütün bunları görüb gözəl qanunlara tabe olanlarla, bu nümunəni yalnız sənin sifətində görüb icazə verdi ki, sobada yanan alovun hərarəti səni əhatə etsin. Sənin düşmənlərin tikan kimi od tutub yandılar. Sənsə qızmar sobada olan oğlan kimi[128] atəşin gücünü yatırtdın, qığılcımlarlın hərarətini qızıl günün sərinliyində və tüstünün qaralığını zanbağın bəyazlığına çevirirdi.Sən odun məhvedici təbiətini yaradıcı qüvvəyə çevirdin və köməyinə səmalardan Müqəddəs Ruhu çağırdın. Onların müdrik adamları səfehləşdi, cəsurları qorxaq oldu, hədələri kəsildi, qəhrəmanları gizləndi, qüvvələri isə tükəndi

Bəxtiyarsan və sənin yanında olanlar da bəxtiyardı.Sən kiçik bir rəqəmdir, indi isə saysız - hesabsız görünməzsən. Sənin nizən İsanın nizəsidir, sənin Allah əsgərinin silahıdır. Sənin surunun səsi qiyamət günündə səmalrdan zühur edn Allahın məlaikəsi Cəbrail surunun səsi kimidir. Bu səs ərzi titrədər, qayaları titrədər, qəbirləri dağıdar, ölüləri dirildər, qocaları gənc edər və hökm çıxarıb bəzilərini sola, o birilərini isə sağa göndərər. Bütün bunlar isə vahid allaha layiqdir.

Sənə isə, vəfalı və sevgili quluna və Səltənətinin varisinə Allah qabaqcadan, Qiyamət günündə olduğu kimi səma töhfəsini bəxş edəcək. Kim ki, kinilə fəxr edirdi- təşvişə düşdü, yalnış fikirlərində məğrur olan səfehləşdi. Sənin silahdaşlarının hər şeyini iki xüsusiyyəti var: əgər onların zirehləri bədənlərini müdafiə edirsə, həmin zirehlər dinidə müdafiə edir; əgər dəbilqəsi qılınc zərbəsindən qoruyursa, həmin dəbilqə xilas dəbilqəsidir; əgər qalxanın sinəni zərbələrdən müdafiə edirsə, demək sənin əlində İnam qalxanı var; əgər qüvvətli əlin oxu düz atırsa, həmin oxla bərabər sənin müqəddəs duaların səmalarda yüksək olan Allaha gedib çatır; əgər sənin səxavətli əlində olan qılınc parıldayırsa, onunla bərabər məlaikələr arasında sənin saf inamın parıldayır. Sənin bayraqların səmalar bayraqlarıdır və sənin nizənin ucunda olan nur Günəşin şüaları kimi parıldayır.

Bax, elə buna görə də sözümün əvvəlində məni qorxu əhatə etmişdi, çünki sözlərdən yüksək olan şeylər haqda danışmağa ozümü

aciz bilirdim.

Sözlər yalnız dörd ünsürdən ibarət olan dünyanı əks edə bilər və bu da hər bir adamın işi deyil. Bu yalnız elələrinin işidir ki, onlar cəsarətlə elmlərin əlçatmayan yerlərinə- hesaba, həndəsəyə, astronomiyaya və tibbə girişib, sonra isə əvvəldən və axirətdən bəhs edən peyğəmbərlik, havarilik və yevangellik kitabların ən sanballılarına gəlib çatır. Mənim özümdə maddiliyi izah edən bütün biliklərin varlığına baxmayaraq, sənsə bir vaxt təkcə cismə malik olan insan, indi, qeyri- cismanilərə bənzər oldun. Səni Zöhrəyə oxşadardım, lakin sən ondan çox parlaqsan. Zöhrə yalnız altı ay ərzində sübh çağı işıq verir, qalan altı ay ərzində o, yalnız axşamlar görünür.Sənsə hər gün işıq verib Zöhrədən də parlaqsan. Zöhrə göydə yalnız sübhçağı görünür, sənsə işığı gündüz də, gecə də verir,göydə bütün iyirmi dörd saat ərzində görünürsən. Əgər mən səni Aya bənzətsəm, onda bütün aqillərə gülünc görünərəm. İldə on iki dəfə o, yetişməmiş, rütübətli, solğun və xəstə doğulub, yarasa kimi gecələr gəzir, zülməti sevib işığa nifrət edir, öz yolunu başa çatdırmır,Atəşdən əziyyət çəkir və tez-tez bizdən gizlənir. Sənsə həddindən artıq vüsətli, hündürboy, şəfəqsaçan, şad xəbər gətirən, mələyəbənzər, sevindirən, ruhlandıran, nurlu və öz tay-tuş dostlarından daha gözəlsən. Səni heç bir şeyə bənzətmək olmaz.Yalnız deyə bilərəm ki,sən Günəşdən də üstünsən.Günəşin xatirinə dəymək və ya səni tərifləmək istəmirəm, ancaq onun təbiəti haqqında sənə demək istəyirəm. Günəş yolunu azan, sərgərdan,

insafsız kölgəsalan, cənubda yaşayan,insanları qışda üzən, yayda isə yandıran, yazda yağmurlu, payızda isə quraqlı, gecələr gizlənən, səhərlər doğulan, gülləri yandıran, göyərtiləri qurudan, gündüzlər heyvanları kölgəyə qovan və günü iki yarıya böləndir.

Yunanlar onu düzgün olaraq Apollon adlandırıblar.Və əgər sən Günəşin tutqun şüalarını yada salsan, bil ki, o, gecələr və buludlar arxasında gizlənən, tozdan üzü tutulan və qasırğadan həyəcana gələndir. Sənsə Günəşə bənzər oldun: Müqəddəs Atanın vasitəsilə qüdrətli, Oğul vasitəsilə qorxmaz və Müqəddəs Ruhun vasitəsilə nurlandıran oldun. Sən gecələr görünən gündüzlərlə imanının şüarını saçansan.

Sənə bədii ifadələrlə müraciət edirəm. Sən hər cür cəhətdən kamilsən. Sən qartaldan daha itigözsən, sənin eşitmən ən qorxaq heyvanın eşitmə qabiliyyətindən daha da itidir. Sən nəinki səmaları görmüsən, sən orada Ulunu görüb kiçikləri rədd etdin. Ötərini atıb əbədiliyi əldə etdin və padşahlıq qızıl tacını rədd etdin və bunun müqabilində sənin üçün əbədi tac hazırlandı ki, onu sən İsanın müqəddəs əllərindən alacaqsan. “ hər kəs Mənim adımın xatirinə öz evlərini və ya qardaşlarını və ya bacılarını və ya atasını və ya anasını və ya arvadını  və ya uşaqlarını və ya torpaqlarını tərk edərsə,yüz qatını alıb əbədi həyata varis olacaq”. [1] Kasıb üçün bunu etmək asandır,amma sənin kimi çara bənzər insan üçün qeyri-mümkündür.Əgər kimsə sənin etdiklərini edərsə-bu insanlara

[1] İncil. Matfeydən, XIX,29.

həqiqətəuyğun olmayan kimi görünər,mələkləri təəccübləndirər və yalnız saysız-hesabsız mələkləri tərk edib fani insan şəklində yer üzünə gəlmiş Allaha layiq ola bilər.Sənin əməllərin Allaha layiqdir.O, İsa bütün dünya üçün həyat və nicat olubdur, sənsə bütün dünyaya həyat və nicat qapısını açmısan.Ataların dini-imanı sənin vətənində hifz olundu, kilsələr dağılmayıb, əzabla ölmüşlərin, sovməələri sakitlik içindədir, keşişlər öz işləri ilə məşğuldur, qurbanlar səcdəgahlarda, peyğəmbərlər qiraətlərində, havarilər təsəlli verməklərində. oxuyanlar dualarında, qızlar bakirəliyində, rahiblər pəhrizlərində və hər kəs öz mövqeyinə görə işiylə məşğuldur.

Sənin səxavətin haqda xəbərlər Şərqdən Kadiksa[129] və cənubdan şimala qədər çatıb. Sənin iztirabla çələnglənmiş adın səmalardakı  Lövh-i Məhfuzda bütün havarilər, əzabla birinci ölənlər, batriklər və yepiskopların adları ilə yanbayan yazılmışdı.Ehtiyatlı ol, ey belə əzəmətə layiq olan və sımalar zirvəsinə ucalan qəribə insan! Öz ümidində möhkəm ol, qoy sənin məhəbbətin tükənməsin. Həqiqi inamda səbirli ol ki, Ölüm Əjdahası öz quyruğu ilə sənin həyatının üzərində qələbə şalmışdısa, indi, yaşa dolğun vaxt, əminəm ki, onun bütün murdar hiylələrini ayaqlarınla əzişdirərsən.

Əgər mən sənə qarşı bütün məhəbbətimi sözlərlə izah edə bilsəydim, bunun üçün gərək çoxlu perqament sərf edəydim. Çox vaxt sənə məhəbbətimi göstərmək üçün yanına gəlmək istəyirdim. İndi isə bizim və bütün müqəddəs kilsə qardaşlarının xahişi ilə səni Müqəddəs Ruha tapşırırıq. Allah sənə yar olsun! Amin!

## Givtin həmin çara ikinci məktubu

Sənə, İsanın əzabını çəkən, onunla birlikdə Xaçda əziyyət çəkən, məlaikələr tərəfindən şöhrət cübbəsinin geyindirilənə, mənim pak oğlum Vaçeyə, Albaniya çarına, Givt, Allah simasında sevinclər arzulayır. Ey, bu dünyanın hökmdarı! Öz biabırçı tənbəlliyimə görə mən sənin kimi gözə görünməyən döyüşdən qalib çıxana təsəlli verən sözləri deməyə cürət etmirəm. Axı sən ürək verən sözləri insanlardan almamısan, sən köməyinə İsanın qorxuducu qüvvəsini çağırıb bütün dünyanı arxanda qoyub başqalarından yüksək olmusan.

İndi isə, səni səbirli olmağa çağıraraq, Allaha dua edirəm ki, mənim təbrikim sənə zövqverən və şirin görünsün. Sənin,ey İsanın əsgəri, üstünlüyünlə xoşhal olub, başa düşürəm ki, öz cəhalətimə görə, öz naqis biliyimə görə bütün lazım olanı toplaya bilim və sənin kimi alicənaba tərif libasını toxuyum. Və əgər Yunanıstanın bütün natiq və filosofları bir yerə toplansalar belə, yenə də onlar sənin ruhani qələbənə lazımi tərifləri ifadə edə bilməzdilər.Çünki sən Allah- təalanı bütün qəlbinlə, bütün canınla və bütün qüvvələrinlə sevərə dərk etmisən.[1] Sən bütün var- dövlətini və əzəmətini tək bir Allaha –hamımın Allahına dəyişmisən. Və onunla yekdil olaraq sən təkcə ərzlə yox, səmaların bütün əzəmətiylə nəşələndin Bütpərəstlərin üfunətli qurbanlarını rədd edərək, sən İsa simasında ətirsaçan oldun və sənin ətrin Qərbədək yayılıb genişləndi və zəfər

[1] Bax:İncil. İkinci qanunçuluq,VI, 5.

çalaraq hamının canını sevindirdi. Yer üzündəki günahlara səbəb olan böyüklüyünü tərk edərək sən Səmavi əzəmətiylə birlikdə ədalətə varis oldun. Bütün yer üzündəki zövqlərdən əl çəkərək, sən İsaya yaxın olub sakitlik limanına gəlib çatdın. Və bütün sözlərimi bir yerə toplayıb deyərəm ki, sən insan olub mələk oldun, yer üzündə qohumların var idisə, səmalarda İsanın qardaşı oldun, fani idin əbədi oldun. Lakin əbədi təkcə sən deyilsən, ancaq çoxlu fanilərə həyat verə bilərsən, çünki İsanın hüzurunda cəsarətin var. Sən mələikələrin istəklisisən, insanlar sənin həsrətini çəkir, amma ən çox həsrət çəkən səndən uzaqda olan mənəm, çünki mən sənin ən qəddar Şeytanla görünməz döyüşdə silahdaşın olmamışam

İndi isə mən heç danışmıram ki, sən məndən inciyəsən və tənbəlliyimi yada salasan, mən ancaq sənə yalvarıram ki, sən öz təbrik məktubunda mənim dərdimi yox edəsən. Sən ki, İsaya bənzər müsibət çəkən olmusan, onun kimi də hər şeydə ona bənzər ol. Əgər o, onunla birlikdə çarmıxa çəkilmiş quldurların günahlarını bağışlamağa çağırırdısa, mənim tənbəlliyimi bağışlamaq sənin üçün daha da yaraşıqlı olar. Çünki möhkəm ürəkli və sağlam bədənli O yaradan səni öz oğulluğuna götürməyi layiq bilibdirsə, O, həmişə bizə imkan verər ki, səni bu dünyada bədəncə və qəlbdən sağlam görək və sənin xeyirli və səxavətli həyatından zövq alaq. İsa naminə sağ ol və uzun illər haqqımızda dualarda olub İsa məhəbbətiylə alış – daşasan!

# İYİRMİ ÜÇÜNCÜ FƏSİL

## Albaniya çarı Vaçaqanın həyatı və fəalliyyəti; Albaniyada yaratdığı müəssisələr; Müqəddəs cəsədlərin tapılılması

Otuz il ərzində çar Vaçedən Mömin Vaçaqanadək Albanlar ölkəsi çarsız qaldı[130]. Bunun səbəbi onda idi ki, İranın pozğun və rəhmsiz şahı Firuz[131] quduz it kimi qəzəblənib özündən çıxaraq, yer üzündə bütün başqa məmləkətləri özünə tabe etmək, kilsələri dağıtmaq, xristian dinini ləğv etmək  və bütün ondan asılı olan torpaqlarda ağılsız bütpərəstliyi bərqərar etmək istəyirdi. Elə buna görə də o, öz mürtəd əliylə İsaya sitayiş edən çoxlu müqəddəs və cəfakeş insanların pak qanlarını tökmüşdür. Hətta qadın və uşaqlar əsir alınıb göz yaşları və iztirablar içində  özgə ölkələrə qul kimi sürgün olunmuşdular. O, erməni, gürcü və alban nahararlarının bir çoxunu, divlərə sitayiş edən  məcusların dininə çevirərək canlarını bədbəxt etdi – kimiləri zorla, kimiləri də hədiyyə və əzətli knyazlıq hökmranlığıyla. Bir çox yerdə o, bütxana tikdirərək atəş önündə murdar ilahilərə ibadəti gücləndirdi. Şərdə doğulmuş İblisin müxtəlif bidətləri çoxaldı və Alban ölkəsinin bədbəxt əhalisinə iztirablar gətirdi. O, əhalini üsyankarlıqda günahlandıraraq camaatı zəncirlə buxoxlayaraq zindanlara atdı və zorla, istəmədən məcusların dinini qəbul etdirdi. Öz xalqıyla birlikdə çar III Vaçaqan  da ixtiyarsız İran şahının zalım və qaniçən tələbinə tabe olaraq məcus dinini qəbul

etməyə məcbur oldu. Amma gizlində III Vaçaqan daim ibadətdə və pəhrizdə olub, İsanın dininə o vaxtadək etiqad edirdi ki, İsa naminə müqəddəs əzab çəkənlərin  tökülmüş qanlarının intiqamını almaq üçün müqəddəs kilsələrin söküb dağılmasına görə, günahsız qocalar və gənclərin məhv olunmasına görə, qadınların və uşaqların əsarətə aparmalarına görə də məcusların dinini qəbul edib əziyyət çəkən və bu yolda həlak olan günahsız canlara görə bizi ən mərhəmətli Allah ziyarət etdi. Öz qəzəb əsasını O, zalım və qaniçən İran şahının üzərinə  eftalitləri qaldırdı və onlar İrana hücum edib təkərbbürlü İran zadəganları ilə birlikdə çoxlu rəiyyət və saysız – hesabsız qoşunlarını qırıb tökdülər.[132] Bəlkə müqəddəs İsaya Babildəki xəyalında məhz bu haqda qabaqcadan xəbər verirdi:" Mən öz seçilmişlərimə əmr etdim və Mənim qəzəbimi yerinə yetirmək üçün Mənim əzəmətimələ zəfər  çalan qüvvətlilərimi çağırdım. Dağlardan sanki izdihamlı insan yığınından böyük gurultu, bir yerdə toplaşan ölkələrin və xalqların qiyam gurultusu gəlir. Tanrı öz mübariz ordusunu gözdən keçirir. Uzaq ölkədən, göylərin qurtaracağındanbütün ərzi məhv etmək üçün Tanrı və Onun qəzəb silahları gəlir. Zar- zar ağlayın, çünki Tanrının günü yaxınlaşır və bu gün Onun tərəfindən dağıdıcı bir qüvvə kimi gəlir. Buna görə də hamı yorulub əldən düşdü və hər bir adamın ürəyi əsib əridi. Dəhşətə gəldilər, onları qıc və ağrılar tutdu; doğan qadın kimi əzab çəkirlər., üzləri alışıb yanır və onlar bir – birinə təəccüblə baxırlar. Budur, Tanrının  amansız günü gəlir, qəzəblə, alovlanan qeyzlə gəlir ki, yer

üzünü səhraya çevirsin və bütün günaha batmışları məhv etsin.

Mən Ərzi şərrinə görə, mürtədləri qanunsuz hərəkətlərinə görə cəzalandıracağam, lovğaların əllaməliyinə son qoyacağam və zülmkarların təkkəbürünü alçaldacağam. Bunun üçün səmaları sarsıdacağam və Kürre- yi ərzi Tanrı alovlanan qeyzi günündə öz qəzəbilə yerindən tərpədəcək. O zaman hər kəs öz torpağına, öz yurduna qaçacaq. Lakin yaxalanan nizəylə deçiləcək, tutulan isə qılıncla öldürüləcək. Onların körpələri öz gözləri qabağında doğranacaq, evləri talan olunacaq, arvadları isə rüsvay ediləcək”.[1]

Və həqiqətən, bu qabaqcadan verilən xəbər yenidən İran şahı qəddar Firuzun gözü önündə yerinə yetirildi; və cəsur eftalitlər Tanrının ilahi buyruğu ilə Onun qəzəbini söndürmək üçün şahın üzərinə hücum etdilər. Əvvəlcə şahın gözləri qabağında onun zalım oğulları, bütün əyanlarını və valilərini qılıncdan keçirdilər, onlarla birlikdə şahın saysız- hesabsız qoşunlarını məhv etdilər, sonra da şahın özünü – mən qəddar Firuz haqda danışıram – özünü qılıncla ikiyə parçaladılar. Şahın meyiti saysız  meyitlər arasında itib batmışdı və onu insan kimi yox, eşşək kimi basdırdılar. Mürtəd şahın yığdığı sərvətləri eftalitlər talan edib apardılar, iranlıların qadınları rüsvay olundu. Onların uşaqlara da yazıqları gəlmədi, yetimlərə də rəhimləri. Və həqiqətən, eftalitlər Tanrının böyük qəzəbini yatırdılar. Qaniçən Firuz şahın bütün xalqlara gətirdiyi bəlaların yetmiş qatı onun üzərinə düşdü.

---

[1] İncil. Havari İsayyanın kitabı, XIII, 3-6.

Bundan sonra Allahın kilsələri şadlıqla doldu, çünki İblisin şərlə dolu oğulları düşmənləri tərəfindən yaxalanıb, daş – qalaq edilib öldürülmədilər, onlar qılınclardan keçirilib can verə - verə öldülər. İblisin ən murdar adamını və onun yeddi kinli oğullarını isə qılıncdan keçirib əzablarla bu dünyadan qovdular. Və Tanrı Firuz şahı tamamilə məhv edından sonra Onun qüvvə və qüdrəti ilə də şər qovuldu.

# İYİRMİ DÖRDÜNCÜ FƏSİL

## Valarşın şahlığı[133]. Albaniya çarlığını Vaçaqan ondan aldı.

Cani Firuz rəhmsiz ölümlə bu dünyadan köçəndən sonra onun yerinə hakimiyyətə qardaşı Valarş gəldi. Məhz Vaçaqanın dövründə Tanrının: “ Kim yaradıb öyrədərsə o, Səmavi çarlıqda ulu adlanacaq”[1] sözləri Vaçaqanın simasında təcəssüm edirdi. Çünki bu mömin çar həqiqətən yaradır və yaxşılıq edirdi. ən əvvəl o, özü günahlı işlərdən və çərli yoldan əl çəkib çoxlu və müxtəlif səxavətli əməllərdə olub, bütün Alban çarlığını mürtəd və iblisi bütpərəstlikdən Tanrıya tövbələrlə tamamladı. Onun ölkəsinin nahararları ki, öz mənəvi müdrikliklərini məcus dinilə və bütlərlə iyrənc ibadətlərilə qəmlədib, bədənlərini isə alçaq pozğunluqla murdar etmişlər, bunları o, öz qeyrətli nəsihətləriylə İsanın həqiqətinə inanmağa məcbur etdi. Onları inandırdı ki, həqiqətən

[1] İncil. Matfeydən, V,19.

Tanrı Oğlunun əmriylə Qiyamət günü gələcək və sünməz əbədi atəşdə ağır cəza yalnız dönükləri, tövbə etməyənləri və kinli günahkarları gözləyəcək. Əbədi mükafatlar və təsvirəgəlməz şənliklər isə o adamlara veriləcək ki, onlar idrakolunmaz İlahiyə etiqad edir və Tanrı buyruğuna görə, etdikləri xoş əməllərinə görə yenidən diriləcəklər.

O kəslər ki, xilasedici xaçı suya salandan sonra yollarından azıb məcus dininə etiqad etdilər, onları tövbəyə məcbur etdi. O kəslər ki, onları uşaqlıqdan əbədi ölüm yoluyla getməyə məcbur edilmişdilər.Vaçaqan əmr etdi ki, onların xaçlarını yenidən suya salsınlar və bu yolla onları Tanrı oğlu, Xilasedici İsanın müqəddəs bədən və qanına ibadət etməyə layiq görürdü. O, öz çarlığından daha çox ölkəsinin nahararlarının müqəddəs kilsə xadimləriylə birləşməsinə sevinir və həyatverici ehkamlarını həmişə yadda saxlayır və əmin idi ki, hər kim doğru yoldan azmışdı, imana gətirib səxavətli həyata daxil edərsə o, "öz canını ölümdən xilas edib hesabsız günahlarından təmizlənər".[1]

Və hər gün Tanrıya xidmətindən ilham alaraq o, müqəddəslərin xatirəsi üçün ibadət edirdi. Bundan sonra o, istehkamları çox olan və hakimiyyəti altında olan Arsaxın əhalisinə əmr etdi ki, onlar bütlərə ibadətdən, onlara qurban verməkdən və bütpərəst mərasimdən əl çəksinlər.

Vaçaqan çox səxavətli və sülhsevər insan idi. O,quruculuqla

[1] İncil. Əhdi Cədid. Yaqubun risaləsi, V, 20.

məşğul olub, öz ölkəsinin əvvəllər kinli Firuz şahın qəsb etdiyi bütün diyarlarına fərmanlar göndərdi ki, hakimiyyətinin bərpa olumasından xəbərdar olsunlar və Firuzun təqib etdiyi ölkə əyanlarının ata – baba mülklərini qaytardı.

Bundan sonra öz mülklərini geriyə alan Albaniya nahararları birləşib çar taxtına İrab şahları nəslindən olan Vaçaqanı məsləhət gördülər. O, böyük şücaətə malik, müdrik, düşüncəli, hündürboy və qədd – qamətli bir adam idi. O, Yezdəgirdin oğlu və Alban çarı Vaçenin qardaşı idi. Onlar Vaşaqanı qəbul edib İran şahı Valarşın vasitəçiliyi ilə çar taxtına layiq gördülər. Vaçaqan Albaniyaya gələn kimi Allahı inkar edən məcusların məzhəbini rəddetmək və İsaya, həqiqi Allah kimi, etiqad üçün yollar axtardı. Elə bu vaxt o, hikməti – ilahiyyə İran şahı Valarşın əqlinə təsir edir və şah əmr edir ki, hər kəs öz iradəsi ilə öz din və inamına sadiq olsun və heç kəs heç kəsə məcusların dinini zorla qəbul etdirməsin. Bunu eşidən mömin və Allahın istəklisi çar Vaçaqan böyük sevinclə Allah kilsəsinə üz qoydu və orada arası kəsilməyən dualarla və göz yaşları ilə əbədi və tərifə gəlməyən müqəddəs Üç Uqnumu mədh etdi. O, yepiskop, keşişlərdən və bütün kilsə xadimlərindən çox xahiş etdi ki, onlar başqalarının halına acıyıb onunla birlikdə dua etsinlər ki, rəhmdil Allahı özləri ilə barışdırsınlar.Özü pəhriz saxlayaraq dua etdi və kasıblara sədəqə verərək özünü müqəddəs Pyotra bənzətdi.[134] Ondab ibrət olaraq Mömin çar Vaçaqan pak dinin səxavətilə bütün günahlarından təmizləndi və həqiqi Allahın dininə etiqad etdi. O,

çoxlu başqa ölkələrin[135] hamının Allahı olan İsaya müraciətində şəfavericisi və bu ölkələrin İblisin ağır əsarətindən xilasedicisi oldu. Çünki şəfa vermək sənətində o həkim dah bacarıqlı və daha biliklidir, kim ki, özü qılıncdan ağır yara alıb sağaldı və kim ki, müxtəlif dərmanları və otları özü sınaqdan keçirib, o, bu dərmanlar vasitəsilə o biri yaraları da tezliklə sağalda bilər. Necə ki, günah işlədən adam özü sonradan səmimi – qəlblə Allah yanına gəlib özcanını tövbə ilə, yəni həmin xilasedici dərmanla dualar və tövbələrlə müalicə edir – belə adam başqa günahkarların həkimi, canının və bədəninin xilaskarı olub, onları bütünlüklə, müqəddəs xristian dininə çevirə bilər.

Vaçaqan bütxana tikənlərə, cadu edənlərə, murdar sənəmlərə sitayiş edənlərə və xristian dininin ayinlərinin bütöv və sarsılmaz saxlamayanlara qarşı ciddi cəza və cərimələr təyin etmişdi. Və əgər cadugərlər, sehrbazlar və bütpərəst kahinlər dəfələrlə xəbərdarliqlara baxmayaraq, yenə də öz çirkin əməllərini davam edirdilərsə, çar Vaçaqan onları ağır işgəncələrlə, çubuqlarla döyməklə və buxovlandırıb onun hüzuruna gətirməklə ağır cəzalarla tərbiyələndirirdi. Belə cəzalarla o, sehrbazların, cadugərlərin və kahınlərin çoxunu şikəst edir və ölkədən qovurdu. Bəzilərini qul edir,bəzilərini isə xaçpərəstliyə döndərib Allahı tanımaq yoluna qoyurdu. Ölkənin çox yerində o, yepiskop, keşiş və nəzarətçilər təyin etdi. Bütün kilsə xadimlərinin nüfuzi Mömin çar Vaçaqanın dövründə yüksəklərə qalxıb hörmətlərə malik olmuşdur.

# İYİRMİ BEŞİNCİ FƏSİL

## Çar Vaçqan şərdə doğulmuş sehrbazların uşaqları üçün məktəblər açır. Murdar barmaqkəsənlər təriqəti ifşa olunur və məhv edilir

Allah tərəfindən taxta çıxarılan çar Vaçaqan əmr etdi ki, cadugər, sehrbaz, bütpərəst kahinlərin, barmaqkəsənlərin və ağı verənlərin uşaqlarını yığıb məktəblərə versinlər və orada ilahi inama və xaçpərəst həyat tərzinə öyrədib, onları, müqəddəs Üç Uqnuma etiqad etdiribdinsizləri Allaha sitayiş yoluna yönəltsinlər. Həmin gənclərin bir çoxunu öz şəxsi Rustak adlı kəndinə toplayıb, onların yeməklərinə pul ayırdı və müəllimlər təyin edib əmr etdi ki, uşaqlara dərs desinlər və onlardan xristian dininin bələdçiləri hazırlasınlar.

Hər dəfə çar öz kəndinə müqəddəslər xatirəsinə ibadət üçün gələndə o, məktəbə gəlib cadugər və bütpərəst kahinlərin uşaqlarını ətrafına yığırdı və bu uşaqlar əllərində kitablar və qrifel taxtaları şarç dövrlərinə alırdılar. O, zaman çar onlara əmr edirdi ki, hamı birdən ucadan oxusun, özü isə qulaq asıb sevinir və xəzinə tapmış insandan daha çox onlarla fəxr edirdi.

Bundan sonra Vaçaqan bəlalı barmaqkəsənlər və ağı verənlər təriqətinə mənsub olanları axtardı, ifşa və istintaq etməyə başladı, çünki həmin təriqətlər insanları həlak edirdi. Bunu etmək fikrinə

gəldiyi zaman rəhmli Allah istədi ki, Mömin çar Vaçaqan bəlalı barmaqkəsənləri ifşa edib onları yer üzündən silib süpürsün. Çar Vaçaqan eşitmişdi ki, bu bəla Albaniya ölkəsində çoxdan kök salmışdır. Ondan qabaqkı Alban çarları onları ya tuta bilmirdilər ya da ki, ümumiyyətlə, onları saymırdılar. Lənətə gəlmiş və kinli İran mərzbanları onlardan bəzilərini tez- tez yaxalayırdılar, lakin rüşvət alıb azad edirdilər.

Bu dəfə həmin təriqətə mənsub olanlar Kür çayı sahilində olan bir meşəli mağarada gənc oğlanı tutub əl və ayaqlarını baş barmaqlarını dörd payaya bağlayaraq öz murdar işlərinə, yəni gəncin diri- diri dərisini soymaqla məşğul olduqları vaxt yan yoldan başqa bir gənc keçirdi və barmaqları kəsilənin fəryadını eşidib gizlincə mağaraya girib və insan qatillərinin murdar əməllərinin şahidi olur. Gənci görən qatillər onun dalınca qaçıb tutmaq istədilər. Canını onlardan qurtarmaq üçün gənc oğlan özünü böyük Kür çayının sularına atdı və çayın ortasında olan adacığın üzərində ağac görüb təqib edənlərdən qorxaraq ağac tərəfə üzüb onun üstündə gizləndi.Amma həmin adamların sir- sifətini yadında saxladı. Gənc oğlan xilas olub, çayı üzüb keçdi və çarın hüzuruna gələrək gördüklərini ona söylədi.

Bunu eşidən çar Vaçaqan ibadət edib insansevər İsaya təşəkkür duasını oxudu və bütün kilsə camaatına əmr etdi ki, pəhriz saxlayıb Allaha dualarda olsunlar ki, ölkədə mürtəd bütpərəstlik ifşa olunub məhv edilsin, çunki İblis öz əsabələrinin baş – beyninə o

qədər təsir edib ki,həmin murdar təriqətin üzvləri heç vaxt öz çirkin əməllərini boyunlarına almazlar. Çar əmr etdi ki, gəncin öldürülməsində iştirak edənlərin  və haqlarında səs – xəbər yayılanların hamısını həbs etsinlər. Bundan sonra tutulanlara əzab - əziyyət verdilərsə, döydülərsə, bu canilərin heç birinə təqsirlərini boyunlarına aldıra bilmədilər. Bundan sonra çarın əmriylə caniləri yerə yıxıb burunlarının deşiklərinə acı sirkəylə şoranın qarışığını o vaxta qədər tökdülər ki, onların göz bəbəkləri ağarıb gözün yuvasında hərləndi, ancaq onlar yenə də bu əzablı işgəncələrə tab gətirib heç bir şeyi boyunlarına almayıb, hər şeyi rədd etdilər və“yox!” dedilər.

Amma Allah, yuxarıda dediyimiz kimi, buyurmuşdur ki, həmin mürtəd təriqət çar Vaçaqanın vasitəsilə məhv olunmalı, yer üzündən silinməlidir və buna görə də çar onların cinayətlərini öz müdrikliyilə boyunlarına aldırdı. O əmr etdi ki, onların hamısını qətl yerinə aparsınlar, sonra da onların arasından ən gəncini yanına çağırıb ona öz qəti sözünü bildirdi: “ Əgər sən hər şeyi boynuna alıb bu iblis yığıncağının əməllərindən doğru danışarsansa, mən əmr edərəm ki, səni öldürməsinlər!” Və həmin gənc başını aşağı salıb dedi:”Şeytan yanımıza insan şəklində gəlir və əmr edir ki, üç dəstəyə bölünək və hər dəstədən üç nəfər yaxalayaq. Bu üç nəfər nə yaralanmalı, nə də öldürülməlidirlər. Bunların diri – diri dərisi soyulmalı və sağ əllərinin  barmaqları kəsilməlidir. Sonra şeytan əmr edirdi ki, onların dəriləri döş qəfəsindən başlayaraq sol əlinin çeçələ

barmağınadək soyulsun. Sonra çeçələ barmaq kəsilib dəriylə bir yerdə kənaratullanır. Həmin iş ayaqqlarla da görülürdü ta o vaxta qədər ki, insan sağ qalır. Yalnız bundan sonra Şeytan əmr edirdi ki, insanı öldürsünlər, onun bütün dərisini soysunlar, aşılayıb səbətə qoysunlar.

Bu bədbəxt işin vaxtı çatanda həmin yerə artıq çoxlarımızın gördüyü insan ayaqqlarına oxşayan üçayaqlı bükülən kürsü gətirirlər. Kürsünün üstünə bahalı paltarlar qoyulur. Şeytan gələn kimi bu paltarları  geyib kürsüyə oturur və üstündə barmaq olan doqquz öldürülən adamın dərilərinin vəziyyətini yoxlayır. Şeytana düşən qurban payını gətirə bilmədikdə o, əmr edir ki, ağacın qabığını soysunlar. Onla isə ona öküzü və ya qoçu qurban kəsirlər və Şeytan özü bədxah xadimlərilə yeyib – içir, kef edir. Bu zaman elə orada hazır olan yəhərlənmiş at durur və Şeytan atlanıb, o, qədər yol çapır ki, at əldən düşüb dayanır və elə bu an Şeytan yox olur. Hər il Şeytan bunu təkrar edir”.

Bundan sonra gənc oğlan həmin mürtəd təriqətinə daxil olan kişi və arvadları barmağı ilə çara göstərdi. Sonra təriqətin başqa üzvləri də gəlib, gəncin dediyini təkrar etdilər.

Sonra çar hər şeyi açan gəncə belə dedi:”Necə ki söz vermişəm ömrünü sənə bağışlayıram. Amma indi onlar başqalarla necə rəftar edirdilər, sən də onlarla elə etməlisən”. Çarın əmrini alan gənc camaatın hüzurunda  onlarla qəbul etdikləri qaydalarla rəftar etdi. Çarın əmrilə sağ qalanların hərəsini öz kəndinə aparıb kənd

camaatı və qohumları qarşısında öldürdülər.

Çarın əmrilə ağı verənlərin də çoxunu tutub öldürdülər.Çünki bu təriqətin üzvləri də Şeytanın göstərişi ilə hər bir adamı zəhərləyib öldürürdülər. Əgər onlar yad adamlardan heç birini zəhərləyib öldürməyə imkan tapmırdılarsa, Şeytan onları o qədər vəsvəsəyə salırdı ki, onlar zəhəri öz yaxın qohumlarından birinə verib onu öldürüüdülər.

Ölkədə başqa şeytan və bütpərəst ayinlərdə var idi. Bir cin şərə qulluq etməkdən boyun qaçıranı kor edirdi, o biri insanı cüzam xəstəliyinə salırdı. Əgər birisi öz cadusu ilə başqasını tələyə salırdısa,cinlər həmin adamı ya kor edirdi, ya da cüzamlayırdı. Çar belələrini də yaxalayıb işgəncələrlə öz ölkəsindən yox etdirirdi. O, Albaniya ölkəsindən başqa zərərli təriqətləri və bütün quldurları kökündən qırdırdı və bunu o, öz sahəsinə istək və məhəbbətlə qulluq edib, tikanla alağı yox edərək, bərəkətli toxum səpib otuz, altımış və yüz qatına məhsul almaq istəyən qayğıkeş və əməksevər əkinçi kimi edərdi[1]. Bundan sonra rəhmini əsirgəməyən məmnun Allah, bu ərin – çar Vaçaqanın əzəmətli hərəkətlərinə, səyinə və Allahın iradəsini yerinə yetirməsinə görə ona örtülü və gizlində saxlanan İsa naminə şəhid olmuşların cəsədləri və tərifə gəlməyən xəzinələrin yerini göstərdi.

---

[1] İncil. Matfeydən, XIII, 23.

# İYİRMİ ALTINCI FƏSİL

## İoannın atası Müqəddəs Zaxariyyanın və Nikomediya şəhərində[136] şəhid çələnginə layiq görülmüş və qaxımış cəsədi gənc Qriqoris tərəfindən Çilblər ölkəsinə[137] aparılmış Müqəddəs Pantaleonun cəsədlərinin tapılması[138]

Isanın naminə şəhid olan müqəddəslərin qaxımış cəsədləri olan yerdə, Tsri adlanan şəhərdə çoxlu əlmətdar hadisə və möcüzələr baş vermişdi. Ölkənin əhalisi bütpərəst olduğu üçün heç kəs bilmirdi ki,müqəədəs cəsədlət haradadır. Amma qızdırmaya tutulan xəstələr bir adət olaraq içində cəsədləri basdırılan kilsəyə gəlib oradan bir ovuc torpaq götürüb gedirdilər və bütpərəst olduqlarına baxmayaraq çoxu şəfa tapırdı. Lakin qəddar və itaətkar İran dini həmişəAllah kilsəsinin əleyhinə olub, bu yerlərdə çox fəal idi.

Bir gün bir iranlı atəşpərəst kahini müqəddəs Zaxariyyanın cəsədi olan yerə gəlib, bu yeri murdarlamaq üçün onun üzərinə sidik salmaq istədi. Amma tumanının bağını açıb sidik kisəsini boşaldan kimi o, canını verib öldü.

Həmin möcüzə barəsində, onun bilavasitə şahidi olmuş, doğruluğu sevən və Maskutlar ölkəsindən gələn hunların yepiskopu Yunan danışmışdır.

Sonra, Tsri şəhərində iranlı Arkesin əliylə şəhid olanların və

cəsədləri basdırılan Haku məntəqəsində yerli kilsənin Yakov adlı keşişinin gecə yuxusuna nurani sifətli və vüqarlı kişi və onunla birlikdə gözəl simalı bir gənc oğlan gəlib dedilər: “Dur get Tsri şəhərinin valisi olan alban nahararı Xoçkorikin yanına və gördüklərinin haqda danış.  Biz onun da yuxusuna girəcəyik. Biz, müqəddəslər həmin kilsənin daxilindəyik. B izi sən və o həmin yerdən çıxarın”. Lakin keşiş yuxusuna fikir vermədi və həmin yuxunu o ikinci və üçüncü dəfə gördü, lakin yenə də buna əhəmiyyət vermədi. Onda onu dəhşətli azar tutdu və o, hətta ölümünü də gördü. Elə bu vaxt yuxusuna yenə də həmin iki nurani və mələklərə bənzər kişilər gəlib keşişə dedilər:”Heç bilirsən nədən ölürsən?” Cavabında keşiş dedi:”Xeyr ağalarım!” Onlar dedilər:” Ona görə ölürsən ki, inad göstərib, Xoçkorikin yanına getmədin və bizim cəsədlərimizi oradan çıxarmadın!”

Keşiş onlara yalvardı ki, onu sağaltsınlar və o dərhal gedib onların əmrini yerinə yetirsin. Bu iki kişi əlləriylə ona toxundular, üstündən xaç çəkdilər və o, həmin an sağaldı. Keşiş tez ayağa qalxıb Tsri şəhərinə getdi və orada şəhərin valisi Xoçkoriki tapdı. Vali keşişdən heç bir şey sormayıb onu Allah bəndəsi kimi qəbul etdi. Keşiş də yuxusunda gördüyü kimi, bilirdi ki, həmin yuxunu Xoçkorik də görüb və buna görə də ona heç bir söz demədi. Axşam yeməyindən sonra keşiş valinin yanında olan iki başqa keşişlə kilsəyə gedib, orada yuxuladı. Xoçkorik isə iki xadimin köməyi ilə öz yerində yatdı. Həmin iki nurani sifətli kişilər Xoçkorikin yuxusuna

girib, ona dedilər:” Qalx ayağa və get kilsəyə, Müqəddəslər oradadır. Onları keşişlə birlikdə oradan çıxarın”.

Yuxudan oyanıb Xoçkorik fikirləşdi:”Deyəsən mən bir qədər tez yatdım və elə buna görə də xəyaldayam” və onu yenidən yuxu basdı, yenə də yuxu təkrar olundu. O kişilər ona:”Biz sənə tez yatmağından demirik. Sənə deyirik ki, bizim cəsədlərimiz həmin kilsənin içindədir və sən keşişlə birlikdə onları oradan çıxarmalısan”, - dedilər.

Xoçkorik dəhşət içində yuxudan oyanır, amma az sonra onu yenə də şirin yuxu basdı.Həmin nurani və parlaq üzlü kişilər üçüncü dəfə yuxusuna girib dedilər:” Dur, get kilsəyə. Orada sən parlaq işıq görəcəksən. İşığı izlə, elə ki, gördün şüalar bir yerdə toplaşıb həmin yerdə cəsədlərimizi axtar”.

Həmin xəyal keşişin də yuxusuna girmişdi və o, kilsədən çıxıb Xoçkorikin yanına gedib ona gördüyünü danışmaq istədi, lakin qapıda Xoçkorika rast gəldi.Bu da keşişin yanına gəlməyə və ona yuxusunu danışmağa tələsirdi. Rastlaşaraq, onlar bir- birinə etiraf etdilər ki, yuxudan ayılıb kilsəyə getməklərinin səbəbi birdir. Bundan sonra keşiş Yakov, naharar Xoçkorik və iki gənc oğlan xaç çevirərək kilsə tərəfə getdilər.Onlar üzərində xaç olan qapıya yaxınlaşıb ibadətə durdular. Diz çökərək xaça baş əydilər. Ayağa duranda kilsənin içində valehedici parlaq işığı gördülər. İşığın elə qorxuducu görkəmi var idi ki, onlar iki Zəbur surəsini oxumayana qədər ayağa qalxa bilmədilər. Üçüncü surəni oxuyandan sonra Böyük Allahın

köməyilə ayağa qalxdılar. Xaç çevirərək kilsəyə daxil oldular. Kilsə yenə də işıqla doldu.

Səhərə qədər hamı ibadətdə oldu. Səhərə yaxın bütün işıq bir yerə toplaşıb hərəkətə gəldi və İsa namınə şəhid olanların basdırıldığı yer üzərində dayandı. Sonra işıq zəiflədi və həmin yer üzərində çıraq kimi gah alışır, gah da sönürsü, yəni işarə edirdi ki, müqəddəs cəsədlər buradadır. Yeri qazıb onlar cəsədləri tapdılar. İçində müqəddəs cəsədlər olan qabın üzərində belə bir yazı var idi:" Həmin müqəddəslərin, yəni İoannın atası Zaxariyyanın və Nikomediyada İsa naminə şəhid olan Pantaleonun qaxımış cəsədlərini buraya gətirmişəm. Özüm də burada ölmüşəm ".Onlar cəsədləri götürüb paketdilər və sonra da müqəddəs yağla sürtdülər. Xoçkorik qabı öz möhürü ilə möhürlədi və sonra ata minib Albaniya çarı Mömin Vaçaqanın yanına gələrək ona möcüzənin zühurundan danışdı.

Allah sevimlisi olan Vaçaqan həddindən artıq şadlanaraq ibadətlə dolu və Allaha çoxlu xeyir – dua və bu əzəmətli hədiyyələrə görə təşəkkürünü bildirdi. Tezliklə çar yepiskopları, rahibləri və zahidləri çağırıb müqəddəslər naminə nəhəng ehsan mərasimini keçirdi və kasıblara sədəqə payladı. Yepiskoplarla keşişlərə xələtlər paylayıb, öz şəxsi saray keşişi Manası Müqəddəs şəhidlərin cəsədlərinin gətirməyə göndərdi.

Müqəddəs cəsədlər olan yerədək çar və arvadı piyada gedirdilər, onların arxasınca xadimlər gedirdilər və bunların hamısı İsa Xaçı, buxur və çoxlu gül – çiçəklə hesabsız adam müşaiyət

edirdi. Çar İsaya, həqiqi Allahı mədh edir, ona müqəddəs cəsədlərə görə təşəkkür edirdi. Müqəddəslərin cəsədi olan qutunu çarın əmrilə qiymətsiz libaslar, qızıl, gümüş və qaş – daşla bəzədilər. Çar əmr etdi ki, taxtadan bir səcdəgah düzəldib onu qırmızı gönə və ağ kətana sarısınlar, içərisində isə müqəddəslərin cəsədləri və bütün əhdlər kitablar üçün aramgah yeri qoysunlar.

Albaniyanın birinci xanım sahibəsi, dindar və səxavətli çar arvadı Şuşanik isə öz böyük əlvan qırmızı göndən olan, istidə sərinlik verən, yaşışda rütubırdın saxlayan çadırını həmin səcdəgahın üstündə qurdurub, oni kilsəyə bənzətdi – içinə o qədər çox adam dolmuşdu ki, çadırım çevrəsinə kətandan parşa saldılar və onun arxasında çar və əyanları ibadət edib müqəddəs İncilin oxunmasına qulaq asırdılar.

Bundan sonra çar haraya gedirsə də o, həmişə özüylə müqəddəslərin cəsədlərini aparırdı. Onlar üçün gözəl təxti – rəvan düzəltdirib al - əlvan parça və kətana sarıtdı və üzərinə qiymətli daş – qaşla bəzədilmiş xaç asdırırdı. Bu xaçın üzərinə çar Vaçaqanın adı həkk olunmuşdu. Həmin xaçı çarın əmrilə onun tövləsindən ən sevdiyi ağ rəngli atları seçib onların quyruqlarına xına qoyurdular. Təxti- rəvanla atları qorumaq üçün çar öz şəxsi əsgərlərini təyin etdi. Təxti – rəvana müqəddəs cəsədlər, İncil və Əhdi – Ətiqdən başqa bir şey qoyulmurdu. Müqəddəslərin çadırını daşımaq üçün xüsusi araba düzəldib ona ağ buğalar qoşuldu. Öz sarayında çar çoxlu keşiş, rahib, İncil oxuyan saxlayırdı və bütün bunlar səhər – axşam həmin

müqəddəslər naminə qulluqda olurdular.

Çarın düşərgəsinin yerini dəyişdirəndə qabaqda müqəddəslərin ağ kətana sarınmış və üstündə qızıl xaçla çarın tacı qoyulmuş təxti – rəvan gedirdi. Ağ atların üstündə rəngarəng parçalar parıldayır və hər bir atın belinə çarın tacları qoyulmuşdu. Təxti – rəvan önündə və arxasında əllərində xaç olan keşişlər gedirdi və onlar Zəbur surələrini oxuyub Üç Uqnumu tərifləyirdilər. Müqəddəslərin təxti – rəvanından sonra Albaniya xanım sahibəsinin təxti – rəvanı və onu müşaiyət edənlər gedirdi. Onlar düşərgə salanda birinci növbədə xaçın üstündə olan al - əlvan çadırı qurur, onun da üzərinə böyük ağ çadır salırdılar. Bundan sonra böyük ehtiyatla Zəbur surələrinin oxunuşu müşaiyətilə buxurub ətri altında olan müqəddəsləri gətirirdilər. Sonra isə bütün lazım olan bəzəkləri ilə çarın çadırını qururdular. Çarın özü, xanımı və bütün əyanları ilə birlikdə müqəddəslərin şərəfinə səhər və axşam dualarda durur, onları tərifləyirdilər. Allahsevən və mömin çar Vaçaqanın oğul – uşağı olmadığı üçün o, rahiblərlə birlikdə ibadət edir Allaha yalvarırdı ki, ona oğul bəxş etsin. Və insanları sevən, bərəkət verən Allah çarın dualarına cavab verərək ona bir oğul bəxş etdi. Müqəddəs şəhidlərin havadarlığı ilə o, Allahın ona göndərdiyi hədiyyəni qəbul etdi. Çar oğlunun adını müqəddəs Panteonun, İsanın əsgəri və şəhidi naminə Pantaleon qoydu və əmr etdi ki, onu Allaha itaətdə tərbiyə etsinlər və o, həmişə ayıq olub İsanın müqəddəs şəhidlərinə qulluq etsin.

Xeyirxah çar hər dəfə nahar edəndə əmr edirdi ki, çarın masası yanına əlavə əla çar yeməklərilə dolu iki böyük gümüş masa qoysunlar. Çar öz əliylə böyük gümüş cama çaxır töküb çar masasına qoyurdu. Çarın masası yanında bir keşiş durur və çara verilən yeməklərdən bir qədərini götürüb həmin iki gümüş masalara qoyurdu.Çar yeməyi bitəndən sonra keşiş həmin yeməkləri kasıblara paylayırdı.

Hər bazar günü, dini mərasimlər zamanı, bütün kilsəyə gələnlərə İncilin həyatverici kəlamları oxunanda əliboş gəlməyə icazə verilmirdi. Çarın özü də İncilə mədh oxunanda əliboş gəlmirdi. Doğrudan da o, həmişə İsaya vücudu itaətlə dolu idi. Yorulmadan, xanımı və bütün əyanları ilə birlikdə pəhriz saxlayıb ibadətdə olurdu, daim müqəddəslər naminə mərasimlər keçirir və hamını İsaya inandırmaqda şad olurdu, qüvvəsini artırırdı və həmişə İsanın əbədi xeyirxahlığına inam bəsləyirdi.

# İYİRMİ YEDDİNCİ FƏSİL

## Maskutlar çarı Sanesanın əliylə şəhid çələnginə layiq görülmüş Albaniya katolikosu Müqəddəs Qriqorisin qaxımış cəsədinin əldə edilməsi fikri

Albaniya çarı mömin Vaçaqanın ən istəkli niyyəti müqəddəs gənc Qriqorisin qaxımış cəsədinin əldə edilməsi idi. Qədim tarixçilərin yazılarından çar bilirdi ki, müqəddəs Qriqoris çəhid

çələngini Vatnean çölündə böyük dənizin salinində geymişdir. Sonra da onun şagirdləri cəsədini götürüb Amarasa apardılar və ulu Qriqorinin tikdiyi kilsənin içində dəfn etdilər. Lakin onun dəfn edilən yeri heç bir işarə ilə qeyd olunmamışdı, çünki şagirdlər qorxurdular ki, ya quldurlar cəsədi məhv edər, ya da başqaları onu götürüb ayrı yerdə basdırarlar. Və bu əhvalatdan sonra çoxlu illər keçdiyi üçün müqəddəs cəsədin harada dəfn olunması hamının yadından çıxmışdı.

Çar öz saray keşişləri ilə müqəddəs cəsədi axtarıb tapmaq haqda məsləhətləşdi. Və həmin kəndin keşişini çağırtdırıb sorışdu:” Kilsəyə yaxın olan qəbirlərdən heç olmasa birinin üstündə işarə və ya başqa əlamət var, ya yox?” Keşiş dedi:” İndi kilsənin ətrafında çoxlu qəbir var, lakin Ulu Qriqorinin bina etdiyi kilsə o qədər böyük idi ki, onu quldurların basqınları nəticəsində heç kəs axıracan tikə bilmədi”. Onda çar dedi:” Mən əmr edirəm ki, kilsə ətrafında qazıntı başlansın”, amma bir az fikirləşərək sözünə davam etdi:” Ola bilsin ki, qəbirlərin çoxluğundan biz indi şəhidin ən müqəddəs qəbrini tapa bilmədik. Ona görə də biz gərək pəhriz saxlayıb dualarda olaq və ən mərhəmətli Allaha yalvaraq ki, bizə kömək etsin və biz də Allahın “ nəyi biz istədiksə istədiksə istəyimizi Ondan alırıq” [1] sözlərini yadımıza salaq.

# İYİRMİ SƏKKİZİNCİ FƏSİL

[1] İncil. İoannın biribci risaləsi,V,15.

## Çar Vaçaqanın bütün yepiskop və keşişlərə onların duaları və Allaha xahiş etmələri haqda məktubu:bəlkə bu vasitələrlə ona gizli olan xəzinə ( Qriqorisin cəsədi) bəxş olundu.

Bu əhvalatdan sonra çar əmr etdi ki, onun ölkəsinin bütün vilayətlərinə aşağıdakı məzmunda fərmanlar göndərilsin. “ Bütün yepiskop, keşiş, rahib, zahidlərə və bütün kilsə qardaşlığına salamlar! Hamıya məlum olsun ki, siz hamınız vaxt itirmədən müqəddəslərə ibadətlərə başlamalı, pəhriz saxlamalı və mərhəmətli Allahdan rica etməlisiniz ki, o, şəhid Qriqorisin cəsədini bəxş etsin. Sizin hamınıza salamlar!”

Çarın fərmanını alan bütün yepiskoplar, keşişlər, rahiblər və kilsə xadimləri ilə birlikdə İsa xalqını götürərək tələsik çarın Divtakan adlı kəndində toplaşdılar. Çarın əmri ilə gecikənləri cəzalandırdılar.

Üç gün bu kənddə müqəddəslərin xatirəsinə əzəmətli ibadətlər keçirdilər.Mərasim vaxtı çar bir qayda olaraq ətrafına bütün kilsə xadimlərini toplayıb ayaq üstə dururdu. Ən müqəddəs Qriqorisin və şanlı şəhidlər Ripsime və Qayanenin qaxımış cəsədləri Arsax vilayətinin Darahıca kəndində idi. Buraya cəsədləri erməni katolikosu İohandan[139] alıb gətirən Matte adlı keşiş olub.Cəsədləri gətirmək üçün çar Darahıca keşişlərini göndərdi. Qriqorisin və şəhid Ripsime ilə Qayanenin cəsədləri Divtakanda keçirilən izdihamlı yığıncağa gəlib çatanda, onları qarşılamaq üçün kəndin ətrafına şar,

onun arvadı və bütün məşhur nahararlar çıxdılar. Qarşılamağa bütün yepiskoplar və onları müşaiyət edən saysız – hesabsız kilsə xadimləri də çıxmışdı.Bütün bunlar dəstələrə bölünüb və hər dəstənin öz müqəddəs kilsə bayrağı, çox hörmətli İncillə, çoxlu miqdarda xaçlar və güəş altında parlayan müxtəlif  timsallarla gedirdi. Hər dəstəni buxur tüstüsü bürümüş, hər yandan dini mahnılar səsi gəlirdi.

Çar bütün camaatla birlikdə böyük sevinclə müqəddəslərin qaxımış cəsədlərini aparan keşişə xidmət edirdi. Beləliklə, cəsədləri müqəddəslərin mənzilinə gətirib şəhid Zaxariyya və Pantaleonun cəsədləri ilə yanbayan qoydular. Yalnız bu vaxt çar inandı ki, mətin inamla axtardığı və kilsə camaatından xahiş etdiyini tapacaq. O dedi:” Yəqin qəti əminəm ki, Ulu Qriqorinin havadarlığı ilə Allah müqəddəs Qriqorisin cəsədini mənə bəxş edəcək! ”

Bundan sonra çar özüylə bütün müqəddəs kilsə camaatını aparıb əmr etdi ki, yepiskoplar, keşişlər, rahiblər, bütün kilsə xadimləri, onların köməkçiləri dəstə - dəstə xaçları və buxurdanları ilə birlikdə onun arxasınca gəlsinlər. Çarın özünü saray keşişləri və çoxlu xadimləri dövrəyə almışlar. Çar istədi  öz xanımını elə orada qoyub getsin, çünki yaz  vaxtı idi və arası kəsilməyən yağışlar yağırdı. Lakin xanımı orada qalmaq istəməyib camaatla birlikdə müqəddəsin cəsədini tapmaq arzusu ilə əriylə birlikdə getdi.

Onlar özləriylə İsa naminə şəhid olmuş beş müqəddəsin cəsədlərini götürdülər. Bunlar aşağıdakılae idi: Ulu Qriqori, Şəhid Zaxariyya, ən müqəddəs Pantaleon  və məşhur qalibələr olan

Ripsime və Qayane. Onlar bu müqəddəslərin vasitəçiliyi ilə Allaha yalvarıb ondan istədiklərini almaq niyyətində idilər.Onlar müqəddəslərin cəsədlərini müxtəlif çar libaslarına sarıyıb sonra da buxurla və müxtəlif ətirli güllərlə birlikdə müqəddəslərin daxildən al - əlvan gönlə və ağ kətanla üzü çəkilmiş və üzəri qaş – daşla bəzənmiş qızıl xaçı olan təxti – rəvanına qoydular. Təxti- rəvana xınalı ağ atlar qoşulmuşdu. Təxti –rəvanın önündə və arxasında çoxlu saray xadimləri gedirdi. Bunlar əllərində xaç gecə- gündüz Allaha dua deyirdilər. Çarın özü də təxti – rəvanın yanında olub başqaları ilə birlikdə Zəbur surələrini oxuyurdu. Yepiskoplar və başqa kilsə xadimləri dəstələrlə təxti – rəvanın hər güncündə gedir, Zəbur surələrini oxuyur, Allahı tərifləyir, ondan müqəddəs Qriqorisin cəsədini onlara bəxş etməyini rica edirdilər. Çar Vaçaqan əmr etdi ki, yepiskoplar və başqaları axşama qədər bir şey yeməsinlər, axşam isə kiçik çörək parçası ilə kifayətlənsinlər. Çarın özü də müqəddəslərin cəsədlərini əldə edənə qədər belə edirdi. Çar sarayı keşişləri canfəşanlıqla pəhriz saxlayır, Allaha cəsədlərin verilməsi haqda dua edirdilər.Bəziləri isə cəsədlərin alınmasına qədər dillərinə heç bir şey vurmadılar. Bütün toplaşanlar gecə - gündüz dua edib, Allahdan Qriqorisin istəkli cəsədini istəyirdi. Elə bu günlərdə Mömin Vaçaqan məclis qurub orada şəhid Qriqorisin cəsədini axtarmaq üçün münasib vaxt seçdilər. Elə həmin günlərdə çar Darahıc kəndinin keşişi Matteni və bir neçə xadimi Sohara göndərdi ki, orada ibadət edib zühur olunan müqəddəslər naminə dua oxusunlar. Səhər ibadət

zamanı Matte mürgülədi və on bir səs gəldi:” Əgər siz müqəddəs Qriqorisi axtarırsınızsa, onda kilsənin şərq tərəfinə baxın!”

Belə də oldu, çünki onlar əvvəlcə yerli kilsənin şimal tərəfində qazırdılar və burada heç bir şey tapmayıb çox kədərləndilər. Allahın köməyilə şərq tərəfi qazıyanda səsin dediyi kimi ən müqəddəsin qaxımış cəsədinə rast gəldilər. Çar, dediyimiz kimi, camaatla, yepiskoplarla, keşişlərlə və bütün xadimləriylə Divtakan kəndindən çıxanda hamıyla birlikdə pəhriz saxlayır və insansevər Allaha dua edirdi. Onlar Aracəng adlı kəndə gəldilər. Burada çarın kilsə xadimlərindən İovel adlı birisinin sübhə yaxın yuxusuna röya gəldi; elə bil ki, o, çiynində belə şəhid Qriqorisin cəsədini axtarır. Röyasında Qriqoris özü ağ libasda gənc keşiş sifətində peyda olub ona dedi: “ Sən nə axtarırsan?” İovel cavab verdi:” Çar, onun bütün xadimləri və Albaniyanın bütün camaatı Qriqorisi axtarır, lakin tapa bilmirik”. Bu an şəhid keşişin əlindən tutub müqəddəsin cəsədi basdırılan yerə gətirir və deyir:” Əgər siz Qriqorisi axtarırsızsa – o buradadır!” və əmr etdi ki, bu yerdə qazısınlar. Qəbrin yanında üzərində xaç olan kiçik təpəcik var idi. Şəhid təpəciyə qalxıb xaçın yanında durdu. Və İovelin qardaşı Natan və Qedeon adlı keşiş həmin yeri qazıdılar. İovel isə diz çöküb əlində kisə gözləyirdi. Müqəddəsin cəsədini tapıb onlar böyük sevinclə yola düşdülər. Elə bu vaxt həmin müqəddəsin səsi gəldi:” Burada mənim qabırğalarım və ayaq sümüklərim qaldı. Onları da götürün!”. Və biz onun dediyi sümükləri tapdıq.

Yuxudan qalxan İovel öz röyasını şara danışdı. Həmin keşiş Amarasda heç vaxt olmasa da, o dedi ki, müqəddəs ona göstərdiyi yeri mütləq tapar. Çar çox sevindi və özü yola çıxmamışdanqabaq Amarasa öz keşişini və həmin İoveli göndərdi. Amarasa çatanda İovel müqəddəsin cəsədi basdırılan yeri göstərdi. Müqəddəslərin cəsədləriylə birlikdə çar bütün yepiskoplar, keşişlər və kilsə xadimləri ilə birlikdə Arajankdan çıxıb Karueç adlı kiçik bir kəndə gəlib orada səhər ibadətlərini etdilər.

Yenə də elə həmən yerdə İovelin yuxusuna dörd yaşlı rahib və onlardan gənc olan Qriqoris gəldi. Onlar Qriqorisin keçən dəfəki yuxuda göstərdiyi yerdə durub Zəburun surələrini oxuyurdular. İovel qorxusundan onların qabağında dizlərini büküb səcdə çəkdi. Sonra ayağa qalxıb onlara sual vermək istəyəndə gördü ki, onlar yox olublar.

O gün səhər ibadəti başlananda mömin çar arası kəsilmədən Allaha dua edir və onu müqəddəs Qriqorisin cəsədinin tapılmasına görə çox - çox şükürlər deyirdi. Birdın ibadət vaxtı çar balaca mürgülədi və yuxusunda bir səs eşitdi:” O şey ki, sən haqqında dua edirsən, sənin indi yuxunda gördüyündür”. Həmən səs yenə də dedi:”Mən Amarasa gedib, orada birisinin yuxusuna girəcəyəm”.

Çar vaxt itirmədən Manase adlı saray keşişini Amarasa göndərir və ona deyir:”Mənim yuxum haqda heç kəsə bir söz demə və orada olanlardan soruş: bəlkə kimsə yuxusunda nə isə görüb!” Çarın yanında olan zahid İovel belə dedi: “ Yuxumda gördüm ki,

həmən Qriqoris qazmağa əmr etdiyi yerdə bulaq qaynadı və əvvəlcə azacıq suyu olan bu bulaq sonradan aşıb- daşmağa başladı. Mən çox təəccüb etdim: axı burada bulağın izi yox idi, bəs indi bu su haradan gəlir. İzdihamlı nümayiş Karueçdən çıxanda onun qarşısında Amarasdan qadınlar çıxdı. Dediyimiz kimi, əhvalat yaz günlərində olub, arası kəsilməyən yağışlar yağırdı, yollar palçıq içində olduğu üçün hərəkət etmək çox çətin idi.Buna baxmayaraq çar əmr etdi ki, ləngiməsinlər və atından düşüb, yepiskop və keşişlərə ürək – dirək verir və onlara Zəbur surələrini oxumağı məsləhət görürdü. Çarın özü böyük səylə İsa naminə şəhid olunmuşların cəsədlərinə dua edirdi. Müxtəlif dillərdə oxunan duaların səsi o qədər izdihamlı idi ki, sanki yerin özü bu duaları şirin səslə oxuyurdu. Allah xalqlarının çoxluğundan, müxtəlif bayraqların rəngarəngliyindən, xalqların üstündəki qızıl, gümüş və qiymətli daşların parıltısından insana elə gəlirdi ki, yerin üzü parlaq buludlarla örtülüb.

Bu əzəmətli xristianlar nümayişinin ortasında üstündə qızıl xaçı olan müqəddəslərin təxti – rəvanı gedirdi və bu təxti – rəvan səmalarda parlayan şərəfli ulduza bənzəyirdi.

Allahsevən və müqəddəs nümayiş kəndə yaxınlaşanda onlar kəndin içindən axan kiçik bir çaya rast gəldilər. Çayın üstündən çar üçün körpü saldılar, lakin çar, onda müqəddəslərə olan böyük məhəbbətinə görə, təxti – rəvandan ayrılmaq istəməyib, çar paltarını çıxarmayıb ayaqyalın[140] çayı keçdi.

Müəyyən olunmuş yerə çatanda,çar yepiskoplar və bütün

camaatla birlikdə diz çöküb uzun müddət ibadət etdi.Həmin yer üzərində çarın çadırını qurdular və o, əmr etdi ki, camaat bütün gecəni ibadət etsin.

Bu vaxt Amarasda yepiskop yox idi və çar kənd kilsəsinin keşişindən də, ağsaqqallardan soruşdu:" Siz həmin yerdə əlamətdar bir şey görmüsünüzmü?" Onlar da zahid İoveldən eşitdiklərini çara danışdılar.

# İYİRMİ DOQQUZUNCU FƏSİL

## Müqəddəs zahid İov Arsaxın Böyük Parskank vilayətinin əhalisini xaçpərəstliyə çevirir

Və kənd keşişi söylədi: " Yer üzündə çox səxavətli, yumşaq xasiyyətli İov adlı bir zahid var idi. O, Behkert kəndindən olub, havarilərə xas olan zəkaya malik idi. O, Arsaxın Böyük Parskank vilayətinin azğın əhalisini xaçpərəstüdib, onlara Allahı tanıtdı və təsvirəgəlməz Üç Uqnumun surələrinə hörmət etməyə səy göstərdi. Dəfələrlə O həmən yerə gəlib müqəddəs Qriqorisin xatirəsinə dua edir və dəfələrlə xalqa deyirdi ki, Albaniyada mömin çar olacaq və o, Qriqorisin müqəddəs cəsədini axtaracaq.

Bir dəfə də bizə naməlum bir zahid qonaq gəldi.Biz də, adəti üzrə, onun qabağına şıxdıq və qardaş qardaşı qəbul edən kimi onu qarşıladıq. O, əl – ayağını yuyub bir qədər yedi və sonra həmən yerə qalxıb uzandı və yatdı. Birdən o yuxudan oyandı və əlləriylə bir xaç

düzəldib onu həmən yerə sancdı və bizə dedi ki, heç kəs bu xaçı yerindən tərpətməsin və daha yaxşı olar ki, buraya böyük bir xaçsancılsın və hər gecə, hər gün camaat bura gəlib ibadət etsin, buxur yandırsın, çünki bu yerdə böyük möcüzələr olacaq.

Bizə qonaq başqa bir rahib gəldi. Biz ənmr etdik ki, ona yemək versinlər. Gənc oğlan ona bir badə şərab verdi. O nahar edəndə kənddə səs – küy qalxdı və biz hamımız onu tərk edib səs – küy olan yerə getdik. Qonağımız isə ayağa qalxıb badəmizi götürüb getdi. Sonra badəni satıb pul qazandı və məktəbə daxil olub həmin pula oxumağa başladı. Bir dəfə həmən oğru yuxusunda görür ki, həmin xaçın yanında, kürsüdə ağ libas geyinmiş bir yepiskop oturur. Özü isə lüt – üryan, əli – qolu bağlı həmin yepiskopun qarşısında uzanıb və yepiskop da əmr edir ki, ona işgəncə versinlər.

Yuxudan oyanıb rahib camaata öz bədənini göstərdi: hər yeri döyülməkdən və əzablı işgəncələrdən göy – qançır olmuşdu. Və yepiskopun əmrilə həmin rahibə hər gecə işgəncələr verirdilər. Bu ağır əzablardan xilas olmaq üçün rahib müqəddəs Qüds şəhərinə ziyarətə gedir və orada gecə - gündüz ibadət edir ki, Allah onu bu əziyyətdən xilas etsin.

Amma Qüdsdə o, həmin yepiskopu yenə də yuxusunda görür. O, həmən yerdə oturub, daha da sərt baxıb əmr etdi ki, rahibi daha bərk döyüb incitsinlər. Yepiskop ona dedi:" Bu əzablardan sən o vaxta qədər xilas olmayacaqsan ki, kəndə qayıdıb badəni oğurlamağını boynuna alıb tövbə edəsən".

Rahib badənin dəyərində pul götürüb Qüdsdən çıxır və Amarasa gəlir. Burada kilsəyə gedir və keşiş çağırıb hər şeyi boynuna alır. Badənin pul dəyərini qaytarıb, keşişdən çox xahiş edir ki, onun günahını bağışlasın. Sonra da yuxuda gördüyü xaçın yerini göstərdi və dedi:” Bax, burada, ağ libas geymiş acıqlı yepiskop oturmuş idi”. Qəbir olan yeri göstərərək, rahib əlavə etdi:” Bax, burada yepiskopun əmrilə məni bərk döyürdülər”.Öz vəziyyətlərindən xilas olan rahib sağ – salamat çıxıb getdi.

Deyilənə görə, qabaqlar kəndin sonsuz qadınları qəbir üstünə gələrək bir ovuc torpağından götürüb gedirdilər və sonra hamilə olub doğurdular. Qızdırmaları və ya başqa xəstəlikləri olanlar da bu qəbrin torpağına əl vurduqdan sonra tamamilə sağalırdılar.

Və bütün bu möcüzləri çara danışandan sonra...

# OTUZUNCU FƏSİL

## Həmin vilayətə vali təyin olunmuş Albaniya çarı Arsvagenin qeyri – qanuni oğlu Xoçkorikin röyası. O, öz yuxusunu çar Vaçaqana danışır

...Bir dəfə Tsri çəhərində yuxusunda şəhid Zaxariyyanı və müqəddəs Pantaleonu görən Xoçkorik adlı birisi[141] gündüz yuxuya getdi və röyasında kilsədə yeddi ağ libaslı kişi gördü. Xoçkorik onlara müraciət edib soruşdu:” Madam ki, siz, ey bəxtiyar ərlər, buradasınız,nə üçün müqəddəs Qriqorisin cəsədi olan yeri

göstərmisiniz? Bəziləri deyir ki, cəsəd buradadır, bəzisi də deyir oradadır. Bizim hamımız isə onu axtarıb qəmlər içindəyik ".Onlar Xoçkorikdən bir səslə soruşdular:" Sən buralarda əlamətli bir şey görmüsənmi? ". O,cavabında" yox "dedi.Yeddi nəfərdən biri qabağına çıxıb dedi:" Ardımca gəl! Mən sənə xaçın qoyulduğu yeri göstərər

Və o mənə haqqında söhbət edilən yeri göstərdi. Bir də gördüm ki, yer parçalandı və yarğanın dibində işıq saçan qəndil göründü. Qəndilin ikiyə ayrılmış alovu yuxarı tərəfə qalxdı. Xoçkorik ona bu əlaməti göstərənə dedi:" Mən gedib sizin mənə göstərdiyiniz əlamət haqqında çara danışacağam"O dedi:" Get danış!"

Xoçkorik saraya gəlib gördü ki, çar yatıb və o çarı ayıltmağa cürət etmədi. Qayıdıb həmən adama dedi:" Çar yatıb və onu yuxudan ayılda bilmədim".

Xoçkorik saraya gedib – gələn vaxt yer parçalanmış qalıb qındil yanır və həmən adam yerindən tərpənməmişdi. Həməm adam Xoçkorikə dedi:" Çar yuxudan duranda ona gördüyünü danış" və bundan sonra o, yarğanı ayağı ilə örtmək istədi. Lakin Xoçkorik əlindən tutub bunu etməyə imkan vermədi və dedi:" Nə qədər çar bunu görməyib yarğana toxunma!" Lakin həməm adam ona qulaq asmayıb ayağıyla həməm yerə vurdu və yarğan da yox oldu. Yuxudan oyanıb Xoçkorik çarın yanına gəlib hamısını ona danışdı.Orada toplaşanların hamısı səhərə qədər yorulmadan bütün

nemətləri bəxş edən Allaha ibadət etdilər.

Ertəsi gün səhər ibadətdən qabaq onlar bir yerdə möcüzəli xaçın yanına gəlib burada çarın çadırını qurdular, ətrafına da pərdələr saldılar. Yepiskoplar öz şagirdlərilə bu pərdəklərin arxasında toplaşdılar. Böyük keşişlər əllərində də xaçlar, kiçik keşişlər Zəburlarla durur, qalan kilsə xadimləri isə buxur yandırırdı. Hər tərəfdə Zəburdan surələr oxunur və hamı tərifə gəlməyən Üç Uqnuma ibadət edirdi. Səxavətli çar üst geyimini çıxarıb, əlinə bel götürüb səylə yeri qazır, xeyirxah və mömin xanımı isə çuxura yaxınlaşıb çıxarılan torpağı öz ətəyində kənara aparırdı.Yepiskop, keşiş, əyanlar və onların arvadları da onlara baxıb torpağı kənara daşıyırdılar.

Lakin səhvən çar yeri bir qədər kənarda qazıdı, şəhidin cəsədi isə bu yerdən bir az sağ tərəfdə idi. Bu zaman çar da, bütün orda olanlarda  qəm – qüssəyə qərq oldular. Bir an çar məyus və dərddən qaldı, lakin sonradan həqiqi inamla ruhlanaraq dedi:" Canlı Allahın (İsanın)" kəlamı qüsursuzdur, çünki harada ki, mənim namimə iki və ya üç toplaşıb, mən onların arasındayam"[1] və axtarılan dərhal tapılar. İndi isə buraya bütün insanların ən müqəddəs Allah naminə o qədər insan toplaşıb ki, mən yəqin bilirəm ki, O, bizə diqqət edir  bizi xəcalətdə qoymaz".

Bundan sonra çar əmr etdi ki, qazılmış yerin müqəddəs Zaxariyyanım ən müqəddəs Pantaleonun və böyük şöhrətli

---

[1] İncil.Matfeydən, XVIII,20s.

Qriqorinin, Ripseme və Qayanenin cəsədlərini gətirsinlər. Elə həmin vaxt bir kişi bel götürüb qazılmış yerdən bir qədər sağda yeni qazıntı apardı və birdən şəhidin müqəddəs qəbri açıldı. Çar və bütün onunla birlikdə olanların qanları sevinclə doldu. Hamıya xəbər verildi ki, müqəddəs Qriqorisin cəsədi tapıldı və camaat müqəddəsin cəsədini görmək niyyəti ilə üz qoydu qazılmış yerə. Əgər çar çadırdan çıxıb camaata təskinlik verməsəydi, çadırdan da, qəbirdən də iz qalmazdı, hər şey ayaq altında tapdalanardı.

Qəbir açılıb, cəsəd görünən kimi içindən ətrafa qəribə ləzzətli rahiyə yayıldı. Buxurabənzər qoxu qəbirin ətrafına toplaşanları bir neçə saata mürgüyə basdı. Çar və onunla olanları bu hal çox təəccübləndirdi və hamı belə möcüzələri bəxş edən Allahı təriflədi. Bundan sonra çarqəbirin yanında oturub əmr etdi ki, onun qiymətli sandıqçasını gətirsinlər. Onu dizi üstə qoyub gözlədi. Keşişlər qəbirdən müqəddəsin sümüklərini çıxarıb bir – bir sandıqçaya qoyurdular. Cəsədin yanında iki şüşə qab tapdılar – birində müqəddəs Zaxariyyanın qanı, ikincisində isə müqəddəs Pantaleonun cəsədinin parçası var idi.

Bütün tapılanları xalqa göstərdilər və hamı səhərə qədər ibadət etdi. Çar sandıqçanı öz möhürü ilə möhürlədi və əmr etdi ki, onu mühafizə etsinlər.

Həmin qəbirdə müqəddəs Qriqorisin şəxsi su qabını da tapdılar. Onu da çar Allaha şükür edərək özüylə götürdü.

Ertəsi gün çar əmr etdi ki, onun plaşını və qızıl bardaqda şirin

çaxırını gətirsinlər. Qriqorisin cəsədini bu çaxırla yuyub plaşın üstünə qoysunlar ki, günəş altında qurusun.

Amaras kilsəsindən bir keşiş həmən cəsədin bir parçasını oğurlayıb qaçdı. Elə o gecə şəhid Qriqoris birisinin yuxusuna girib keşişin adını və oğurluq etməsindən danışdı. Çar keşişi dindirəndə o, hər şeyi boynuna alıb oğurladığını qaytardı.

Orada işləyən daşyonanlardan biri öz narazılığını bildirib küfr danışdı və" Qriqorisi yox, bir mürtədidi tapdıq!" dedi: - Elə həmən an onu Allahın cəzası tutdu. O, yerə yıxıldı və onun başı tərsinə dolandı. Bir neçə gün o, belə vəziyyətdə qaldı. Sonra gedib qəbirdən bir ovuc torpaq götürüb bu torpağı öz göz yaşlarıyla o qədər islatdı ki, ona şəfa verildi və günahları bağışlandı.

Bənna və ustaların canlarına bərk qorxu düşdü və onlar səylə çalışıb həmən yerdə kilsənin tikilməsini başa çatdırdılar.

Çar əmr etdi ki, hər yepiskopa müqəddəs cəsədin bir parçasını versinlər ki, onlar da onu öz kilsələri arasında bölüşdürsünlər. Cəsədin böyük hissəsini isə Amarasda saxladı. Qalan hissəsini isə o böyük məharətlə möhürləyib özündə saxladı və özü də ona xidmət edirdi. Müqəddəsin qəbri üstündə bir sovməə tikdirib ona " müqəddəs Qriqoris sovməəsi"adını verdi. Bundan sonra çar böyük sevinclə ayaqüstü, bütün yepiskoplarla birlikdə ibadət etdi və onun şirin səsi Zəburun surələrini oxumaqda qalan oxuyanların səsinə qovuşurdu. Bundan sonra çar düşərgədən ayrılıb, üçüncü gecədə, dördüncü günün sübh çağında başqaları ilə birlikdə canlı Allaha

(İsaya) təriflər oxudu. Sonra da bütün orada olanlar müqəddəslərin cəsədlərini götürərək əvvəlki nizamla geriyə qayıtdılar.

Beləliklə, səxavətli çar Vaçaqan ondan qabaqkı çarlara, bütün onun sələflərinə və nəslinə mənsub olmayan mənəvi və qeyri – təbii xəzinəyə malik oldu və bu xəzinə ona daimi və ağlasığmaz mal, şərəfli və şöhrətli girov kimi verilmişdi.

Beləliklə, çar Vaçaqanın vasitəsilə bütün ölkə xristianları Allah mərhəmətindən öz paylarını aldılar və Vaçaqanın şöhrəti mən hesab edirəm ki, heç də qərbin sahibi olan imperator I Konstantinin[142]şöhrətindən az deyildi.

Amma bizə, Şərq xalqına gəldikdə, bu müqəddəs çar bizim üçün Allahı dərketmə qapısının işığı və saysız – hesabsız yaxşılıqlar üçün nümunə oldu. Bu izdihamlı mərasim üçün uzaqlara gedən çar onun sanına görə seçilmiş bu yolla da geriyə qayıtdı və onun şəxsi əzəməti həmən üstündə göründüyü yolu olduğundan daha da qəşəng etmişdi.

Yola düşən çar piyada gedir və onunla birlikdə yolda olan təntənəli nümayiş sanki sakit dəniz kimi aram – aram yeriyirdi. Ətrafdakı hava da həmahəng səslərə sanki sevinirdi, elə bil ki, mələikələrin özləri də bunlarla bir oxuyur, yer isə səmalara bənzər olmuşdu. Çarın özü indi də, Amarasdan qayıdanda təxti – rəvanı piyada müşaiyət edirdi və çayı keçən kimi əmr etdi ki, hamı dayansın Bir qədər çar, Ondan sonra isə yepiskoplar camaata xeyir- dua verərək əmr etdilər ki, hamı evlərinə qayıtsın. Çar isə yepiskopları,

keşişləri və başqa əyanları cəsədlərlə bir yerdə Karueç kəndinə aparıb dincəlməyə əmr etdi.

Sonra onunla gələnlərin və ona cəsədin əldə edilməsində kömək edənlərin hamısına minnətdarlığını və təşəkkürünü bildirib çar dedi:” Müqəddəslərin xahişi və sizin dualarınız vasitəsilə mənə və sizə daim arzu etdiyimizi bəxş edən İsaya əbədi eşq olsun!” Və orada olanların hamısı bir səslə çara, xanımına və saray əyanlarına təşəkkür edib dedilər:”Qoy sənin Allaha olan xahişlərin müqəddəs Qriqorisin vasitəçiliyi ilə yerinə yetirilsin Qoy Allah sənə bu ölkədə çar kimi uzun ömür versin ki, kilsələrimiz bizim gündən – günə artan səylərimiz nəticəsində daha da firavan olsun. Qoy bizim xilaskarımız İsa və onun səmavi Atası sənə İsanı anmaqla ömür keçirməyə imkan versinlər”.

Çar özüylə katolikos Şuphalişonu aparıb yoluna davam etdi. Hər dəfə müqəddəslərin təxti – rəvanı bir kəndə yaxınlaşanda, çar atdan enib ayaqüstü onlara kənddən çıxana qədər xidmət göstərirdi. Bunu o, ərköyün və məğrur çarlar kimi yox, xristian dinini bilən mahir bir adam kimi, ləzzət dəryasına qərq olmuş kimi yox, Allahın ehkamlarına səylə və məntiqlə tabe olan adam kimi edirdi.

Bu hadisə baş verən kimi və müqəddəs Qriqorisin şöhrəti Uti vilayətinin bütün el – obasına yayılan kimi hər kəndin kişi və qadınları müqəddəslərin qabağına çıxırdılar və hətta ucqar yerlərdən gələnlər də əllərində xaçlar, gül – çiçəklər və buxurlar yeganə olan Üç Uqnumu tərif edirdilər.

Beləliklə, onlar çarın öz mülkü olan Divtakan kəndinə gəlib çıxdılar. Burada onlar müqəddəslərin cəsədlərini əbədi rahatlığa qoyub onlar üçün böyük yad etmə mərasiminikeçirdilər.Çar isə əmr etdi ki, müqəddəslərin cəsədlərinə bahalı və ətirli yağlar sürtsünlər. Çar Vaçaqanın çox istəkli Xançik adlı gənc qızı var idi. Çar onun üçün bir malikanə tikdirmişdir və qızına cəsədlərin hissəciyini bəxş edərək müqəddəslərin naminə böyük xatirə yasını keçirdi. Özünə də çar bir hissəcik götürdü və bundan sonra onu müqəddəs Zaxariyyanın qanının parçasıyla bir yerdə həmişə özüylə gəzdirirdi. Cəsədlərin qalan hissəsini möhürləyib onları təmtəraqla bəzənmiş bir otaqda saxlayırdı və ancaq Divtakanda müqəddəs Pantaleonun naminə sovməənin tikilməsindən sonra çar müqəddəslərin cəsədlərinə xidmət etmək üçün keşişlər, rahiblər və xadimlər təyin olundu və çarın özü ildə iki və ya üç dəfə müqəddəslər üçün yad etmə mərasimini təşkil edib pəhriz edir, ibadətdə olur və kasıblara sədəqə paylayırdı. Müqəddəslərin cəsədlərinin hissəciyini alan adamlara çar əmr edir ki,onlar daim onlar üçün yad etmə mərasimlərini təşkil etsinlər. Can yandırmayanlara Cəhənnəm əzablarını yada salırdı. İnanalara isə çar deyirdi ki, Allahın bəxş etdiyi nemətlər əbədidir.

Öz müqəddəslərini Allah belə tərifləyir.

# OTUZ BİRİNCİ FƏSİL

## Çar Vaçaqanın bilikli keşiş Matteyə sualı

Çar sual verir:" Bədəni tərk edən can duyğusunu itirmir, yoxsa duyğusuz olur və dirilər ölənlərə necə kömək edə bilər?" Cavab: " Allaha ibadət etməklə, pəhrizlə, dualarla və onların naminə görülən başqa xeyirxah işlərlə. Məsələn, Davud Saulun[143] yaraq- əsləhəsini geyib səndələməyə və büdrəməyə başladı, amma ağır yaraq - əsləhəni atan kimi o, yenə də özünü yüngül hiss etdi, əvvəlki vəziyyətinə qayıtdı. [1]

Canlar da belədir – nə qədər ki, onlar bədən yaraq - əsləhəsinin içindədirlər, onlar ağırlıq altındadır, amma bu ağırlığı üzərindən atan kimibəsirətli, dərrakəli və daha da duyğulu olurlar. Biz, canın bədəndən sonra duyğusuz olmağını təsdiq edənlərin iddiasını müqəddəs kitabın bu sözlərilə rədd edirik:" Mənim Musa bəndəm öldü".[2] Lakin indi Musa bədəndən azad, əcaib şərəf içində Allahın qabağında zühur etdi və bunu görən Pyotr Allahdan rica etdi ki, ona da orada yer eləsin. Əgər peyğəmbərin canı dediyin kimi, bədənini tərk edib duyğusuz olsaydı, necə ola bilərdi ki, həmən can duyğusunu əldə edib Allah oğlu belə nəzakətlə deyirdi: " Mən ölülərin yox, dirilərin Allahıyam".[3]

Məgər ölü cism duyğusuz deyilmi? Və aydındır ki, duyğusuz can da ölüdür. Və deyilib ki:" Mən bu şəhəri Öz xatirimə və Mənim bəndəm Davudun xatirinə müdafiə edəcəyəm". [4] De görüm duyğusuz

---

[1] İncil. Birinci Çarlıq kitabı, XVII, 38-39.
[2] İncil.İisus Navinin kitabı, I, 2.
[3] İncil. Matfeydən, XXII, 32.
[4] İncil. Dördüncü Çarlıq kitabı, XX, 6.

cana nə gəlib ki. Şəhəri kimdənsə qorusun? Yalnız peyğəmbərin diri canına görə Allah lüft edib ona şəhərin mühafizəsini tapşırır ki, əhalisini düşmənin qılıncından xilas etsin. Allah havarisi Pavel deyir: “ Bədəndən çıxıb İsanın yanında bərqərar olmaq daha yaxşıdır”.[1] Həmən sözləri Ataya həyat verən Kəlam da deyir:”Ata!Istəyirəm ki, Sən mənə verdiklərin Mənimlə olduğun yerdə olsunlar və Mənim şərəfimi görsünlər”[2]

İndi de görüm, duyğusuz can Allahla bir yerdə necə ola bilər?Və yaxud: ölmüş dövlətli adamın canı uzaqdan, Cəhənnəmdən, iti gözü ilə İbrahimlə Lazarı necə görüb tanıya bilərdi?[3] Bunu həqiqətli ibrətli kəlamla hamıdan yaxşı xilaskarımız izah edir, bədəndən çıxan can bədəndəkindən daha iti gözlü, daha müdrikdir. Nəinki müqəddəs və möminlərin canları, hətta günahkarların canları belə duyub müdrik olurlar. O dövlətli adam kimi: o, öz iti gözü ilə İbrahimi görüb tanıdı, baxmayaraq ki, aralarında dəhşətli uçurum var idi. Və Allahın cəhənnəmə gəlib günahkarların xilas edilməsinə həqiqi inam bizi öyrədir ki, həqiqətəndə daha duyğulu və daha müdrik o canlardır ki, onlar bədənləri tərk ediblər. O adamlar ki, müqəddəsləri yad edib, onların canlarına nəzir verir və bu vasitəylə səxavətli Allahdan mərhəmət diləyirlər – bunlar hamısı həmən mərhəməti alırlar. Həqiqətən müqəddəslərin canları Allah qabağında

[1] İncil. Korinflilərə ikinci risalə, V, 8.
[2] İoanndan, XVII, 24.
[3] İncil. Lukadan, XVI, 23.

bunlar haqda xahiş edirlər və o, bu canların xahişini dərhal eşidib günahları bağışlayır.

# OTUZ İKİNCİ FƏSİL.

## Xoşbəxt yepiskop Avraamın Albaniya çarı Vaçaqana ölənlər barəsində yazdığı məktub

Sevimli, məni eşit! Əgər biz ölənlərin canlarını tanıyır və ya tanımamağımız haqda söhbət ediriksə, onda ölənlərdən daha səfeh kim ola bilər? ( Lakin qurbanları qəbul edən və xahişləri yerinə yetirən Allah dirilərin dualarını eşidir, qurbanları qəbul edir və Allaha ümid bəsləyib ölənlərin canlarının əziyyətlərini yüngülləşdirir).[1] Bizi öyrədən Müqəddəs kitabda deyilir ki, havari Yelisey ölən gəncə fikir verməyib, anasının yalvarmasına qulaq asıb oğlunu dirildibanasına qaytarır.[2] Allahımız İsanın dul arvada rəhmi gəldi və O, qadının yeganə övladını dirildir.[3] Havari Pyotr isə dul arvadların göz yaşları və iniltilərini görərək Tavifanı dirildib, onu dul arvadlara qaytarır.[4]

---

[1] Mötərizədə olan cümlə Patkanovda yoxdur.
[2] İncil. Dördüncü Çarliq kitabı, IV,34.
[3] İncil. Lukadan, VII, 12-16.
[4] İncil. Müqəddəs havarilərin əməlləri, IX, 39-41.

Beləliklə, əgər qohumların duaları kimisə ölümdən həyata qaytara bilirsə, demək Allahın qüvvəti daha da böyükdür!Buna görə də, əgər biz sağlar rəhm edən Allahdan kiminsə günahlarının bağışlanmalarını Allahdan gözləyə bilərlər.

# OTUZ ÜÇÜNCÜ FƏSİL

## Aquendə keçirilən məclisdə Albaniya çarı Vaçaqanın elan edilən qanunları[144]

Albaniya çarı Vaçaqanın hakimiyyəti dövründə əhali, yepiskoplar, keşişlər, əyanlar və rəiyyətlər arasında çoxlu mübahisələr baş verirdi. Buna görə çar qərara gəldi ki, Mareri ayının on üçündə Aquendə böyük məclis çağırılsın.[145]

Mən, Albaniya çarç Vaçaqan və Bərdənin baş yepiskopu Şulhalişo, Qəbələnin yepiskopu Manase, Haşunun yepiskopu Yunan, Uti vilayətinin yepiskopları Ananiya və Sahaq, Kalankatuk kəndinin[146] keşişi İosif, Bərdənin keşişi Toma, Göqçay keşişi Poqos, Tsri vilayətinin yepiskopu Şmavon, Darahoc keşişi Matte, Sazbaday keşişi Abikaz, Ayrmanuşay keşişi Urbat, keşişlər Uovel, Pərmudə Yaqub və Arsax vilayətinin əyan və qəbilə başçıları, Kalankatuk qəbiləsinin başçısı Bakur və bir çox başqaları hamılıqla mənim məclisimə Aquen adlı yaylağıma gəldilər.

Biz belə qərara gəldik:

1)Kəndə keşişləri ildə iki dəfə yepiskopa hörmət göstərməli, müqəddəs kitablar üzrə ondan dini nizamlarını öyrənməli və adəti üzrə ona ildə bir dəfə hədiyyə aparmalıdırlar.

2) Küşişvə ondan aşağı olan vəzifələrə təyin olunan zaman, yepiskopa keşiş dörd dirhəm, ondan aşağı olan vəzifəyə görə iki

dirhəm verməlidirlər.

3) Adlı – sanlı əyan və çar nəslindən olan şəxs ömrü boyu öz əliylə öz canı üçün bir yəhərli – qayışlı at və ya nə bacarsa verməlidirlər. Əgər həmən şəxs bunu ömrü boyu verməzsə, o, öləndən sonra bunu onun ailəsi etməlidir.

4) Xalq tərəfindən keşişə gətirilən torpağın bəhrəsi aşağıdakı qaydada verilməlidir: varlı adam[147] dörd cərib[148] buğda, altı cərib arpa və on altı bardaq şirin çaxır. Kasıb varlı verən taxılın yarısını, çaxırdan isə bacardığı qədər. Kiminki nə bağı var, nə də əkin yeri – ondan heç bir şey alınmasın. Kim ki, öz canının Cəhənnəmdən xilas olunması üçün artıq verər halal xoşu olsun. Havari Pavel dediyi kimi: “ İnsan nə əkərsə onu biçər”.[1]Kimin təsərrüfatında qoyun varsa – bir qoyun, üç qoyunun yununu və bir parça pendir verməlidir. Atı olan bir dayça, iribuynuzlu heyvanı olan isə buzov verməlidir.

5)Heç bir əsilzadə (azad), kəndli və ya başqa bir adam ölənlərin xatirəsini yad etmək üçün ildə bir dəfə özünə layiq nəzirini verməyi unutmamalıdır. Onlar öz gəlirlərindən ölənlər üçün pay ayırmalıdırlar. Əgər rəhmətə gedən şəxsin atları var idisə, onlardan kilsə payı olaraq istədiyi bir at, əgər iribuynuzlu mal – qarası var idisə istədiyi bir öküzü verməlidirlər.

6) Əgər rahiblik edən və ya rahib vəngdən( monastırdan) bir şey oğurlayar və bu əhvalat açılarsa, həmən adam mühakimə olunmalı və öz yerindən qovulmalıdır, ona ayrılan torpaq payı isə

[1] İncil. Havari Pavelin Qalatalara risaləsi, VI, 7.

kilsının xeyrinə alınmalıdır.

7) Əgər bir vəngdə keşişlərin sayı artıqdır, amma onun kilsəsinə mənsub olan dindarların sayı azdır və əksinə, əgər dindarların sayı çox, keşişlər isə sayca azdır, bu halda dindarları çox olan kilsədən bir qismini ayırıb sayı az olan kilsəyə verilməlidir.

8) Əgər hər hansı bir xaçpərəst kiminləsə dava edib onun qanını tökərsə, həmən adamı yepiskopun yanına gətirib onu qanunlara əsasən cəzalandırmaq lazımdır.

9) Böyük kənddə ibadət aparan keşiş ikinci kənddə xidmət göstərməlıdir. İki kiçik kənd biri – birinə yaxındırsa,onlar birləşməli və onlara bir keşiş xidmət göstərməlidir. Qoy keşiş idarə edə biləcəyi dindarlara xidmət göstərsin.

10) Heç kəs öz qohumu olan əmi və bibi nəvəsi ilə evlənə bilməz və qardaşının da arvadını ala bilməz.

11) Kim öz arvadını səbəbsiz boşayıb ikinci arvadla kəbinsiz yaşayırsa, kim cadugərlərə müraciət edirsə, bunları qatillə qanun pozanın əl–qollarını bağlayıb çar divanına gətirməli və işgəncələrdən sonra ölüm cəzasına məhkum olunmalıdır.

12) Əgər bir evdə ölü üçün yas saxlayıb ağlayırlarsa, evin sahibinin ağıçılarla birlikdə əl – qolunu bağlayıb çarın divanına gətirmək və orada onları cəzalandırmaq lazımdır. Ev adamlar qoy göz yaşlarını tökməsinlər.

13) Kim ölmüş heyvanın ətini, qırxgünlük pəhriz zamanı ət yeyirsə və ya bazar günü işləyib kilsəyə getmirsə, qoy onu keşiş

dindarların gözü qabağında cəzalandırsın.

14) Kim qırxgünlük pəhrizin ərəfəsində çərşənbə və ya cümə günü ət yeyərsə, bir həftə pəhriz saxlamalıdır. Amma əgər kimsə keşişin yanına gəlib pəhriz saxladığını təsdiq edərsə onda kəndxuda o adamdan bir öküz alıb keşişə verməlidir.

15) Əgər dindarlardan kimsə keşişi və ya ondan vəzifəsi aşağı olanı bir şeydə taqsırlandırarsa və onlar boyunlarına alsalar ki, bu ittiham ədalətli və düzdür, onda yepiskop onlara cəza verər və onlar kilsədə tövbə etməlidirlər. Lakin onlar həqiqəti danarlarsa və başqalarının bu haqda dedikləri təsdiq olunarsa, onlar qanunlar əsasında cəzalanıb kənddən qovulmalıdırlar. Əgər onların günahları təsdiq olunmazsa, onda keşiş gərək nahar ibadətini keçirsin və bu da onun günahsız olduğunun andı kimi qəbul olunur.

16) Əgər keşiş öz etimada layiq olan peşə yoldaşları şagirdləri tərəfindən bir cinayətdə taqsırlandırılsa, keşiş səcdəgah və ittiham edən dindarlar qabağında durmalıdır və kilsədən çıxarılıb kənddən qovulmalıdır. Əgər müəyyən olunsa ki, keşişin peşə yoldaşları və şagirdləri bütün bunları paxıllıqdan ediblər və camaat bilirdi ki, bunlar onunla küsülü idilər, onda keşiş nahar ibadətini keçirsin, dindarlar isə böhtançıları lənətə yağdırıb qovmalıdırlar. Amma əgər onlar hər şeyi boyunlarına alıb deyərlər ki, onlar keşişə böhtan atıblar, bu halda onların üzərinə tövbə etmək qoyulur, lakin vəngdən qovulmurlar. Lakin əgər bundan sonra onlar başqa bir zərər gətirərlərsə, onda hamısı qanunlara əsasən mühakimə olunmalıdırlar.

17) Sonra. Yepiskop və keşişlər çara əsilzadələrdən şikayət etmişlər ki, onlar hər kənddə iki və ya üç kilsə və vəng tikirlər. Əsilzadələr öz növbələrində qara fikirlərini söylədilər. Bundan sonra çar, yepiskop və əsilzadələr razılığa gəldilər ki, tikilmiş kilsələr yerində qalmalı,amma onlardan gələn xeyir və gəlirlər baş kilsəyə verilməlidir.

18) Qoy əsilzadələr kilsəyə verdikləri üşrün yarısını Baş kilsəyə, yarısını da öz kilsələrinə versinlər.

19) Hər bazar günləri həm ağa, həm də nökər bir yerdə ibadət üçün Baş kilsəyə gedib orada nahar ibadətini keçirsinlər. Hər bir qərib rəhmət qərib paylarını kilsəyə verməlıdirlər.

20) Əsilzadələr öz şəxsi mülklərindən yepiskopun xəbəri olmadan keşişi nə qova, nə də götürə bilərlər. Yepiskoplar da əsilzadələrin razılığı olmadan keşişləri nə təyin, nə də çıxara bilərlər. Keşiş, əsilzadə və ya dindarlar tərəfindən ona qarşı təhlükə olarsa belə, yepiskopun icazəsi olmadan öz yerindən getməməlidir.

21) Əgər əsilzadə öz kilsəsində səcdəgah qurmaq və oraya qaxımış cəsəd gətirmək və ya nahar ibadətini keçirmək istəsə, bunları o, mümkünsə yepiskopun icazəsilə etməlidir. Kim ki, bunları yepiskopun icazəsilə edir, ona uğurlar olsun. Kim ki, bunu yepiskopun icazəsi olmadan edir, o, kilsədən uzaqlaşdırılır və yepiskopa mümkün miqdarda cərimə gətirir. Yalnız qanunlar təyin edən cəriməni gətirdikdən sonra o, xeyir – dua ala bilər.

Bütün bu şərtləri yepiskop, keşiş və əsilzadələr çarın

hüzurunda müəyyən etdilər.Qoy çar, onun xanımı vəoğlu yepiskop, keşişlər və bütün kilsənin duaları ilə xoşbəxt olsunlar. Qalan camaat və bu məclisə toplaşanlar da xoşbəxt olsunlar.

Bu qanunlara çarın vəzirləri Mutak, sərkərdə Mirhərik, qəbilə başçıları Marut, Tirazd, Asparakos, Şama, Bakur, Ratan, Arğeş, Girdımanın[149] sahibi Cəsur Vardan, Xurs, Bermusan, Xosken, patriarx Pivroq və Albaniyanın bütün əsilzadələri qol çəkdilər və qanunları Albaniya çarı Vaçaqan öz möhürüylə təsdiq etmişdir.

# OTUZ DÖRDÜNCÜ FƏSİL

## Şəhidlərin Dizəpaya dağında zühur olması və onların qaxımış cəsədlərinin Abbasın katolikosluğu vaxtında[150] əldə edilməsi

Dizəpaya dağında yerləşən Kataroy vəngindəki sovməə düşmənlər tərəfindən hələ Abbasın bu Albaniya ölkəsinin katolikosluğuna[151]seçilməsindən qabaq yandırılmışdır. Çar Vaçaqanın və Amaras yepiskopu Qarnikin dövründə bu dağda müqəddəs Moisey, müqəddəs Daniyel və müqəddəs İlya zühur etmişlər. Bunlar masagetlər çarı Sanesanın övladları idi və müqəddəs Qriqorinin başqa 3870 gənc kimi şagirdləri idi. Təqib olunanda onlar qaçıb Dizəpaya dağında gizlənib, özlərinə yurd saldılar. Lakin qaniçən Sanesan onları yaxaladı və Navasard ayının[152] doqquzunda hamısını qılıncdan keçirdi.

Qoy Allahın şəhidlərinin havadarlığı ilə əbədi olaraq bu Albaniya ölkəsinə[153] rəhmi gəlsin.

Albaniya ölkəsi tarixinin Birinci kitabı burada bitir.

# İ K İ N C İ  K İ T A B

## BİRİNCİ FƏSİL

## Ölkənin Xəzərlərin talanedici basqınları nəticəsində dağılması və Albaniya katolikosunun taxtının Çoladan köçürülüb Böyük Bərdə şəhərində bərqərar edilməsi

Bu hadisələrdən sonra xəzərlər Albaniya ölkəsini əsarət altına aldılar.[1]Kilsələr və müqəddəs kitablar yandırıldı. Sonra şahlar şahı Xosrovun[2] padşahlığının və erməni təqviminin ikinci ilində[3] ölkəyə soxulmuş İsa Xaçının düşmənlərinin talanların nəticəsində Albaniya katolikosluğunun taxtı Çola şəhərindən ölkənin paytaxtı olan Bərdə şəhərinə köçürüldü. Böyük Arran vilayətindən olan Abbas katolikos seçilmişdi. O, Katolikos taxtında qırx dörd il oturandan və müqəddəs ömür sürəndən sonra əbədiyyətə qovuşdu.

# İKİNCİ FƏSİL

## Behikin röyası

Abbasın katolikosluğunun birinci ilində mən, ləyaqətsiz Vehik, yuxumda naməlum, əlində Müqəddəs xaçı olan tərki – dünya bir zahid gördüm. O, məni öz adımla səslədi. Mən soruşdum: “ Sahibim, sən kimsən?” O dedi:” Mən Pavlosam. İndi yanıma gəl və bu xaça başını əy, amma ona toxunma”.

Yuxudan ayılanda mən buna əhəmiyyət vermədim. İki ildən sonra yuxumda müqəddəs Varosu gördüm. O, zahid paltarında idi və mənə dedi:” Biz, qaxımış cəsədlər, Arsax vilayətinin Mahan elinə

mənsub olan Qalsət çölündə basdırılmışıq. Burada birinci şəhid Stefanın, şəhid Feodosinin, müqəddəslər Varosun, Mamasın, Mar, Sarqisin, şəhid Qeorqun, Kozmanın, Damianın cəsədləri və qırx şəhid[4] cəsədlərinin bir qismi var". Yuxuma həmin surətdə kişi girdi və mənə dedi:" Mən xilaskardan rica etdim ki, cəsədim itib batmasın. Kim ki, bu müqəddəs xaçın zərrəciyini almaq istərsə, bunu alabilər. Orada bu xaçın və İsa üstündə əzab çəkmiş xaçın da zərrəcikləri var".

Mən, Vehik, bunlara çox təəccüb etdim, çünki bu yuxunu yeddi il dalbadal görürdüm. Ona görə mən ən mərhəmətli Allaha və müqəddəs şəhidlərə yalvarıram ki, bu röyanın sirrini mənə açsınlar. Həmən röya təkrar gəldi və məni cəsədləri çıxarmağa təhrik etdi. Cəsədlər: " Biz hələ də əziyyət içindəyik", -.deyirdilər.

Bundan sonra mən Vehik, durb getdim müqəddəs katolikos Abbasın hüzuruna və ona şərəfli şəhidlər haqqında danışdım. Bunu eşidən katolikos ölməz Allahı şükranə duaları ilə təriflədi və təcili yanına Tirıdən olan keşiş Danili göndərdi ki, o, əcaib sirlə şəxsən özü tanış olsun. Həmən mömin Danil, keşiş Boh və kitab hərisi İyezekil ilə birlikdə təcili yola düşdülər və tezliklə Kalsetə, mən Vehikin yanına gəldilər. Bu şadlığa – bizim köməyimizə çoxlu başqa adamlar da gəldi, məsələn: Momharekdən rahib Abbas və onun dindar yerliləri,keşiş Markos öz peşəkarları ilə, Karmalin çölündə yerləşən müqəddəs İoann adna vəngdən keşiş Tirit və çoxlu dindarlar. Onlarla birlikdə biz ibadət etdik və ricalarda olduq. Bundan sonra yeri qazdıq və insan boyunda quyu açan kimi, ordan

ətir saçan və müqəddəs Xilaskarın:" Məgər şam qabın altına qoymaq üçün gətirilir"[1]sözlərinə uyğun olaraq gizli xəzinə üzə çıxdı. Öz sadiq bəndələrinə Allah çırağı aşkar etdi və həsrət çəkən ürəklərə sönməz ziyanın nurunu verdi. Bu cəhətlərin əldə edilməsinə Allah bu Albaniya ölkəsinə öz mərhəmətini iqrar etdi, mənzərəli Karset çölünə isə ətirlik gətirdi.

Bütün dindar qardaşlığı Allaha şükür edib, müqəddəsləri təriflədi və orada onların hamısı cəsədlərin zərrəciyindən götürüb qiymətli qutulara qoydular. Cəsədlərin böyük hissəsini keşiş Danil götürdü və bu qiymətli hədiyyələrlə katolikos Abbasın yanına gəldi. Abbas hədiyyələrə görə həddindən artıq sevindi, müqəddəs cəsədlərin gəlməsi münasibətilə bayram keçirdi və cəsədləri xüsusi və pak sandıqçaya yerləşdirdi.

Bu son sözləri qələmə alan mən, Adrian, dua edirəm ki, mənim oxucularım məni ən ləyaqətsizi yad etsinlər və yaddan çıxarmasınlar ki,dünyaya ziyanın şüaları katolikos Abbasın günlərində saçılıb. Elə bu səbəblərə görə də qoy Allah öz ulu mərhəmətində onlara yol göstərən Vehiki də yad eləsin. Bizləri yad edən sizlərə isə qoy İsa müqəddəs şəhidlər naminə mükafatını indi və əbədiyyətdə versin. Amin ![5]

# ÜÇÜNCÜ FƏSİL

[1] İncil.Markdan, IV, 21;Matfeydən, V, 15.

## Erməni katolikosu İovannesin[6] dinin möhkəmlənməsi haqqında Albaniya katolikosu Abbasa məktubu

"Mənim xeyirxah, ədalətli, Allahsevər və sevimli qardaş və peşə yoldaşlarıma – Albaniya katolikosu cənab Abbasa, bahalat yepiskopu Moiseye, Qələbə yepiskopu Qriqora, Amaras yepiskopu Hromrika, Balasakan(Beyləqan) yepiskopu Trimoteye, Şəki yepiskopu Ambakuma, Girdiman yepiskopu Yovhankaya Böyük Konqmank yepiskopu Qevonda – ermənilər katolikosu İovannes, Taron yepiskopu Abraham, çar iqamətgahının yepiskopu Qriqor, Tayk yepiskopu Stepannos, Orxorunik yepiskopu Maştos, Vənənd yepiskopu Givt, Assuriya yepiskopu Abdişo, Amatunilərin yepiskopu Rap, Rştunilərin yepiskopu Kristofor, Mokk yepiskopu Sekundos və bütün qalan erməni yepiskoplarından salam və ehtiram!"

Bizə dərdli xəbərlər çatıb ki, qoyun dərisi bəzi yırtıcı canavarlar murdar Pyoturun vəngindən çıxıb sizin ölkənizə gəliblər. Hərçənd onlar özlərini "kasıbsevərlər" adlandırıdılar, həqiqətən isə belədir ki, onlar İsaya nifrət Üç Uqnumu isə rədd edirlər. Onlar lənətə gəlmiş Nestorun[7] və Xakkedon qurultayının[8] şeytan zir-zibilini günahsız və pak canlara maneəsiz yeridi, onlatrın üzünü pak dindən döndərib əbədi ölümə məhkum və yenidən dirilmə ümidindən məhrum edirlər. Bəndələrinə və canlılarına sağlmaz bəla gətirən zərə haqqında eşidib, biz qərara gəldik ki, qəti inadla

köməyinizə gələk və məktubda müqəddəs havarinin bu sözlərini yadınıza salaq:” Özünüzə və müqəddəs Ruha sizi nəzarətçi qoyduğu sürüyə qulaq asan”[1], O, sizi həm də müəlli qoyurdu və biz sizin yadınıza xaçpərəst dinində möhkəm olmağı da salırıq ki, bu möhkəmliyi bizim atalarımıza müqəddəs Qriqorinin və üçqat xeyir-dualı qurultayların:Nikeyada, 318 yepiskopun iştirakıyla[9], Konstantinopolda, 150-nin iştirakıykla[10] və Efesdə, 200 iştirakı[11]( cəmi 668 yepiskop iştirak edirdi)[12] vasitəsilə müqəddəs kitabdan – Əhdi Ətiq və Əhdi Cədiddən alıblar və və biz bunların hamısından razı qalıb, onlardan bütün Xristos kilsələrinin inamı olan xaçpərəst dinini irsən almışıq.

Biz tək bir Allaha, Qadir Ataya, Bütün varlığın xaliqinə, bir hakimə, Allah oğluna, Atadan doğulana, həqiqi Allahdan həqiqi Allaha, İsaya etiqad edirik. Biz Atadan törənən, Ata, Oğul və Müqəddəs Üç Uqnumla bir yerdə hörmət və tərif edilən, xilqətdə və bir kamil varlıqda birləşən, şərəflə və qüvvətlə bütün məxluqatın qayğısına qalan Müqəddəs Ruha inanırıq. Və ən nəhayət, Allahın əbədi Kəlamı Tanrı olub, kamil və dəyişməyən, sözlə təsvir edilə bilməyən Müqəddəs Bakirənin doğduğu, öz varlığından ayrılmayan və cismən çürüməyən və həmişə Mən Varam qalan İnsana döndü və həmən dəyişməz Allah onda qismən yox, bütövlükdə, ikili yox, intəhasız birliklə təcəssüm edilir. Təcəssüm olunan Ata yox, Oğul oldu, bütöv cisim olan Müqəddəs Ruh yox, Atadan Vahid doğulan

[1]İncil.Müqəddəs havarilərin əməlləri, XX, 28.

olub və bu Atanın iradəsi və Müqəddəs Ruhun qüvvəsilə olubsa da, yalnız Allah kəlamının vasitəsilə olub. Müqəddəs milad məhz belə anlaşılır. Nəhayətsizliyin özü bələkbağıya sarınmışdı ki, böz dəyanətə sarınaq; O, yem qutusuna qoyulmuşdu ki, biz öz heyvanlığımızdan qorxmayaq; O, mələikələr tərəfindən təriflənmişdi ki, biz onlarla birlikdə tərənnüm edək;O, cadugərlər tərəfindən mükafatlanmışdır ki, biz də İnamı bar verməyə məcbur edə bilək; O, süddə yetişdirilib ki, biz günahlardan azad ola bilək; O, cismən kamil böyümüş ki, biz də İsanın kamilliyinə çata bilək; O, könüllü olaraq bütün iztirablara tab gətirmiş ki, biz günahların əzabından qurtara bilək; O, çarmıxa çəkilmiş ki, biz həyat bəhrəsinə layiq ola bilək; O, öldü ki, onun ölümü ilə bərabər Ölüm də ölə bilsin;O, məzara qoyuldu ki, Cəhənnəmin qıfıllarını parça – parça edə bilsin; O, üçüncü gündə dirildi ki, bizi həyata apara bilsin; O, səmalara ucalıb Atanın sağ tərəfində oturdu ki, biz də sağ tərəfdə oturmağa layiq ola bilək;

O, diriləri və ölüləri mühakimə etmək üçün yenidən qayıdacaq və onun hakimiyyətinin sonu yoxdur.

Buna görə də biz inanır, səcdə edir və tərifləyərək deyirik:" Müqəddəs Allah, müqəddəs və ən qüvvətli, müqəddəs və ölməz, günahlarımıza görə çarmıxa çəkilmış- bizə rəhmin gəlsin!" Kim ki, buna inanmırdı, müqəddəslər tərəfindən lənətlənmişlər, necə ki, biz, İsada iki təbiət və iki sima var, Müqəddəs Bakirə Allahı yox, bizə bənzəyən bir insanı doğub həyasızcasına israr edənləri, qədim və

müasir kafirləri – Ayriyi[13], Samosatlı Paveli[14], Manini[15], Markianı[16],murdarNestorini[17] və Feodoriti[18], ziyanlı və küfrlə dolu Xalkedon qurultayını və papaz Levin yəhudiliklə dolu risaləsini[19] lənətləyirik.

İsrar edənlərin elələri də var ki, onlar İsa yerdə olanda göylərdə mövcud deyildi deyirlər; çarmıxa çəkiləndə o, şərəf taxtında oturmamışdı: qərbdə olanda O, Atanın sağ tərəfində yox idi. Allah belə fikirdə olanlara lənət etsin. Buna inanıb razı olanları da biz də indi lənətləyirik.

Biz sizin yanınıza sədaqətli keşişimiz Matteni göndəririk ki, bu məktubu sizə çatdırsın. Sizə havari İoannın sözlərini xatırladırıq: " Kim sizə gəlib bu elmi gətirmirsə onu evinizə buraxmayın və ona salam verməyin, çünki onu salamlayan onun şər işlərinə şərikdir."[1] " Və hər bir ruh cisimli canlı gələn kimi İsaya inanmırsa, bu ruh Allahdan yox, Dəccəlin ruhudur".[2] Belələrini öz sıralarınızdan qovun və onların məhvedici təlimlərinə qulaq asmayın.

"O vaxtdan ki, sizin atalarınızbizim atalarımızla yekdin olub, siz də bizimlə bir imana bağlısınız, biz istəyirik ki, sizin üç və ya dörd yepiskopunuz bizim tərəflərə gəlib həqiqi elmi öyrənsinlər ki, nə bir keşiş həlak olsun, nə də onun kilsəsinə mənsub olan dindarlar itib batsınlar və həm səmalarda olan məlaikələr və həm də yer üzündə yaşayan biz – İsanın qul və pərəstişkarları yaxşılıq üçün sevinsin. Sizə Allahın salamları!

---

[1] İncil. Havari İoannın ikinci risaləsi, II, 10-11.
[2] İncil. Havari İoannın birinci risaləsi, IV,3.

# DÖRDÜNCÜ FƏSİL

## Yuxarıdakı məktubu Albaniya katolikosu ağamız Abbas alandan sonra kafirlərin təqib olunması və Albaniyadan sürgün edilməsi

Hər tərəfdə acı qarışıqlıq salan Xalkedon ümumkilsə qurultayının lovğa, dəyərsiz  və küfrlə dolu fitnəsi Allahın səbirli olmasından dolayı bütün dünyanı əhatə etdi, onun yalançı təlimi daha da qüvvətləndi və bu təlimin səthi ehkamlarına heyran qalanların çoxunun ruhu əbədi zülmətin içinə qərq olunmağa məhkum oldu.

Bu təlimin alaq otları bu Albaniya torpağında da kök saldı. Bu zaman Albaniya katolikosu ağamız Abbas və onun məktubda adları çəkilən bütün yepiskopları ciddiliklə bu küfrü təftiş edib və onu yayan murdar Tovması, Zəbur surələrini oxuyan Binəti, İbası və başqalarını Albaniyadan ucqar torpaqlara qovdular. Beləliklə, Allahın mərhəməti sayəsində ruhanilər arasında əmin – amanlıq bərpa olundu.

Lakin o zamanlar mübarizələr alovunun ən qızğın çağları idi.

# BEŞİNCİ FƏSİL

## Barbar xalqlarının basqını. Aləmi sarsıdan müxtəlif hadisələr və ölkələrə bədbəxtlik üz verməsi haqqında hekayə

Görün uzaq və yaxın dünyanın diqqətini cəlb etmək üçün mən[1] necə əcaib hadisələr haqqında söhbət etmək istəyirəm! Bu hadisələr heç də keçmiş əsrlərin müxtəlif yerlərdə və müxtəlif xalqlar arasında alovlanan cürbəcür müharibə və hərc – mərclik dövrlərinin hesablamaları ilə müqayisə etmək olmaz. Bütün bunlar çoxlu təfsilatlar və dəyişmələri ilə Müqəddəs Ruh tərəfindən qabaqcadan nizamlanmışdır. Nə dünyəvi və ya ilahi qüvvələrlə bağlı və əfsanələrlə dolu fəsahətli yunan əsərlərində, nə də fəlsəfədə bunlara bənzər heç bir şey tapmaq mümkün deyil. Çünki başımıza elə bəlalatr gəldi ki, onların barəsində bizim Xilaskarımız həyatverici Kitabında çoxdan xəbərdarlıq etmişdi və əziyyətli günlərində on iki seçilmiş şagırdinin qulaqlarına çatdırmışdı: " Həmçinin müharibələr və hərbi xəbərlər haqqında eşidəcəksiniz. Baxınız, dəhşətə gəlməyiniz, çünki bunların hamısı olmalıdır. Amma bu hələ son deyil:çünki xalq xalqın üstünə qalxacaq, padşahlıq padşahlıq üstünə: müəyyən yerlərdə aclıq da olacaq, azar da, zəlzələlər də. Günəş də tutulacaq, Ay da öz işığını verməyəcək, ulduzlar da göydən düşəcək və səma qüvvələri sarsınacaq.[2] Axı, Allah bizə xəbərdarlıq edib

---

[1]Yəni müəllif.

[2] İncil. Matfeydən, XXIV,6-7,29; Markdan, XIII, 7-8.

demişdi:” Ayıq olun, çünki nə gününü bilirsiniz nə də saatını”.[1] İndi isə dünyada olan bəlalar nəticəsində mənim fikrim dumanlara qərq olub, niyyətlərim də pozulub, mən hekayətimin ardıcıllığını yaddan çıxarıb Peyğəmbərin dediyi kimi:” Mən öz çörəyimi yeyəcəyimi yaddan çıxarıram. Səsimin ah - zarından” [2] qərara gəldim ki, Albaniyada cərəyan etmiş vaxtdan və hadisələrdən başlayım. Amma indi hələ ki, bu ana qədər bizi əhatə edən qorxunu və dəhşəti kənara qoyaraq, biz hadisələrin nizamlı təsvirinə qayıtmalıyıq, çünki görürük ki, çoxları bizi əhatə edən Barbar düşmənlərin saysız – hesabsız basqınları haqqında bilmək istəyir.Bununla yanaşı, böyük və əcaib əlamətlər barəsində eşitmək istəyirlər, çünki bunların köməyilə ulu və insansevər Allahın əli gözlərimiz qabağında həlak olan düşmənlərimizi cəzalandırdı. Və keçmiş zaman bizdən keçmişlər haqqında ardıcıl izahatı tələb etdiyi üçün, öz hekayətimizi biz ağamız İsanın mehekan ayıda zühur edilməsini 18- ci nahancın birinci ilindən başlayıram, bu da şahlar şahı – IV Hürmüzdün oğlu II Xosrovun hakimiyyətinin otuz beşinci ilinə təsadüf edir.[20]

# ALTINCI FƏSİL

## Ziyanlı Xalkedon qurultayının lənətlənməsi dövrü haqqında məlumat. Albaniya küfrdən necə toxunmaz

[1] İncil.Matfeydən, XXV, 13.
[2] Zəbur, CI, 5-6.

**qaldı. Gürcülərin ermənilərdən ayrılması və katolikos Abraham albanlar barəsində nə kimi tədbirlər gördü**

Ermənilər xaçpərəstliyə Roma təqviminin qırx üçüncü ilində dönüblər[21]. Albaniya isə xristianlığı ermələlərdən 270 il qabaq qəbul edib[22]. Ermənilər xaçpərəst olandan yüz səksən il sonra, erməni katolikosu Babıgenin vaxtında[23], ( Dvində), dünyaya təşvişə salan Xalkedon qurultayı məsələsinə dair yerli qurultay çağırılmışdı[24]. Dindar yunan imperatorları Zenon və Anastasiusun əmri ilə Yunan, İtaliya, Erməniyyə, Albaniya və İberiya birlikdə biabırçı Xalkedon qurultayını və papaz Leonun risaləsini lənətlədilər[25]. Səksən yeddi il sonra erməni katolikosu Abrahamın vaxtında[26] gürcülər lənətə gəlmiş Kürionun vasitəsilə və onlarla birlikdə Yunan və İtaliya ermənilərindən ayrıldılar[27]. Lakin Albaniya pravoslavlıqdan əl çəkməyib hələlik ermənilərlə bir yerdə qaldı. Buna görə Abraham öz risaləsində Kürionun dönüklüyünü bütün adamlar arasında pisləyib onu dini qılıncla hamıdan ayırır[28]. Əvvəlcə bu haqda o, Albaniyaya xəbər göndərir və aşağıdakı məktubu yazır:”Albaniyanın ( katolikos) taxtı Erməniyyədəkindən qabaq təsis olunub[29] və fikirlərində bənzəyiş var. Biz albanları köməyilə keşişlərin yunanlara verdiyi, qiyamətə qədər etibarlı olan höklərinə görə Kürionu lənətləyib rədd etdik. Biz və albanlar, gürcülər haqqında aşağıdakı qərarları qəbul etdik: onlarla heç bir təmasda olmamaq – nə ibadətə, nə yeməkdə, nə içməkdə, nə dostluqda, nə uşaqların tərbiyəsində, nə onların Mtsxeqdə, nə də Manqlisdə[30] olan xaçlarına ibadətdə, onları bizim

kilsələrə buraxmamaqda, nə də onlarla qohumluqda. Onlarla yəhudilərlə olduğu kimi yalnız alış – verişdə təmasda olmaq olar.

Əgər bu qadağana baxmayaraq kimsə onlarla təmasa girsə, qoy o adamın canı və başı lənətlənib ömrü boyu Allaha kilsəsindən qovulsun. Qoy bu qərarları pozan Zülmətə qərq edilib Cəhənnəmə vasil olsun!"

# YEDDİNCİ FƏSİL

## Yunanların ermənilərin kilsəsində doqquz rütbənin olmaması barəsində ermənilərə etirazları; Ermənilərin Albaniya katolikosunu özlərinə arxiyepiskop kimi tabe etmək təşəbbüsləri[31] və albanların buna qəti etirazı. Sünikin ermənilərdən üz çevirib albanlar tərəfinə keçməsi və onlardan kilsə rütbəsini və kilsə yağını almaları

Markian Yunanlar üzərindəki bütün fəsadlı hakimiyyəti dövründə[32] öz yaramaz arvadı, devrilmiş Nestor küfrün havadarı olan Pulheriya[33] tərəfindən aldanaraq, Xalkedon qurultayını çağırıb xristian dininin əsaslarını dağıtdı. Bundan sonra həmin qurultayın tərəfdarları dəfələrlə ermənilərlə mübahisəyə girib onları tabe etmək istədilər. Bəzən bu tabeliyi məktublar vasitəsilə, bəzən də üzbəüz oturaraq birinci dəfə Konstantinopolda, ikinci dəfə isə Feodosiopolda onlar azmış erməniləri öz tərəflərinə çəkmək istədilər. Hərçənd imperator əmrilə yığılan yunan din xadimləri əmin idilər ki, öz

zəngin dilləri və gözəl danışma qabiliyyəti sayəsində onlar qalib gələcəklər, lakin onlar da ləyaqətli cavablar alırdılar. Çünki artıq ermənilər də savadlanmışdılar və onların arasında yunan dilini bilənlər də var idi.

Ermənilər hər yana xəbər yaydılar ki, Mayraqomlu İovan yunanların tərəfdarı olub ermənilərin əleyhinədir[34]. Bu böhtanın təşəbbüskarı sonralar erməni katolikosu olan Solomon adlı bir rahib idi[35]. Bu Solomon öz müəllimi Makenos vəngin keşişi Solomondan bu barədə soruşdu və o da aşağıdakını yazıb öyrədirdi: “ Ermənilər inam cəhətdən yunanlar tərəfindən məğlub edilməlidirlər, ancaq onlar yunanlara bu məsələdə məğlubiyyətə uğradılar. Yunanlar deyirlər:” Allah kilsələri doqquz rütbə ilə yaratdı və bu rütbələrin yer üzündəki ardıcıllığı mələklərin göydəki ardıcıllığı kimidir[36]. Yerdə belədir:katolikos, yəni baş keşiş, arxiyepiskop, yəni baş yepiskop, mitropolit, yepiskop, keşiş, dyakon, dyakon köməkçisi, İncil oxuyan və Zəbur oxuyan. Bunların hamısı bir yerdə katolikos seçə bilərlər, katolikos isə bunların hamısını təyin edə bilər.

Buna görə də, əgər siz səmimi – qəlbdən Allaha inanırsınızsa, onda dediyiniz, sizin patriarxınız kimdir, çünki yer üzündə cəmi dörd kilsə başçısı patriarx taxtı vardır: İskəndəriyyədə - Markın taxtı, Antakiyada – Matfeyin, Romada – Lukanın və Efesdə - İoannın[37]. Bu kainatın dörd tərəfinə, Cənnət çayının dörd axarına, heyvanların dörd növünə, dörd Zəbur oxuyana və Musanın dörd qanunlarına ( çünki İkinci qanunçuluq – Musanın beşinci kitabı ayrı sayılır) müvafiq

edilmişdir. Biz onların hamısına tabe oluruq və bizimlə bir din olmaq üçün onlardan birinə və ya hamısına tabe olunuz. Sizin müqəddəs Qriqoriniz Qeysəriyyədə arxiyepiskop rütbəsinə layiq görülmüşdür və bu qayda ondan sonra olanlar üçün də bu günə qədər saxlanılır. Əgər siz tamam ayrı bir kilsəyə mənsubsunuzsa, onda indiyə qədər bizə tabe olan sizin arxiyepiskop bu gün kimə tabedir?[38] Yox, əgər sizin katolikosunuz, nə də kilsənizin bütün rütbələri yoxdursa, onda aydındır ki, Ariy və başqa barbarlar və başqa dinə mənsub xalqlar kimi siz də dönük kafirlərsiniz".

Bütün bunlara cavab tapmayan ermənilər məğlub oldular. İmperator Yustinian öz hakimiyyəti dövründə müqəddəs İoann Zəbur oxuyanın qaxımış cəsədini Konstantinopola gətirib[39] oradaca da patriarx taxtını bərqərar etdi, baxmayaraq ki özünün əsas taxtı Efesdə qaldı. Həmin minvalla o, Matfeyin taxtını Antakiyadan Qüdsə, dediyi kimi " ulu Çarın şəhərinə"[1]aparır. Lakin onun əsas taxtı Antakiyada qaldı. O zamandan həddindən artıq fəallaşan iddialılar oldu ki, harada bir havari vəfat edən kimi bu yeri patriarx məskəni kimi elan edirdilər. Və onların tərəfindən belə bir qayda qoyulan kimi, biz də öz patriarx taxtımız barəsində fikirləşdik.

İranlılar və yunanlar Erməniyyəni öz aralarında böldülər[40]. Baş keşiş Movses Dvində oturmuşdu[41]. Yunanlar isə ona qarşı taxtda İohan adlı birisini oturtdular[42]. Katolikosluq iki yerə parçalandı. Buna görə Sünik xalqı hər iki katolikosluğa nifrət edərək ölkələrinin

[1] İncil. Matfeydən, V,35.

yepiskopu olan Pyotrun vəsiyyətilə müqəddəs Qriqorun taxtının bərpa olunmasına qədər idarə etdiyi Sünik kilsəsinin yepiskoplarının xeyir – duası ilə Albaniya katolikosları tərəfindən təyin olunmalı idilər[43]. Buna görə yepiskop Vrtanes Sünik yepiskopluğuna Albaniyanın müqəddəs patriarxı Zəkəriyyə tərəfindən təyin olunmuşdu və bundan sonra Sünik ildən – ilə müqəddəs mərhəmi albanlardan alırdı. Belə vəziyyət düşmənçılık aradan qaldırılana qədər davam etdi və erməni katolikosuğu yenidən birləşdi və taxtına Abraham oturdu[44]. O ki qaldı kilsənin doqquz rütbəsinə, deməliyik ki, kilsə əyanları özbaşına və ermənilərin qaba xasiyyətinə uyğun olaraq Abrahamı katolikos təyin etdilər. Albaniya kilsəsinin başçısı arxiyepiskop , gürcü kilsəsinin başçısını isə mitropolit.

Belə olduqda gürcü kilsəsinin başçısı Kürion üsyan edib öz etirazını bildirdi. Lakin Abraham dedi ki, albanlar xristianlığı gürcülərdən qabaq qəbul ediblər, buna görə də arxiyepiskop rütbəsi onlara çatır. Bu mübahisənin nəticəsi olaraq gürcülər pravoslavlığı atıb Xalkedonçuluğa keçdilər[45].

Yunan sərkərdələri əvvəlcə onları təhrik edirdilər ki, albanlar üzərində başçılığa nail olsunlar. Lakin albanlar razı olmayıb qədim zamanlarda Albaniyaya gəlmiş, İsanın şagirdlərindən biri olan və İsanın qardaşı Yaqub tərəfindən də katolikosluğa təyin edilən məşhur havari Yeliseyin adını çəkdilər. O, Albaniyada xristianlığı təbliğ edib və orada, Gişdə bütün Şərqdə olan kilsələrin ulu anası olan kilsüəni bina edib[46] və o zaman ermənilərdə kilsəyəbənzər heç bir şey yox

idi.Albanlar öz dəlillərini irəli sürüb ermənilərdən ayrıldılar ki, bundan sonra daha heç kəsə tabe olmasınlar[47]

Yunanlar təkəbbürlə deyidilər ki, ermənilərin nə yepiskopları, nə də mitropolitləri var və buna görə də onlar qərara gəldilər ki, Mardpet yepiskopunu (Teodorusu ) mitropolit təyin edib, ona yalnız xaçla rütbə verdilər, amma yepiskopların təyinatına heç bir hüquq vermədilər. Mardpet mitropoliti xahiş etdi ki, ona bir, ya iki yepiskop ayırsınlar, lakin kilsələrin əyanları buna razı olmadılar. Onlar qorxurdu ki, təzəliklə birləşən iki katolikosluq yenidən parçalansın.

Sonradan Sünik hakimlərinin Allahın ehkamlarına tabe olmalarını, Sünik kilsələrinin keşişlərini savadlı və hər cəhətdən hazırlıqlı olmalarını görərək kilsə başçıları onlara Erməniyyə mitropolitləri rütbəsiylə birlikdə yepiskopluq əsasını gəzdirmək hüququnu verdilər və şərt qoydular ki, süniklilər öz rütbələrini yüksəltməsinlər və öz kilsələrinin başçısını arxiyepiskop elan etməsinlər. Amma ölkənin sakit qalması üçün onlara köhnə adətlərini saxlamağa icazə verdilər ki, orada yenidən nizamsızlıq yaratmasınlar. Buna görə də süniklilər dini mərasimlər vaxtı özlərini arxiyepiskop adlandırmırlar və ermənilərin məktublarına cavab yazanda da bunu etmirlər. Əgər arxiyepiskop rütbəsi elan olunmuş olunsaydı, onda bu rütbəylə də imza edərdilər, ancaq madam ki, belə elan olunmayıb, onlar da özlərini arxiyepiskop adlandırmırlar.

Mitropolit qarşısında xaçı daşımaq Allah şərəfidir və Onun adı insana xaç və ibadət vasitəsilə daxil olur.

Beləliklə, kilsənin doqquz rütbəsi təsis olundu və Sünik keşişləri məktublara “Dini atanız”, erməni katolikosları cavab olaraq, “Sizin qulunuz ” sözlərini yazırdılar. Sonralar katolikos İlyanın Albaniyada olduğu vaxt kobud hərəkəti nətəcəsində[48] ermənilər “Sizin qulunuz” sözlərini yazmaqdan imtina etdilər, süniklilər isə “Dini atanız” sözlərini daha işlətmədilər[49].

İşlərin əsl həqiqəti belədir”.

# SƏKKİZİNCİ FƏSİL

## Amaras yepiskopu Mxitarın məktubunda olan bəzi küfrlü sözlərə ermənilərin cavabı

“Sizə, – öz təkliflərində könüllü güzəştə gedən, yaraşmayandan vaz keçən və sözgəlişi, öz iradələrinizdə Afina keşişlərinə bənzər və bərabər olan Albaniyanın olduqca nəcib və hörmətli kilsə əyanlarına! Sizə, şimalda müasir dövrün yeni tələbə və tarixçiləri olub, diqqətlə bütün hadisələrin gedişatına fikir verən - sənə, Amaras yepiskopu Simeona, Müqəddəs kilsənizin başqa həmfikir yepiskoplarına, azad adamlara və Albaniya xalqının başqa nümayəndələrinə!

Biz – erməni katolikosu Abraham, Mardpet yepiskopu Teodoros, Bacrəvan yepiskopu Stepannos, Sünik yepiskopu David, Xorxorinik yepiskopu Movses, Apahünik yepiskopu Kristafor və

başqa yepiskop, keşiş və azad adamlar Allah naminə hərarətli dua və yalvarışlarla sözə öz səmimi salamlarımızı göndəririk.

Bizə yazdığınız məktubda öz müqəddəs ibadətləriniz və təxminən nə kimi insanların nə kimi ziddiyyətlər yarada bilmələri məsələsinə dair öz istəkləriniz haqqında bəhs etdiniz. Həmin məktubu biz Sünikin Qriqor adlı əyanı vasitəsilə aldıq. O, həmçinin bizə sizin Allahın həqiqi yolundan öz döndərən bir xadiminizdən söhbət etdi. Sizin möminliyə can atmağınızdan və bizim müqəddəs cədlərimizin din və iman yolları ilə getmək arzunuzdan biz, əlbəttə, xəbərdarıq. Ondan ziddiyyətlə dolu aldığımıza baxmayaraq, biz səbirli qalaraq bizi və sizi cədlər arasında olan səmimi dostluq naminə bu məsələlərdə güzəşt yolunu seçmişik.

Siz öz məktubunuzda öz inamınız haqqında qısaca danışdınız, biz də bunu müzakirə edib Müqəddəs Ruhun nəzəriyyəsiylə müqayisə edib sizin imanınızın həqiqətdən harada uzaqlaşmasına və ya ona uyğun gəlməsini görmək istəyirik. Sən səhv hesab etməyin barəsində mənə öz fikrini izah et və özün də irəlidə durmada tərəddüd etmə, çünki belə şeylər Allah kilsəsinin adətində deyildir.

Bir neçə zəif ibarələrdən sonra sizin məktubunuzdan bilindi ki, siz bizi bir adamın sözünə inandığımıza təqsirləndirirsiniz. Deyirsiniz ki, bu adam dar düşüncəlidir və buna görə də bizim hərəkətimiz yersiz və mənasızdır və təkidlə qeyd edirsiniz ki, “ biz dində və imanda heç də sizdən a.ağı deyilik, çünki havarilər və müəllimlər bizə də sizin kimi Zəburu eynilə öyrədiblər”.

Bir neçə sətirdən sonra aydın olur ki, Üç Uqnumun əbədiyyətdən qabaq mövcud olması barəsində siz bambaşqa fikirdəsiniz. Sonra, siz Kəlamın təcəssümünü elə halda izah edirsiniz ki, bu havarilərdən alınan İsa kilsənin təlimindən uzaqlaşır və müqəddəs kitablarla təsdiq olunmur. Bu insanlara qəfildən yaxınlaşan cavanların nəzəriyyəsidir ki, onlar insanları İsa kilsəsindən oğurlayıb sonra da yanlış fikirlərin vasitəsiylə onların şagirdlərini də tovlayıb kilsədən çıxarırlar.

Başqa bizim öz fikirlərimizlə razı olmayan və sadəlövh adamları çaşdıra bilən fikirlərə gəldikdə isə deməliyik ki, yalançılıq qapıları biz dindarlar üçün bağlıdır. Və əgər məsələlər belədirsə, onda ey hörmətli müqəddəs atalar, fikirləşin və görün sizin imanınız sizi haraya gətirib çıxarar və sizi Müqəddəs Ruhun təlimindən necə uzaqlaşdırar. Məsələyə bir az dərindən baxın, zülmət içində işığı axtarın və aydın, mükəmməl və dəqiq cavablar verin! Sənsə, ey səadət arzulayan, mənimlə birlikdə öz iti nəzərlərini Üç Uqnum tərəfə qaldır ki, Onun haqqında havari Pavel hələ, romalılara göndərdiyi risaləsində belə demişdir:" Sizə, ey qardaşlar, Allahımız İsanın adıyla və Müqəddəs Ruhun məhəbbətiylə yalvarıram: mənimlə birlikdə mənim üçün Allaha dualarda olmağa çalışın"[1]. Müqəddəs Üç Uqnumun şərəfini o belə tərənnüm edirdi və öyrədirdi ki, havarilərin bütün vəsiyyətləri bu ifadələrlə doludur və yalnız onun adıyla biz xaçı suya sala bilir və ibadətlə onu tərənnüm edirik.

[1]İncil. Pavelin romalılara risaləsi, XV,30.

Bəs nəyə görə Allah Oğlu bir yerə yığdığı kilsəni və dindarları biz indi parçalamalıyıq? Gəlin Nadavla Aviuda bənzəyib kafirlər kimi özgə oduna ibadət etməyək ki, özümüz də həmin odla məhv olmayaq[50]. Gəlin İsadan üz çevirməyək ki, O yenidən bizim təqsirimiz üzündən bizim yerimizə əzab çəkməsin, gəlin dinimizi dəyişməyək ki, Nuh nəvəsi Kənanı qoçlarla təkələri ayıran Allahın adından lənətlədiyi kimi[1]bizi də lənətləndirməsinlər. Çünki bu iş bizə və Amaras kilsəsinə rəhbər təyin olunan sənə, Mxitara aiddir. Sənsə təkid edirsən ki, həmin kilsə Qriqoris tərəfindən təsis və Qriqoris və onun nəsli kimi eyni dinə mənsubdur. Allah eləməsin ki, biz sizin Kənan övladları olmağınızı və ya İudaya etiqad etməyinizi eşidək. Kilsənin ikiyə bölünməsi haqqında əmr verməyin və onun bir hissəsini azdıranların əlinə salmayın. Əgər biz dinləri havarilərin dinlərindən fərqli olmayan ataların övladlarıyıqsa, gəlin onların təlimindən bərk yapışaq və təmiz suda su ilə əhəngi qarışdıraraq korlamayaq, çünki adıyla fəxr etdiyimiz O Səmavi Atamızın qarşısında bizi təqsirləndirən məhz Özü olacaq. Gəlin haqsızlığın çoxluğu ilə aldanmayaq, əksinə, gəlin ibrətli kəlamlarla uyğun olraq çoxlarının bəlalara düçar olmalarına şərik olmayaq[2] və cəhd edək ki, nicat gəmisində səkkiz başqa canla gizlənək ki[3], və onlar Tufan zamanı boğulan cammat içindən xilas ola bildilər, gəlin Lutla[51] birlikdə odlu yağmurdan xilas olaq və altı min həlak olunanlardan

[1] Bax: İncil. Kövn, IX, 20-25.
[2] Bax: İncil. Xuruc, XXIII.2.
[3] İncil. Havari Pyotrun Birinci risaləsi, III,20.

sağ qalan iki nəfərlə həsrəti çəkilən torpağa daxil olaq.[1]

Çünki indi də dağlar arasında əks – səda kimi Mərhəmətlinin səsi eşidilir:” Kiçik sürü, qorxma! Sizin atanız mərhəmət göstərib sizə Səltənət verir!”[2]

Biz inadkarlara bu istiqamətdə fəaliyyət göstərmək üçün nəsihət edəcəyik, amma biz Üç Uqnuma ibadətin nizamını müdafiə edir və edəcəyik və biz buna etiraz edən hər qardaşdan belə uzaq olacağıq”.

# DOQQUZUNCU FƏSİL

## On səkkizinci Nahancın birinci ilindən[52] başlanan tarixi hesabat

Vaxtiləİran şahı Kiruşun dövründə Qüds şəhərinin 70 ilik əsarəti[53] bitən kimi, mömin imperator Flavi İrakli dövründə[54] Qüdsün bu səfərki əsarəti də bitəndə Allah məğrur İran şahı Böyük Xosrovu[55] ziyarər edib onu ona görə danladı ki, o, uzun müddət qələbələr çalaraq paytaxtı Roma olan imperator Avqustun ölkəsi ilə birlikdə Fələstinin parlaq şəhəri olan Qüdsi də dağıdıb talan edirdi.

Xosrov şah görəndə ki, Yunan ( Bizans) imperatoru ilə başladığı müharibə onun qərbə yürüşə gedən ordusunun Xorsan adlı sərkərdəsi sayəsində müvəffəqiyyətlə davam edir, o, öz sərkərdəsinə, onun döyüşlərə yaxşı hazırlıq görüb, bu döyüşlərdə fars

[1] İncil. Bu haqda İncilin “ Kövn” fəslinə bax.
[2] İncil. Lukadan, XII,32.

hiylələrini işlədib qələbə çalmasına görə ona, müxtəlif şərəfli və dəbdəbəli adlar adlar verdi. Onu gah Rəzmi Ozan, gah da Şəhrivaraz çağırırdı.

Xorsan Böyük Qüds şəhərini alıb[56] yandırdı. O, bütün dünyaya işıq saçan və cəhənnəmə qalib gələn həyatverici Müqəddəs Xaçı əsir edib apardı.Onunla bir yerdə Xorsan müqəddəs yerlərdən bütün qızıl, gümüş qabları və cavahiratla süsləmiş şeyləri, çox bahalı mirvari ilə bəzədilmiş geyimləri, hətta çox gözəl və dəbdəbəli şəhərlərin evlərində olan şeyləri, mərmər sütunları, elə heyvan və böyük quşları daşıyıb aparmışdı ki, onların Şərq ölkələrində heç adlarını da eşitməmişdilər. Amma mən öz hekayəmi uzatmaq niyyətində deyiləm, çünki onun bütün orada törətdiklərindən mənim heç xəbərim yoxdur. Qarət etdiyi dağ boyda cavahiratı onun əmriylə İran şahının sarayına daşıdılar. Lakin şah bu saysız – hesabsız qənimətdən, musiqidə, rəqslərdə və əyləncələrdə mahir məlahətli bakirə qızlardan və oğlanlardan nə doydu, nə də həzz aldı. O, quruda və dənizdə döyüşərək bizanslıların gözəl şəhərlərini əhalisiylə birlikdə İrana köçürürdü. Öz memarlarına əmr etdi ki, onlar İranda Bizans şəhərlərinə oxşar şəhərlər salsınlar. Bu şəhərlərdən birinə Beh Əncətok, yəni " Antakiyadan daha gözəl"[57], başqa tikdiyi şəhərlərə köhnə adlarını saxlayırdı, ancaq ona "Daha gözəl" sözlərini əlavə edirdi.

Şahın bütün diləkləri yerinə yetdikdəndən və o, bütün xalqlar və şahlıqları istədiyi kimi fəth etdikdən sonra elə güclü və qüdrətli

oldu ki, lovğalanmağa başladı və hesab etdi ki, guya o, öz şahlığını belə qorxulu və əzəmətli öz şəxsi qeyrəti və mərdliyi sayəsində etmişdir. O, heç fikirləşmirdi ki, Allah – təala bütün insan şahlıqlarından yüksəkdir və mülkü istədiyinə verir ( və istədiyindən alır).[1]

Tədricən şah Bizans çarı qarşısında zəifləyir və əvvəlki kimi, qüdrətinin ən yüksək zirvəsində olduğu kimi, indi öz başını qürurla qaldıra bilmirdi.

Vaxtı gələndə imperator bütün Xosrovla döyüşlərdə olan öz sərkərdələrinə və ordularına xəbər verdi ki, Allah onların əməllərinə kömək edir. O, əmr etdi ki, onlar bütün orduları və sursatları ilə müəyyən yerdə toplaşsınlar.[58] Onların hamısı təyin olunan yerə yola düşdülər. Heç kəs öz qonşusunu gözləmirdi və vaxtı itirmədən " ğz kotanlarını qılınclara və oraqlarını nizələrə dəyişdirdi və zəiflər belə bir – birinə ürək verib deyirdilər:" Biz güclüyük və cəngavərik!"[2]

İmperator özü ordusuna rəhbərlik edib yola düşdü. Öz sarayını oğluna tapşırıb onun başına tacnı qoydu və öz taxtına oturtdu.

İrakli onun ölkəsini və şəhərlərini alan və onları itaətdə saxlayan İran qoşunlarına hücum etmir, onların yanından keçmir və döyüşə təhrik etmirdi. İranlıları öz ölkəsinə buraxıb, ordusuyla dənizi keçir və yolunu Egerlərin torpaqlarından[59] salaraq Erməniyyəya daxil olub, Araz çayını keçdi və Böyük Xosrov şahın üzərinə qəfildən

---

[1] Bax: Quran, 14, 25.
[2] İncil. Havari İoilin kitabı, III, 10.

hücum etmək istədi.[60]

Xosrov bu xəbəri eşitdikdə həddindən artıq  təəccübləndi və dedi:" Məgər o həmin adam deyilmi ki, qorxusundan qabağımdan qaçırdı? Bəs indi bu nədir?" Xosrov Midiya hüduduna yaxın olan yay iqamətgahından imperatorun gözündən qaçaraq, Suriyaya gəldi və oradan öz böyük sərkərdəsi Şəhrivaraza çaparlarla hədə və təhqirlərlə dolu məktub göndərdi:" Yalnız buraya dərhal gəlib və bütün mənə qarşı cəsarət edib çıxış edənlərin istər ikiayaqlı olsun, istər dördayaqlı, hamısını qırıb tökəndən sonra, sən məni bu böyük rüsvavçılıqdan azad edib qəzəbimi bununla sakitləşdirə bilərsən!"

Məktubdan dəhşətli xəbəri biləndən sonra sərkərdə təcili İran qoşunlarını gözdən küçirdi. Ona təslim olmuş və əlinə keçmiş Bizans və Fələstin şəhərlərində mühafizə dəstələri qoyub onlara tapşırdı ki, o, qayıdana qədər onlar şəhərləri ehtiyatla idarə etsinlər. Özü isə çox gözəl silahlanmış atlı ordularını götürüb şahın təyin etdiyi yerə tələsdi.

Görəndə ki, İran şahı onun əlindən çıxıb qaçdı, Böyük imperator İrakli onu təqib etməyib Atrpatakan ölkəsinə hücum edir və İran şahlarının yayın istisində havasının sərin olduğuna görə özlərinə iqamətgah seçdikləri Qazaka ( Gəncək) şəhərinə[61] daxil olur. İrakli ölkəni dağıdıb talan etdi[62] və əhalisini əsir aldı. Oradan qayıdanda İrakli qışı Albaniya, Gürcüstan və Ermənİyyədə keçirmək istədi. Buna görə o, bu ölkələrin hakim və əyanlarına məktublar yazıb tələb etdi ki, onlar könüllü olaraq onun qabağına çıxaraq, onu

qarşılasınlar və bütün qış boyu onun özünə və ordusuna xidmət etsinlər. Əgər onlar bu tələblərə əməl etməsələr, onları bütpərəst hesab edəcək və ordularına əmr edəcək ki, bu ölkələrin qalalarını alıb torpaqlarını viran etsinlər.[63]

Bunları eşidən Albaniyanın sahib və əyanları Xosrovun əmrilə böyük Bərdə şəhərini tərk edib müxtəlif yerlərdə istehkam qurub yerləşdilər. Amma Bərdənin xaçpərəst bütpərəst sakinlərinin çoxu, o cümlədən sənətkarları xəstəlik və başqa səbəblərə görə şəhərdən çıxıb qaça bilməyib evlərində qaldılar.

Bərdə kilsəsinin Zaxariyya adlı yumşaq xasiyyətli keşişi şəhər sakinlərinin nicatı üçün öz həyatını belə əsirgəmirdi. Andla, ibadətlə və müxtəlif tədbirlərlə o, xaçpərəstlərin çoxlarını əsirlikdən qurtardı. Müxtəlif girovlarla yəhudilərlə bütpərəstləri şəhərdə saxlaya bildi. Sonralar Zaxariyyanın bu xidmətlərinə böyük qiymət qoyuldu və hamının razılığı ilə o, Albaniyanın katolikosluğuna layiq görüldü.[64]

Saysız – hesabsız Bizans orduları öz düşərgələrini Kalankatuk kəndinin[65] yanında axan çayın sahilində saldılar. Yanlarından keçdikləri kəndlərin özlərini, gözəl bağ və üzümlükləri tapdalayıb xaraba qoydular. Sonra onlar yerlərini dəyişib düşərgələrini Tərtər çayın sahilində Divtakan kəndinin yanında saldılar.[66]

Bunlardan sonra “ Nor Zor” ( “ Yeni ordu”) adlı İran qoşunu gəldi. Onun sərkərdəsi Şəhripalakan idi. Qoşunların arasında Qranikan Salar – şaha sadiq olan bir tanınmış sərkərdə də var idi. O

da gəlib şahın hüzurunda hazır durmuş idi.

Sonra Bizans tərəfdən yenə bir İran sərkərdəsi gəldi[67] və bunlar birləşib İraklinin ordularını Sünikin torpaqlarından geriyə qovdular. İran ordularının özlərinə bərk zərbələr dəyməsinə baxmayaraq[68], onlar bizanslıları öz ölkələrinə qədər qovdular, onların şəhərlərini silah gücüylə əllərindən aldılar.

# ONUNCU FƏSİL

## Xosrov şahın Bizans imperatoru ilə müharibə üçün öz ordularını səfərbərliyə alması. Ona neçə illər ərzində qılıncla endirdiyi zərbələr və Bizans ölkəsinin talan edilməsi barəsində

İraklinin təhriki ilə saysız – hesabsız Xəzər orduları ölkəmizə soxulub onu talan etməyə başladılar.[69] Bununla əlaqədar İran şahı Xosrov onlara öz elçisini göndərib belə bir sual verdi:" Mənim ölkəmə siz kimin əmrilə soxuldunuz? Bəlkə məndən qaçıb Qərb dənizlərinin adalarında gizlinib sərgərdan gəzənin əmrilə? Əgər sizin qızıl, gümüş, qiymətli daşlar, ipək parça və qızılla naxışlanmış və mirvarilərlə süslənmiş libaslara ehtiyacınız var idisə, onda mən sənə onun vəd etdiyinin ikiqatını verə bilərdim. Buna görə sənə deyirəm : İraklinin bihudə kələklərinə görə mənim üzərimə basqınlar etməyin. Yox, əgər siz bunu edərsinizsə, qoy sizin etdiyiniz kimi olsun. Ancaq mən sizə qabaqcadan gördüyüm tədbirlər haqqında deməliyəm. İraklinin sizinlə birlikdə mənə qarşı görmək istədiyi tədbirlərindən vaz keçməsi üçün mən indi onun ölkəsində olan böyük və müzəffər sərkərdəmi – Şəhrivarazı və Qərbin üstünə göndərdiyim mənim iki qəhrəman sərkərdələrim Şahin və Kərdəri qanlı və mənim seçilmiş və təpədən dırnaqlarınadək silahlanmış minliklər və onminliklərə

daxil olan əsgərlərimi geriyə çağıracağam.[70] İndi mən onların yüyənlərini şərq tərəfə döndərib bütün qüvvəmlə sizin üstünüzə hücum edəcəyəm, sizi rahat buraxmayıb, sizi yer üzünün lap o başına qovana qədər sizə nə bir vaxt verəcəyəm, nə də rahatlıq. Onda siz bütün təfsilatlarla başa düşərsiniz ki, sizin tədbirlər nə qədər mənasız və faciəlidir. Bəs oradan gətirdiyim bu saysız – hesabsız qoşunları mən haraya aparır, harada yerləşdirir, harada düşərgələr salmalıyam? Bu qoşunlara hansı ölkə müqavimət göstərə bilər? Əgər siz bütün bunları yerinə yetirməyib, ölkədən çıxmasanız, onda mən sizə xəbər verdiyim kimi hərəkət edəcəyəm”.

Belə kinli və həlledici sözlərin qarşısında xəzərlər bu il öz əməliyyatlarını dayandırıb həmin Dərbənd keçidi ilə vətənlərinə qayıtdılar.

Lakin xəzərlərin bu basqınlarda əldə etdikləri böyük qənimətləri - əsirlər, heyvanlar, qızıl qablar və dəbdəbəli geyimləri görən onların hakim şahzadəsi özlüyündə qərara gəldi ki, gələn il bu yerlərə özü basqın etsin. O, bütün ona tabe olan müxtəlif xalq və qəbilələrə, dağlı və aranlılara, dam altında yaşayan şəhərlilərə ulduzlar altında yatan çöllülərə, dənizdə və quruda yaşayanlara, başları qırxılmış və uzun saçlılara[71] əmr etdi ki, onların hamısı onun işarasiylə ba.dan ayağa kimi silahlanıb bir yerə toplanmalıdırlar.

Və Xosrov şahın hakimiyyətinin otuz səkkizinci, onun üçün uğursuz olan və qəmli qətli ilində[72] həmin yuxarıda adı çəkilən[73] Cebu Xaqan[74] öz oğlu ilə gəldi və heç kəs onun qoşunlarının sayını

deyə bilməzdi.

Bu dəhşətli və qəmli xəbər Albanlan ölkəsinə[75] çatanda böyük paytaxt və qala olan Bərdədə ölkəmizin möhkəmləndirilməsi haqqında qərar çıxardılar. Qərar Xosrov şahın bu ölkənin valiliyinə və knyazlığına təyin etdiyi Qayşaq adlı şəxs tərəfindən verilmişdi. O, şəhərdə ətraf vilayətlərin əhalisinin çoxunu saxlayaraq xəzərlərə müqavimət göstərmək qərarına gəldi və ölkənin əyanları və şəhər əhliylə ittifaq bağlayaraq öz mövqeyini möhkəmlətməyə çalışdı. O, böyük Çola şəhərinin müdafiəçiləri və onun həddindən artıq möhkəm divarlarını qoruyan döyüşçüləri ilə nə ola biləcəyinə diqqət etməyə hazırlaşdı. Bu əzəmətli divarları İran şahları tikdirmişdi və bunun üçün onlar çox böyük pullar xərcləyib, öz ölkələrinin əhalisini taqətdən salmışdılar. Bu möhtəşəm tikinti üçün onlar inşaatçıları səfərbərliyə alıb çoxlu müxtəlif tikinti vəsaiti daşıtdırdılar və bunlar Qafqaz dağları ilə Şərq (Xəzər) dənizi arasındakı keçidləri bağladılar.

Lakin ümumdünya qeyzi gözlərimizin önünə çatanda dəniz ləpələri divarlardan yüksəyə qalxıb onları yıxdı və bünövrəsinə qədər dağıtdı. Qala divarlarında olan döyüşçülər bu eybəcər, enlisifət, kipriksiz arvadlar kimi uzun və açılmış saçlıların onların üzərinə hücumunu görəndə, onların dəhşətli qorxusu daha da artdı. Onların sərrast ox atmaları qaladakıları daha da sarsıtdı, çünki bu oxlar kamanlardan sanki sel kimi axırdı. Şəhərə girdikdə onlar qaniçən qurdlar kimi xalqa hücum edir, dar küçə və döngələrdə rəhm etmədən hamını qırırdılar. Bu qırğında onlar istər gözəl və gənc qız

olsun, istər oğlan, istər xəstə, istər taqətsiz – hamını öldürür, hamını məhv edirdilər, şikəsti də, qocanı da. Öldürülmüş anaların süd yerinə döşlərindən qab əmən körpələrə belə rəhmləri gəlmirdi. Sanki od tutmuş saman kimi onlar bir qapıdan girir o birisindən çıxırdılar vı olduğu yerlərdə vəhşi heyvanlara və quşlara bol yem qoyub gedirdilər.

Yavaş – yavaş bu ləpələr bizim tərəfə yeridi. Bu xəbər Bərdə şəhərinə sahib olan və onu idarə edən bizim ağamız knyaza çatanda o, yaxınlaşan böyük təhlükədən çixiş yolu axtarmaq üçün şəhərin İç qalasına qorxudan sığınan qoşunlarla məsləhətləşmək istədi. Amma danışmaq üçün onun ağzını açmaq istəyən anda onu elə dəhşət bürüdü ki, dizləri bir – birinə dəyib elə əsdi ki, o, tək bir sözü də ağzından çıxara bilmədi. Orada yığılan camaat onu belə qorxuda görərək hay – küy qaldırıb çığırdı:” Bəs niyə sən bizi indiyəcən burada saxladın? Bizim özümüzü arvad – uşaqlarımızla birlikdə bu qaniçən vəhşilərin əllərinə vermək üçünmü? Belə böyük və nizamsız camaatla bizdən cəmi üç mil[1] uzaqlıqda olan amansız düşmənin əlindən necə çıxa bilərik?” Sonra da bir – birinə dedilər: “ Biz niyə ləngiyirik? Nəyi gözləyirik? Bu şəhərdə özümüzə gor tapmalıyıq? Gəlin şeylərimizi, var – dövlətimizi atıb qaçaq. Bəlkə, canımızı qurtara bildik!”Bunu deyib camaat şəhərin dörd qapısı tərəfə cumdu ki, şəhərdən çıxıb Arsax vilayətinin dağlarında gizlənsin.

Bunu bilən düşmənlər qaçanların ardınca yönəlib bir qismini

[1]M i l – 7420 metr.

Uti vilayətində yerləşən, ana yurdum olan böyük Kalankatuk kəndiylə üzbəüz yerləşən dağın ətəyində haqladılar. Lakin hava qaraldığı üçün onlar qaçanlara böyük zərər yetirə bilmədilər. Onlar əllərinə düşənlərin bir neçəsini öldürüb, başqalarını isə ev şeyləri ilə, dolu arabalar və heyvanlarla birlikdə öz düşərgələrinə apardılar. Allahın köməyilə onlar qalan qaçanları təqib etmədilər və bunların hamısı vaxtilə Qırmızı dənizdən keşən yəhudilər kimi [1], gecənin qaranlığında xilas olub Arsax vilayətinin əlçatmaz dağlarında nicat tapdılar. Həmin yolla knyaz Qayşak və onun ailəsi qaçıb İran torpağında xilas oldular. Özü isə bundan sonra bu yerlərdə keçmiş vəzifəsini qaytara bilmədi.

Bundan sonra düşmənlərin axını selə dönüb gürcü torpaqlarına yayıldı və dəbdəbəli, çiçəklənən, məşhur və böyük ticarət mərkəzi olan Tiflis şəhərini əhatə edib mühasirəyə aldı.

Bunu eşidən böyük imperator İrakli bütün ordularını səfərbərliyə alıb öz mütəffiqi ilə birləşdi. Onlar bu görüşlərinə çox sevinib bir – birinə çar hədiyyələrini təqdim etdilər.[76]

Tiflis qalasında mühasirəyə alınmış zavallıların iztirablarına bundan sonra baxıb fəlakətlərin onların üzərinə necə hücum edəcəyini görmək lazım idi. Onların ərzaq ehtiyatları hələ qurtarmamışdı. Və belə oldu ki, Xosrov şah iki böyük hökmdarın görüşləri barəsində hələ Tiflisin mühasirəsindən qabaq eşitmişdi və o, şəhər müdafiəçilərinin köməyinə təcili olaraq cəsur və cəngavər

[1] Bax: İncil. Xuruc, XIV.

sərkərdəsi Şəhripalakanın başçılığı altında öz saray mühafizəçiləri və qoruyucularından min atlı döyüşçü göndərdi.

Şəhər əhalisi onların köməyinə göndərilən belə qüvvətli və təcrübəli döyüşçüləri görəndə çox ruhlandılar, şimal və qərbdən gələn və şəhəri dağlar kimi əhatə edən çoxlu qoşunları görə - görə hər iki çarı masqaraya qoydular.Şəhər camaatı yer üzü saysız – hesabsız düşmənlərin ayaqları altında necə əsib inləməyi, qala divarlarını söküb – yıxmaq üçüm nəhəng daşlar atan Bizans ustalarının əlləriylə düzəldilən müxtəlif dördtəkərli mancanaqları və başqa bu kimi alətləri görə - görə. Daş və torpaqda doldurulmuş dəri tuluqlarla şəhərin bir hissəsini əhatə edən Kür çayının sularını geriyə döndərib şəhəri su altında qoymaq istəmələrini görə - görə yenə də heç bir şeydən qorxmayıb, bir – birlərinə ürək – dirək verib düşmən tərəfindən dağıdılmış divarları düzəldib bərpa edərdilər.

Lakin tədricən iki hökmranın orduları döyüşlərdə yorulub əldən düşdü və döyüşlərdə piyada döyüşçülərinin çoxu həlak oldu. Hər iki çar məsləhətləşib belə fikrə gəldilər: “ Bizi qoşunlarımıza belə itki verməyə kim məcbur edir? Ancaq güclünün əl – qolunu bağlayandan sonra onun evini və mülkünü istədiyimiz kimi qarət edə bilərik”.[1]

Bundan sonra böyük və kinli imperator İrakli öz işlərini nizama salıb onun köməyinə gələn adama deyir: “ Bu il öz qoşununla sağ və salamat öz vətəninə qayıt. Mən görürəm ki, siz bu istilərə

[1] İncil. Matfeydən, XII, 29.

davam gətirə bilməzsiniz və qızğın günəşli Suriya torpağında böyük Dəclə sahilində yerləşən İran şahının paytaxtına gedib çatmağa taqətimiz yoxdur. Amma isti aylar keçib gedəndən sonra, gələn ildə tezliklə qayıt gəl ki, biz öz planlarımızı yerinə yetirək. Mən özüm isə İran şahı ilə mübarizəmi dayandırmayıb, onun özünü və xalqını təqib edərək ölkəsini qorxu altında saxlayacağam. Mən hiylələrimi o vaxtadək qurtaracağam ki, onu öz adamları vurub öldürsünlər".

Şəhər əhli onların zəifliyini və taqətdən düşmələrini oxuyan kimi daha da təkəbbürlədilər və onların məğlubiyyətini lağa qoydular. Onlar iri bir balqabaq gətirib onun üzərində bir dirsək uzunluğunda hunlar çarının surətini çəkdilər. Kipriklərin yerinə gözə görünməyən nazik xətlər çəkdilər, saqqal yerini biabırcasına lüt qoydular, burun deşiklərini qarış boyda edib altına bığabənzər seyrək tük düzdülər ki, onu hər kəs asanlıqla tanıya bilsin. Bundan sonra onlar bəzədilmiş balqabağı gətirib qala divarının üstünə düşmən əsgərlərilə üzbəüz qoyub qışqırıq saldılar:" Budur, sizin çarınız buradadır. Gəlin ona təzim edin, çünki bu – Cebu Xaqandır!"

Və əllərinə nizələrini alaraq xaqanın timsalı olan balqabağı deşməyə başladılar. Onlar ikinci çarı, İraklini də ələ salıb lağa qoyur, söyür, biabır edirdilər və onu pozğun uşaqbaz adlandırırdılar.

Bütün bunları eşidib görən çarlar qəzəblənib qeyzə gəldilər. Onlar kinlərini və nifrətlərini sinələrində boğub başlarını tərpədərək dəhşətli andlar içib vəd etdilər ki, onların ölkələrində bir adam da sağ

qalmasa belə, bu təhqirlərə görə intiqamlarını alacaqlar. Və onlar hədələrini təkrar edə - edə geriyə gönüb getdilər.

# ON BİRİNCİ FƏSİL

## Şimal qoşunları İraklinin köməyinə gəlir

Bundan sonra, Xosrov şahın hökmranlığının otuz altıncı illində[77], imperator İrakli öz böyük kədəri və rüsvayçılığından qurtarmağa yol axtarırdı. Bu vaxt ərzində o, bütün Bizans torpaqlarına öz hakimiyyəti altına alıb ordu toplayır ki, şimal – şərq ölkələrinə yolu bağlayan Qafqaz dağlarında yarıq açmaq üçün kğmək etsin və Çola qapılarını açdırıb çoxlu Barbar qəbilələrini içəriyə buraxaraq onların köməyilə məğrur İran şahı Xosrova qalib gəlsin. O, öz əyanlarından olan Andre adlı istedadlı və dərrakəlisini hazırlayıb xəzərlərin yanına göndərdi və onun vasitəsilə onlara saysöz – hesabsız sərvətlər vəd etdi: “ Əgər onlar öz səyləri ilə mənə kömək etsələr mən bu hörüksaxlayan xalqın acgözlüyünü, bu heyvanların qızıla tamahlarını təmin edərəm”.

Bu sözləri eşidən Şimal çarının xələfi, çarlığın Cebu Xaqan adlı ikinci adamı onlara nə kimi nəhəng sərvətlər vəd olunur və bütün bunları o, İran şahının tabeliyində olan ğlkələrə hücum etdikdən sonra əldə edə biləcəyini görüb böyük məmnuniyyətlə belə cavab verdi: “ Mən onun düşmənlərindən onun əvəzinə intiqam alacağam. Mən özüm şəxsən qalxıb tezliklə onun köməyinə öz cəsur

qoşunlarımla gələcəyəm. Mən onun tələblərini müharibə ilə, öz oxum və qılıncımla onun istədiyi kimi təmin edəcəyəm!"

Və müqaviləni təsdiq etmək üçün, o, həmin əyanla birlikdə bir min seçmə atlı döyüşçü və mahir oxatan göndərdi. Onlar qəflətən Çola qapısından keçir və şəhərin keşikçiləri və İran şahının keçidin ətrafında yerləşdirdiyi başqa qoşunlarına əhəmiyyət vermədən qartallar kimi başı aşağı hücum edərək Kür çayı tərəfə yönəldilər. Yollarında kimə rast gəldilərsə, hamısını məhv etdilər və İberiya və Hegeriyanın torpaqlarından, sonra da böyük ( Qara) dənizdən keçərək imperatorun hüzuruna gəldilər. Burada ( Konstantinopolda) onlar bir – birinə verdiyi anda sadiq olmaları haqda öz ölkələrinin qanunlarına müvafiq olaraq razılığa gəldilər. Xəzərlər İraklidən onun torpaqlarından azad keçməyə icazə alaraq yenə də başqalarını duyuq salmadan həmin yolla öz ölkələrinə qayıtdılar.

Xosrov şahın hökmranlığının otuz yeddinci ilinin əvvəlində[78] Şimalın çarı xəzərlərin arasında, knyazlıq rütbəsinə görə şad adlanan[79] qardaşı oğlunun başçılığı altında vəd etdiyi ordunu basqına göndərdi. O, Albaniyanın bütün vilayətləri və Atropatenanın bir hissəsini yağmalayıb çoxlu xristian və bütpərəstləri qılıncdan keçirdi. Bəs əsir edilib öz ölkəsinə apardığı adamların sayını və ya adlarını kim deyə bilər?

Düşərgəsini Araz çayının sahilində salmış Şad böyük Xosrov şahın yanına elçi göndərib onu xəbərdar etdi ki, o, imperatorla ittifaq bağlayıb və onun köməyinə gəlmişdir. Onların bir – birinə

göndərdikləri məktubların məzmunu belədir: “ Əgər sən bizanslıların imperatorundan əl çəkib ondan zorla tutduğun torpaq və şəhərlərini ona qaytarmasan, əgər onun ölkəsindən əsirlərlə birlikdə apardığın və bütün xaçpərəst xalqlarının ehtiram və sitayiş etdikləri İsa Xaçını geriyə qaytarmasan və əgər öz ordularını onun torpaqlarından geriyə çağırmasan, onda qulaq as, gör Şimalın çarı, bütün yer üzünün hökmdarı, sənin və bütün çarların çarı sənə nə deyir: “ Mən, ey Suriyanın valisi, üzümü sənə tərəf çevirib, imperatora vurduğun bir zərər əvəzinə ikiqat zərər verərəm. Öz qılıncımla sənin torpaqlarında sən öz qılıncınla onun torpaqlarında gəzdiyin kimi gəzərəm. Sənə heç rəhmim də gəlməz və bütün bunların hamısını mən təxirə salmadan yerinə yetirəcəyəm!”

Böyük Xosrov şah bütün bunları elçilərdən eşidəndə qalxıb, sel kimi, ya ovçular üzərinə şir kimi və ya balalarını itirən dişi ayı kimi gurladı. Onların birləşib üstünə hücum etmələrini o çox yaxşı görürdü, amma tədbirli olduğu üçün o, elçilərin qabağında öz qorxusunu və cəsarətsizliyini heç də büruzə verməyib onlara qürur və tənə ilə cavab verdi: “ Get və öz çarına və bizim qardaşımıza de ki, sizin sülaləniz mənim cədlərim və mənim tərəfimdən əsrlər boyu həmişə hörmətlə və sevimli qardaşın sülaləsi kimi qarşılanırdı və biz oğul – qızlarımız vasitəsilə bir – birimizə qohum olmuşuq. İndi sənə heç yaraşmaz ki, sən mənim azmış bizans qulumun sözlərinə məhəl qoyasan”.

Və türkan[80] öz ölkəsinə qayıtdı. Həmin vaxt imperator İrakli

öz qoşunları ilə İran torpaqlarına hücum edərək inadla əlləşirdi ki, özünü İran şahının paytaxtına yetirsin. İran şahı gördü ki, onu işləri qaydaya düşmür və İrakli, əksinə, təkidlə ona tərəf irəliləyir. O, onun qabağından qaçaraq geriyə çəkildi və öz paytaxtı böyük Ktesifon şəhərinə qayıtdı. Öz arvadlarını, kənizlərini və uşaqlarını Dəclə çayının o biri sahilinə köçürdü. Sonra orada olan az miqdarlı əsgərlərini yığıb onları imperatorun üstünə göndərdi.

Mənsəblər və hədiyyələr vasitəsilə Xosrov şah sarayında igidliyi ilə məşhur olan bir əyanı öz tərəfinə cəlb edir, adını dəyişib ona Roçveh ( “ Bəxtəvər”) adı verir və onu dilə tutaraq imperatorun üstünə göndərdiyi qoşuna başçılıq etmək razılığını aldı və düşmənə qarşı yola saldı. O, əlacsız və şahdan qorxaraq tabe oldu, lakin bilirdi ki, Xosrovun tələsik yığdığı bu qoşunu imperator darmadağın edəcəkdir. Bir, iki, üç və dörd dəfə o, ehtiyatla Xosrov şaha müraciət etdi: “ Mən qabaqcadan öz ölümüm haqda yox, sənin qoşununun həlakı haqqında səni xəbərdar etmək istəyirəm və əgər sən tezliklə mənə kömək üçün qoşun gündərməsən qorxmadığın ölümün nə olmasını özün də dadarsan”.

Şah əmr etdi ki ona belə cavab versinlər: “ Onlardan qorxma, döyüş və qələbə çal!” Şah axırıncı məktubunu isə böyük qəzəblə belə yazdı: “ Əgər qalib gələ bilmirsənsə, ölməyi ki, bacararsan!”

Bu acı məktubu oxuyan sərkərdə öz qoşunu qabağında əllərini günəşə və işığa uzadaraq nərə çəkdi:” İlahilərim, məni və mənim mərhəmətsiz şahımı ayırd edin!” O və qoşunları bizanslılarla

döyüşə girişib həlak oldular və tufan zamanı qovulan toz –torpağa döndülər.[81]

Qoşunlarının belə dəhşətli məğlubiyyəti barəsində xəbər tutmuş İran əyanları narazılıqla bir – birlərinə deyirdilər: " Nə vaxtadək bizim arihəmvətənlərimizin qanı sel kimi döyüş meydanlarında tökülüb axacaq? Nə vaxtadək biz bu qaniçən şahımızdan qorxub əsəcəyik? Nə vaxtadək bizim var – dövlətimizi əlimizdən alıb sarayda, qızıl – gümüşümüz isə şahın xəzinəsinə yığılacaq? Nə vaxtadək bizim yollarımız bağlanıb başqa ölkələrlə ticarət edib mənfəətimizdən məhrum olacağıq? Nə vaxtadək canlarımız bədənlərimizdə titrəyib onun dəhşətli əmrlərinə tabe olub əziləcək? Məgər o, ölkələr hakimləri olan bizim layiqli qohun - əqrabamızı məhv edib dərya kimi udub boğacaq? Məgər qardaşlarımızın çoxu müxtəlif vaxtlarda onun əmriylə dəstə - dəstə, yüzlərlə və minlərlə parça – parça edilib öldürülməyib və ya boğdurulmayıbmı? Məgər o, ərləri arvadlarından, ataları oğullarından ayrı salıb uzaq tayfaların əlinə qul və xidmətçi kimi göndərib və adamlarımızı böyük dəstələrlə düşmən sərhədləri boyunca yerləşdirmirdimi?"

Bu kimi və bunlara bənzər sözləri onlar biri – birinə pıçıltıyla deyirdi, çünki heç kəs bunları onun ölüm vaxtı çatmayana qədər bərkdən deməyə cəsarət etmirdi. Elə həmin vaxt şahın ən sadiq adamlarından biri olan, onun böyük oğlu Qubadın mürəbbisi üsyan etdi. O, Qubadla sözləşdi ki, atasını və qardaşlarının çoxunu

öldürsün[82] və öz mürəbbisinin rəhbərliyi və göstərişi ilə İran şahlığını əlinə keçirsin. Mürəbbisinin hiylə kələyilə Qubad Xosrovun saray əyanlarını aldadıb çaşdırmışdı. Mürəbbi tezliklə bütün əyanların ürəklərini Qubad tərəfə çevirdi ki, onların köməyilə Qubadı atasının yerinə taxta oturtsun.[83]

# ON İKİNCİ FƏSİL

## Xosrovun öldürülməsi

Mənə bir qədər qulaq asın və mən sizə qısaca o adamın hiyləsi haqqında danışım və xəbər verim ki, o, dəhşət saçan ovçunu təkcə nərəsindən bütün uzaqda yaşayan xalqlarını vəlvələyə salan, yaxınlarını isə gördükdə mum kimi əriyən şərqin şirini ölüm toruna necə salıb tutdu. O, qısa bir müddətdə bütün insanların qəlblərinə hakim olub, Xosrovun, sanki yetim imiş, əleyhinə üsyan etdi.

Bunu edərkən o, çarların və əyanların heç birini köməyə dəvət etməmiş və öz yetişdirməsinin Xosrovun əleyhinə yardım üçün başqa uzaqda yaşayan xalqları və qəbilələri çağırmamış. O, yalnız imperator İrakliyə gizli elçi göndərib ondan xahiş etdi ki, o, həmin vaxt öz qoşunları ilə durduğu yerdə bir qədər ləngisin.[84] Bundan sonra o əmr etdi ki, bütün əyanlarına və İran şahlığının böyük saray alaylarının başçılarına Qubadın adından belə məktublar yazılsın: " Şahlıq hakimiyyəti atamın əlindən alınıb mənə həvalə olunmuşdur. Bir neçə kiçik atlı dəstələrlə hazır ol!" sonra o, bu dəstələri Beh

Ərdəşir şəhərin yanında, Dəclə çayının üzərində olan körpünün başında, öz sadiq mühafizə dəstələri ilə qorunan atası Xosrovun qaldığı Mədain sarayı ilə üzbəüzdə yerləşdirdi. Qubadın sağ və solunda ucadan qışqıran carçılar gedirdilər. Onlar: “ Qoy bütün həyat sevənlər və öz günlərini firavan keçirmək istəyənlər yeni şahı, Qubadı təbrik etməyə tələssin, çünki, odur şahlar şahı!” – sözlərini təkrar edirdilər.

Unutma Qəsrinin ( Anhuş) darvazalarını açıb onlar uzun illər zindanda qalan şahın bütün saysız – hesabsız dustaqlarını azad edib dedilər: “ Çıxın bayıra, ey Xosrovun bədbəxt məzlumları! Sizin həyat qapılarınızı yenicə taxta çıxmış onun oğlu Qubad açmışdır!” dustaqların zəncirləri qırıldı və onlar azadlığa çıxıb Qubada xeyir – dua edərək ucadan: “ Qoy şah həmişə var olsun!” – dedilər. Bundan sonra onlar şahın tövlələrinə girib və əl – qolları zəncirli olmalarına baxmayaraq, Xosrovun seçmə çapağan atlarına minib sarayına hücum etdilər. Saray alaylarının, çar mühafizəçilərinin çoxu və Xosrovun adını daşıyan xüsusi saray qoruyucuları bölməsinin adamları Qubadın tərəfinə keçmələri əlaməti olaraq sinələrindən öz nişanlarını çıxarıb şahın oğlu Qubadın nişanlarını taxdılar. Qubadın adamları sarayda qalanlara xəbərdarlıq etdilər ki, onlar Xosrovu tutub yaxşı qorusunlar. Əks halda onları ölüm gözləyər.

Xosrov səs – küyü eşidəndə yanındakılardan soruşdu: “ Bu nə səs – küydür?” Onlar isə cavab tapmadıqları üçün susurdular. Amma səslər və şeypurların gurultusu daha da yaxınlaşdı və Xosrov yenə də

soruşdu: “ Bu nə qarışıq səslərdir?” Və onlar belə cavab verdilər: “ Sənin oğlun Qubad sənin yerinə şah olmaq istəyir və hamı onun ardınca gedir. Onun adamları çayın sahilində şəhərlə üzbəüzdədir və onlar sənin əmrinlə zindanlarda saxlananların hamısını azad etdilər. Onlar da ürəkdən sevinir, Qubada xeyir – dua edir və onu şah adlandırırlar”.

Xosrov bu məhvedici və xüsusən dustaqların buraxılması haqqında xəbərləri eşidəndə ah – vayladı, nalə çəkdi, zarıldadı, qışqırdı və vurnuxdu. O bilmirdi və yalnız onun üstünə hücum edən nəhəng ordunu görürdü.

O, saraydan çıxıb öz bağının qapısı tərəfə gedərək ağacların arasında gizləndi, qorxudan canı qısıldı, ürəyi düşdü. Artıq onun gözləri başının üstündəki amansız qılıncı görürdü.

Bundan sonra xalqın böyük dəstəsi sarayı dövrəyə aldı və şahı axtarmaq üçün ayrılanlar onu ümidsiz halda gizləndiyi yerdə tapdılar. Onu saraydan çıxarıb “ Hindular köşkü”[85] adlanan və Maraspand adlı qəsrdə yerləşən binaya[86] gətirdilər. Biləndə ki, o haradadır və binanın sahibi kimdir, Xosrov əlini sinəsinə vurub inildədi: “ Mən bədbəxtin halına bax! Mən fal açıb gələcəkdə hindlilər arasında Maraspanda tələyə düşəcəyimi mənə deyən falçılarln sözü düz çıxdı və doğrudan da bəlaya düşdüm, ancaq burada, Hindistanda, yox!”

Onu bir gün orada saxladılar və ertəsi günün sübhündə başını qılıncla bədənindən ayırıb onun şərinə son qoydular. Öz qardaşlarının əl – qollunu və ayaqlarını sınıq – sınıq edən Qubad

onları şikəst hallarında sağ qoymaq istəyirdi. Lakin çoxlu şikayətlərdən sonra onların hamısını öldürtdü.

Qubad atası Xosrov şahın yerini tutub[87] bütün şahlıq və rəiyyətlər üçün çox xoşxasiyyətli və mərhəmətli hökmran oldu. O, qonşu padşahlarla barış yollarını axtarırdı. O, atasının saray zindanlarında məhbus etdiyi bütün adamları öz evlərinə buraxdı və ölkəsinin bütün vilayətlərinə fərmanlar göndərib hamıya bildirdi ki, hamı xoşbəxt və bəxtəvər ömür sürsün. O,öz ölkəsinin bütün yerlərində üç il ərzində hamını bütün şah vergilərindən azad edib çalışdı ki, onun şahlığı dövründə heç kəs belinə qılınc bağlamasın.

Lakin iğtişaş və həyəcanlı vaxtlarda törətdiyimiz günahlar tələb edirdi ki, biz hökmransız qalaq, Qubadın bütün niyyətləri nəticəsiz və fani oldu. Yeddi aydan sonra onun həyatı sona yetdi, atasını öldürən onun yanına getdi, padşahlıq Sasan oğullarının əllərindən alınıb İsmayılın oğullarına[88] verildi.

# ON ÜÇÜNCÜ FƏSİL

## Sasani Xosrovun nəslindən olan Mehranilər sülaləsi Albaniyanın hakimi olur

Etibarlı və gerçək tarixçilərdən öyrəndik ki, İran şahının qohumlarından olan Bindoy və Bistam qardaşları Xosrovun atası

Hörmüzdün əleyhinə üsyan edib onu öldürdülər və sonra qohumlarından biri ilə öz qardaşı oğulları olan Hörmüzdün oğlu Xosrovla birlikdə Bəhram Çubinin əlindən qaçıb Bizansa, imperator Mavrikinin yanına gəldilər. Mavriki Xosrovu özünə kürəkən edərək[90] onu geriyə göndərdi və o, vətəninə gələrək öz şahlığını əlinə aldı. Bir çox illər keçdikdən sonra Xosrov iki əmisini Bindoyu və Bistamı və onların nəslindən altımış nəfərə qədər öldürüb öz atasının intiqamını aldı.

Bundan sonra Xosrovun qohumu Mehran[91] qaçıb ona sadiq olan ölkənin vilayətlərini öz hakimiyyəti altına aldı və Albaniyaya getdi. O, özüylə 30 min ailə aparıb böyük Bərdə şəhərinin yaxınlığında Uti vilayətinə daxil oldu və sonra xəzərlərin ölkəsinə gedərək İranın bu düşmənlərinə qoşulmaq istədi.

Xosrov şahın əyanları onu məzəmmətləndirərək dedilər: “ Nə üçün sən öz qohumun olan Mehranla maraqlanmırsan? Axı o, səndən qorxaraq, düşmənlərinin yanına gedərək onları sənin əleyhinə qaldırır”. Bundan sonra Xosrov təcili olaraq  Mehrana belə belə məktub yazır: “ Qardaşım! Mənim sadiq qardaşım ( hərazat)! Düşmən kimi məndən uzaqlaşma. Əgər sən mənimlə bir yerdə yaşamağı xoşlamırsansa, bu məktub sənə çatanda nə qədər yol getmişsənsə, Albaniyada yaşamaq üçün özünə bir o qədər torpaq götür”.[92] Bu məktub Mehrana dərə - təpəli Girdiman vilayətində[93] çatmışdır. O. məktubu oxuyub çox şad oldu və sevindi.

Bu yerlərin mülayim təbiətinə nəzər salaraq Mehran böyük

məmnuniyyətlə orada qaldı və orada şəhər salıb onu Mehravan adlandırdı.[94] O, yaz mövsümü gələndə Girdiman vilayətinin yuxarı əyalətlərinə gedib, hiylə ilə oranı on iki yerli əyyanın yanına dəvət edərək hamısını qılıncdan keçirib ölkəyə sahib olur. Bundan sonra o, əmin – amanlıq içində uzun ömür sürəndən sonra rəhmətə getdi.

Onun Armayel adlı oğlu var idi. O. Vardı dünyaya gətirdi, Vard isə üç ilərzində Girdiman qalasını tikən cəsur Vardanı[95] dünyaya gətirdi. O, ürəyinə vəfasızlıq salaraq yuxarıda haqlarında tarizimizdə yazdığımız qədim yerli Aranşahları[96] guya qonaqlığa dəvət edir. O, onlar üçün ölüm yeməyi hazırlayıb onu öz qanları ilə birlikdə onlara yedizdirdi. Onlardan altımışının başlarını vurdurub yalnız birini – öz qohumunun qızının ərini, Aranşah Zərmehri sağ buraxdı.[97]

Beləliklə, onlar Albaniyaya hakim oldular və əlavə olaraq vəhşi Qafqaz qəbilələrini də özlərinə tabe etdilər.

Vardan əmin – amanlıqla ömür sürüb öldü.O, oğlu Vardı dünyaya gətirdi, Vard isə Varazmanı, şahzadə Şuşiki və Albaniyanın birinci – knyazı Varaz – Qriqoru[98] dünyaya gətirdi. O, xristianlığı Albaniya katolikosu Viro tərəfindən qəbul etmışdir.[99] Varaz – Qriqorun Varaz – Peroj, Cavanşir, Yezad – Xosrov və Varazman adlı dörd oğlu var idi.

Qoy bu siyahı tamamlanmış olsun.

# ON DÖRDÜNCÜ FƏSİL

## Albaniyanın ali katolikosu Viro barəsində, onun iztirabları və Allahın mərhəməti haqqında

Bütün canilər, dustaqlar və böyük sarayın zindanlarında olan bütün başqa adamlar, öz vətənlərinə və doğma yurdlarına qayıtmağa ümidlərini itirən bunların hamısı, yeni şah Qubad tərəfindən əfv edilərək, Qubad şahın əmrilə hədiyyələrlə yola salındılar və hamı böyük sevinclə öz vətəninə qayıtdı.

Bunların arasında böyük Albaniya knyazlığının Viro adlı katolikosu da var idi.[100] O. dahi və müdrik insan olub fəlsəfənin yaxşı bilicisi idi. Böyük və şahanə işlərdə müdrik məsləhətlər verməkdə onun dili sürətlə yazan bir qələm kimi idi. Onun çox mülayim danışığı sadə adamların və xalqın xoşuna gəlirdi. O, filosof kimi danışar və çoxlu hikmətli sözlər deyərdi: mirvari saf qızıl sapına düzüldüyü kimi, onun ağzından bir – birinin ardınca hikmətli sözlər tökülürdü. O, fars dilindən tərcümə işində xüsusilə mahir idi, çünki Xosrovun saray zindanında şaha qarşı üsyan edən Albaniyanın böyük knyazları ilə birlikdə[101] iyirmi beş il həbsdə olarkən bu dili

mükəmməl öyrənmişdi. Bu knyazların çoxu sonralar həlak oldu, bəzilərinin boynunu vurdular, digərləri şikəst edilidi, bir qədəri isə uzaq ölkələrə sürgün olundu.

Lakin Vironun baxtı gətirib şahın sarayına yol açdı və Müqəddəs Xaçın bərəkəti onu şah xanımın – Şirinin[102] aramgahına gətirdi. Şirinin səyləri nəticəsində şah Vironun həyatını ona bağışladı. Lakin şah qəti and verdi ki, nə qədər ki, özü sağdər, Viro heç vaxt ölkəsinə qayıtmayıb sarayda həbsdə olacaq, amma katolikos rütbəsi ondan alınmayacaq və onun gəlirləri müsadirə olunmayacaq. Şah onu qiymətli bir şey kimi saxlayır, müharibə və döyüşlər üçün hazırlanan çapar at kimi bəsləyirdi. Belə vəziyyət onun sürgününün sonuna və Albaniyanın rəhmsiz düşmənlərinin əzablı və dəhşətli zərbələri yaxınlaşana qədər davam etdi. Bu zaman Allah vaxtilə Musanı Madiam ölkəsindən göndərdiyi kimi[1], Vironu da göndərir ki, əsirlikdən qurtarıb öz xalqını qaniçən və pozğun xalqın[103] pəncəsindən xilas etsin ki, hər qəbildən bir və hər şəhərdən iki sağ qalanlar yer üzündə artıb çoxalsınlar. [2]

Sarayi tərk edib vətəninə gələn Viro öz tabeliyində olan kilsələrin qarşısında səcdə edib qapı və döşəmələrini qucaqladı, sel kimi göz yaşı axıdıb dizi üstə yerdə süründü. O, yerdən qalxıb ruhlanaraq yanındakılarada təskinlik verir və Allaha şükür edirdi ki, onu şirin pəncəsindən qurtarıb ona imkan verib ki, o yenə də öz kilsələrinin tağ – tavanlarını görə bilsin. O, bir qədər istirahət edib

---

[1] Bax: İncil. Xuruc, IV, 19.
[2] İncil. Havari İyeremiyanın kitabı, III, 14.

çox sevdiyi vətənindən uzun illər ayrılıq həsrətini azaltmaq istəyirdi. Lakin onu dəhşətli kədər, zəhmət və məşəqqətlər gözləyirdi və çox keçmədən ölkəsində baş verəcək dağıntıların şahidi olmalı idi. Çünki o, vətəninin, sevgi həvəsiylə tərbiyə aldığı ölkəsinin müxtəlif yerlərini gəzən zaman,ı qəflətən şimaldan ikinci dəfə[104], gözlənilmədən şiddətli külək əsdi və böyül Şərq ( Xəzər) dənizini coşdurdu. Vəhşi və iyrənc heyvan öz qaniçən balası Şadla birlikdə cənuba hücum edib, üzünü İberiyaya və Tiflis şəhərinə tutdu. Orada isə keçmiş cəngavərlərdən heç biri qalmadığına görə xəzərlər əvvəlki təhqirlərin intiqamını almaq üçün çox yaxşı fürsət tapdılar. Şəhəri mühasirəyə alıb hücuma keçdilər və şəhər əhlini sıxıntıya saldılar. Əhali əks hücuma keçib iki ay ərzində müqavimət göstərdilər. Lakin onlar üzlərinə baxan ölüm hökmünə əbəs yerə müqavimət göstərirdilər və tezliklə başlanacaq qırğının dəhşəti onları üzüb tələsdirirdi.

Elə həmin vaxt qorxunc vəhşi nərildəyib tiflisliləri ovlamağa başladı və çoxlarını tutub küləklərinin ağzına atdı, öz yuvasını ovladığı qurbanlarla, döyüşçülərinin əllərini isə qənimətlə doldurdu.

Onlar öz qılınclarını yüksəklərə qaldırıb hamılıqla qala divarlarına hücum etdilər. Bu nəhəng qoşun bir – birinin çiyinlərinə qalxaraq tezliklə divarları aşdı. Bədbəxt şəhər əhalisinin üzərinə zülmət kimi qara kölgə düşdü, onların əzaları keyiyib əlləri qüvvətsiz oldu. Artıq onlar məğlub oldular. Qala divarlarından geriyə çəkilən onlar quştutanın toruna düşüb titrəyən sərçələrə bənzəyirdilər.

Onlardan heç biri evinə baş çəkib ailələrinə dəhşətli bəla barəsində xəbər verməyə macal tapmadı, nə də istəkli balasının qeydinə qalmağa, nə də öz valideynlərini yada salmağa vaxtları oldu. Onlar vahimə içində taqətdən düşüb gizlənməyə yer axtarırdılar. Bəziləri evlərin çardaqlarında, digərləri xəndəklərdə gizlənir, çoxları isə nicat yerini kilsələrdə axtarırdı. Öz uşaqlarını oxşayan anaların fəryadı balalarını axtaran böyük qoyun sürüsünün naləsinə bənzəyirdi. Amma arxalarınca həyatbiçənlər dəstəsi gəlir, onların əlləri qanları sel kimi axıdır, ayaqları bədənləri tapdalayır, gözləri isə ölən adamların yığınlarına sanki göydən tökülən dolu dənələrinə baxırdı.

Fəryad və nalələr yatandan sonra xəzərlər gördülər ki, bircə nəfər də sağ qalan yoxdur və həmin vaxt bildilər ki, onların qılıncları içdikləri qandan içib doymuşdur. Elə o vaxt əllərinə iki zadəgan düşdü: birisi İran şahının buraya təyin etdiyi vali, digəri isə yerli gürcülərdən idi. Onları Xəzər çarının yanına gətirdilərvə o, əmr etdi ki, onu balqabaq sifət və gözsüz göstərmiş bu adamların ikisinin də gözlərini çıxarsınlar. Sonra o əmr etdi ki, onları boğsunlar, dərilərini soyub içinə saman doldursunlar və divardan assınlar.

Bundan sonra xəzərlər əllərini xəzinələrlə dolu sandıqlara uzatdılar və hər bir Xəzər döyüşçüsü qiymətli qaş – daş və cəvahiratla yüklənib hamısını çarlarının yanına gətirərək,onun qabağında tay – tay tökdülər. Onlar o qədər sərvət daşıdılar ki, çarın gözləri saysız – hesabsız qızıl və gümüş pullara baxmaqdan yoruldu. Kilsə əşyaları, qızıl və gümüş qab – qacaq, mirvarili və qiymətli qaş

– daşlı bəzəklərin sayını isə kim və nə vaxt təsvir edə bilərdi?

O, öz tamahını artıqlaması ilə ödədikdən sonra əmr etdi ki, bütün qənimətləri vətənlərinə göndərsinlər. O, döyüşkən ordusuoğlu Şadın sərəncamında qoyub ona və onun pəhləvanlarına əmr etdi ki, Albaniyaya hərəkət etsinlər, özü isə yığılmış xəzinələrlə birlikdə evinə qayıdır. O,oğluna və sərkərdələrinə belə əmr verdi: “ Əgər onların ölkəsinin ( Albaniyanın) hakim və əyanları mənim oğlumu qarşılayıb öz torpaqlarını onun tabeliyinə verərlərsə, şəhərləri, qalaları və bazarları mənim qoşunlarıma təslim edərlərsə, siz də imkan verin onlar yaşayıb mənə qulluq etsinlər. Yox, əgər onlar belə etməsələr, onda qoy sizin gözləriniz on beş yaşından yuxarı kişi nəslinə rəhm etməsin, oğlanları isə qadınlarla bərabər mənə və özünüzə qul və kəniz kimi saxlayın”.

İki ordu bir – birindən aralandı və Şadın ordusu atasının göstərişi ilə ona əmr olunmuş yerə gəlib çatdı. Buradan o, atasının göstərişi ilə İran şahının canişini olan Sema Vişnasp adlı Albaniyanın Mərzbanına və Albaniyanın katolikosu, yuxarıda adını çəkdiyimiz Viroya elçilər göndərdi. İranlı onları qəbul etməyib: “ Axı siz kimsiniz ki, mən bu Albaniyaya görə sizə tabe olum?” – dedi və yığışıb İrana qaçdı, özü ilə ölkədən bir çox qiymətli şeylər apardı.

Albaniyanın patriarxı Viro isə ölkənin boynuna aəir boyunduruğun geydirilməsini başa düşüb narahat oldu. O, İran şahına inanmır, ondan qorxurdu, çünki elə bu ittihamla üsyankarlıqda təqsirləndirilib uzun illər boyu sürgünə məruz qalmışdı.O, elçilərə

tabe olub düşmənin yanına getdi ki, öz ölkəsini fəlakətdən və talandan qurtara bilsin.

Lakin bəsirətli olduğuna görə Viro İran şahına gizli məktub göndərib ona düşmənin xətərindən xəbər verir ki, Şah xəzərlərlə onun danışıqlarını İrana gələn zaman ona bağışlasın, şah bunu bəyənmədiyi təqdirdə isə o, ölkəni tərk edər. Şahdan cavab gələnə qədər Viro düşmənin elçilərini öz yanında saxladı, onlara bir qədər gümüş verib müxtəlif  bəhanələr ləlengitdi. Bəzən onlara:” Mən ölkənin bütün əyanlarını  və bütün vilayətlərini çağırıb onlarla birlikdə sizin çarınıza cavab məktubunu yazacağam” – deyir, bəzən də: “ Onların hamısının gəlməsinə ehtiyac da yoxdur. Mən özüm çarınıza layiq məktub yazıb qiymətli hədiyyələrlə birlikdə göndərərəm” – deyirdi.

Lakin elçilər onu tələsdirib deyirdilər: “ Sən nəyi gözləyirsən və niyə ləngiyirsən? Axı Albaniyanın bütün vilayətlərinə  təyin olunmuş basqın günü yaxınlaşır! Budur biz, bizim knyazların və sahibimiz Şadın gizli niyyətlərini sənə açıb dedik. Əgər sən onun fərmanına uyğun hərəkət etmək fikrində deyilsənsə, onda tələs, qaçıb canını qurtar. Axı biz sənin əlindən hörmət və hədiyyələrdən başqa bir şey görməmişik  və öz Allahımızdan qorxub səni aldatmaq istəməyib qoşunlarımızın əllərini sənin, adamlarının və xalqının boöazında görmək niyyətində deyillik”.

Bunlar belə söhbətlərində olduğu vaxt birdən ölkəmizin hər yerini, dağlarını və düzənliklərini, təpələrini və dərələrini duman və

zülmət bürüdü. Torpaqlarımızın elə bir guşəsi, elə bir qarışı qalmadı ki, onu zülmət bürüməsin.Bütün kənd və şəhərlərdə, bütün və yollarda hamı bir ağızla" Vay, vay!" qıçqırırdı. Barbarların nəriltisi kəsilmirdi və ölkədə elə bir yer yox idi ki, oradan qəzəbli düşmənin ölüm saçan səsi gəlməsin. Və bütün bunların hamısı eyni gündə və eyni saatda baş verdi ki, çünki onlar püşk atıb qabaqcadan öz aralarında bütün bizim vilayət və kəndlərimizi, çaylarımızı və buloaqlarımızı, düzənliklərimizi və bataqlıqlarımızı bölüşdürüb təyin olunmış vaxtda bütün ölkəmizi talan etdilər. Ölkəmiz başdan – başa lərzəyə gəldi və o zaman peyğəmbərin bu sözlərinin doğrulduğunu necə açıq – aydın görmək olardı ki, necə " Şirin qabağından qaçan insan birdən ayı ilə üzbəüz gəlir və ya evinə gəlib əlini divara söykəyən insanı ilan çalır".[1]

Bizim başımıza da o günlərdə eyni əhvalat gəldi, çünki əgər kimsə qılıncdan, sanki qorxunc şirdən özünü xilas edə bilirdisə ətparçalayan və qaniçən ayının pəncəsinə, zülm cənginə düşürdü. Onlar donuxub qalır, acından, taqətdən və ruhdan düşərək ixtiyarsız əsarətə gedirdilər və qəddar düşmənlərin qorxunc görkəmi onlar üçün zəhərli ilanın çalmasına bərabər idi.

Düşmən orduları dəryasının dalğaları bizi aparandan sonra, bu dalğalar katolikosumuzu da təqib edib onu qayalı dağlarda yerləşən Qoltaqarak kəndindən qovdular. O, orada bütün şeylərini, kilsə avadanlığını və qiymətli daş – qaşlarını atıb, atına minib onların

---

[1] İncil. Havari Amosun kitabı, V, 19.

qabağından qaçdı. Xadimlərdən heç biri onu müşaiyət edə bilmədi. Onunla yalnız ölkəmizə gəlmələrdən hündürboy və qüvvətli bir ər, iranlıların qabaqcıl Qad Vişnasp adlı birisi gedə bildi.

Düşmənlərin basqınına keçilməz Arsax vilayətinin qayalı dağları və daşlı dərələri də dözə bilmədi. Bizim günahlarımız ağır yolları onlar üçün yüngül etdi və onların atları büdrəmədən dağları asanlıqla aşırdılar.

Düşmənlər katolikosa çatıb oxlarını ona tərəf tuşladılar. Lakin özüylə danışdığı Müqəddəs Xaçın anılmaz bərəkəti onu düşmənlərdən qorudu və o gün ona düşmən əli dəymədi.

Gün batıb qaş qaralanda düşmənlərdən canlarını qurtaranlar ibadət edib Allaha yalvarırdılar ki, onları gecənin zülməti bürüsün və o gecə böyük katolikosun və bütün sağ qalanların üzünə nicat yolları açılsın. Yenə də onun yanına düşmən elçiləri gəlib ona Şadın bu sözlərini çatdırdılar: “ Mənim dediklərimə əməl etsən onda sən özün də, sənin ölkən də və ölkəndə kim sağ qalıbsa – hamınız xilas olunarsız. Əgər rədd cavabını versən, onda mənim əmrimlə səni tutub istədiyindən asılı olmayaraq yanıma gətirəcəklər”.

Katolikos Viro bu böyük ölkənin bütün adlı- sanlı adamlarını, çar nəslindən olan bütün zadəganları, vilayət valilərini, kəndxudaları, keşişləri və məmurları Caraberd qalasına, öz yanına çağırıb onlara dedi: “ Ərlər və qardaşlar! Başımıza gələn bu dəhyşətli fəlakətləri siz özünüz görürsünüz. Siz hamınız günahlarımız ucbatından üzərimizə göndərilən amansız və doymaq bilməyən və başımızın üstünə qalxan

qılıncın qorxu və dəhşətindən dadmısınız. Və budur çaşıb qalmışıq və bilmirik haraya gedək və bu düşmən əlindən haraya qaçaq? Deyiniz görək, onlar dediyi kimi edək ya yox? Bilməlisiniz ki, onların əlindən ölmək günümüz gözümüzün qabağındadır. Fikirləşin və vaxt itirmədən mənə cavab verin və əgər mən bu cavabda bir fayda görsəm sizinlə razılaşaram. Məni elçi tələsdirir. O isə sadə adam deyil, düşmən qoşunu arasında böyük adamdır və Şad şahzadənin lələsi və mürəbbisidir”.

Katolikos sözünü bitirdikdən sonra orada toplananların hamısı bir ağızdan dedilər: “ Nə üçün, ey ağamız, biz bədbəxtləri ələ salırsan? Məgər aramızda müdrikliklə və öyüd – nəsihətdə səndən ağıllısı varmı? Sənin yanında ağzını açıb ağıllı sözləri kimdeyə bilər? Belə halda əgər insansevər Allah bizə mərhəmətini göstərsə, xeyirxah ata kimi özünü bizim yolumuzda fəda et ki, biz də nə qədər qüvvəmiz bizə imkan versə sənin yolunda canımızı qurban edərik!”

Katolikos onlara dedi: “ Allahın köməyilə onların qəzəbindən qorxmuram. Ancaq siz gərək mənimdediyimi edəsiniz. Qoy sizin hər biriniz imkanınıza görə qızıl, gümüş və qiymətli geyim şeyləri gətirsin. Və heç biriniz xəsislik etməsin, çünki bu hədiyyələrlə biz onların könüllərini alarıq”.

Bu sözlərdən sonra onların hər biri istənilən şeyləri onun yanına gətirdi. O, özü də öz xəzinəsindən çoxlu onlara layiq hesab etdiyi şeylərini ayırdı. Yanına gələn şahzadənin mürəbbisindən Xəzər qoşunları arasında bütün əyanlarının, sərkərdə və knyazlarının

və qəbilə başçılarının adlarını və rütbələrini öyrəndi ki, kimə nə kimi hədiyyə versin. O, hədiyyələri bölərək, bağlamanın üzərində adlarını yazıb öz möhürü ilə möhürlədi. Sonra o, əmr etdi ki, hədiyyələri arabalara yığsınlar və orada olanlara dedi: " Mən hesab edirəm ki, bu rəiyyətlərdən başqa, siz əyanlar da məni yadlar düşərgəsinə müşaiyət etməlisiniz ki, onlarda bir şübhə oyatmasın və hesab etsinlər ki, biz onlara doğrudan da tabe olmuşuq".

Bunu eşidəndə onların bəzisi könüllü olaraq katolikosla birlikdə xəzərlərin yanına getdi, bəziləri isə qorxaraq getmədi. O, onları məcbur etməyib azad buraxdı, onunla gedənlərə isə dedi: " Övladlarım, özünüzə ürək verin, qorxmayın! Bizim rəhbərimiz həqiqətin Müqəddəs Ruhu, Musa peyğəmbərin əsası və İsanın Müqəddəs Xaçının bərəkətidir və onlar coşan dənizin ləpələrini bizdən uzaq edərlər".

Onlar yerlərindən tərpənib yola düşdülər. Dağlararası dərələri keçib Uti vilayətinin gözəl, hamar və bərəkətli düzənliklərinə enəndə orada Şadın o qədər əsgərləri var idi ki, onlar doğma yerləri tanıya bilmədilər.Vaxtilə yəhudilər Qırmızı dənizin ortasından keçən kimi[1] indi də xəzərlərin qoşun dəstələri aralanıb onlara şahzadənin çadırına yol açdılar. Onlar şahzadəni vilayətin şimal tərəfində, böyük Bərdə şəhərinin, gur suların yanında salınmış düşərgəsində tapdılar. Şadın yanına çatanda onlar gördülər ki, o, öz əyan və sərkərdələri arasındadır. Biz[105] onların çadırının içində bardaş qurub oturduqlarını

[1] Bax: İncil. Xuruc, XIV, 22 və sonrakılar.

gördük, elə bil ağır yüklənmiş dəvələr oturmuşdu. Hərəsinin qabağında natəmiz heyvanların ətilə dolu bir qab və ya yanında duzlu su ilə dolu ayrı qab var idi. Əti suyun işinə salıb yeyirdilər. Qabaqlarına Tiflisdən apardıqları gümüş və zərli qab və badələr də düzülmüşdü. Onların əllərində buynuzdan düzəldilmiş badələr və uzun taxta qaşıqlar da var idi ki, bunlarla da onlar şorbalarını içirdilər. Həmin kirli, yuyulmamış və üstündən yağı[106] silinməmiş qaşıq və parçlarla onlar acgözlüklə təmiz şərabı və ya dəvə və at südünü öz doymaq bilməyən tuluğabənzər qarınlarına tökürdülər və demək vacibdir ki, bir qabdan və parçdan iki – üç nəfər istifadə edirdi. Qabaqlarında bizdə olduğu kimi saqilər, arxalarında isə nökərləri yox idi, hətta şahzadənin də. Yalnız qalxanlar və nizələrlə silahlanmış və diqqətlə şahzadənin çadırının keşiyində duran qarovul dəstələri var idi.

Albanların katolikosunun ardınca birinci və ikinci qarovul dəstələrinin yanından keçirib çadırın içinə hədiyyələrlə birlikdə buraxandan sonra, onların qabağına xəzərlər çıxıb əmr etdilər ki, hamısı yavaş – yavaş yeriyib üç dəfə təzim etsinlər. İkinci girişin qabağında hamını saxladılar və hədiyyələri götürüb təkcə katolikosla iç çadıra, şahzadə olan yerə daxil oldular. Katolikos içəri girib onun qabağında yeri öpdü və hədiyyələri ona təqdim etdi. Hədiyyələrin bir hissəsini şahzadənin yanənda olan əyanlara payladı.

Şad hədiyyələrini katolikosun öz əllərindən aldı. O, bu qədər çoxlu adamlarla gəlməsinə sevinib əmr etdi ki, katolikos çadırda

onunla yanbayan otursun. O, katolikosun üzünə bir qədər baxaraq dedi: “ Sən mənim atamsan və sənin siman Allaha bənzərdir. Nə üçün sən mənim yanıma gəlməyə yubanırdın? Axı onda mənim qoşunum sənin ölkəndə bu qədər fəlakət törətməzdi. İndi isə, sən gələndən sonra, mən qoşunlarımın bütün hissələrinə əmr edəcəyəm ki, onlar basqınları dayandırsınlar. Bütün qoşun mənim sözlərimə tabedir. Atam Cebu Xaqanın günəşinə and içirəm ki, məndən nə istəsən sözsüz – səmirsiz yerinə yetirəcəyəm. Sənsə ölkənin bütün əhalisinə əmr et ki, hamı öz evinə, işinə -gücünə və məşğuliyyətinə qayıtsın. Mən də qonşu ölkələrə basqın edib bütün aldığım qənimətləri sənin ölkənə gətirəcəyəm. Sənin ölkənə bir basqınıma görə mən sənə əsirlərlə və mal –qara ilə ikiqat verəcəyəm, çünki mənim atam bu üç ölkəni – Albaniyanı, Lpinki və Çolanı əbədi olaraq almışdır”.

Katolikos ayağa qalxıb ona təzim etdi və dedi: “ Biz sənin atanın və sənin bəndələrinik və həmçinin bu ölkənin bütün sakinləri. Gəl bundan sonra öz bəndələrinə rəhm elə və qılıncını bizdən uzaq et ki, biz necə qabaqlar Sasanilərə xidmət edirdiksə indi də sənə edək”.

Bu sözləri Müqəddəs Xaçın qüvvəsilə dedikdən sonra vəhşi xasiyyətli şahzadənin və onun bütün əyanlarının və qoşunlarının qəzəbi yatdı, onlar katolikosla quzular kimi mülayim olub ona sevimli qardaşları və bütün vətəndaşlar. Onlar katolikosu Şadla bərabər edib onları “ Şad ilahi” və “ Katolikos ilahi” deyə çağırır[107] və katolikosla gələnlərə “ sevimli qardaş” deyirdilər.

Bundan sonra xəzərlər onları oturdub yeməyə dəvət etdilər. Onlara bardaş qurdurub qabaqlarına iyrənc ətlə dolu boşqablar qoydular. Lakin onlar qırxgünlük pəhrizlərinə gürə yemədilər və xəzərlər onları məcbur etməyib əti yığışdırıb onlar üçün sacda hazırlanmış lavaş gətirdilər. Allaha şükür etdilər və çörəyə xeyir – dua oxuyub onu yedilər. Bu da xəzərlərin çox xoşuna gəldi.

Yeyib doyandan sonra onlar ayağa qaxdılar və Şad əmr etdi ki, katolikosu və onun adamları təmtəraqla şəhərə yola saldılar ki, onlar öz evlərində yaxşı dincəlsinlər. Bundan sonra katolikos daim onların düşərgəsində, səfərlərində və istirahət vaxtlarında onlarla birlikdə olurdu. Və o zaman ki, onlar katolikosa bənd oldular, o, da cəsarətə gələrək öz istəklərini deyirdi. Bir dəfə o, şahzadəyə dedi: " Ey sahibim! Madam ki, sizin bəndələrinizik, mən də sənə sənin xeyirin üçün soz deməliyəm. Bizim ölkəmiz dağılmış qalmasın deyə sən öz sadiq adamlarını bütün yerlərə - kənd, oba, vilayət qala və şəhərlərə göndər ki, bu yerlərin xalqı öz yurdlarına qayıdıb qorxmadan çalışsınlar ki, və sizin bu adamlarınız xalqı sənin qoşunlarının zülmündən qorusunlar. Madam ki, bizim ölkə sənə və sənin atana könüllü xidmət etməyə hazırdır, onda sən də, sənin əyanların da bizim xahişlərimizi yerə salmayınız. Qoşunlarına əmr et ki, öz çadırlarında saxladıqları bütün əsirləri – kişi və qadınları, oğlan və qızlarıazad etsinlər. Qoy atalar oğullarından, analar qızlarından ayrı düşüb, bütün ölkədə, sanki ovçulardan qorxan və balasını atıb qaçan ceyran kimi pərən – pərən düşməsinlər".

Buna bənzər mülayim və incə sözlərlə öz mənəvi qüvvəsində katolikos onların qəlblərini alıb istəyinə nail ola bildi. Şahzadə bütün qoşunlarına əmr etdi ki, onlar əsirləri azad buraxsınlar və heç kəs bu əmrin yerinə yetirilməməsinə cürət etməyib əsir olanlardan kimisə gizlətməsin, çünki əks təqdirdə bu adamı ağır cəza gözləyir. Bu məqsədlə o, qoşunlarına tudun adlanan öz vəkillərini və onlarla birlikdə katolikosun səkkiz adamını göndərdi. Onlar qoşunların düşərgələrinə gəlib çadırları bir – bir yoxlayıb əsirləri axtardılar. Şeylərin altından və mal – qaranın arasında gənc oğlanları tapıb onları bayıra çıxardılar və heç kəs onlara müqavimət göstərə bilmədi. Əsirləri dəstə - dəstə toplayıb katolikosun yanına gətirirdilər. O da baba nəvələri geyindirir, acları yedizdirir və sonra da onları evlərinə yola salırdı. Bu andan Allahın bərəkəti həmişə onunla idi və o, həmişə öz işlərini və əməllərini uğurla başa çatdırırdı. Onun adı isə düşmənlər arasında o vaxtadək çəkildi ki, Allah – təala öz xalqına baş çəkib onların əlindən qurtardı.

# ON BEŞİNCİ FƏSİL

## Eyni vaxtda öz vermiş dəhşətli aclıq, taun və ümumi ölüm haqqında

Aclığın ağır günlərində bizə danışmaq lazımdır və vacibdir. O zaman hər şeyi didib parçalayan siçovullar gəlib ayaqlarımız altında

qaynaşır, tarlalarımızın bütün məhsulunu və bütün bitkiləri yeyib həzm edirdilər. Sonra üç qəddar sərkərdə - Aclıq, Taun və Ölüm birləşib, əlbir hücum edərək insanları məhv edib biçirdilər. Və heç bir adam son təsəllisinə, günahlarının bağışlanmasına layiq görülmədi, çünki Taun mane olur, Aclıq əzir və Ölüm isə boğurdu.

Ah, nə acı zamanlar idi! Bütün bu dəhşətli bəlanı görən gözlərimiz nə qədər də bədbəxt idi! Ölümdən xilas olan adamlar dağlara müraciət edərək: " Yıxılın üstümüzə!" – deyə yalvarırdılar. İnsanlar elə qorxmuşdular ki, ağac yarpağının xışıltısından belə əsib titrəyirdilər. Bu Böyük Pəhriz vaxtına düşən qorxulu günlərdə istisnasız olaraq bütün insanlar ölmüş heyvanların ətini yeyir, bitkilərin köklərini çıxarır, ağacların qabıqlarını soyur, yarpaqları və budaqları qırıb çeynəyirdilər, lakin bunların heç biri onlara qüvvət vermirdi. Zavallı insanlar qurumuş üzüm tumunu yığıb üyüdürdülər və bunu yeyirdilər. Ac olan insanlar bir yerə toplaşıb özlərinə bənzərlərə hücum edib əllərində nə varsa qapıb yeyirdilər. Kasıbların halı daha acınacaqlı idi. Ac gözlər hər an öz yaxınına hücum edib onu soymağa hazır idilər.

Etibarlı adamdan bunu eşitmişəm.[108] " Biz elə adamlar görmüşük ki, onlar meyitlərin əzalarını kəsir, köhnə öküz dərisini, kirli kisələri və çəkmə boğazlarını bişirib yeyirdilər". Biz başımıza gələn fəlakəti ayrı yerlərdə baş verən fəlakətlərlə heç müqayisə də edə bilmərik. Bəlkə imperator Vespasian və oğlu Tit[109] tərəfindən sökülüb dağıdılan Qüds şəhərinin vəziyyətini bunlara oxşatmaq

olardı. Biz acından ölənlərin meyitləri üstündə yeriyirdik və bu qara və şişman meyitlər çöllər üstünü, çayın yatağını qara daşlar kimi örtmüşdü. Peyğəmbərin dediyi: “ O, eşşək kimi basdırılacaq”[1] və “ ölünün matəmində kədər çörəyini dadmayacaqlar” [2] sözləri gerçəkləşdi.

Yaz günləri gələndə insanlar ot yeməyə başladılar və bunun üzündən yazda ölənlərin sayı qışda olduğundan daha çox idi.

Lakin bütün bunları görüb dərk edənlər bilməlidirlərlər ki, aclığın sonunda bütün ölkəni heç bir başqa xəstəliklərə bənzəməyən xəstəlik bürüdü. Bu xəstəliyə düşənlər bir – iki ay ərzində dəli olurdular. Onlar yerə oturub dişlərini qıcıdır, gözləri pərpər qalıb anlamırdılar ki, onlar xəstədirlər və heç su istəməyi də bacarmırdılar. Bəziləri özlərindən çıxmış dəlilər kimi öz yataqlarından lüt və eybəcər halda qalxaraq əlləri ilə hava ilə vuruşurdular, bəziləri isə xəstələrə baxanlarla çox kobud rəftar edirdilər. Amma xəstəliyin çox amansız olmasına baxmayaraq, onu dəlilik də adlandırırdılar, heç bir ölüm hadisəsinə təsadüf edilmədi. Xəstəliyin qurbanları qaralıb cılızlaşır, onların bədənləri zəifləyir, əzaları iflic olur, tükləri və saçları isə tökülürdü.

Uzun günlər boyu mən kədərlənib bu ölüm hadisələrinə görə göz yaşları tökür, ən mərhəmətliAllaha yalvarırdım ki, o, bizi bu dözülməz fəlakətdən qurtarsın. Mən, Albaniyanın, Lpinkin və Çolanın katolikosu Viro başqa eybəcər şeylərdən, yəni bədənlərin

---

[1] İncil. Havari İyeremiyanın kitabı, XXII,19.
[2] Yenı orada, XVI, 7.

çirkliyindən, başların dazlaşmasından və sairədən heç danışmaq da istəmirəm, çünki məhz bunlarda peyğəmbərin ixtiyarının izhar olunmasını görürəm. O deyib: “ Mən bütün bellərə cın – cındır sarıyıb, bütün başları daz edəcəyəm və ölkədə yeganə sevimli oğul ölübmüş kimi ağlatma törədəcəyəm”.[1]

Allah – təala bütün buyurduğunu yetirəndən sonra onları yadına saldı, necə ki, vaxtında Nuhu və gəmisini coşqun sular içində yadına salmışdı. Onlara rəhmi gəldi və o, bədənlərinə toxluq verib aclıqlarını yatırdı və hər ehtiyacı olana istədiyini verdi ki, hər kəs bu lazımlı şeylər üçün sevinib Allaha öz mədhini qat – qat artırsın.

# ON ALTINCI FƏSİL

## Arsaxa köçüb oturan tərki – dünya Yovsepin barəsində. Onun Qüds şəhərinə ziyarəti və oradan müqəddəslərin qaxımış cəsədlərini gətirməsi

İraklinin çarlığı illərində, İranda Yezdəgirdin şahlığının süqutu vaxtında, Erməniyyədə Yezrin katolikosluğu, sərkərdə Muşeqın dövründə, Sünik knyazı Qriqorun və yepiskopu Matuşaqın vaxtında, Albaniya hökmdarı və Girdıman sahibi Varaz – Qriqorun çarlığında[110], mən, tərki – dünya Yovsep Qeqam dairəsində yerləşən Birti vəngini zamanın qəmli fəlakətləri üzündən tərk etdim, çünki

[1] İncil. HavariAmosun kitabı, VIII, 10.

qanunpozan adamlar azğınlaşıb kilsələri ayaqlayıb məzlum xalqdan vergi yığır, öz pozğun hərəkətləri ilə ölkəni viran edib dağıtdılar. Bu bəlaları hamıdan çox indi qüvvəyə gələn və bütün ölkələri ayaqlayan tacik[111] xalqı törədirdi.

Bu zülmdən qaçaraq mən Arsax vilayətinin İlerk kəndinə gəlib qocaman yepiskop Mehrin yanına getdim.

Mən ləyaqətsizi qəbul edib o, kənd əhlindən bir parça torpaq alıb bu kilsəni tikdirdi. İyirmi il mən bu kilsədə xidmət edəndə Allah onu öz cədlərinin yanına qaçırdı və onun yerini Andreas tutdu və on bir il burada keşiş oldu. Mən ona qulluq etdim və o da mənə hər cür kömək etdi.

Lakin bu yerdə müqəddəslərin qaxımış cəsədləri yox idi. Elə bu vaxt Tancikdən olan Mxitar adlı tərkidünyalılardan birisi, müqəddəs Qüds şəhərini görmək üçün iki yoldaşı ilə birlikdə oraya, bütün müqəddəslərin ziyarətinə getdi  və tam bir il orada qaldı. Orada İsa peyğəmbər bir dindar köylü yunanlının vasitəsilə Mxitara öz qohumları üçün saxladığı müqəddəs Stefanın və müqəddəs Qriqorun cəsədlərinin hissələrini verdi və dedi: “ Bunları ölkəmizə aparıb onlara layiq bir yerdə qoyarsan”. Mxitar bu sərvəti götürüb, düşmənlərdən qorxa – qorxa Bizansa getdi və Tavr dağlarında yerləşən müqəddəs Andrey vənginə çatdı. Həmin Andrey öz yoldaşlarının çoxu ilə birlikdə çar Selevik tərəfindən[112] şəhid olunmuşdu. Mxitar vəngin xadimi olan Tomasa yalvardı ki, Andreyin cəsədinin parçasını ona versin, o da onun xahişini yerə

salmadı. O, bu pak sərvətlə birlikdə gəlib Arsax vilayətinə çatdı.

Mən Yovsep, bunu eşidən kimi onları qarşılamağa getdim. Elə həmin gün mən bu müqəddəsləri onlara layiq yerdə rahatladım, ertəsi gün də Mxitardan soruşdum ki, o, müqəddəsləri haraya aparmaq fikrindədir. O da: “ Allah haranı buyursa onlar da orada olacaqlar” – dedi. Mən də müqəddəslərə olan məhəbbətimə görə Mxitara dedim: “ Bilirəm ki, mən bu cəsədlərə qulluq etmək üçün layiq deyiləm, amma səninlə birlikdə mən onlara ömrümün axırınadək xidmət etməyə hazıram”. O, buna razı olub müqəddəslərin qaxımış cəsədlərini sovməəyə qoydu. Həmin sovməəni isə xarrat Pokrik (“ Kiçik”) öz oğlu Yohanla və dəmirçi Baxtanerlə birlikdə üç aya tikmişlər. Bundan sonra onların xatirini yad etdik və adət üzrə əsasən ibadətdə olduq.

Bundan sonra ürəyimə damdı ki, müqəddəs İoannın cəsədinin bir hissəciyini tapmalıyam. Bu müqəddəsi Xilaskarımız İsanın özü qadınların doğduqları arasında ən ulusu adlandırırdı. [1] Keşiş Andreasın icazəsi və vəsaiti ilə keçmiş Yovhan və Mxitar dostlarımın razılıqları ilə mən öz şagirdlərim Kristosatur, Qriqor və Sarqislə İoannın cəsədini axtarmaq üçün yola düşdük. Müqəddəs Qüds şəhərinə gəlib müqəddəs yerləri ziyarət etdim[113] və böyük dərd və qəm içində qayıtdım, çünki orada hamı küfrə tutulmuşdu, onlar dünyanı dağıdan Xalkedon qurultayının tərəfdarları idilər. Onlarla vidalaşmayıb, mən Qeqarkunik vilayətində olan Puhavank kəndinə

[1] Bax: Əhdi-Cədid. Matfeydən, XI,11.

qayıtdım, çunki hələ uşaqlığımdan eşitmişdim ki, burada Müqəddəs İoannın cəsədinin hissəciyi var. Orada mən yerli keşiş Qriqorikə yalvardım ki, o hissəcikdən mənə də pay versin. O, Allahın izniylə razı oldu və sandıqçanı açaraq içində müqəddəs İoannın, Havari Fomanın və birinci şəhid Stefanın qaxımış cəsədlərinin hissəciklərini tapdıq. Bütün bunları bizim cədlərimiz vaxtında müqəddəs Qüds şəhərindən gətirmişdilər.

Mən Yovsep, bu hissəcikləri ondan alıb həmin sovməəyə gətirdim və hər kəs buna çox sevindi. Cəsədləri rahatlandırıb onları Qüdslü Kirillin göstərişinə əsasən yad etdik.

Bundan sonra Qeqam vilayətində olan bütün müqəddəs cəsədlər bizim sovməəyə gətirildi və hamısının adları qaydası ilə yerində yazıldı.

Qoy Allah – təala bu müqəddəslərin havadarlığı ilə bizim ölkəyə mərhəmətini əsirgəməsin.

# ON YEDDİNCİ FƏSİL

## Düşmənlərimizdən intiqamımızı alan möcüzələr haqqında

İran şahı Qubad oğlu Ərdəşirin hakimiyyətinin ikinci ilində[114], yəni hələ istədiyi kimi hökmranlıq etdiyi vaxtda, şimal çarının qüvvəsi o qədər artdı ki, o, yer üzünü öz qorxu və dəhşətilə

başdan – başa bürümüşdü. O, qızıl axtarıb tapmaq ustalığına malik olan, gümüş əridən, dəmir və mis çıxaran sənətkarlar üstünə nəzarətçilər təyin edib, tacirlərdən və böyük Kür və Araz çaylarında balıq tutanlardan İran şahlarının vergi dəftərlərinə əsasən didrahm məbləğində vergi tələb etdi. O, bizim torpaqlarımızın bərəkətli olduğunu biləndən və ondan heç bir şeyi gizlətməmələrinə əmin olandan sonra Ermənyyəyə və onunla qonşu ölkələrə basqın etmək qərarına gəldi.

Öz ordusundan üç minə yaxın qüvvətli döyüşçü seçib onlara Çorpan Tarxan adlı[116] cəsur və qaniçən birisini sərkərdə təyin etdi və onları qabaqcadan göndərdi ki, onun özünə təhlükəsiz yol seçsin və hələ də Fələstin ölkəsini öz əlində saxlayan məğrur İran sipəhsaları barəsində[117] məlumat toplasın. Bundan sonra o, öz ordusunu hər cür ləvazimatla təzhic edib yavaş – yavaş Çorpanın ardınca hərəkət etdi. Erməniyyəyə gəldikdə Xəzər sərkərdəsi öyrəndi ki, İran sipəhsaları ona qarşı səfərə çixib və buna görə o, ilan kimi qıvrılıb özünü pusquda gizlətdi. Lakin Şəhrivaraz bildi ki, düşmən onun üçün nə hazırlayıb və xəzərlərin bu cəsur dəstəsi nə qədər irəliləyə bilmişdir. Həmin vaxt o, öz qoşunlarına dedi ki. Sasanilər sülaləsinə mənsub olanların hamısını qırmaq və onların yerinə onun özünü şah elan etmək lazımdır. O deyirdi: “ Ey İran camaatı! Baxın və bilin ki, mənsiz siz heçsiniz. Mən Bizans oğlunu ( imperatoru) qovdum, indi də Şərq xalqının üstünə gedirəm. Mən öz cəsur qoşunlarıma əmr edəcəyəm ki, onlar öz atlarının nalları ilə bütün bu şimaldan gəlmiş

qotlar tayfasını[118] tapdalayıb əzsinlər. Öz ümidlərini bağladıqları və ev uşağı kimi bağırlarına basdıqları bu südəmər[119] onların əllərində bir oyuncaqdır və o, onları müdafiə edə bilməz. Onlar az saylı qoşun tərəfindən məğlub edilib həlak oldular. İndi isə sizi qorxaq sayaraq xəyallarında bizim Arilər ölkəmizin şan – şöhrətinə varis olmaq istəyirlər".

Sözünü deyib Şəhrivaraz, ordusunun Honax adlı ən cəsur döyüşçüsü və ərəb cinsli atları olan süvari dəstəsinin başçısına təkəbbürlə dedi: " Dur ayağa və ordunun içindən keçib özünə on min igid və mərd seç və onlarla düşmənə qarşı get. Özünə döyüş meydanı axtarma və düşmənlə vuruşma. Qisasçı kimi öz qılıncını qınından çıxarıb düşmənin üstünə şığıma ki, sonralar öz aralarında: " Biz onları qılıncımızla qırdıq!" – deyib lovğalanmasınlar. Onları ancaq atlarınızın nalları və sinələri ilə əzin! Əzin və tozlarını külək kimi sovurun! Onların dəstəsini darmadağın edəndən sonra irəli get, düşərgələrinə çat və orada çarlarının və onun əsgərlərinin üzərinə hücum et. Bu döyüşdə sən tək özün onların öhdəsindən gələrsən və onların hamısını qırdıqdan sonra həmin döyüş meydanına " Düşmən məzarı" adını qoyarsan. – " Dediklərim budur!"

İgidlər igidi bunu eşidib daha da qürurlandı. Ordusunu gözdən keçirib düşmənə hücum etdi. Lakin düşmənlər onların yaxına gəlməsindən qabaq hər şeyi bildilər və ordularını iki yerə bölüb bir hissəsini pusquda oturtdular, digəri isə səflərini düzüb onları gözləyirdi. İranlılar hücum edən kimi onlarla üzbəüz olanlar qaçdı və

hücum edənlər də onları təqib etdilər. Elə bu vaxt pusquda olanlar qəflətən hay – küylə hər tərəfdən hücum edib iranlıları alov kimi, Göyçə gölünün sahilində yanan qamışlıq kimi dörd yandan əhatə etdilər. Onların hamısını qırdılar və birini də sağ qoymadılar ki, gedib bu qədər adamın ölməsi haqqında bəd xəbəri böyüklərinə çatdırsın. Beləliklə, onların lovğalığı öz başlarına oyun açdı, çünki insanın qüvvəsi təkcə onun öz gücündə deyil və düşmənləri taqətdən salan yalnız Allahdır.

Xəzərlər, meyitləri soyandan, iranlıların atlarını yəhər – qayışlarını, nizələrini və qızıl qəbzəli qılınclarını, qalxanlarını, təmtəraqlı və yunan ustaların əlləriylə bəzənmiş əlbisələrini yığandan sonra bütün bu qənimətləri öz aralarında bölüşdürdülər. Öz adətləri üzrə onlar gözəl atlarının qulaqlarına nazik zolaqlara parşaladılar, yallarını qırxdılar, quyruqlarını da ət və sümüyü ilə qarışıq bir dirsək uzunluğunda kəsib onları eybəcər hala salaraq yükdaşıyan qatırlara çevirdilər.

İranlıların lovğalığı lazımi qədər cəzasını aldıqdan sonra, yanında qılınc gəzdirən hər bir döyüşçü və hər bir insan başa düşdü ki. onun qabağında çarların nüfuzu və sərkərdələrin qüvvəsi heç bir şeydir.

Bundan sonra Şimal qazanı[120] üzünü öz ordularına çevirdi və bütün qəzəbini onların üstünə yıxıb, bir günaha görə min qat, iki günaha dörə isə on min qat cəza verirdi.

Madam ki, düşmənlərimizin başına gələn dəhşətli və müdhiş

cəzadan söz açdım, sözlərimin təsdiqi üçün bir qədər misal gətirməyi vacib bildim. Bəlkə bütün bunlar Fironu suda boğmasından[1] və ya Musanın amaliklilərlə döyüş zamanı əllərinin qaldırılmasından[2] və ya Hedeonun qırdığından[3] və ya İyessey oğlu Davudun əzəmətli şücaətindən[4] və ya gecəyarısı assurilər düşərgəsini lərzəyə salan dəhşətli qorxudan[5] və başqa buna bənzər hadisələrdən daha da üstündür? Amma gəlin söhbətimizin ana xəttinə yenidən qayıdaq, Allah – təala bizə görə əzəmətli buyruqlarda olub, biz isə hələ onlardan bəhs etməmişik.

Xəzərlər dağ keçidlərini aşıb, üç ölkəyə - Erməniyyə, İberiya və Albaniyaya gəlib çıxdılar və onlar bu yerlərdə durduqları zaman fəlakətli Şimal şiri Cebu Xaqanın özündən onun acgöz balası Şada qəmli xəbər gəldi: " Mənə quldurlar basqın ediblər və sən daha üzümü görməyəcəksən. Çünki öz məqamımı möhkəmləndirməyib mən ağılsız hərəkət edərək, özümü mənim üçün faydasız olan hökmranlığa sərf etdim. Buna görə də mənim hədsiz lovğalığım mənim özümü cəzalandıraraq yüksək mövqeyimdən uçuruma atdı. Sənə məsləhətim: bir an da gözləmədən səninlə bir yerdə olanların hamısını məhv et və onlardan canını qurtar. Çünki əgər onlar burada baş verən hadisələrdən səndən qabaq xəbər tutsalar, onlar özləri səni yox edərlər. Onda mən də vəliəhdsiz ölərəm".

---

[1]Bax: İncil. Xuruc, XIV, 26-28.
[2] Yenə orada, XVII, 9-12.
[3] Bax: İncil. Hakimlər kitabı, VI- VIII fəsillər.
[4] Bax: İncil. Birinci Çarlıq kitabı. XVII və sonrakılar.
[5] Bax: İncil. Dördüncü Çarlıq kitabı, XIX, 35.

# ON SƏKKİZİNCİ FƏSİL

## İranda şücaətini və qəhrəmanlığını göstərən Varaz – Qriqorun ikinci oğlu böyük knyaz Cavanşirin əməlləri və igidliyi

Böyük İran şahı Xosrovun ölümündən dörd il sonra taxta onun oğlu Yezdəgird oturdu[121]. Həcərin[122] nəslindən olan on iki qəbilə ittifaq bağlayıb qüvvətləndi. Onlar saysız – hesabsız təhlükə doğuran miqdarda öz uzaq məmləkətlərindən çıxaraq tufan kimi səhranı arxada qoyub Suriyanı keçdilər və ildırım sürətilə İran dövlətinə basqın etdilər. O vaxt İranın müxtəlif vilayətlərinin sərkərdələri, əyanları, hakimləri və azadxahları və İrana tabe olan bütün ölkələr yad düşmənə müqavimət göstərmək üçün öz qoşunlarını topladılar. Bu hadisələr zamanı məşhur Ərdəşir nəslindən[123] olan Albaniya knyazı Varaz – Qriqor öz ikinci oğlu Cavanşirə[124] diqqət edərək gördü ki, o, cəsur, görkəmli və gözəl şahzadədir. O, hələ indi – indi boy – buxuna çatır və onun üzündə zərif tüklər o qədər də görünmürdü. O, atasının istəklisi olub, qartal kimi cəld və həmişə döyüş meydanına çıxmağa hazır idi. Cavanşirin bütün oğullarının ən qabiliyyətlisi olduğunu bilən atası onu kübar cəmiyyətində yaşayan əyanlarla bərabər etmək niyyətində deyildi və buna görə də Cavanşiri İran şahının sarayına göndərmək istədi. O,

belə qənaətə gəldi ki, onu şah sarayında təmsil etmək üçün oğullarından Cavanşir daha bacarıqlıdır.

Cavanşir atasından bir dəstə döyüşçü alaraq İran paytaxtında keçirilən ümumhərbi keçidə Sünik knyazı ( Qriqordan) və erməni sərkərdəsi ( Muşeq Mamikonyandan) qabaq gəldi. İran sipəhsaları Rüstəm Cavanşiri görən kimi onu qardaş və doğma oğlu kimi qarşıladı.[125] Cavanşiri, ümumiyyətlə, hamı xoşladı. Sipəhsalar çoxminli atlı qoşunu ilə Mədainə gəlib gənc Cavanşiri Yezdəgird şaha təqdim etdi. Şah iki əlini Cavanşirin başı üstünə qoyub onu tərifədi və Albaniyanın sərkərdəsi rütbəsinə layiq gördü.

Cavanşir Dəclə çayını keçərək Beh Kubad dairəsinə gəldi və o, öz çoxsaylı qoşununa güvənərək qürurla hüsab etdi ki, bütün cənub qoşunlarını ayaqlayacaq. O, öz düşərgəsini Ölu Suların[126] sahilində düşmənlə üzbəüz saldırdı. Ərəblər irəliləyəndə Albaniya sərkərdəsi onları qarşılayıb hücumlarını müvəffəqiyyətlə dəf edirdi. Elə birinci döyüşdə o, düşmənlərin bir neçəsini öldürüb daha da ürəkləndi, çünki gördü ki, Allah – təala onunladır.

Bir neçə gündən sonra, Meheqan ayında, İsanın Mövlıd günündə[127], 30min atlı və 20 min piyada[128] yaxşı silahlanmış iranlı və müttəfiq qoşunlar ərəblərin üzərinə hücuma keçməyə hazırlaşdılar. Lakin Qadisiyyədən gələn çoxlu atlı və 20 min piyadalı Həcər oğulları ( ərəblər) qalxanları birləşdirib İran qoşunlarını darmadağın etmək üçün özləri qabaqcadan hücuma keçdilər.

Albaniya sərkərdəsi Cavanşir öz igid döyüşçüləri ilə onların

səfləri içərisinə soxulub düşmənlərindən ikisini yerə sərdi, özü üç ağər yara aldı, atı isə dörd yerdən yaralandı. Düşmən onu quduz bir kinlə Fərat çayınadək təqib etdi, o isə həmlələri dəf edərək çayı üzüb keçdi. Onun üst – başı qan içində idi, silahıda palçıq içində idi. O, bütün İran ordusunun və əyanlarının ot kimi biçilib[129] qırılmasını gördükdə tələsik şah sarayına yola düşdü. Burada onu çox səmimi qarşıladılar. Şaha Cavanşirin şücaətindən və aldıqları ağır yaralarından danışanda şah onu dəbdəbə ilə qəbul edib əmr etdi ki, ona şah sarayında yer ayırıb yanına həkimlərini göndərsinlər.

Yaraları bir qədər sağalandan sonmra Cavanşir şahın yanına gəldi və o da əllərini onun başına qoyaraq hamıya təriflədi. Şah onu sərkərdəyə layiq olan mükafatlandırdı, o cümlədən sərkərdə kərəyanları, iki qızıl nizə və iki qızılla süslənmiş qalxanla fərqləndirdi. Bu qalxanları bundan sonra Cavanşiri o biri sərkərdələrdən fərqləndirən şan- şöhrət əlaməti kimi həmişə onun qabağında daşıyırdılar. Şah onun belinə mirvarilə işlənmiş qızıl kəmər və qızıl saplı qılınc bağladı, qollarına qolbaqlar saldırdı, başının üstünə isə qaşlı – daşlı tac qoydurdu. Onun boynuna ağır mirvari boyunbağı asdılar, çiyninə taftadan tikilmiş şah geyimi saldılar. Və zərli ipək parçasından tikilmiş dörd qotazlı mavi rəngli şalvar geyindirdilər.

Şah əmr etdi ki, ona kəndlər və balıqla dolu çaylar bağışlansın. Bütün bunların timsalında görmək olardı ki, müqəddəs “

möminliyin şərəfli bəhrəsi”[1] sözləri necə də özünü doğrultdu! Cavanşir şahın əlindən bu qədər mükafat alandan sonra daha da şöhrətləndi.

Midiyada və Həmədanda iki İran sərkərdəsi bir – biri ilə uzun vaxt döyüşürdülər. Cavanşir hamının gözü qabağında onlardan birini yerə yıxdı və qaçmağa məcbur etdi və müdrik bir adam kimi onları barışdırdı. Elə buna görə də Xorazad adlı sərkərdə ona böyük hörmət bəsləyir, onu həmişə təmtəraqla qarşılayırdı.

Yezdəgird şahın hakimiyyətinin səkkizinci ilində ərəblər ikinci dəfə iranlıların üzərinə hücuma etdilər və şahın özünü Mədain şəhərində altı ay ərzində mühasirədə saxladılar.[130] Elə bu vaxt Xorazad və Albaniya sipəhsaları Cavanşir öz qoşunları ilə düşmən üzərinə hücum etdilər. O, gözlərini göylərə qaldırıb dua etdi və üç min döyüşçü ilə düşmən üzərinə hücum edib onları geri oturtdu və təqib edərək Dəclə çayının o biri sahilinə keçməyə məcbur etdi. Bundan sonra o, altı ay ərzində ərəblərə Dəclənin yenidən keçməyə imkan vermədi. Bundan sonra o, şahı götürüb böyük Dastakertə getdi.

Bu vaxt düşmən böyük qüvvə toplayıb Cavanşirin üzərinə hücum etdi. O isə şahı götürüb Beklala[131] apardı. Həcərin oğulları isə ( ərəblər) tufanlı dənizin ləpələritək onu təqib edirdilər. Bütün bu günlər ərzində Albaniyanın sipəhsaları dayanmadan düşmənlərə zərbələrini endirir və hamıya öz şəxsi şücaətini göstərərək dəfələrlə

---

[1] İncil. Havari Pavelin yəhudilərə göndərdiyi risaləsi, XII. 11.

şahın ayaqları altına vurduğu düşmənlərin kəllələrini tullayırdı. Bundan sonra hər iki tərəf qoşunlarını düzüb döyüşə hazırlıq gördü. Elə bu vaxt İran ordularına Allah –təalanın qəzəbi tutdu və onlar dəhşətli məğlubiyyətə uğradılar. Səmalardan endirilən buyruğa görə İran şahlığının son saatı vuruldu.[132]Yeddi il dalbadal cəsur Cavanşir bu ağır döyüşlərdə iştirak edib, on bir dəfə ağır yaralar almışdı. Bundan sonra o, iranlılarla vidalaşıb Atropatenaya getdi. Burada şan – şöhrətli ada malik olan Cavanşiri yerli İran sərkərdəsi gördü və təkidlə ona öz bacısını vermək istədi. Lakin Cavanşir bütpərəst arvad almaq istəmədi və öz vətəninə qayıtdı. Sevimli oğlunu görən atası Rəhilədən olan və xiffətini çəkdiyi birinci oğlunu görüb sevinən ulu babamız Yaqub kimi[133] həddindən artıq sevindi. Cavanşirin saçları ağarmış atası Yaqub kimi öz oğlunu bağrına basıb ağladı.

# ON DOQQUZUNCU FƏSİL

## Albaniya sipəhsaları Cavanşir haqqında və onun iranlılar üzərindəki qələbələri. Yezdəgirdin ölümü. Cavanşir Bizans imperatoru himayəsinə keçir

İran müharibələrindən şöhrətlə qayıdan Cavanşir çarın sərəncamı ilə Albaniyanın bütün işlərinə rəhbərlik edirdi. O,

qoşununu götürüb atası ilə birlikdə Bərdə şəhərindən çıxaraq şimal tərəfə çəkildi. Cavanşirin üsyanı haqda xəbər iranlılara çatanda onların qoşunları bizim ölkəyə soxuldular. Düşmən qoşunlarının ön dəstələri tezliklə bu vilayətin cənub dairələrinə girən zaman Cavanşir yaxşı silahlanmış dəstəsilə sürətlə iranlıların qabağına çıxıb öz əlilə onların Dəyləm mənşəli başçılarını vurdu. Cavanşir və onun döyüşçüləri onlardan çoxlarını qılıncdan keçirib bir qismini də əsir aldılar. Onlar böyük qənimətlər, o cümlədən at və qatırlar ələ keçirərək geriyə döndülər. Lakin buna baxmayaraq İran qoşunları onları təqib etməkdən əl çəkmədi. Onlarla ikinci döyüş dağlıq yerdə baş verdi. O günü də Cavanşir qələbə qazandı və o, Allahın köməyilə düşməni darmadağın etdi. Amma elə bu vaxt ona xəbər çatdı ki, iranlılar Bərdəyə daxil olub onun anasını və qardaşlarını əsir aldılar.

Mən [1] həqiqəti gizlətmirəm və deyirəm: o gün Cavanşir balalarını itirmiş dişi ayı kimi çox qəzəbləndi və hiddətləndi. O, qəmli – qəmli tezliklə Kambeçan vilayətində və Kürün o biri sahilində yerləşən öz ata – baba mülkünə gəldi. Burada o, iranlıların qüvvələrinə laqeydlik göstərməyərək onlarla döyüşə hazırlıq gördü və qoşunlarını düşmənlə üzbəüz çox düzgün yerləşdirdi. O, çox qızğın döyüşdə başından yaralandı. Lakin Allahın köməyi ilə yenə özünə gəldi və düşmənlə o vaxtadək vuruşdu ki, onlardan heç biri sağ qalmadı. Bundan sonra o, şan – şöhrətlə Gürcüstan tərəfə getdi. Qaldığı yerdə onun yanına ölkənin knyazı Adarnarseh öz əllərilə

[1] Yəni müəllif.

Cavanşirin yaralarını sarıdı və onun qələbələrilə fəxr etdi. Burada onlar sarsılmaz sülh sazişi bağladılar, bunlardan sonra Cavanşir gürcü qoşununun köməyilə tezliklə Uti vilayətinə yüyürdü və orada rastlaşdığı bütün iranlıları qılıncdan keçirdi. O, iranlıların hamısını öz qış iqamətgahı olan Bərdə şəhəri alanda da qırdı. O, şəhəri alaraq öz anasını və qan qardaşlarını da azad etdi.

Bundan sonra Atropatenadan onun ölkəsinə tez – tez çoxsaylı iranlı dəstələri soxuldu. Lakin Cavanşir onlardan qorxmurdu, çünki o, azsaylı düşmən dəstələrindən daha çox böyük qoşun dəstələrilə döyüşməyi xoşlayırdı. Belə ki, o, Şakaşen vilayətində iki döyüşdə əlində qılıncı çoxlu iran dəstələrini qırıb məhv etdi və bunların içində döyüşçüləri ilə birlikdə bir neçə minbaşını da öldürdü. Lakin Cavanşirin əlində qılıncı başqa döyüşlərdə nə qədər düşməni öldürməsi haqqında danışmağımız burada artıq olar və buna heç ehtiyac da yoxdur.

Cavanşirin qələbələrini görüb eşidən Ermәniyyə və Gürcüstan əyanları onun üçün öz nəsillərindən qız seçib onunla qohum olmaq istədilər Lakin o, Sünik vilayəti knyazının Aruncan nəslindən özünə seçib onunla evləndi və bununla da süniklilərin hamısını çox sevindirdi.

İran sərkərdəsinə gəldikdə o, Cavanşirin əlindən öz dəhşətli məğlubiyyətini və qoşunlarının məhv olmasını gördükdə üzünü sülhə və məhəbbətə çevirməli oldu. O, Cavanşirə Sünikin böyük knyazı vasitəsilə məktubla müraciət edərək and içdi ki, onunla ittifaq

bağlayacaq. Vasitəçi onların arasında sülh və dostluq yaratmağa çox çalışdı. Lakin o, ittifaq bağlayıb ürəyində bədxahlığı gizlətdi. Albaniyanın sipəhsaları da öz anası və qardaşları ilə öz ölkəsinə qayıtdı.

Cavanşir böyük İran şahlığının tənəzzülü haqqında fikirləşərək və keçmiş Şərq şahlarının müstəbid olmalarını yada salaraq öz şəxsiyyətinə xüsusi təmtəraq verdi və belə qənaətə gəldi ki, bundan sonra öz hakimiyyətini heç kəsə tabe etməsin. Cavanşir İran sərkərdəsinə cəsarətlə xəbər verdi ki, hər iki tərəf bildiyi kimi müstəqil hökmranlıq etməlidir. Bundan sonra o, öz qardaşları ilə ata – baba vilayətinə gedir. İran sərkərdəsi isə ittifaqı pozub hiylə ilə Cavanşirin atasını yanına çağırdı ki, onu özünə tabe olmağa məcbur etsin. Bundan sonra sərkərdə Albaniya vilayətlərinə valılər təyin edib o yerlərə öz qoşunlarını göndərdi.

İndi cəsur Cavanşir və onun böyük qardaşı nə edə bilərdilər? Atalarının intiqamını almaq üçün onlar silahlandılar və yorğa atlarını minib uzun yolu qisaltdıraraq gəlib Firuzabad ( Bərdə) şəhərinə çatdılar. Əvvəlcə, onlar qalın meşəlikdə yerləşən bir tövlədə yatıb dincəldilər, səhər çağı isə onlar atlarının cilovlarını buraxaraq şir balaları kimi şəhərə hücum edib ona sahib oldular. Şəhərdə və ətrafında İran sərkərdəsinin döyüşçülərindən kimi tapıb gördülərsə, hamısının cəzasını verdilər. Qardaşların yaxşı silahlanmış dəstələri iranlıları atalarını azad buraxmağa məcbur edənə qədər qırdılar.

Yezdəgirdin şahlığının iyirminci ilində İran şahlığı tamamilə

məhv edilmişdi. Bu əhvalat həcərlilərin (ərəblərin) bütün dünyaya məşhur olan müharibələrinin otuz birinci və sahibim Cavanşirin hakimiyyətinin on beşinci ilində baş vermişdi.[135]

Beləliklə, taciklər ( ərəblər) Şimal və Şərq ölkələrinə hücum edərək tayfa və qəbilə başçılarını öz qəsrlərini onlara təslim etməyə və arvad – uşaqlarını girov verməyə məcbur edirdilər ki, gələcəkdə onlara qarşı üsyan qaldırmasınlar.

Cənubdan gələnlərin amansız olduğunun görən Cavanşir onlara tabe olmayıb Kür çayının o biri sahilinə keçir. O bir qədər orada qaldıqdan sonra yenə də ürəyinin atəşini söndürmək üçün ərəblərlə döyüşə yenidən başlamaq və atasını azad eləmək istədi. Lakin atası onu bu fikirdən daşındırdı və könüllü olaraq düşmənə təslim oldu.

Müdrik Cavanşir isə erməni sərkərdəsi ilə ittifaq bağlayıb onu Bizans imperatoruna tabe olmağa razı saldı.[136] İttifaqə bağlayandan sonra Cavançir Bizans imperatoruna məktub göndərdi...

# İYİRMİNCİ FƏSİL

## Peyğəmbər Məhəmməddən sonra əmirəlmöminin aşağıdakılar olub

Məhəmməddən sonra ərəblərin ikinci hakimi Əbu Bəkr ibn Əbu Kuhafa idi. O, hakimiyyətdə doqquz il olub.[137]

Sonra yeddi il Ömər ibn əl- Xəttab xəlifə olub.[138] Onu öldürüblər.

Üçüncü xəlifə Osman ibn Əffan on bir il hakimiyyətdə olub.[139] Sonra Osmanı yıxdılar, hakimiyyəti və saçlarla saqqala həna qoymaq şərəfini Abdullaya verdilər.[140]

Sonra doqquz il xəlifə Müaviyə oldu.[141]

Yəzid ibn Müaviyə səkkiz il xəlifə olub.[142]

Abdülməlik ibn Mərvan on bir xəlifə olub.[143] Onun vaxtında həccac ibn Yusif yaşayırdı.[144]

Valid ibn Abdülməlik doqquz il xəlifə oldu.[145]

Süleyman ibn Abdüləziz on dörd il xəlifə oldu.[146]

Ömər ibn Abdüləziz on il xəlifə oldu.[147]

Yəzid ibn Abdülməlik altı il xəlifə oldu.[148]

Hişam ibn Abdülməlik iyirmi il xəlifə oldu.[149]

Valid ibn Yəzid bir il xəlifə oldu.[150] Onu öldürdülər və taciklər ( ərəblər) arasında iğtişaşlar əmələ gəldi.

Mərvan ibn Məhəmməd dörd il xəlifə oldu. Mərvan əmirəlmöminin Validi öldürən 60 nəfər Qureyşilər qəbiləsinin başçılarını öldürmək işarəsini etdi.[151] Sonra Xorasandan Əbülabbas[152] gəldi və Xorasan valisi Əbu Müslümün[153] Xorasan qoşunlarının köməyi ilə Mərvanı öldürüb yeddi il xəlifə oldu. Əbülabbas Məhəmmədin oğlu Əlinin nəvəsi Abdullanın nəticəsi, bu da Abbasın oğlu və Əbdülmütəllibin nəvəsi idi. Bunlar Haşimilər sülaləsini təmsil edirdilər. Əbülabbas hakimiyyəti əlinə alaraq gizlicə

Əbu Muslümü öldürür, amma onu öldürəndən bir qədər sonra özü də ölür.

Onun qardaşı Əbu Cəfər Abdulla iyirmi iki il xəlifə olub. O, İbrahim Günbəzində vəfat edib. [154]

Məhəmməd adı ilə tanınan Mehdi ibn Abdulla doqquz il xəllifə oldu.[155]

Musa bir il xəlifə olub.[156]

Mehdi oğlu Harun iyirmi beş il xəlifə olub.[157] O, ölkəmizə çoxlu əziyyət verdi və bu səbəbə görə ermənilərin bir çoxu əyalətlərini tərk edib Bizansa qaçdı.

Harunun oğlu Amin üç il xəlifə olub.[158] Harun hələ sağlığında ölkəsini iki oğlu – Amin Bağdadla Xorasanın hakimi oldu, lakin Məmun onunla müharibə etdi və Amin öldü. Məmun kimi tanınan Abdulla isə bütün ölkəyə sahib oldu.[159]

İbrahim on il xəlifə oldu.[160] Harun ər – Rəşid Məhəmməd peyğəmbərdən sonra iyirmi üçüncü əmirəlmöminin idi.

Erməni təqviminin iki yüz səksəninci ili idi.[161]

# İYİRMİ BİRİNCİ FƏSİL

## Cavanşirin Bizans imperatoru Konstanta məktubu

“ Bizanslıların hər şeyə qalib gələn, əzəmətli və mərhəmətli imperatoru, dənizlərin və quruların Allah tərəfindən təyin olunmuş Konstantin Avqustu, sənə Albaniyanın sipəhsaları və knyazı

Cavanşir səndən asılı olan öz Şərq ölkəsiylə birlikdə mütilik salamlarını göndərir. Səndən uzaq olan bir xalqı öz himayənə almaq təklifimiz qoy sənin kimi İsa sevimlisi hökmran üçün xoş olsun ki, sənin əzəmətli şöhrətindən və bizim itaətliyimizə görə sənin ilahi iltifatından bizə də pay düşsün".

Ən dindar imperatora bu məktubu oxuyanda o, səmimi – qəlbdən sevindi və o günü böyük bir qonaqlıq verdi. Vaxt itirmədən cavab məktubunu yazmağı və qarışılıqlı ittifaq haqqında müqaviləni hazırlamağı əmr etdi. O, Cavanşirə çox qiymətli hədiyyələr göndərdi. Onlar arasında zərli söykənəcəyi olan gümüş taxt, qızıl saplarla tikilmiş geyimlər və mirvarilə bəzədilmiş qını olan öz şəxsi qılıncı var idi. İmperator Cavanşiri birinci patrik ( proton patrik) rütbəsinə qaldırdı[162], və əmr etdi ki, albanlardan 1200 nəfərə patrik, konsul ( hivpat), eks- prefekt ( apahivpark), general ( stratelat) və elist rütbələrini vermək üçün fərmanlar göndərsinlər və bu rütbələri Cavanşir istədiyi şəxslərə paylasın. O, hətta sinəsində gəzdirdiyi İsa Xaçının zərrəciyini çıxarıb Cavanşirə göndərdi.

# İYİRMİ İKİNCİ FƏSİL

## Konstantın məktubunun mətni

" Sənə, hökmdar Cavanşirə, Girdıman sahibinə və Albaniya knyazına, apoipata və proton patrikə və Şərqin[163] hökmdarına – Xilaskar Xaçın ilahi qüvvəsindən mərhəmət və bərəkət, bizim

imperator şəxsimizdən isə salam və məhəbbətimiz.

Sənin Allaha məhəbbət və itaətinlə dolu təbrik məktubunu aldıq və biz şadıq ki, sən və sənin Şərq məmləkətin bizə tabe olmağa razı oldunuz. Buna görə biz və bizim oğullarımız əbədi olaraq sizə, sənə və sənin nəsildən – nəslə gələn oğullarına sevgi, səmimiyyət və sarsılmaz məhəbbətlə münasibət bəsləyəcəyik”.

Cavanşir məktubun məzmunu ilə tanış olanda həddən artıq sevindi, amma biləndə ki, imperator ona İsa Xaçının zərrəcəyini göndərib, onun sevinci aşıb daşdı. O, Xilaskar xaçının qabaöında səcdə edərək, bütün nemətləri bəxş edən Allaha şükür etdi. Elə o vaxt xaçın qabağına əllərində gül – çiçək yepiskop və çoxlu əyanlarla birlikdə Albaniyanın katolikosu çıxdı və bu əzəmətli hədiyyəyə görə Allaha min – min şükür etdilər. Bu andan sonra orada heç bir nalayiq söz eşidilmədi, eyş – işrətə yol verilmədi və camaat vaxtını sadə əyləncələrə sərf edirdi.

Cavanşir xəlvətə çəkilərək bütün gecəni yatmayıb öz ölkəsinin səadəti haqqında fikirləşirdi. Dan ulduzu göylərə qalxanda o, çarlıq libaslarını geyinib taxtına oturdu. Qapılar açıldı və içəri silahlı əsgərlər girib onun sağ – solunda durdular. Bundan sonra ehtiramla rütbələrinə görə Cavanşirin yanına yanına əyanlar gəldilər. O, ədalətli hökmlər çıxarıb xalqının etibarlı haqqını verirdi. O, bütün günü nəşəli keflə yox, öz ölkəsinin qayğısına qalmaqla məşğul oldu. O, Qafqaz dağlarında vəhşi həyat sürənləri də müdrikliyilə yola verirdi. Beləliklə o, öz ölkəsini və İberiya sərhədlərindən Dərbəndə

və Araz şayına qədər olan torpaqları hakimi – mütləq kimi idarə edirdi.[164]

# İYİRMİ ÜÇÜNCÜ FƏSİL

## İmperator İraklinin oğlu və nəvəsinin hakimiyyəti illərində nələr baş verib

Yunanlar imperatoru müzəffər İrakli çoxlu döyüşdə qalib gəlib bütün dünyada cəsur adam kimi şöhrət qazanmışdı. Ondan sonra üç il ərzində yunanların imperatoru onun oğlu Konstantin oldu.[165] Onun hakimiyyəti dövründə ərəblər Suriyanı işğal edib müqəddəs Qüds şəhərinin kilsələrindən bac alırdılar.

Bu erməni təqviminin səkkizinci ilində olub.[166]

Sonra Konstantinin oğlu Konstans gəldi və iyirmi doqquz il imperator oldu.[167] Onun hakimiyyətinin beşinci ilində Ərəbistanda müharibə oldu.[168] Onun altıncı ilində ərəblər Dəbil şəhərinin alıb 35 min nəfər əsir götürdülər. Onun hakimiyyətinin on doqquzuncu ilində keşiş Nersesü ermənilərin katolikosu oldu və iyirmi il bu vəzifədə qaldı. Bu, erməni, təqviminin yüz on birinci ilində olub.[169] Həmin Nerses Konstansın dini tərbiyəçisi idi və o, imperatorun vəsaitinə Qalaqudəştdə[170] ağıllı dindarlar üçün bina tikdirdi. Bu müqəddəs Qriqorun naminə kilsə idi və bunun açılışına Bizans imperatoru dəvət edilmişdi. İmperator tikilmiş binadan heyran qaldı

və əmr etdi ki, bənna onunla gedib sarayının yanında da belə bir bina tiksin. Amma bənna gələ bilmədi, çünki yolda vəfat etmişdi.[171]

# İYİRMİ DÖRDÜNCÜ FƏSİL

## Bizans imperatorunun İrana gəlməsi. O, Cavanşiri yanına çağırır

Iraklinin nəvəsi Konstans hakimiyyətinin on doqquzuncu ilində özüylə dünyanın nursaçan məşəli olan İsa xaçını götürüb çoxsaylı qoşunu, seçmə atlıları və təcrübəli sərkərdələri ilə öz ölkəsinin torpaqlarını arxasında qoyub İrana gəlir. O, sərkərdələrindən birini Cavanşirin yanına göndərib onu görüşə dəvət edir. Cavanşir tələsik imperatorun iqamətgahına Midiyaya gəlir. İmperator Cavanşirin gəlməsindən xəbər tutaraq şəxsən onu qarşılamaq üçün Kinkivar kəndinə gedir[172], onu salamlayır, əmr edir ki, o, arvadının ölümünə görə geydiyi matəm libasını çıxarıb[173], şar paltarını geysin. Cavanşir cəsarətə gələrək imperatordan xahiş etdi ki, o, Əbədi Çarın ( İsanın) xaçının zərrəciyini ona versin. Elə orada imperator Xilas Günəşinin zərrəciyinin günahları yandıran bir hissəsini ayırıb ona verdi və dedi: “ Qoy bu sənə və sənin oğlanlarına düşmənlər əleyhinə möhkəm arxa olsun”.[1]

Belə səmavi hədiyyələri alan Cavanşiri görəndə erməni əyanları və sərkərdə Hamazasp[174] ona paxıllıq etdilər, lakin o, buna heç bir əhəmiyyət vermədi.

Bundan sonra o, imperatordan vidalaşıb getmək izni aldı və imperator İran və erməni əyanlarının hüzurunda onunla xadimi kimi yox, eyni səviyyəli qardaşı kimi vidalaşdı. Cavanşir də Allahin ona

[1] Zəbur, 60. 4.

mərhəmətinə heyran qalaraq öz ölkəsinə qayıtdı.

Cavanşirin gəlməsindən xəbət tutan Albaniya katolikosu Uxtanes[175] bütün kilsə xadimlərilə birlikdə onun qabağına çıxdı və uca səslə ona xeyir – dua verərək dedi: " Budur. Allah – təala bizə Sihyondan[176] qüvvət əsasını göndərib və bununla biz düşmənlərimizə qalib gələcəyik".[1]

Müdrik Cavanşir İsa Xaçı üçün layiq olan yer axtardı və öz doğma vilayətində Girdıman qalasında onun üçün Allah evi tikdirdi və İsa peyğəmbər şərəfinə buranı həddindən artıq bəzədi.

Yaz gələndə Albaniyanın hörmətli knyazı Vaqarşapatda qalan imperatorla yenidən görüşmək üçün yola düçdü. İmperator əmr etdi ki, bütün saray xadimləri və əyanlar onun qarşısına çıxsınlar. O, imperator kimi təntənə ilə Konstansın sarayına daxil oldu. Cavanşiri görən kimi Konstans onu qucaqladı və bütün əyanlarından yuxarıda oturtdu. Bu gün başqa günlər içərisindən onun üçün daha uğurlu oldu, hər yan dah təmtəraqlı olub, qızıl və gümüş içində par – par parıldayırdı. İmperator əmr etdi ki, Cavanşirin qabağına çara layiq süfrə açsınlar, bu isə onunla həmsüfrə olanları həddindən artıq təəccübləndirdi. Bundan başqa imperator Cavanşirin belinə öz babası İraklinin və ulu nənəsi Niketanın çar kəmərini bağladı, çiyninə öz əbasını saldı və iki bayraq bağışladı, Cavanşirin iki gənc oğlunu da patrik rütbəsinə layiq gördü. O, Albaniyayanın ilk çarlarına məxsus olan bütün kənd və mülklərini Cavanşirə irsən nəsildən – nəsilə

---

[1] Yenə orada, 109, 2.

keçmək şərtilə bağışladı və çar kimi bütün Şərq xalqına hökmran təyin etdi.

İmperator heç bir fikrini ondan gizlətmirdi və ondan müdrik məsləhətlər eşıdəndə heyran olurdu. Cavanşirlə vidalaşanda imperator dedi: “Cismən sən həmişə mənimləsən, mənim qəlbim səninlədir, salamatlıqla qayıt!” Və belə ehtirama layiq olan Cavanşir öz ölkəsinə qayıdır və əmr edir ki, xalq tiksin, əksin, kef çəksin və əmin – amanlıqla yaşasın. Özü çoxlu saraylar tikdirdi, onun heç bir şeyə ehtiyacı yox idi və insana nə lazım idisə Allahın köməyilə onda var idi. Hətta Türküstan çarı da ondan əmin – amanlıq və dostluq gözləyirdi və Cavanşirə hədiyyə olaraq seçmə atlar, nökər və xadimlər və sürünən heyvanların gönünü göndərirdi. Suriyadan, Atrpatakandan, Ayraratdan, Gürcüstandan və hətta Hindistandan adamlar gəlirdi ki, ona baxıb, onun səsini eşitsinlər. Bütün ölkələrdə onun idrakı barəsində əcayib söhbətlər getdi və onun hər gələnə qarşı məhəbbəti hər bir ölkədə gözəl ölkədə əfsanəyə çevrilirdi. Bütün bunlara görə o, yalnız həyatverici Ağaca borclu idi, çünki bu Ağac və hər şeyi bilən Atanın mərhəməti onun adını bütün dünyada məşhur etmişdilər.

# İYİRMİ BEŞİNCİ FƏSİL

## Xəzərlərin Albaniyaya basqını və onların Kürün o biri sahilində Cavanşir tərəfindən məğlubiyyətə uğraması

Bundan iki il keçdikdən sonra[177] xəzərlər qarət və talan məqsədilə Albaniyaya basqın etdilər. Belə halda Albaniyanın knyazı yaraq - əsləhəsini geyib hər şeyə qalib gələn Xaçın qabağına gələrək diz çökdü və İsrail çarının Zəbur surəsini oxudu:" Allahım! Qalxanla zirehini götür və qalx mənim köməyimə; qılıncını siyir və mənə basqın edənləri saxla!"[1]

Ordusunu götürüb Cavanşir böyük Kür çayının o biri sahilinə keçdi və xəzərlərə hücum etdi. Onun duası rədd olunmadı, şünki qızğın döyüş vaxtı onun yorğa atı büdrəyib onu yerə atdı. Lakin Cavanşir ölmədi, Allahın köməyilə o, ayağa qalxdı və duran kimi düşmənlərə hücum edib o günü böyük qələbə qazandı və barbar qəbilənin başçısına bu sözləri dedi: " Get və Çola darvazasından geriyə çəkil və bir daha buraya qayıtma, çünki Allahın özü sənin buraya yolunu kəsdirib"

# İYİRMİ ALTINCI FƏSİL

## Girdıman qalasında Allah naminə kilsənin tikilməsi və onun Cavanşir tərəfindən təqdis edilməsi. Kilsənin üzərində İsa xaçının bərqərar edilməsi

Xəzərlərin qovulmasından və Cavanşirin qələbəsindən sonra iki il ərzində[178] Allah naminə gözəl kilsənin tikilməsi başa çatdı.

[1] Zəbur, XXXIV, 2-3.

Kilsə tikiləndən sonra Cavanşir əbədi işıq saçan Allah evinə daxil oldu və diz çökərək yalvardı: “ İlahi! İndi gəl Sənin naminə tikdirdiyim aramgahına!”

Sonra o, özüylə katolikosu, onun yepiskoplarını və öz əyanlarını götürüb, onlarla birlikdə Firuz – Qubad şəhərindən şimalda bir günlük yolda yerləşən vəngə gəldi. Bu vəngi o, yaşayış məntəqələrindən uzaq yerdə, iki vilayət arasında ona görə tikmişdi ki, həm özü, həm buraya yolu düşənlər burada rahatlansınlar. Cavanşir diz çöküb burada da ibadət etdi və belə bir fərman verdi: “ Qoy buraya ayaq basan hər kəs burada sığınacaq tapsın”.

Sonra onu müşaiyət edənlərlə birlikdə buradan yola çıxıb Girdıman vilayətinə gəldi. Arats ayının on birində[179] o, tikdiyi müqəddəs evdə işıqsaçan Xaçı bərqərar edir. Orada diz çökərək acı tövbələrlə, göz yaşları ilə hər şeyin Xaliqinə dua edərək bu sözləri dedi:

# İYİRMİ YEDDİNCİ FƏSİL

## Cavanşirin duası

“İlahi! Sənin mənim kimi çoxgünahlı bəndənə rəhmin gəlib! Yer üzündə çarmıxa çəkildiyin Xaçı mənə bağışladınsa bu tikdiyim kilsəyə Sənin Müqəddəs ruhunu da bəxş et və necə ki, sən vaxtında Süleymanın kilsəsini bəzətmişdin,eləcə də bu kilsənin öz şöhrətinin

buluduyla ört ki, bu şöhrət dumanında iltifatla sakin olsun.[1] Bu kilsəni Şərq dənizinin sahilində yaşayanlar üçün dualar və xahişlər evinə çevir ki, Sənə bu yerdə ibadət edənləri yüksək səmalarda eşidib, onların dualarını qəbul edəsən. Və əgər Albaniya ölkəsinin bütün sakinləri hamılıqla bu evə Sənin adını tərənnüm üçün gələrlərsə, Sən bu Allahı qəbul edən Xaçın qüvvəsilə düşmən üzünə qapıları bağla və quldurları döyüşlərdə həlak et. Əmr et ki, yer üzünə həyatverici şeh tökülsün ki, üzüm meynələri və əncir ağacları və tarlaların başqa bitkiləri çoxlu bar versin ki, insanlar istəkli yer üzündə dinc və rahat yaşasınlar. Mən Cavanşiri əliboş və həyəcanlı halda özündən rədd etmə, çünki mənim günahım ağırdır və mən razılıqla öz ümidlərimi sənin, Ya Rəbbim, qadir Xaçına yaxşı həkimə ehtiyacı olan ümidsiz xəstə kimi bağlamağa hazıram.

Qoy bu mənim tikdiyim ev döyüş günlərində başımın üstündə mənə örtük olsun, əleyhimə üsyan edənləri ayaqlarımın altına devir, oğul qızlarımı isə şərlə üzbəüzdə qorxmaz et və onları həmişə qüvvədə saxla. Sən ki, İlahi, məni uşaqlıqdan hifz edib təhlükələrdən xilas edirdin, mənim var – dövlətimi, qul və kənizlərimi artırıb mənə çarlıq hökmdarlığını bəxş etmisən, bu gün öz bəndəni mərhəmətlə qarşılayıb müdrik biliklərini mənim rəiyyətlərimə ver ki, onlar Sənin yolunla getsinlər və sözsüz Sənin sayəndə hökmdar olan Bizans imperatoruna tabe olsunlar.[180]

Qiyamət günü gələndə isə, onda ki, görünməyənlər

[1] Müqayisə üçün baqx: İncil. Üçüncü Çarlıq kitabı, VIII, 12.

görünənləri əvəz edəcək, Surun səsləri də ölənləri yuxudan oyandıracaq və bütün məlaikələr yerin hər tərəfindən Sənin, hakimi – mütləqin yanına toplaşacaq, onda ümid etdiyim Sənin Xaçınım Sələfinin vasitəçiliyi ilə, ya Rəbb, mərhəmətinlə məni, mənim arvadım Xosrovanuşu[181], saçları ağarmış atam Varaz – qriqoru, anam Huriduxtu, qardaşlarım Varaz – Peroju və Yezut – Xosrovu və övladlarımı ziyarət et. Müqəddəs Davud kimi göz yaşlarını tökən mən Cavanşiri isə qəzəblə mühakimə etmə və kəskin danlama, çünki ölüb getsəm onda mənim qanımın Sənə nə faydası? Məni əbədi əziyyətlərdən  xilas et ki və Sənin naminə tikdiyim kilsə yerinə, mən günahkar üçün və mənim canıma, ya İsa, Sənin Atanın iqamətgahında sığınacaq hazırla".

Bu duasını bitirdikdən sonra o, şanlı bayrama hazırlanmış hədiyyələri gətirib, buradaca xilas duasını oxudu: " Qoy bura elə yer olsun ki, həm oğullarım, həm də özüm Allah – təalaya buraya birinci barları gətirək ki, Sənin də bizə mərhəmətin gəlsin".

Bundan sonra Cavanşir gözəl və ilahi təbriklərlə öz qış iqamətgahı olan Firuz – Qubad şəhərinə qayıdıb orada bütün ili əmin – amanlıqda keçirdi.[182]

# İYİRMİ SƏKKİZİNCİ FƏSİL

## Cavanşirin Hunlarla dostluq ittifaqı və onlardan qız alması

Ertəsi il, qışın gün dönümündə[183], mərd Cavanşir öz taxtında arxayın oturduğu vaxt, hunlar çarı çoxminli atlı qoşunları ilə Albaniayaya basqın etdi. Cavanşir bu hadisəyə qədər öz ölkəsinin əhalisini ehtiyatlı və düşmənə qarşı hazırlıqlı olmağa çağırırdı. Lakin hücuma keçmiş hunlar Kür çayının bu sahilinə keçib Araz çayına çatdılar və nəinki Albaniyada, hətta Ayrarat vilayətində və Sünik ölkəsində aldığı əsirləri və qış otlaqlarında olan qoyun və mal – qara sürülərini öz düşərgələrinə apardılar.

Bundan sonra hunlar çarı Cavanşiri görmək istədi və Cavanşirin yanına öz qardaşlarını göndərərək onların vasitəsilə görüş istədi ki, aralarında qardaş məhəbbəti yaransın.

Bu vaxta qədər heç bir İran hökmdarı Türküstan çarı ilə üzbəüz çıxmağa cəsarət etmirdi ki, lakin igid və mərd Cavanşir ondan heç qorxmadı. O, cürətlə və mərd ürəklə xilaskarın Xaçı önündə diz çöküb dedi: " Əgər mən ölüm kölgəli dərə ilə getsəm belə yenə də şərdən qorxmaram, çünki Sən mənimləsən".[1] Bunu deyib bütün əyanları ilə onun yanına getdi. Hunlar çarı da qayıqla çayın sərin sularıyla bu sahilə gələrək Cavanşirin qabağına çıxdı.

Onlar öz aralarında sülh sazişinə gələrək ixtilaflara son qoyub qardaşlıq dostluğu haqqında razılaşdılar. Aqavili[184] imzalayıb hər ikisi öz evinə qayıtdı.

Amma görün mənim igid sahibim ertəsi gün necə hünər göstərdi! On yeddi döyüşçü ilə o, çayın o biri sahilinə keçib hunların

[1] İncil. Zəbur, XXII, 4.

düşərgəsinə gəldi və burada çarın qızını aldı, əsarətdən yüz iyirmi min baş qoyun, səkkiz min at və öküz qurtardı və min iki yüz əsir azad etdi. O, evinə şad ürəklə qayıdıb sevinc göz yaşlarını tökdü və Allaha belə sözlərlə dua etdi: “ Mən ümidimi kamanıma bağlamıram, İlahi, çünki düşməndən bizi xilas edən Sən olacaqsan və Sənin adını biz əbədi olaraq mədh edəcəyik”.[1] Bundan sonra Cavanşir ona sadiq olan adamlara əmr etdi ki, qaytardığı malları öz sahiblərinə versinlər.

Onun əmri yerinə yetirildi.

Bilməlisən ki, bütün bunlar Cavanşirin hakimiyyətinin iyirmi səkkizinci ilində[185] baş verib. Bu onun otuzillik hökmranlıq dövründə olub və bütün bu illər ərzində o, gənc yaşlarından yetkinləşməsinə qədər hakim sipəhsalar kimi bir bir çox hallarda ləyaqərli qəhrəmanlıqlar göstərib, hakimiyyət illərinin dörddə üçünü əvvəlcə İranda, sonra da hunlar darvazası ətrafında keçirib, bu rəşadəti onu bütün dünyaya tanıdıb və haqqında olan xəbərlər uzaqlarda – şərqdən qərbə və şimaldan cənuba qədər, arilər və qeyri – arilər arasında geniş yayılmışdır.

İndi isə mən, bərəkətverici xaç ona zülmətdən işığı nücə gətirdi və atəşdən gül –çiçəyi çıxarmağa ona necə kömək etməsindən söhbət açacağam.

# İYİRMİ DOQQUZUNCU FƏSİL

[1] İncil. Zəbur, 43, 7-9.

## Burada sən Cənubun çarı Cavanşirə nə kimi hörmətlər göstərməsi barəsində hekayəti oxuyarsan

Nəhəng dağlar və çox dərin və qasırğalı dənizlər Allah Kəlamına tabedir, çünki səmalardan eşidilən buyruq yer üzünü titrədir və dağlarda yaxınlaşdıqca onlardan tüstü püskürdür. İndi isə Allahın qorxusundan hündür təpələr hamarlaşıb düzənliyə çevrildi və qaynayan dərinliklərin coşan dalğaları öz daxilinə qərq oldu. İran dövlətinin məğrur şöhrəti də belə soldu və onun təkəbbürlü lovğalığı uçurumlara aşdı. Küləklərin qəzəbindən dərinliklərin qanadlanmış səsləri kəsildi[1] və havada uçan çöllərin tikanlı otlarını küləklər gətirib nəhəng okeanın üstünü örtdü. Çünki elə zaman olub ki, Bizans imperatorlarının nəhəng orduları yer üzünü şiddətli sellər basan kimi dünyanın bütün xalqlarını tabe etmişdilər. İndi isə o taxtın gücü və qüvvəti elə yox olub tükəndi ki, vaxtilə ona tabe olan xalqlar Hedeonun tikanlı kolu kimi sancanın himayəsinə keçdilər[186] və onu öz çiyinlərinə yükləyən nəsillər heç tərpənə bilmədilər. Qərb köpəkləri[187] görəbndə ki, Allah – təala onun qılıncına artıq kömək etmir və quduzlaşmış qaban gücləşib onun buynuzları qırır, o başa düşür ki, Allahın İbrahimə qədimdən deyilmiş: " İsmayılın əlləri hamının üstündəvə hamının əlləri onun üstündə"[2] və həmçinin " qabağında hər şeyi atəş udur, arxasında isə

---

[1] Bax: İncil. İyezikiilin kitabı, I, 24-25.
[2] İncil. Kövn, XVI, 12.

alov yandırır"[1] sözləri gerçəkləşəcək.

Bu vaxt Bizans imperatoru öz qoşununun qalıqları götürüb tələsik dənizi və qurunu keçir və qərbdəki uzaq adalara gedir. Cənub çarlığının paytaxtının Suriyaya köçürülməsinin altıncı ili idi. Onlar qul – kənizə Həcərin Ölkəsini tərk edib öz çarlıqlarının ( xilafəti) taxtını Diməşqə köçürdülər.[188] Orada bərqərar olan [189] , onun ətrafında. Sağında və solunda uzanan torpaqların şirəsini sorub çəkdi. Ona (xəlifəyə) elə böyük və geniş istedad, siyasi müdriklik, hökmranlıq qabiliyyəti və insan səxavəti verilmişdi ki, bu dörd xasityyətinə görə də o, dünyanın dörd tərəfini idarə edirdi.

Bizans imperatorunun cənub çarı (xəlifəsi) tərəfindən şəhərlərini alov atəşi kimi udub həzm etməsi və onun saysız – hesabsız xalqlarını qılıncdan keçirməsi nəticəsində zəifləyib haldan düşməsini görən Şərqin ulu knyazı Cavanşir öz ölkəsinin taleyi barəsində təşvişli fikirlərə qərq olmuşdu. O qorxurdu ki, cənub orduları onun ölkəsinə soxularaq onu talan edəcəklər. O, öz köməyinə saysız Türküstan qüvvələrini də səfərbərliyə ala bilərdi, lakin fikirləşdi ki, Cənub çarının əsarətinə tabe olmaq daha da məqsədəuyğundur. Cənubun hökmranı eşitmişdi ki, bizim knyazımızın Bizans imperatoruna qarşı meyli var və o, Türküstan qəbilələrilə qohumluğu sayəsində onları itaətdə saxlayıb istədiyi vaxt yürüşə çağıra və ya yürüşdən saxlaya bilərdi. Buna görə məğrur dünya fatehinin beynində həsəd əmələ gəldi və o, inanılmış adamları

---

[1] Incil. İoilin kitabı, II, 3.

ilə Cavanşiri öz böyük andları və hesabsız mükafatları ilə birlikdə öz yanına dəvət edir. İsa Xaçına və onun mərhəmətinə ümid bağlayan Cavanşir çoxlu hədiyyələrlə Kainat hökmdarının yanına getdi. Amma bundan qabaq o, Girdıman qalasında Allah naminə tikdirdiyi kilsəyə gəldi. Burada o, ah çəkərək dua etdi ki, Xaliq onu ziyarət etsin və ulu Davud kimi deyirdi: " Ya hökmün və həqiqətin Xaliqi! Məni təqib edənlərimin əlinə vermə".[1] Bu fikirlərlə o, qalib gələn İşıqla vidalaşıb zirehlərini geydi və uzaq məmləkətə yola düşdü.

Yolda onun qabağına bütün əyanları ilə erməni sərkərdəsi çıxdı, onu sevinclə qəbul edib böyük ehtiramla yola saldı. O, Suriya torpaqlarına qədəm basanda gördü ki, xəlifənin əmrilə bütün valilər və şəhər əyanları, hərəsi öz vilayətlərində ona lazımi hörmət göstərir: atlar həmişə hazır və yataq yerləri öz qaydasında idi və xəlifənin sarayına qədər Cavanşir belə təmtəraqla yol getdi.

Xəlifə öz əyanlarına əmr etdi ki, onlar Cavanşirin qabağına çıxıb ona özü mindiyi atları hazırlasınlar. Bax, belə bir fövqəladə ehtiramla Cavanşiri saysız – hesabsız əsgərləri olan düşərgəyə gətirdilər. Cavanşirin məşhur adını eşidən camaat onu görmək üçün onun qabağına çıxmağa tələsirdi. Cənubun hökmdarı da o günü həmişəkindən fərqli olaraq Günəş doğanda yuxudan kefi kök qalxıb Şərqin knyazını dostcasına salamladı və onun gəlməsinə çox şad oldu. Cavanşiri yalnız çarlara layiq olan müstəsna təmtəraqla qəbul etdilər və ona qədər burada heç kəs belə hörmət görməmişdi. Xəlifə

[1]İncil.Zəbur, XXVIII, 121.

Cavanşirin qeyri – adi müdrikliyini görəndə bu qəbul daha da yüksək mənalı oldu, çünki xəlifəyə müxtəlif xalqların hakim və üləması tabe idi, amma bunlardan heç biri ona Cavanşir kimi ağıllı məsləhətlər verə bilmirdi. Buna görə xəlifə Cavanşirə və onunla gələn bütün adamlara çox qiymətli hədiyyələr bağışladı.

Bundan sonra şərqin hökmdarı xəlifədən ona sağ – salamat qayıtmağına icazə istədi. Xəlifə Cavanşirlə və onun xalqı ilə möhkəm dost olmağa and içdi və bundan sonra Kainatın məğrur hökmdarı Cavanşirə əl verib vidalaşdı və deməliyik ki, o, xaricilərə heç vaxt əl vermirdi.

Bütün bunlar bitəndən sonra Cavanşiri böyük şan – şöhrətlə Kainat sarayından yola saldılar. Ayrarat vilayətinə gəldikdə onu Mamikonyan nəslindən olan Qriqor[190] və onun əyanları qarşıladılar. Qriqor onu öz Aruç şəhərciyinə apardı. Buraya ermənilərin katolikosu bakirə göyərçin Anastas[191] da gəldi.

Cavanşir ona salam və təzim etdi və katolikos da ona xeyir – duasını verdi.

Cavanşir yoluna davam edərək təmtəraqla Girdıman vilayətinə gəldi və əvvəlcə tikdiyi kilsəyə getdi. Kilsəni çox bahalı və incə şeylərlə bəzədi, çox pul sərf etdi. Rəssamları dəvət edib onlara kilsəni başdan ayağa kimi qızılla və ipəklə bəzətdirdi, dünyanın İşığını hifz edən aramgahın qapısını gümüşlə bəzədi və üzərinə naxışlar saldırdı. Bundan sonra cəlallı knyaz Cavanşir üç il dalbadal[192] özünü Cənub hökmdarın sadiq təbəəsi kimi göstərdi.

# OTUZUNCU FƏSİL

## Cavanşirin Cənub hökmdarının yanına ikinci səfəri. Onun bizanslılara məntiqə uyğun köməyi. Onun vergilərin azaldılmasına nail olması

Cənubun hökmdarı ikinci dəfə şərqin şan- şöhrətli knyazı Cavanşiri yanına dəvət edib, ona mükafatlar vəd etdi ki, onun birinci səfərində aldığı şərəf və şöhrətə yeniləri əlavə edilsin.

Həmin vaxt Cavanşirin yanına Konstantinopoldan əyanlar gəlib xəbər verdilər ki, onlar Həcərin oğullarına ( ərəblərə) bac verməyə razı olublar. Hərəmağalar Konstansı onun imperatorluğunun otuzuncu ilində öldürmək qərarına gəldikdən sonra[193], xəlifə onlara əmr etdi ki, onlar şərqin hökmdarı (Cavanşir) gələnə qədər həmişəki yerlərində qalsınlar.

Şöhrətli hökmdar Cavanşir özü, birinci dəfəki kimi, Diməşqə bütün öz müşayiətçiləri ilə gəldi və birinci səfərində olduğu kimi, bu dəfə onu daha da böyük şan – şöhrətlə və şərəflə qarşıladılar. Xəlifə əmr etdi ki, Cavanşir üçün öz doğma qardaşının iqamətgahını hazırlasınlar, axşam yeməklərində isə xəlifə onu həmişə öz yanında oturmağa dəvət edirdi. Sonra xəlifə Cavanşirə imperiyanın paytaxtından gəlmiş hörmətli adamlarla sülh barədə danışıq aparmağı təklif etdi. Xəlifə Cavanşirin ağıl – fərasətinə və dərin düşüncələrinə heyrət edirdi. Bizans elçiləri də ona minnətdar idilər, çünki o, Cənub hökmranını onların tərəfinə çəkə bilmişdi.

Bundan sonra Cənubun hökmdarı Şərqin hakimini, başına tac

qoyulmuş padşah kimi, daha yüksək təriflərə layiq gördü və əmr etrdi ki, ona Hindistandan gətirilmiş və yaxşı öyrədilmiş nəhəng fili bağışlasınlar. Adətən, qorxuducu və vahiməli fillər padşah saraylarını bəzəyirlər. Bu günə qədər heç kəs eşitməyib ki, xəlifə rütbədə ondan aşağı olan Cavanşirə quşların ən gözəli – tutuquşu bağışladı. Keçmiş zamanlarda belə quşlardan yalnız bizanslılar ölkəsində görmək olardı. Bundan əlavə xəlifə ona başqa hədiyyələr də bəxş etdi: qızıl qınlı polad qılınc , mirvari ilə süslənmiş kaftan, qızıl xaçlar, ipək parçalar, əba və cürbəcür qiymətli geyimlər. Bundan başqa, ona öz mindiyi atlardan əlli ikisini bağışladı. Xəlifə böyük xanımına əmr etdi ki, o da Şərqin böyük xanımına heyrətamiz hədiyyələr, ona layiq bəzəklər və zərli və ipək parçalar bağışlasın. Xəlifə əmr etdi ki. Cavanşirlə gələn əlli nəfərin haməısına ipək parçalar və bəzəklər verilsin. O, Sünik vilayətini Cavanşirin ixtiyarına verib təkid etdi ki, o, Araz çayının o biri sahilində yaşayan Atropatenanın əhalisini də idarə etsin. Lakin Cavanşir dünyanın dörd tərəfinə hakim olub özünü hakimi – mütləqə çevirmək istəmədi. O, bu əlavə şöhrətdən imtina edib, öz təbii səxavətinə görə daha çox abadlıq və tikinti işlərilə məşğul olmağı və öz ölkəsinin qayğısına qalmağı daha üstün tutdu. Buna görə o, xəlifədən xahiş etdi ki, onun ölkəsinə təyin olunmuş bacın miqdarını azaltsın. Cənubun hökmranı buna razı olub əmr etdi ki. vergi onun üçdə biri qədər yüngülləşdirilsin. Başqa knyazlardan fərqli olaraq xəlifə Cavanşirə daha böyük hörmət göstərərək onun əlini sıxdı və şərəflə yola saldı. Cavanşir öz ölkəsinə qayıdıb ilk

növbədə tikdiyi Allah evinə tələsdi, orada diz çöküb Allah – təalaya böyük mükafatlara görə şükür etdi və dedi: “ Allahdandır, mənim qüvvətim və şöhrətim !”

O, buradan öz qış iqamətgahı olan ölkə paytaxtına getdi və burada ümumxalq məclisi çağırdı. Məclisdə Cavanşiri həmişəki halında yox, çox gözəl geyimli və yüksək çarlıq məqamında gördük. Orada biz çox nadir cinsdən olan heyrətamiz bir çar quşunu gördük. Onun sarı lələkləri yaşıla çalırdı və başını tərpədəndə döşündəki qırmızı tükləri boynu ətrafında doğralanıb yenə də əvvəlki hala gəlirdi, sanki sübh çağında şehin damlaları idi. Gözləri parıldayır və dimdiyi donqar kimi əyri idi və insanın səsinə bənzər nazik səslə danışıb, sözlər quraşdırırdı. Qədim zamanlarda Roma imperatoru Neronu tərifləyən quş kimi, bu quş da bizim həddindən artıq bəxtəvər knyazımızı tərifləyirdi. Lakin bu quş nə qədər böyük təəccübə səbəb olurdusa, indi haqqında söhbət edəcəyim daha da təəccüblüdür.

Cavanşir ova və ya gəzməyə çıxanda hamı onu və onu müşaiyət edənləri şəhər darvazalarından çıxanda görürdü. Elə bu vaxt, sanki çara salam vermək üçün, onun qabağına yöndəmsiz, nəhəng, divar boyda, ayaqları şalban kimi, özü də dağ boyda olan fil çıxırdı. Onun alnından zəhərli ilana bənzər xortum sallanırdı. Fil xortumunu sağa – sola yelləyir, gah yuxarıya qaldırır, gah da ağzına soxurdu və hava alıb burnunun deşiklərindən qorxunc səslər çıxarırdı. Mən yalan demirəm, şünki ona baxanda adamı dəhşətli titrətmə tuturdu.

Cavanşirin gətirdiyi gözəl, məğrur, külək kimi itiayaq və yorğa atları da gördük və deməliyəm ki, onların çox gözəl qızıl yəhərləri və yüyənləri var idi. Görəsən sizlərə burada daha nədən danışım, nədən söyləyim ? Hikməti – ilahiyyə belə imiş ki, Cavanşir dünyaya gələn gündən şan – şöhrət üçün yaranmışdı və bu günə kimi Allah – təala onu bütün işlərində əzəmətli olmağa layiq görürdü. Elə bunlara görə biz onu heç bir çardan əskik görmürdük. Onun artıqlaması ilə hər şeyi var idi: saysöz – hesabsız qızıl vı gümüşü, dəbdəbəli və gözəl paltar və əlbisəsi və müxtəlif qiymətli daş – qaşları. Mirvarisi. Nəyi desən – onda var idi.

Otuz üç ildir ki, Allah – təala Albaniyanın knyazını hər şeydə qalib edirdi, xalqlar hökmdarları dörd çar ona böyük hörmət və ehtiram göstərirdi. Cavanşirin şöhrəti və əzəməti heç o çarlarınkından az deyildi. Qoy heç kəs uşaq kimi sadəlövh olub onun hökmranlığını o çarlarınkından aşağı görməsin. Heçk vacib də deyil ki, onun başında çar tacı yox idi.

Buna görə də bizim, onun aciz bəndələrinin, onu nəinki imperatorlar Avqust və ya Tiberi ilə müqayisə etməyə haqqımız var, biz onu böyük əməllərinə görə Allahdan çələng almış müqəddəs Konstantin ilə müqayisə edirik. Və həqiqətən, ey Şərqin çox hörmətli knyazı, biz hamımız səni tərənnüm edirik, çünki səni, ey mənim ağam Teodoros[194], xaliq edən rəbbimiz İsa peyğəmbər, səndən yalnız günahlarından üz döndərməyi, Allahı sevməyi, Ondan qorxmağı və Onun müstəqim yolu ilə getməyi tələb edir ki,

nəsilbənəsil sən və sənin oğlanların səadətli və xoşbəxt yaşayasınız. Amin!

# OTUZ BİRİNCİ FƏSİL

## Allah bəndəsi zahid İsrailin röyası və Qüds müqəddəslərinin cəsədlərinin əldə edilməsi

İsrailin başlanğıcı məlum olmayan zahidliyi haqda doğru hekayəti mən tapa bilmədim və burada yalnız bildiyimdən danışacağam. O, tamam bir il dağda yaşayıb dizləri üstə yerdə yatırdı. Bir dəfə, gecə saat dörd radələrində yuxusuna bir əcaib, saf, aydın və işıqsaçan röya girdi və həmin vaxt onun burnuna çox ləzzətli bir ətir qoxusu dəydi. Onun müdrikliyi artdı və o, birdən – birə haçansa böyük sirlər barəsində deyilənləri, onların mənalarını, bəxş olunan Zəburun yayılmasını, nə vaxt, necə və kimlər tərəfindən qəbul edilməsini, qanlı döyüşlərə girişib şəhidin adına layiq olanlarını, haradan olmalarını və ilahi sərvətlərin məhz harada gizlədilməsini və ona bu barədə nə etməsini yadına saldı.

Bütün bunların hamısı barəsində ona yuxusunda bir və iki dəfə deyildi və oyanarkən o, uzun müddət dəhşət içində qaldı.

Sonra yerindən qalxıb əllərini Allaha uzatdı və ona şükür edib səhər ibadətini etdi.

Və birdən o, Allahın: “Lənət olsun ona ki, o, Allahın işini

saymazyana görür[1]" - sözlərini yadına saldı. İsrail öz şagirdini götürüb tələsik dağdan enib yepiskopa danışdı və dedi: " Mənim ağam! Gəl tənbəllik etməyib Allahın hökmünü yerinə yetirək, əks təqdirdə qayğısız olmağımıza görə cəzamızı çəkəcəyik.Sən bu işlə təxirə salmadan məşğul ol ki, Allahın sirri açıla bilsin".

Bunu eşidən böyük Kolmankın yepiskopu Davud bir anlığa fikrə getdi. O qərara gəldi ki, özüylə bir neçə keşiş götürüb onlarla Albaniya katolikosu Uxtanesin[195] yanına getsin. Onun yanına gəlib bütün əhvalatı danışdı. Uxtanes bunları eşıdib Allaha şükür etdi və yepiskop İsrailin gördüyü röyaya təəccüb edib öz – özünə dedi: " Necə oldu ki, bu zahid belə sirrə layiq oldu?", O, əmr etdi ki, bu münasibətlə böyük kilsə məclisi çağrılsın və bu məclisə Arsax vilayətinin və Böyük Arranın yepiskopu mömin İoveli də dəvət etsinlər. İovel gəlib katolikosu və yepiskop Davudu acı sözlərlə danladı: " Nə üçün siz belə boşboğazlığa qulaq asıb, uydurma röyalara fikir verirsiniz? Axı müqəddəs kitablar bizi öyrədir ki, belə şeylərə inanmayaq! Bəllidir ki, havarilərin, Zəbur oxuyanların vaizliyindən sonra heç bir röya təkrar olunmayıb və buna görə də bizim vaxtımızda röya görünə bilməz". İovelin özü isə Müqəddəs kitabların məzmununa hamıdan çox bələd idi.

Onda müqəddəs katolikos ona belə cavabverdi: " Sən dediyin kitablardan bizə də məlumdur. Lakin bu röyanın hekayəti yeni və möcüzəlidir. Bəlkə də bu röya Allahdandır və biz onu rədd edərək

---

[1] İncil. Havari İyeremiyanın kitabı, 48,10.

başı soyuq adamlar kimi cəzasını çəkə bilərik. Bu röyaya mənfi yanaşmaq olmaz, çünki onda biz Allahla mübarizəyə çıxarıq. Bu röyanı uydurma da hesab etmək olmaz, çünki havarilərdən sonra son zamanlarda insanların röyaları nəticəsində Müqəddəs Xaçdan başlayaraq, müxtəlif yerlərdə, müqəddəs Qüds şəhərində və çoxlu başqa şəhərlərdə insanlardan gizli olan və indi bütün yer üzünü dolduran və kilsələri parıldadan bütün müqəddəs xəzinələr əldə edilib. Axı burada da, Albaniya ölkəsində, çox yerlərdə müqəddəslərin qaxımış cəsədləri tapılıb. Və bu röya da heç təəccüblü deyil, çünki heç bir İlahi xəzinə torpağın altında gizli qala bilməz. Uydurma və yalanın vasitəsilə həqiqəti danmaq olmaz və Allahın işini İblisin masqarası yerinə qoymaq olmaz. Hər şeyi dəqiq yoxlayıb həqiqəti bilmək vacibdir bə müqəddəs havari bu barədə deyir: " Hər şeyi sınaqdan keçirin və yaxşıdan yapışın". [1] Bundan başqa kilsə risaləsində də deyilir: " Hər bir ruha inanmayın, lakin ruhları sınaqdan keçirin, görün onlar Allahdandırmı?"[2]

Indi siz, o diyarın yepiskopları, hər ikiniz gediniz və biriniz bu məsələ haqqında hər şeyi öyrəniniz. Allaha yalvarın ki, qoy o, özü açsın – "Bu röya İlahidəndir, yoxsa uydurmadır, çünki insanları aldadan İblisin imrəndirmələri də bizə bəllidir, lakin Allahın bərəkəti bizim üçün daha aydındır. Bizi hər gün bu barədə xəbərdar edin ki, Allah – təala öz sirrini sizə açıb göstərdiyini bilək".

Hər iki yepiskop - Davud və İovel məmnuniyyətlə

[1] İncil. Havari Pavelin Fessaloniklilərə Birinci risaləsi, X, 21.
[2] İncil. Havari İoannın Birinci risaləsi, IV, I.

katolikosun əmrini qəbul edib, onunla vidalaşdılar və Müqəddəs Ruhun himayəsi altında böyük Arran keşişliyinin ərazisində, Tərtər çayı sahilinə, cıdır meydanına oxşar bir yerə gəldilər. Bu da Böyük Kolmank vilayətinin Rustak mahalında idi. Onlar oraya gəlib bir təpədə yerləşən meşəlikdə ayaq saxladılar. Burada taxtadan tikilmiş, üstündə xaçı olan sovməə var idi. Onun üstü kirəmitli, divarları isə çox bəzəkli idi. Yepiskopların bu yerə gəlməsindən xəbər yayılan kimi oraya Allahın möcüzəsini görmək üçün tələsik əyanlar, yepiskoplar, keşişlər, yüzbaşılar, valilər, kəndxudalar, məmurlar və çoxlu kişi və qadınlar gəldi.

Bundan sonra yepiskoplar bu təntənəli yığıncağa müraciət etdilər ki, hamı üç gün pəhriz saxlasın və ibadət etsin, çünki camaatın bir qismi bu əhvalata inanmırdı. Elə baş yepiskop İovelin özü də bunu uydurma hesab edirdi. Üç gündən sonra keşiş İsrail əlinə bel götürdü və hamı diz çöküb gözlərini bir yerə dikdi. O, əmr etdi ki, bu yeri qazsınlar və camaat çıxarılan torpağı öz ətəklərində kənara aparırdı. Onlar xeyli qazıb yoruldular, lakin istədikləri xəzinəni tapa bilmədilər. Onda onlar altında günahlardan təmizləyən Allah səcdəgahı olan sovməənin şərq divarını sökdülər və istədiklərini orada axtardılar. Elə səcdəgahın altında üç dirsək dərinliyində bir çala açdılar oradan çox nəşəli. Hər tərəfə yayılan və hamıya ləzzət verən ətir saçdı. Bu ətir saçan min müxtəlif gülün və müşk - ənbərin ətri idi və hamı buna təəccüb etdi. On qarış dərinliyə gedəndən sonra onlar qurşun möhürlü iki gümüş sandıqçaya rast gəldilər.

Sandıqçaların üstündə suriyanı və erməni dillərində yazısı olan bir qalın qızıl lövhə var idi.

Bu ilahi möcüzə hamının gözü qabağında peyda olduğu üçün bu əhvalat hamını mat qoydu. Camaat irəliyə getdi və hamı bu müqəddəslərə sevgisini izhar etmək üçün sandıqçaları çıxarmağa səy göstərdi. Ürəklərdən gələn və gözlərə zövq verən bu səmimi sevinci görmək lazım idi. Hər tərəfi şadlıq bürüdü. Allahın möcüzəsi müqəddəs ərlərin çoxunu təəccübləndirdi və onlar da Allahın tərifə gəlməyən hədiyyələrinə görə ona min – min şükür etdilər. Bütün bunlara görə Allah adamı İsrail, yepiskoplar və xalq arasında böyük hörmətlərə malik oldu və hamı ona ehtiramla baxırdı.

Sonra İsraillə birlikdə yepiskoplar xəlvətə çəkildilər və sandıqçaların möhürünü qıraraq içində xilasedici İsa Xaçının hissəciyini gördülər. Yepiskopların böyüyü qızıl lövhənin üstündəki yazını oxudu: “ Bu, Qüds müqəddəslərinin qaxımış cəsədlərinin hissəciyidir”.

Böyük Arranın yepiskopu İovel özü bu ilahi əlamətini görəndən sonra, onun müdrikliyi daha da artdı və o, səmimi – qəlbdən Allaha şükür etdi. Zahid İsrailin röyasının düzgün çıxmasını təsdiq edərək hamıya bu möcüzədən danışır, zahidi tərifləyirdi və beləliklə, əvvəlcə sökdüyünü indi özü bərpa edirdi. O, cəsədlərin axtarışına mane olduğu üçün özünü müqəssir bilib töhmətə layiq görüldü. Həyatverici Nur olan yer onun vilayətində olduğu üçün İovel razı olmadı ki, bu qaxımış cəsədləri ona, bir yolçu və ya gəlmə

kimi kimsə bəxş etsin. O, bu xəzinənin qeydinə öz malı kimi qalırdı. Sandıqçanın birini öz heysiyyətinə görə götürüb xidmət etdiyi yerə apardı. Allah bəndəsi İsrail isə bundan çox narazı qaldı, çünki o hesab edirdi ki, Allah – təala bu tutyanı ona bəxş edib və bu yeri o, özü tapıb. Buna görə də bu müqəddəs sandıqçaları o, özü paylamalı idi, lakin mülayim olduğu üçün o, bunu etmədi və heç kəsə də şikayətlənmədi. Yepiskop Davudun icazəsilə İsrail özünə ikinci sandıqçanı götürdü. Xalq bütün yepiskop və keşişlərin müşayiətilə əllərində məşəl və şamlar, Zəbur surələrini oxuya – oxuya müqəddəs xəzinəni Qlxoy Vəng kilsəsinə aparıb aramgaha qoydu. Bundan sonra hamı vidalaşıb öz yerinə qayıtdı.

# OTUZ İKİNCİ FƏSİL

## Allahın bu böyük möcüzələri necə izhar etməsi haqqında yepiskoplar Davud və İovelin böyük kilsə məclisi adından yazdıqları məktubun surəti

“ Sənə, ey Şərqin[196] səmavi və ruhani məhəbbətilə dolğun və müqəddəs Ruhun bərəkətilə mükafatlanmış müqəddəs katolikosu Uxtanesa, sənə, alicənab, qayğıçəkən, həmişə şöhrətli olan Cavanşirə və sizinlə həmişə həmfikir olan əyanlarınıza, biz, ləyaqətsiz yepiskoplar Davud və İovel, sizi Allah adı ilə salamlayırıq!”

Sizə bu məktubda gizlənmiş hissəciklərin möcüzəli zühurundan, Müqəddəs xaçın əldə edilməsindən xəbər vermək

istəyirik, çünki bu əhvalat bizim təəccübümüzü artırıb, bizə imkan verib ki, biz indi əvvəl ona inanmadığımız üçün heç danışmaq istəmədiyimizin şahidi olduq. Biz indi öz gözümüzlə Müqəddəs Xaçın zühurunu gördük və bunun həqiqi və doğru olduğunu şəhadət veririk, çünki bu şöhrətin şöhrətidir. Bu barədə necə susmaq olar və günəş kimi işıq saçan çırağı necə gizlətmək olar?  Və aydındır ki, bu çırağı parıldayan çıraqdana qoymaq lazımdır. İndi bizim üçün, bizi xilas etmək üçün üzərində birinci dəfə Xilaskarımızı daşıyan, həmişə gözəl dördqanadlı Xaçın, yəni bizim xilaskarımızın zühur etməsini elan etmək vacibdir. Həqiqətən, bu Xaç xaçpərəstlərin ümidi ölənlərin dirilməsi və korların bələdçisidir. Və əgər qabaqlar Xaç məzəmməti izah edirsə, indi o, möminləri xilas edən əlamətdir. Axı biz məhz onun vasitəsilə müqəddəs kilsəsinə daxil olmuşuq və öz üzərimizdə Səmalar hakiminin nişanəsini gəzdiririk. Buna görə sözlərimizə diqqət verin!

Biz bu işə könüllsüz girişdik, çünki öz şübhələnən ağlımızla fikirləşdik ki, bu yalandır. Lakin biz sizin əmrlərinizin ziddinə çıxa bilməzdik. Və biz bu işi hərtərəfli və düzünə öyrənərək, allahın mərhəmətiylə həqiqətə nail olduq. Biz, Arsaxın bir düzənliyində olan çayın sahilinə, sovməə olan Çlax adlı yerə gələndə, bizim gəlməyimiz barədə xəbər çox tez yayıldı və ətraf yerlərin sakinləri yığışıb böyük dəstələrlə keşişlər və əyanlarla birlikdə buraya toplaşdılar. Onların arasında bu məsələyə zidd baxanlar da var idi.Bu halda biz əmr etdik ki, hamı üçgünlük pəhriz saxlasın və bu

müddətdən sonra, hamımızın dualarıyla ibadətgahın altını qazdıq. Birdən – birə oradan bizi valeh edən ətir saçdı. Bir qədər sonra Tanrının bərəkətilə və müqəddəs ata İovelin duasıyla biz istədiyimizə nail olduq: iki gümüş sandıqça çıxdı, üstündə qurşun möhür və yunan qıfılı. Sandıqçanın birinin üstündə suryani və erməni dilində yazısı olan qalın qızıl lövhə var idi. Yazılana görə biz sandıqçaları keşişlərin yanında açıb, orada həyatverici Xaçın və çoxlu başqa tutyaların hissəciklərini tapdıq. Yazıda deyilirdi ki, bu, Qüds şəhərində olan Allah tutyalarının hissəcikləridir. Bütün orada olanlarla birlikdə mən, nifrətə layiq olan İovel də, həm şeyi bəxş edəndə şükür etdi, ağlımdan bütün şəkki – şübhəmi çıxardım və zahidin röyasını inamla qəbul etdi. Həmin hissəciklər mənim xidmət etdiyim yerdə tapıldığı üçün mən böyük həvəslə sandıqçanın birini götürüb öz kilsəmə apardım. Başqa tutyaları isüə biz, yepiskoplar Davud və İovel, başqayepiskop, keşiş və xadimlər vasitəsilə Allahın köməyilə böyük sevinc və dini mahnılarla yepiskopun kilsəsinə apardıq.

Qoy Allah – təala Allah Oğlunu qəbul edən Xaçın mərhəmətiylə sizi şöhrətdə və qüvvədə saxlasın və imkan versin ki, sən, dini çiçəkləri görən Uxtanes və sən, taxt – taclı knyazımız Cavanşir və sənin vəliəhdlərin uzun ömür və əmin – amanlıq içində yaşayıb, ölkəmizin Səmavi şehlə bərəkətləşən torpağından həmişə nemət görərsiniz. Allahın adı ilə salamat qalınız!”

# OTUZ ÜÇÜNCÜ FƏSİL

## Yepiskopların  məktubuna katolikosun və knyazın cavabı

“ Biz sizin yazdığınız məktubu oxuduq və ona görə hər gün Öz mərhəmətli əməlləriylə xaliq etdiyi insanlar üçün möcüzələr yaradan səxavətli Allaha böyük tərif və mədhlər deyirik və sizi, ey yepiskoplar, Davudu bə İoveli təbrik edirik!

Mən, ləyaqətsiz katolikios Uxtanes və sipəhsalar və knyaz Cavanşir sizi Allah simasında şadlıqlarda olmağınızı arzulayırıq!

Biz, bizə bəxş olunmuş həyatverən xilasımıza görə daim Allaha şükür edirik. Onun bizə verdiyi tükənməyən hədiyyələrə görə, gəlib bizim gözlərimizi açan, bizim aramızda, burada zühur etmiş müqəddəs Xaça görə şükür edirik. Buna görə də biz yorulmaq bilməyən dilimizlə rəbbimizi xeyriyyəçimizi, möcüzə gətirəni, bütün nemətləri bəxş edəni və Müqəddəs Ruhun pak mükafatını bizə verən İsa peyğəmbəri tərənnüm edirik. Hərçənd biz cismən sizlərdən uzaqdayıq, ruhca yanınızdayıq və siz indicə əlinizə gələn Müqəddəs Xaçın önündə bizi yada salın. Yubanmadan siz bu bərəkətlə, Müqəddəs Xaçla və mömin zahid İsraillə birlikdə bizim hüzurumuza ehtiyatla gəlin ki, biz də böyük kilsə məclisinin üzvləri ilə birlikdə bu töfhəyə səcdə edək. Allahın adı ilə salamat qalın!”

Yepiskoplar Şərqin sipəhsaları Cavanşirin və müqəddəs

katolikos Uxtanesin məktubunu oxuyan kimi, elə o an əldə etdikləri xəzinəni götürüb zahid İsraillə birlikdə Şərqin böyük knyazı Cavanşirin, katolikos Uxtanesin və bütün əyanların olduğu böyük Firuz – Qubad şəhərinə gəldilər. Onlar nursaçan bərəkəti qəbul edərək bütün ellə birlikdə təntənəylə meydanda ona səcdə etdilər. Cavanşir müqəddəs Xaça hədiyyələr gətirib katolikos və bütün camaatla birlikdə zahid İsraili tərənnüm etdi. Bundan sonra Cavanşir əmr etdi ki, İsraili işıqsaçan müqəddəs Xaçla onun olduğu yerə - Böyük Kolmank vilayətinin şimal hissəsinin dağlıq yerində olan Qlxoy vəngə aparsınlar. Və bu müqəddəs ərlə vidalaşıb hamı sevinclə öz evinə qayıtdı.

# OTUZ DÖRDÜNCÜ FƏSİL

## Alban zadəganları nəsilləri murdar edən nigahlar bağlayır. Buna görə onları lənətləyirlər

O zamanlar Albaniyanın zadəganları yaxın qohumlar arasında qanunsuz nigahlara yol verib, özlərini murdar etdilər. Bunların arasından birinci çar nəslindən olan Koqtun hakimi idi, sonra Arşaqaşen vilayətindən üç ailə - Dastakertdən, Cinşımdan və Mamşelundan, sonra Kürün o tayındakı həcəri ailəsi, sonra Uti vilayətində laknar (eşikağası) adını daşıyan Varaz – Firuzun ailəsi, sonra Arajakanda yaşayan kilsədə keşiş paltarını saxlayan Varajan və Tuyerakın ailəsi.

Mömin katolikos Uxtanes onları qanunsuz nikahlarına görə

lənətləyib bu nikahları pozurdu. Lakin bunların hamısı öz şərlərindən əl çəkmədikləri üçün məhv edilib yer üzündən yeksan oldular.

Bundan sonra müqəddəs katolikos Allah civarına köçdü və onun taxtında Şəkinin keçmiş yepiskopu, Uxtanesin matəminə dəvət olunmuş xeyirxah və nəcib Yeliazar seçildi. Səhər ibadətindən sonra yepiskoplar katolikosluğa Firuz – Qubadın yepiskopu olan bir rahibi seçmək istədilər. Elə bu vaxt Şeytan onu yerə yıxdı və o, hamının yanında rüsvay oldu. Bundan sonra yepiskoplar püşk atdılar və vaxtında Matfey kimi[197] səxavətli Yeliazar həmin yığıncaqda katolikos rütbəsinə layiq görüldü. Həmin vaxt dünyəvi hakimiyyət Allahın izniylə bu fani dünyada xoşbəxt Cavanşirin əlində idi.[198]

# OTUZ BEŞİNCİ FƏSİL

## Böyük knyaz Cavanşirin faciəli ölümü

Bu vaxt[199] böyük knyaz Cavanşirin dağ mahalında gedib ilin bayram günlərini şadlıqlarda və mahir xalq mahnıları ustalarının arasında keçirmək istəyirdi. Şöhrət qazanmış, sevimli, qəddi – qamətli sərkərdə olan, öz zəkası ilə hamını hökmranlığa tabe etmiş və xoşbəxtlikdən bütün yer üzünün səadəti ilə yüklənmiş Cavanşir öz rəşadəti və qabiliyyəti ilə başqalarından üstün idi. Lakin bu şöhrətli və hamının istəklisi olan ər qüsurlar tələsinə düşərək Allahın ehkamlarını atdı və vurnuxan, bihudə bir adama döndü. Onun bütün

şan – şöhrəti hörümçək toruna döndü[1] və əcaib cah – cəlal tezliklə yox olub getdi.

Yayın qızmar günlərində[200] bizim məşhur sərkərdəmiz öz əyanları və şəxsi qoruqçuları ilə yüksək dağlar ətəyinə qalxıb orada gül – çiçəklə dolu çəmənliklərlə gəzib, onların sükütündan zövq alıb günlərini kefdə və firavanlıqda keçirirdi. Yayın ortasının qızmar günləri keçib Xaçqaldırma bayramı gələndə[201] o, dağlardan enib Uti vilayətinin Bərdə şəhərinə gəldi ki, orada özü tikdirdiyi kilsəyə gedib Allaha ibadət etsin və onun adına qurbanlar versin.

Şanlı Cavanşir orada zövqlə istirahət etdiyi vaxt adı bilinməyən bir namussuz, şərli və murdar adam Cavanşirin ona qarşı olan məhəbbətini, hədsiz ehtiramını və atasının evinə göstərdiyi qayğını unudaraq, Cavanşiri öldürmək fikrinə düşdü və onun bir para dostlarını cəlb edərək onları özünə cinayət yoldaşı etdi. O, bu acınacaqlı iş haqqında düşünərək Cavanşiri zinaya təhrik edir və işvəli sözlərlə onu murdar kefə çağırırdı.

Artıq gecənin yarısı keçmişdi və Cavanşirin keşiyini çəkən silahlı gözətçiləri rahatlanıb yuxuladılar. O, güllüklər arasında olan cığıra çıxdı. Zirehsiz olub, belində təkcə qılıncı var idi. Elə bu vaxt kənardan qabağına sanki onun silahdarı imiş, əlində knyazın əsası, belində polad qılıncı və qalxanlı şər ürəkli xain Varazo çıxdı. Bundan əlavə bu insafsız caninin kaftanı altında zirehi də var idi.

Onlar bağın ortasını keçib geniş çar həyətini əhatə edən

[1] İncil. İovun kitabı, VIII,14.

divara çatanda hər şeydə tədbirli olan qüdrətli Cavanşir qəddar qatilin niyyətini anladı. Knyaz qəfildən yaraq - əsləhə səsini eşidib qorxdu və özünü itirdi. O zənn etdi ki, bu, onu öldürmək üçün hazırlanmış sui- qəsddir. Buna görə o, görünmədən sakitcə saraya qayıtmaq istədi. Lakin qılıncını yarıya qədər qınından çıxaran insafsız qatil buna hazır idi və qılıncını siyirərək dönüb igid knyazın belinə zərbə endirdi və onu ağır yaraladı. Lakin buna baxmayaraq qatil asanlıqla onun öhdəsindən gələ bilmədi. Cavanşir şir kimi nərildəyib öz qılıncını siyirib qatilin üstünə cumdu, amma Allah tərəfindən verilən qüvvə onu tərk etdi və onu vaxtilə yaxşılıq etdiyi adamın əlinə saldırdı.

Cavanşir əlində qılıncı birinci dəfə qatilin üstünə atılanda o, qalxanını qabağa verib qabağında durdu. Knyazın qılıncı qalxana pərçim oldu və o, qılıncını daha çıxara bilmədi. Qəzəblənən qatil isə zəhərli ilan və qudurmuş vəhşi heyvan kimi zərbə üstə zərbə endirib Cavanşirin bədənini doğram – doğram edib öz ağasını yerə sərdi. Cavanşiri artıq ölmüş və ya ölümcül halda bilib öz ağasının qatili gizlicə oradan gedib evinə gəldi ki, ondan heç kəs şübhələnməsin. Guya o, öz evindədir və sakitcə yuxulayır. Bu arada kimsə hadisədən xəbərdar olub hay – küy qaldırdı və az çəkmədən hadisə yerinə çoxlu adam gəldi. Caninin yanına əmisi oğlu gəlib ona əhvalatı söyləyib öldürəni nələr gözləyir deyəndə, cani ata minib tezliklə aradan çıxdı.

Bundan sonra Cavanşirin qardaşı oğlu knyazın şəxsi gözətçilərindən əlli atlı götürüb qatili təqib etdi. Ona çatmağa

ümidləri olmadığı üçün təqib edənlər qisas almaq niyyətiylə Arcahunik mahalına gəldilər. Qatilin atasının evini talan edərək yandırandan sonra ağlaya – ağlaya və Cavanşirin halına acıya – acıya geriyə qayıtdılar.

Cavanşir isə hələ nəfəs alırdı və bir neçə gün yaşadı da. O, oğullarını çağıraraq hər birinin xəzinə payını və rütbələrini təyin etdi, hər birinə malikanə ayırdı və ağır yaralardan taqətdən düşüb vəfat etdi.[202] O vaxt bizim Albaniyada böyük qarışıqlıqlar baş verdi, saray qabağına əyanlar və silahlı adamlar yığışdı. Bütün ölkə dərd və qəmdə olub, Cavanşirin yasını tuturdu. Görün, nə böyük dərdə saldı bizi qatil, ölkəmizə necə ağır zərbə endirdi!

Elə bu vaxt bədii üslubu bilən, bilikli, şeir sənətində mahir və məşhur təfsirçi Dəvdək adlı bəlağət ustası ayağa qalxdı. O, məharətlə, təmtəraqla və mahir katib kimi yazaraq Cavanşiri tərif etdi. Bir neçə vaxtdır ki, o saraya gəlib uzun müddət burada yaşadı.[203] Böyük sipəhsalar Cavanşirin gözlənilməz qətl xəbəri bizim Şərq ölkəmizə yayılan kimi o, xeyirxah hökmdarımız haqqında akroşer üslubunda ağını yaratdı.[204]

# OTUZ ALTINCI FƏSİL

## Böyük hökmdar Cavanşirin ölümünə ağı[205]

Ey ilahi kəlamları xəlq eləyən ulu Tanrı,

Özün nəğmə-ağı söylə, yad et bizim hökmdarı
Elə nəğmə- ağı qoş ki, bu əvəzsiz itki üçün
Gözümüzdən gecə - gündüz axsın odlu göz yaşları.

Bu Gündoğan ölkəmizi tutan kədər çox böyükdür,
Yer üzünü hərtərəfli hıçqırıqlar bürümüşdür.
Fəryadıma qulaq assın bütün ellər, qəbilələr
Mənimlə bir bütün bəşər qoy ağlasın hönkür – hönkür.
Təməlindən qopub getdi əzəmətli canlı qaya,
Parçalandı bizi qucan, hifz eləyən yüksək divar.
Qülləli göyə çatan bir imarət yıxıldı, ah,
Sındırılıb məhv edildi möhkəm qala, hündür hasar.

Dincliyimiz yoxa çıxdı, qara gəldi ağ günümüz,
Üstümüzə hücum çəkdi basqınçılar sürü – sürü.
Heyrətamiz bir dövləti xarabaya çevirdilər.
Möcüzəli səltənətin al şəfəqi söndürüldü.

Bizim yurda gələn bəla yəqin həmin bəladır ki,
İsayya da qorxudaraq bildirmişdi bir zamanlar[206]
Bayramımız yasa döndü, kölgə düşdü qızıl xaça[207]
Şadlığımız göz yaşında batıb getdi, ey insanlar!

Geri dönməz itki üçün qazdılar bir dərin məzar,

Şərafətli hökmdarı ora qoyub basdırsınlar.
Basdırsınlar fitnə - fəsad izlərini, cinayəti,
Arifləri azdırmaqçın çox əlləşdi o azğınlar.

Aslan kimi qüdrətliydi o öz Aslan yatağında,
Düşmənləri zağ- zağ əsər, qarşısında donardılar.
Qüdrətinə baş əyərdi həm qorxudan, həm sevgidən,
Bütün elat başçıları, bütün müdrik ağsaqqallar.

Uzaq – uzaq ellərəcən yayılmışdı şan –şöhrəti,.
Yer üzünün o tayına çatmış idi adı, sanı,
Bütün cahan vəsf edirdi onun sonsuz qüdrətini,
Qaranlığa işıq salan, uzaq görən zəkasını.

Rum qeysəri, bir də Cənub hökmdarı[208] tələsirdi.
Can atırdı görmək üçün bizim böyük hökmdarı.
Şərafətlə, ləyaqətlə, ən bahalı zər – zinətlə
Qarşılardı, salamlardı onlar bizim bayraqdarı.

Bizi qəfil yaxaladı bu cinayət, bu qan – qada,
Maymaq kimi azmağımız bizə baha başa gəldi.
Əfəlləşdik, ölgünləşdik, qəzəbləndi ulu Xaliq,
Böyük məşhur  bir dövləti uf demədən məhv elədi.

Hökmdarı sədaqətlə hifz eləyən sadiqləri
Elə bil ki, küsüb ondan, üz döndərib, gözdən itdi.
Bu uğursuz, bu qanlı gün uzaqlaşdı Ulu Tanrı,
Hiyləgərlər caynağında onu yalnız qoyub getdi.

Öz satqınlıq kamanını çəkib dartdı çuğul düşmən,
Məkri hiylə qılıncını itilədi parıl – parıl.
Sənin parlaq günəşini döndərdilər başqa yola,
Kimlər? Moavların[1] alçaq rəzilbalaları.

Aldatdılar, apardılar tənha, gizli bir guşəyə,
Açdılar tunc sinəsində neçə - neçə dərin yara.
Gecə gizli öldürülən mobidlər tək qətl olundu,
Görün kimlər qaldırdı əl əzəmətli bahadıra!

Atasından xəbərsiz bic... zatıqırıq, alçaq, iyrənc,
Dizin – dizin sürünsün qoy, həsrət qalsın xoş bir özə.
Qarğışlara, nifrətlərə, lənətlərə bürünərək
Veyillənsin qoy dünyada Qabil kimi əsə - əsə.

Qaçmağa yol, öz tapmasın, cığırlar da tutulsun qoy
Başı üstə vəhşi quşlar şappıldatsın qanadını.
Dərələrin qarğaları cəmdəyinə daraşsın qoy,

[1] Bax: İncil. Musanın dördüncü kitabı, Əqram, XXII- XXVII fəsillər.

Ağzı qanlı yırtıcılar didim – didim didsin onu.

Açsın Cəhənnəmin ağzını, İrod odu udsun onu[1]
Doğulsunlar ürəyində yarasalar, soxulcanlar.
Yandıraraq, söndürərək, öldürərək, dirildərək
Bu qatili dönə –dönə, xıncım – xıncım etsin onlar.

Sınsın çürük budaq kimi sərkərdəyə qöyan o əl,
İflic olsun o mərd üzü tapdalayan murdar ayaq.
Onun zərdab qanını qoy ağ güvələr zəhərləsin,
Gəbərsin qoy, vəbalara, cüzamlara tuş olaraq.

Tikanlı ağacların kölgəsində dincələrsə,.
Gəlsin ilan balaları, bürüsün dörd çevrəsini.
Üz – gözünə qurbağalar zigil atsın, acı töksün,
Şiş bürüsün əndamını, xərçəng kəssin nəfəsini.

Bizim üçün o, dünyanın yeganə, tək çırağıydı,
Sükançıydı, cilovlardı şahə qalxan dağları.
İgid, cəsur Cavanşirin poladlaşan şəxsiyyəti
Əsarətçi zalımların yatırdadı qiyamını.

O, yatmazdı, mürgülərdi... gözü ayıq, qəlbi qaynar.

[1] İudeya çarı I İrod e. ə. 37-4 illərdə hökmranlıq etmişdir. Bax: Əhdi – Cədid. Matfeydən, II fəsil.

Marsın cəng arabasın ulduzlara surərdi o.
Qollarına toplasa da min igidin qüvvətini,
Çiçəkləri asta üzər, gülü ehmal dərərdi o.

Danışarkən dodağından mirvarilər saçılardı,
Əxlaqı saf, ruhu yüksək, könlü odlu bir həvəsdə.
Yuxusundan ayrılarkən, aslan kimi sıçrayardı,
Bölüb isti çörəkləri, paylayırdı süfrə üstə.

Həzrət İsa peyğəmbərin qabırğası arasından
Axan qanlar süzülmüşdü onun dərya ürəyinə.
Ən müqəddəs dualarla tanrısına tanışdı o,
Öz qəlbinin qüdrətilə ölümsüzlük tapmışdı o!

Mənim ağım qu quşunun, pərilərin ağısı yox,
Dəstəsindən ayrı düşən bir quşcuğun naləsidir.
Yetim qalıb bizim şəhər, kövrəkləşib polad qala.
Uzun illər görməmişdik bu cür məqam, bu cür bəla.

Haçan gəlib tapdı bizi o qanlı əl, canlı bıçaq?
Kaş bataqlıq qurdu kimi yerindəcə qurusun o.
Ağzı yansın, qan qussun o.

Sən ki, saçardın nurunu günəş kimi üstümüzdə,

Batıb getdin... qərq olmuşuq gecələrin zülmətinə.
Bulud girdi aramıza, ayrı saldı səni bizdən,
Gözlərimiz həsrət qaldı yaraşıqlı qamətinə.

İllər boyu ağlayacağam, öz bağrımı didəcəyəm,
Sənsiz qalan o boş taxtı hiddətlə seyr edəcəyəm,
Sən gedəli, dörd tərəfdən bağlanıbdı sevinc yolu,
Gözlərimdən bulaq kimi yaşlar axır qanlı – qanlı.

Əzizlərin, doğmaların sevgin ilə alovlanır,
Yaddan çıxmaz bu məhəbbət bizim eldə heç bir zaman.
Kaş ki, bizim sözlərimiz ətir saçan buxur kimi,
Alışaydı məzarında, yanaydı son damlayacan.

Başımın tacı düşdü,
Taxtımız da, bəxtimiz də viran qaldı.
Gücümüzün şan – şöhrəti səninlə bir basdırıldı.

Səninlə edərdi fəxrTəbər gölü[209], Lubnan dağı,
Azğın şimal külləkləri[210] dayanardı səni görcək.
İndi yurdu sənsiz görüb hunlar qapır baltasını,
Viran qalır nar bağları, tapdalanır çəmən – çiçək.

Səltənətlər qara geyib, tac qoyan da sevinməyir,.

Gəlinlərin yatağını toz bürüyüb, qəm tozları.
Balasını itirmiş tək yaxa yırtır, yaş tökürlər,
Dərddən solmuş bənizlərin nə yamandır bu qubarı.

Üzərindən atmaq istər ləkələnmiş şöhrətini,
Tac qoyan da anlayır ki, tac əbədi bəzək deyil.
Bu ölümlə biz bir daha dərk elədik, başa düşdük:
Heçdi, puçdu fani dünya. Bizə dünya gərək deyil.
Xoşdur mənə bu sözləri deyib yanmaq, alovlanmaq,
Ancaq daha xoş olardı səninlə bir dəfn olunmaq.

# OTUZ YEDDİNCİ FƏSİL

## Varaz – Tiridatın Cavaşirin hökmranlıq taxtına oturması. Hunlar Cavaşirin ölümünə görə qisas almaq istəyirlər. Varaz – Tiridat onlarla sülh bağlayır

Qəm – qüssə keçəndən, dərd sovuşandan və əzablı fəlakət bir qədər yaddan çıxandan sonra ölkənin bütün knyazları, baş nəsillərin ağsaqqalları, valıləri, hakimləri və əyanları katolikos Yeliazarın yanına gəlib Albaniya ölkəsinin taleyi və səadəti barəsində düşündülər. Ölkədəki hakimiyyətin qayğısına qalaraq onlar bir səslə Bizans imperatoru tərəfindən konsul və patrik rütbələrinə layiq görülən Cavanşirin Varaz – Peroj adlı qardaşı oğlu knyaz Varaz – tiridatı seşdilər.[211] Katolikos və ölkənin bütün knyazları hamılıqla bu seçkini tələsik keçirməyə can atırdılar. Elə buradaca bütün əyanlar müxtəlif heyvan şəkilləri olan bayraqlarını açdılar, şeypurlar çalındı və Varaz – Tiridatı qızıl – qalxana otuzdurub onu tərifləyə - tərifləyə üç dəfə göyə atdılar. Belə bir böyük təmtəraqla onlar yüksək hakimiyyətin şərəfini – vətən hökmranının taxtını ona verib həmən gün bu münasibətlə çoxlu hədiyyələr və bəxşişlər payladılar.

Bu vaxta qədər də igid Varaz – Tiridat öz müdrikliyilə fərqlənir, hamıya məhəbbət və qayğı ilə yanaşırdı. Knyaz taxtına oturduqdan sonra onun bəzi paxıl qohumları onun yüksəlməsini soyuq qarşıladılar, lakin o, öz mehriban davranışı ilə onları sakitləşdirib qəlblərinə hakim oldu. Öz hövsələsi və mülayimliyi ilə o, ölkəni sərhədləri daxilində özünə tabe etdi və tezliklə şanlı paytaxtını – Bərdəni əlinə keçirdi.

Elə bu vaxt[212] hunların sərkərdəsi və böyük knyazı Alp İlituer[213] saysız – hesabsız ordusunu, Yacuc ölkəsinin [1] müxtəlif

---

[1] Müqayisə et: İncil. İyezekiilin kitabı, 38 və 39-cu fəsillər.

yerlərindən gəlmiş cəsur adamları, bayraqları ilə birlikdə silahlı sərkərdələrini, oxatan və qalxandaşıyan dəstələrini, zirehli və dəbilqəli atlılarını toplayaraq Cavanşirin qanını almaq niyyətilə Qafqaz dağları ətəklərində yerləşən vilayətləri və Qəbələ vilayətinin kəndlərini talan etdi.[214] O, öz böyük şəxsi dəstəsiylə düzənlikləri aşaraq Kür çayını keçdi və Uti vilayətinə daxil olaraq buradakı insanları öz mal – qarasıylə birlikdə əsarətə apardı. Sonra onlar qayıtdılar və Lpink yaxınlığında olan düzənlikdə düşərgə saldılar.

Albaniya knyazı Varaz – Tiridat bilǝndə ki, ( xəzərlərin) çoxsaylı orduları hər yanı amansızlıqla dağıdır, talan edir və əhalisini əsir aparır, o, pərişan olub fikrə getdi. Böyük katolikos Yelizarı hunlar knyazının yanına göndərdi ki, onun vasitəsilə knyaza öz həqiqi itaətini və məhəbbətini bildirsin və desin ki, o, bu məhəbbəti ona sevimli qardaş olduğu üçün bəsləyir, ona çatdırsın ki, biz, albanların, Cavanşirin ölümüylə əlaqəsi yoxdur və bu ağır cinayət alçaq və mənfur bir adamın əliylə icra olunub.

Albaniya katolikosu bütün bu sözləri hunlar knyazına çatdırıb əlavə ona bilmədiyi çoxlu ilahi kəlamlar da söylədi və onu Allahın qəzəbiylə qorxudub və Allahı ona sevdirib özünü sülhə və sarsılmaz dostluğa təhrik etdi. Beləliklə, Yeliazar hunlar knyazını inandırdı ki, Varaz – Tiridata kömək etməli və ona tərəfdar olmalıdır. O, qoşununu yığıb öz ölkəsinə qayıtdı.

# OTUZ SƏKKİZİNCİ FƏSİL

## Varaz – Tiridatın hakimiyyəti. Onun müxtəlif ölkələrdən mənsəb və mükafatlar alması. Böyük Kolmank yepiskopu Davudun vəfatı, onun yerini İsrail tutur və özü də mehriban keşiş olur

Bu vaxtdan mömin knyaz Varaz – Tiridatın nüfuzu gündən – günə etibarlı oldu. O, ərəblərin qüdrətli və əzəmətli hökmdarlarından ən yüksək rütbələrə layiq görülüb, onun tərəfindən Şərq diyarlarının canişi, bütün Albaniyanın və Uti vilayətinin hökmdarı hüququnu almışdır. Varaz – Tiridat hamıya qalib gəlib və hamını özünə tabe edib, ona tabe olan torpaqları həvəslə və əzmlə idarə edirdi.

Bu vaxt Böyük Kolmanın müqəddəs yepiskopu Davud vəfat edib öz cədləri ilə birləşdi. Öz həyatını xeyrə həsr etdiyinə görə o, xalq arasında “ Xeyirxah” adı ilə tanınırdı, indi də yüksək səmalarda mələikələr məclislərində özünə layiq yeri tutdu. Onun idarə etdiyi kilsə dairəsi rəhbərsiz qaldığı və bütün kilsə dərin hüzndə olduğu üçün Albaniyanın mömin knyazı öz sərkərdələri, Albaniya katolikosu və bütün yepiskop və əyanlarla məsləhətləşdi ki, tezliklə ilahi mərasim keçirilsin. O dedi: “ Gəlin Böyük Kolmank vilayətinin kilsə dairəsinə rəhnərliyə Allah bəndəsi, səxavətli İsraili seçək ki, oranın dindarlarını Allahın izniylə bir müdrik müəllim kimi savadlandırsın”.

İsrail əvvəlcə bu vəzifəni tutmağa razılıq vermirdi, lakin

knyazın əmrini alandan sonra, havarinin " Əgər kimsə yepiskop olmaq istəyirsə o, yaxşı işlər görmək istəyir" [1] – sözlərini və cavanlığında Vaqarşapat şəhər kilsəsində gördüyü röyanı yadına salaraq daha müqavimət göstərməyib ucadan dedi: " Qoy Allah buyuran olsun!"

Bundan sonra Varaz – Tiridat onun yanına təcili ağsaqqal əyanlardan bir neçəsini göndərir ki, onlar İsraili paytaxta gətirsinlər. Onlar İsraili Arsax vilayətinin Baş ( Qlxoy) vəngində tapdılar. Elə orada keşişlər məclisi toplandı. Keşişlər buradan əllərində lazımi etimadnamə ilə Albaniya hökmdarı və katolikosu yanına gəlib İsraili rahib paltarında təqdim etdilər. Hökmdar və katolikos etimadnaməni götürüb onlara öz razılıqlarını verdilər və həmin etimadnamə sərkərdə və əyanlar tərəfindən də təsdiq edildi.

Katolikos, İsrailə lazımi hörmətlər göstərib onu Böyük Kolmank vilayətinə yepiskop təyin edir və bu haqda ona verilən fərmanla İsrail öz əsabələri ilə vilayətinə yola düşür. Yepiskop qalacağı yer olan Taqcan kilsəsinə gəlir və burada onu keşişlər, kəndxudalar və bütün dindarlar ehtişamla qarşıladılar. O, xaçı əlinə alıb Allaha şükür edir və bərəkətlər duasını oxuyur. O, öz davranışında çox mülayim və həyatında çox toxtaq idi. Ona tabe olan vilayət kilsələrini yoxlayaraq o, bütün dindarlar Allah buyruqlarına əməl etməyi vəsiyyət edirdi və işlərdə özü hamıya bir nümunə idi.

---

[1] İncil. Əhdi – Cədid. Pavelin Timofeyə Birinci risaləsi, III, 1.

# OTUZ DOQQUZUNCU FƏSİL

## Böyük knyaz Varaz – Tiridat yepiskop İsraili dostluq naminə Ayrarat vilayətinə erməni katolikosu Sahakın və dindar knyazın yanına göndərir

Bu vaxt mömin knyaz Varaz – Tiridatın ağlına belə bir fikir gəldi ki, yepiskop İsraili dostluğu möhkəmləndirmək məqsədilə Ayrarat vilayətinə erməni katolikosu Sahakın[215] və dindar knyazın[216] yanına göndərsin. Ermənilər İsrailə böyük hörmət göstərib qabağına çıxdılar. Ona Vaqarşapatda istirahət üçün yer ayırdılar.

Bundan bir qədər qabaq Erməniyyənin knyazı və böyük sərkərdəsi İsa naminə şəhid olan müqəddəs Qriqorun qaxımış cəsədini və sümüklərini Dərənəli vilayətini Tordən adlanan yerindən Ayrarat vilayətinin Vaqarşapatşəhərinə gətirib, onları bu münasibətlə böyük Nerses[217] tərəfindən tikilmiş kilsənin içində rahatlandırır.

Yepiskop İsrail katolikosun nə sərkərdənin qabağında diz çöküb xahiş etdi ki, əgər mümkünsə onlar onun ürək arzularını yerinə yetirsinlər. O xahiş etdi: “ Müqəddəs Qriqorun cəsədinin bir hissəciyini mənə versin!” Lakin onlar buna razı olmayıb dedilər: “ Müqəddəs Qriqorun cəsədi heç vaxt heç kimə verilməyib və onun hansı bir hissəsini sizə verməyə bizim ixtiyarımız da yoxdur”.

Bu halda İsrail kömək üçün Böyük Erməniyyənin knyaz xanımı Yelenaya[218] müraciət etdi. Yelena özü Albaniyadan [219] idi və

buna görə də ona kömək etdi. Xanım öz əsabələri ilə katolikosun yanına gedib ondan cəsədin bağışlanmasını xahiş etdi. Bu barədə o, öz əri, erməni sərkərdəsinə də möraciət edib dedi: “ Mənim ölkəmə və atalarımın evinə də böyük Qriqorun cəsədinin bir hissəsini verin və vətənimdən gəlmiş yepiskopun xahişini yerinə yetirin ki, onların diləklərinə əməl olunsun və yepiskop da buradan bəxtəvər getsin”.

Və insansevən Allah hər ikisinin ürəyinə razılıq salıb şəhid Qriqorun çənəsini İsrailə verdirdi. O da istəkli xəzinəni onlardan alıb ermənilərlə vidalaşdı və özünü Allaha tapşırıb evinə qayıtdı.

İsrail və yanındakılar bir neçə günlük yolu gedərək öz vətənlərinə gəlib gətirdiyi əmanəti Baş vəngdə rahatlandırdı[220]

# QIRXINCI FƏSİL

## Knyaz Varaz – Tiridatın yepiskop İsrailin Hunlar ölkəsinə sülh bağlamaq üçün göndərilməsi haqda öz əyanları ilə müşavirəsi

Məğrur Məhəmmədin Cənub padşahlığının 62-ci ilində[221] Albaniyanın knyazı Varaz – Tiridat öz qohumları olan əyanlar və katolikos Yelizarla məsləhətləşib dedi: “Rəhmsiz Ərəbistan xalqının üzərimizə qoyduğu vergilər bizi sıxır və ağır vəziyyətə salır. Eyni zamanda, hunların hər il ölkəmizə etdiyi basqınlar da bizim üçün dəhşətli fəlakətdir. Buna görə də ölkəmiz ikitərəfli düşmən basqınlarından talan olub taqətdən düşür. Ey mənim qohum və sevgilərim, gəlin ölkəmizin yepiskoplarından birini seçib hər iki

hökmdarın yanına göndərək ki, bizim sakitliyimiz üçün o. Allahın köməyi ilə onların hər ikisini sülhə və dostluğa dəvət stsin və biz də onlar tərəfə qorxu və düşmənçıliıklə baxmayaq”.

Bütün knyazlar və əyanlar onunla razılaşıb elə orada müdrik və təvazökar Böyük Kolmank vilayətinin yepiskopu İsrailin üstündə durub, ondan xahiş etdilər ki, hunlar ölkəsinə elçi getsin. İsrail öz ləyaqətli davranışı və müdrikliyi ilə başqalarından fərqlənib təmasda olduğu adamların əqlini özünə cəlb etməyi bacarır və Allaha itaət etməkdə heç bir vəsiyyəti pozmurdu. O dərhal uzaq hunlar ölkəsinə yola düşmək razılığını verdi. Hunlar üçün hədiyyələr hazırladılar və onun özünü və onu uzaq səfərdə müşaiyət edənləri ərzaqla təmin edərək Mehekan ayının on səkkizində yola saldılar. Onlar Firuz – Qubad şəhərindən çıxaraq Kür çayını keçib Albaniyanın sərhədini aşdılar və səfərin on ikinci günündə Lpink şəhərinə çatdılar. Şəhərin bütün əhalisi onları qarşılamağa çıxdı. İsrailə isə yepiskopluq mənsəbinə və xüsusən, Allahın Xaşaçuran bayramının yaxınlaşmasına görə böyük hörmət və məhəbbət ərz etdilər.[222] Onlar şəhərdə istirahət edib bayramı keçirdilər və sonra yola düşüb möhtəşəm dağların ətəklərində olan Çilblər ölkəsinə gəkldilər.[223] Burada, Qafqaz dağlarının ətəklərində, şimaldan əsən soyuq qış küləkləri tezliklə tufana çevrilib onları üç gün yoldan etdi. Onlar gözlərini açıb heç yollarını da tapa bilmədilər. Həddindən artıq yorulmalarına, şeytanların qaldırdığı ulaşma və gurultudan dəhşətə gəlib əldən düşmələrinə  baxmayaraq, onlar daim sayıq qalırdılar.

Lakin Allah adamı İsrail bunların heç birindən qorxmayıb Xaçı əlinə alaraq əmr etdi ki, hamı diz çöküb ibadət etsin. Bundan sonra İsrail yavaş – yavaş adamları ilə Bərdə Qruak adlanan dağa qalxdı. Müqəddəs Xaçın qüvvəsi və yepiskopun duaları ilə tufan yatdı və onlar əzəmətli dağları aşa bildilər. Amma yenə də bir neçə gün nə günəş göründü, nə də ulduzlar və şiddətli şaxtadan nəfəs almaq mümkün deyildi. Onlar taqətdən çox əldən düşmüş halda hələ bir çox gün yollarına davam etdilər və axırda böyük Qriqorinin nəvəsi, Albaniyanın katolikosu Qriqorisin şəhid çələnginə layiq görüldüyü qədim çar iqamətgahına[224] çatdılar.

Onlar bir neçə gündən sonra Dərbənd yaxınlığında olan Çola darvazasına çatdılar və burada şəhər əhli onları böyük hörmətlə qarşılayıb,sonra da ehtiramlayola saldılar.

Uzun səfərlərini davam edərək axırda 40 günlük Pəhriz bayramı ərəfəsində[225] gəlib dəbdəbəli Varaçan şəhərinə[226] şatdılar.[227]

İsrailin gəlməsini xəbər alan hunların böyük knyazı onun qabağına təbriklərlə çıxıb böyük sevinclə qəbul edərək, ona yepiskopluğuna layiq lazımi hörmət və ehtiram göstərir. Qırxgünlük Pəhriz bayramının xoş günləri gələndə isə şəhər əhli İsraili böyük məhəbbətlə qarşıladı. Onlar ona çox böyük hörmət göstərdilər və qayğıkeş hunlar knyazı və onun alicənab əyanları bu cəhətdən fərqləndilər.

Belə təmtəraqlı qəbulu və dostluq münasibətlərini görən yepiskop İsanın sözlə deyilə bilməyən mərhəmətilə təşəkkürünü

bildirdi.

Uzun və yorucu əziyyətlərdən sonra İsrail bir neçə gün istirahət edir və bu günlər ərzində o, çoxlu küfr eşidib və bədbəxt , lakin mehriban xalqın xurafata meylini görürdü. Çoxlu şər və dinin ikitirəliyini görən İsrailin ürəyi acıyır, özü də kədərlənirdi, çünki burada elə adamlar var idi ki, özlərini Allaha sitayiş edənlər adlandırırdılar, lakin həqiqətdə Allah qüvvəsindən üz çevirib başqa – başqa şeylər uydururdular.

# QIRX BİRİNCİ FƏSİL

## Yepiskop İsrail öz təbliğatı və nəsihətilə hunları xaçpərəst dininə çevirir. Onun möcüzələrini görən hunlar onu itaətlə dinləyirlər

Şeytanın təhrikilə yolunu azmış və ağaca sitayiş günahına qərq olmuş bu qəbilə, öz şimal kütbeyin axmaqlığına görə, uydurulmuş və yalançı inamlarına sadiq olaraq öz murdar bütpərəst ayinlərini başqa dinlərdən yüksək tuturdular. Əgər gurultuyla müşayiət edilən və fəzanı yandıran ildırım bir insanı və yaxud bir heyvanı vururdusa, hesab edirdilər ki, bu, onların Kuar adlı ihahilərinə qurbandır və buna görə də ona sitayiş edirdilər. [228] Bundan başqa onlar sitayiş etdikləri nəhəng və eybəcər, farsların Aspandiat adlandırdığı Tanrı- xan allahlarına at kəsib qurban verirdilər.[229] Heç bir sağlam fikirləri olmadan onlar müxtəlif eyiblərə düşürlər. Meyitlər üstündə dumbul və zurna çalır, bıçaq və ya

xəncərlə yanaqlarını, əl və ayaqlarını çərtib qan axıdırlar. Çox vaxt kişilərin lüt – üryan halda bir – birilə və ya dəstə - dəstəylə qəbiristan yaxınlığındakı meydanda qılınclarla döyüşmələri kimi çox eybəcər və murdar səhnələr olur. Böyük – böyük dəstələr bir – birilə ötüşür və güləşir, sonra da pozğunluğa və ya at çapmağa girişirdilər. Kimsə ağlayıb ulayırdı, kimsə də şeytan kimi özündən çıxırdı. Onlar dilxoşluq edir, oynayır, rəqs edir və eybəcər işlərlə məşğul olub murdarlığa qərq olurdular, çünki Xaliqin nurundan məhrum idilər. Onlar oda və suya qurbanlar gətirir, naməlum yollar ilahəsinə, aya və onların gözlərinə təəccüblü görünən bütün məxluqa sitayiş edirdilər. Şəhvətli həvəslərinə uyaraq, öz vəhşi bütpərəst adətlərinə görə atalarının arvadlarını, ya iki qardaş bir arvadı və ya bir neçə arvad alırdılar. Müxtəlif eybəcər adətlərin və xurafatların çoxluğuna baxmayaraq, onlar Ədalət Günəşini görməyi, dərk etməyi bilmirdilər.

İsrail hunların belə çirkin bütpərəst qanunlarına meylini görəndə o, gecə - gündüz Allaha dua edib yalvardı ki, o, bu ölkəni belə şeylərdən xilas etsin və onun özünə bunları xaçpərəstliyə çevirmək üçün yol göstərsin. Onun göstərişi ilə ibadət vaxtı təyin olundu ki, hunların bütün əyan və başqa nümayəndələri kilsəyə yığışıb ilahi vəsiyyətlərə qulaq assınlar. Allah evinə gələn hunların knyazı və camaatı yepiskopun sözlərini eşitməyə hazır idilər. Onlar bir – birinə deyirdi: “ Gəlin ondan təskinlik verən sözlər eşidək, çünki o,Müqəddəs Ruhun vəsiyyətlərini dünyaya yayan müqəddəs xaçpərəst dininin təliminin təbliğatçısıdır”. Onların dinləməyə hazır

olduqlarını görən İsrail öz alimliyi və müdrikliyilə belə başladı:" Övladlarım, xaçpərəstliyə dönün və Allaha inanın ki, O, mərhəmətə gəlib sizə varlıq bağışlasın. Çünki O, Rəbbimiz və hər şeyin Xaliqidir. Bu andan öz murdar inamlarınızı atın və xaliq olunana daha ibadət etməyin, çünki bütün bunlar Şeytandan gəlir və insan ruhunu korlayır. Heç kəs Allahın və Şeytanın badəsindən bir anda içə bilməz və Allah – təalanın süfrəsindən dadan, eyni zamanda, Şeytanın masasından yeyə bilməz. Qoy Allah sizin günahlarınızı, istər şüurlusu olsun, istər şüursuzu, bağışlasın və qoy o sizi idrak sobasına daxil etdirib sizi ədalətli cəzaya məhkum etsin. Bütün kainatı Allahın aləmində nurlandıran, cahilliyə, nadanlığa qərq olmuş bütpərəst xalqları zülmətdən çıxaran və onlara həqiqi dinin nurunu gətirən Allah – təala sizi də Öz işıqsaçan mərhəmətilə aydınlığa gətirər. Təki siz tərəddüd etmədən Allaha öz çevirəsiniz və möhkəm iradənizlə Allah Oğlunun şərəfli adına müraciət edəsiniz. Müqəddəs Üç Uqnuma inanın, etiqad edin! Çünki cisimsiz qoşunlar da tərifedici səsləri ilə üçqat təkrar edirlər: " Əziz, pak və müqəddəs Rəbb! Bütün yer üzü Onun şərəfi ilə doludur!" [1] Məgər əvvəllər müqəddəs havarilərin və şəhid Qriqorinin bizə vəsiyyət etdikləri İlahinin üçlük vəhdətini – Ata Özünüdən, Oğul Atasından və Müqəddəs Ruh onların varlığından – görmürsünüzmü? Bütün yer üzü Onun şərəfi ilədoludur, yəni Xilaskarın sözü ilə bu Çarlığın İncili bütün aləmdə

[1]İncil. İsayyanın kitabı, VI, 3.

təbliğ olunacaq”.[1] Və bütün bütpərəstlərə məlumdur ki, İncil bütün dünyaya yayılmışdır. Zəburun ayəsində deyildiyi kimi O, dünyanı əhatə etmişdir: “ Onun səsi bütün yer üzündə eşidilir və onların sözləri də kainatın hüdudlarına qədər çatır”. [2] Başqa bir havari də deyir: “ Çünki yer üzü sular dənizi dolduran kimi Allahın biliciliyi ilə doldurulub”.[3]

Və bu gün biz gördük ki, Allahın kəlamı üzərinizdə hakim olur və yayılıb ürəklərimizin zəmilərində bar verir. Mahir əkinçinlərin əməyi sayəsində toxum bol məhsul gətirib: dənin birisi – yüzqat, birisi – altımışqat, birisi də - otuzqat.[4]

Əgər sizin zəmiləriniz bu qədər məhsuldardırsa, onda nə üçün siz ölümgətirən quşa icazə verirsiniz ki, o sizin ağlınızın pak və çiçəklənən zəmisinə qonsun? Məgər siz bilmirsinizmi, bizim ulu atamız Adəm məhz buna görə Cənnətdən qovulub, kollu və dəvətikanlı torpağa varis olmuşdur? Bu barədə havari də deyir.[5]

Qanunpozan knyaz Allah olmaq istəyəndə o, əlini uzadıb bütün insanları bir – birinə günahla bağladı və Allahın xaliq olan birinci insanına həsədindən onu itaətsizliklə qızışdırıb Adəmin oğlunu xaincəsinə təhrik etdi ki, o, öz qardaşını öldürsün. Və bu qətlin sayəsində o və onun bədbəxt nəsli bütün cismi günahların, şübhələrin və lənətlər toxumlarının valideynlərinə çevrildilər və bu

---

[1] İncil. Matfeydən, XXIV, 14.
[2] İncil. Zəbur, XXVIII, 5.
[3]İncil. İsayyanın kitabı, XI, 9.
[4] İncil. Markdan, IV, 8, 20.
[5] İncil. Pavelin romalılara risaləsi, I, 21və sonrakı, V, 1 və ardı.

barədə İncildə deyilib:

“ Və Lameh özünə iki arvad aldı”[1] Lamehin oğlu İuval isə mahnılar yaradır, santur, boru, arfa, təbl və başqa səs doğuran musiqi alətləri düzəldib,[2] bunların vasitəsilə bütpərəstliyə dəvət və zina ehtirasına təhrik edirdi.

Navuxodonosor da metal alətlərin azğın səsləri ilə camaatı çağırıb, qızıldan tökülmüş nəhəng bütə bütün öz bayramlarında sitayiş edib qurban kəsməyə məcbur edəndə məhz bununla məşğul idi.[3]

Məgər Şeytana sitayiş edən Adəm oğlunun hədsiz şərhini görmürsünüz? Qətl Şeytandan əmələ gələn kimi, ikiarvadlılıq və musiqi alətlərinin icadı da həmin azdıran Şeytanın təhrikindən doğur. Beləliklə də, Adəm oğlunun nəsilləri zinaya və pozğun işlərə qərq olub lənətə gəlmiş Sifin qəbiləsinin qızları ilə qarışdılar. Və xoş vədlərin yerinə Allah – təala onları cəzalandırmaq üçün üzərlərinə Tufanı və ümumdünya qırğını göndərdi. Yalnız təkcə Nuh bütün qəbiləsindən mömin və müqəddəs olduğu üçün Allahın buyruğu ilə öz ailəsiylə birlikdə bu cəzadan - Tufandan xilas olundu. Beləliklə, hörmətə və mükafata yalnız inam və qüdsiyyət layiq görüldü.

Kənan da deyilənə görə[4], Nuhu lağa qoyan Xamın həyasızlığına görə[5] lənətləmişdi: “ Kənan lənətlənib; o, qardaşlarının

---

[1]İncil. Kövn, IV, 19.
[2] Yenə orada. IV, 21.
[3] Bax: İncil. Daniyalın kitabı, III, 1-7.
[4]Bax: İncil. Kövn, IX, 18.
[5] Yenə orada. IX, 25.

qardaşlarının yanında qulların qulu olacaq”.[1] Biz görürük ki, Nimrud onun nəslindəndir[2] və o, öz cinli cadugərliyi ilə mərəkə yaratmaq üçün bütün xalqları daş yığmağa şirnikləndirmişdir.Özü isə öz nəhəng boyu və əzəmətli qüvvəsi ilə öyünüb o birilərin üzərində ağalıq etməyə başladı. Necə ki, deyilib: “ Onun çarlığına əvvəl Babil, Ereh, Akkad və Sennaar torpağında olan Xalia daxil oldu.[3]

İnsan əliylə qurulmuş Babil qülləsinin dağılmasından və dillərin qarışmasından sonra Nimrud, məşhur tarixi salnamələrdən bildiyimiz kimi, həddindən artıq lovğalaraq özünü ilahiyə bənzətdi və öz mahir ustalarına əmr etdi ki, onlar gümüşdən və misdən onun heykəllərini düzəltsinlər və bu heykəllərə də o, öz adını verdi. Həmin azmış xalqların çoxu onun heykəllərinə qurban kəsirdilər. Sizi də mən indi bu vəziyyətdə görürəm, görürəm ki, xurafata vəfalı olan, tərəddüd edən qəlbinizlə ayaq dəyməmiş cığırlarla oraya – buraya dolaşırsınız və cadugər və ovsunçularla, falabaxanlarla və vəhşi nəhəng Aspandiat adlı birisinə aldanaraq onlar üçün atları qurban kəsirsiniz. Heç də başa düşmək istəmirsiniz ki, murdar qüvvələrə pərəstiş edənlərin özləri də murdardırlar. Və necə ki, bütxanalar murdar və natəmizdir, eləcə də allahın qabağında Aspandiata qurban gətirənlərin hamısı murdar və çirkindir və Əhdi – Ətiqdə deyilir: “ Çünki pozğun Allah qabağında iyrəncdir, möminlə isə onun

[1] Bax: İncil. Kövn, IX, 25.
[2] Yenə orada. X, 6-8.
[3] Yenə orada. X, 10.

ünsiyyəti var”.[1]

Bundan başqa, siz səmada çıxan ildırımı Allah hesab edib xilaskar adlandırırsınız. Heç fikirləşirsiniz ki, ey nadan insanlar, nə üçün buludlar arasında çaxan ildırımlar və göy gurultusu sərt qış şaxtası olan altı ayda hara da yox olurlar? Məgər bu ildırımlar xaliqimiz Allahın izniylə çaxmırlarmı və yenə də Onun əmriylə qış fəslində heç bir ildırım çaxa bilməz? Buna görə də aydındır ki, ildırımlar Allah ola bilməz və yalnız Xaliq Allahın xilqətidir və siz: “ Göyü və yeri yaratmayan allahlar yer üzündən yox olacaqlar” [2] sözlərinə əhəmiyyət verməməkdə çox səhv edirsiniz. Bilin və baxın – Allah öz hökmündə Birdir və Onun üstündə heç kəs yoxdur. O, bütün görünən və görünməyənin Xaliqidir. Allah Atadan doğulmuş bircə Oğuldur ki, Özü də Atadan və Müqəddəs Ruhdandır, Onların varlığındandır və kainatı da Onlar xəlq ediblər.

Bundan sonra, bütün köhnə yanlış fikirlərinizi kənara atın, ürəklərinizi təzələyin və ən yaxşı nə varsa onu seçin, çünki İsa peyğəmbər dünyaya günahkarları xilas etmək üçün gəlmişdir. Gəlin və Ona tövbə ilə müraciət edin. Günəşə və Aya sitayiş etməyin, Günəşi və Ayı, dənizləri və yeri və onlarda nə varsa xaliq edən Allaha sitayiş edin. Çünki Günəşə və Aya sitayiş edənlərin payına yalnız sönməyən atəş düşür. Sulara qurban gətirənlər daş kimi suyun dibində boğulacaqlar. Yarpaqlı ağaclara sitayiş edənlər və onlara nəzir verənlər haqqında İncildə belə sözlər deyilib: “ Çöldə olan hər

[1] İncil. Süleymanın ibrətli sözləri kitabı, III, 32.
[2] İncil. İyeremiyanın kitabı, X, 11.

ağac od tutub yanacaq, qanunpozanları udacaq və sönməyəcək”.[1]

O ki qaldı o kəslərə ki, onlar sinələrində ilan təsvirli qızıl və gümüş bəzəklər gəzdirir, onların barəsində İncildə deyilir:” Onlar Allahın qəzəbli günündə nə onların qızılı, nə də gümüşləri xilas edə biləcəkdir”.[2]

Və günahkarlar üstündən əzabların ağır yükünü və əbədi odun atəşini yalnız Allah Özü götürə bilər, çünki bunlar bütpərəstlər kimi mürtəddirlər.

Bütün bunları və bəlkə də bundan artığını böyük yepiskop İsrail söyləyirdi.

# QIRX İKİNCİ FƏSİL

## Yepiskop İsrailin vasitəçiliyi ilə Hunlar İsaya inam gətirirlər. Bütxanalar dağılıb İsa xaçı ucaldılır

Allah adamının sözləriylə ruhlanmış xeyirxah və yüksək taxtsahibi olan knyaz Alp İlutuer, onun əyanları və saysəz – hesabsız döyüşçüləri yepiskopun fəsahətli nəsihətini və təmtəraqlı sözlərini dinləyib, Allaha şükür edib dedilər: “İndi biz həqiqətən inanırıq ki, İsrailin vasitəsiylə Allah – təala bizə öz xeyirli təskinliyini göndərib ki, bizi düşünülməmiş işlərdən və müxtəlif şeytan əməllərindən xilas

[1] Yenə orada. İyeremiyanın kitabı, VIII, 20.
[2]İncil. Xuruc, XX, 23.

etsin”.

Bundan sonra onlar İsa əsarətinə itaətkarlıqla tabe olaraq, qırxgünlük pəhriz vaxtında təvazökarlıqla pəhriz saxlayıb gecə - gündüz səylə ibadət etdilər. Onlardan hər biri yepiskopun məsləhətiylə öz qonşusu ilə müqəddəs kilsəyə ibadətə getməkdə və əvvəlki acgözlüyü unutmaqda yarışırdı. Xeyirxah knyaz öz yaxın məsləhətçiləri ilə birlikdə boyunlarını götürdülər ki, hər il həftəlik pəhriz saxlasınlar. O,özü dindar olduğu üçün bir anda Allah vəsiyyətinə əməl edərək zülmət övladlarını təqib etdi. İsanın nurlu elminə inanaraq o, gündən – günə Onun məhəbbətilə bəzənir, müqəddəs Dinin istəkli sığınacağına çevrilirdi. Əsli ölənlərdən olan bu adam Allah mərhəmətinin övladı oldu və həyat bəxş edənə yaxınlaşdı. Qüvvə və hünəriylə fərqlənən bu adam yarışlarda şöhrət qazanır və Yunan olimpiadalarının qalibi kimi öz qüvvəsiylə başqalarından fərqlənib, Türküstanda xəzərlər xaqanının yanında şücaətlər göstərib özünə parlaq ad qazanmışdı. O, xaqanın məhəbbətini qazandı və o da öz qızını ona verir. Bundan başqa o, il – ituer mənsəbinə[230] layiq olur və yepiskopun nurlu təlimini şöhrət çələngi kimi qəbul etdiyinə görə üç ölkədə məşhurlaşdı. O, ölənlərin üstündə ağılsız ah – zarları və bıçaqlaşmanı tədricən aradan götürməyə çalışır və öz ata – baba dinini murdar və natəmiz hesab edərək and içdi ki, Aspandiatın və başqa saxta ilahilərə həsr olunmuş bütxanaları dağıdacaq. O, əmr etdi ki, yalnız yer və göylərin Xaliqi olan canlı Allaha ibadət etsinlər. O, beynindən şərin rəzalərini kənara

ataraq dünyaya yenicə gəlmiş uşaq kimi üzlü südə həsrət idi. Çox yerlərdə yeni kilsələr tikdirib Allahın keşişlərinin şöhrətini ucaldırdı.

Yepiskopun əmriylə murdar Aspandiatın adıyla bağlanmış hündür və bol yarpaqlı palıd ağaclarının ən böyüyünü kəsdilər. Bu ağaca onlar at qurban kəsir, onun qanını yarpaqlarına çiləyir, kəlləsini və dərisini də budaqlarına asırdılar.[231] Bu palıd ağacı bütün başqa ağacların anası sayılırdı və bu ağaca hunlar ölkəsində çoxları, o, cümlədəm bu bütü xilaskar, həyatverən və bütün nemətləri bəxşedən sayan knyazın özü və bütün onun əyanları sitayiş edirdi. Nəhəng ağacın kəsilməsi barədə yepiskopun əmrini eşidib özlərini təhqir olunmuş sayan və gələcəkdə məhv oluna biləcəklərini düşünən cadugərlər, sehrbazlar və kahinlər qara camaatı qabaqlarına salıb hunlar knyazının və ölkə əyanlarının yanına gəlib çığır – bağır saldılar: “ Necə ola bilər ki, siz şüurlu olaraq bizim və ilahilərimizin düşmənininin dediyinə, yəni bu ağacın kəsilməsinə razılıq vermisiniz? Nə üçün siz ona qulaq asıb sizin atalarınızın tikdirdikləri məbədləri və qurbangahları talan edib dağıdırsınız? Çarlar və knyazlar, bütün bizim xalq bu günə qədər bu məbədlərə hörmət edir, bunlardan və müqəddəs ağaclardan gözəl sovqat alır, xalqımızın sayını artırır, onlardan qüvvələnib düşmənlərimiz üzərində qələbələr çalırdılar. Siz bi yepiskopda nə görmüsünüz ki, onu belə ehtiramla dinləyirsiniz? Nə üçün siz ona belə ixtiyar verirsiniz ki, o, sizin ilahilərinizin məbədlərini söküb dağıdır? Məgər siz nəhəng və cəsur Aspandiata, bu ağaca ibadət edib və qurban verib ondan gözəl

hədiyyələr və başqa istədiklərinizi almırdınızmı? O, xəstələri sağaldır, kasıb və yoxsulları yüksəldir, qızmar quraqlıqda və isti günlərdə biz onun qüvvəsi vasitəsilə yağışlar arayıb isti, qızmar günləri sərinlədir, bu yağışlar çölləri və ağacları göyərdir və sizin kefiniz və qidanız üçün meyvələri şirəylə doldururdu. Məhz bunun vasitəsiylə biz leysanları kəsdirir, göylərin gurultusunu və ildırınmlarını sakitləşdirirdik. Bu adamın səhvlərlə dolu sözlərinə və onun elan etdiyi Allaha siz indi də inanacaqsınız? Özünüz və cədləriniz ibadət etdiyiniz doğma ilahilərinizi yerə yığmaq və onları ayaq altında tapdalamaq istəyən adamın əlinə düşməmək üçün onlardan imtina etməməli və üz döndərməməlisiniz. Onlara ibadət ediniz, çünki onlar qeyzə gəlib ölkəmizə böyük və amansız zərbələr endirə bilərlər. Axı pəhləvan qüvvətli Aspandiat üçün tikilən və qurulan məbəd və qurbangahlar olan yerlərə və ölkəmizin qəyyumu və xilaskarı olan bu gözəl və qalın yarpaqlı ağaca kim yaxınlaşa və onlara əl vura bilərdi? Bu ağacın tökülmüş yarpaqlarını və ya qurumuş budaqlarını öz ehtiyacları üçün yığan nadanlar belə ağac tərəfindən dəhşətli yaralarla, dəliliklə və hətta ölümlə cəzalanırdılar və onların evləri və nəsilləri belə yox edilirdi. Heç sizin yepiskop bu ağaca yaxınlaşa, ona əl vurub gedə bilərmi və bizim ilahilərimizin məbədlərini sökə bilərmi? Biz bilirik ki, əgər o, inad göstərərək onlara yaxınlaşsa, o, böyük bəlalara düçar olar və hətta həyatdan kənar da edilə bilər!”

Bundan sonra hunlar knyazı cadugərlərə, sehrbazlara ,

əfsunçulara və məbədlərə, ağaclara xidmət edənlərə belə dedi: “ Biz bu ərə inanırıq və o, bizim aramızda təbliğ etdiyi Allaha ibadət edirik. Məbədləri söküb dağıtmaqda və bu ağacı kökündən çıxarıb və doğrayıb yandırmaqda biz ona maneçilik etməyəcəyik. Əgər siz bu bütlərin, məbədlərin qurban verdiyiniz ağacların vasitəsilə onu qorxuda bilib, onu dəhşətli azarlara salaraq öldürmək imkanındasınızsa, onda biz sizə inanıb əvvəlki kimi məbədlərin tikilməsini davam etdirəcəyik, bütlərə, timsallara  və ağaclara ibadət edib, qurban kəsib, onların paylarını ayıracağıq. Yox, əgər siz ona qarşı durub onu qorxuda bilməsəniz, o da bütlərlə məbədləri dağıdandan və ağacı qırıb yandırandan sonra nə xəstələnər, nə də ölər, biz əmin ola bilərik ki, onu bizə göyü, yeri, günəşi, ayı və ulduzları xaliq edən Allah göndərib və biz bu Allaha inanırıq. Sizi isə əl- qolunuz bağlı ona təhvil verəcəyəm ki, o, sizi bu ağacla birlikdə yandırıb məbədlərlə bir yerdə məhv etsin”.

O dəqiqə cadugərlər, sehrbazlar və kahinlər divanəlik cildinə girib ovsunlamağa və donquldanmağa başladılar, lakin öz yalançı və bihudə əməlləriylə heç bir şeyə nail ola bilmədilər. Bu vaxta qədər lazım gələndə, onlar insanları gözə görünməyən cidarlarla dolaşdırır, istədiyi adamların canına əcinnələri doldurub onları ağır əziyyətlərə salırdılar və sonra onlara belə yalanı satırdılar: “ Siz gərək bütlərə və ağaclara qurban verəsiniz. Siz isə bunu etmirsiniz, buna görə də bizim böyük ilahilərimizin cəzasına məhkum olunmusunuz. İndi qurbanlarınızla hədiyyələrinizi götürüb məbədlərlə ağaclara təqdim

edin ki, bu xəstəlik və əziyyətlərdən qurtara biləsiniz”.

Əvvəllər onlar nə deyidilərsə, Şeytan əməllərini yerinə yetirirdi və bu sadə adamların canına vəlvələ salırdı.Onlar bəzən vəsvəsəli hərəkətləriylə hamının gözü qabağında göylərdə leysan yağdırır, quraqlıq əmələ gətirirdilər və bununla insanları aldadır, ölkəni də fəlakətə salırdılar, çünki özləri azıb, tərəddüddə olanları da azdırırdılar.

Amma bu dəfə onlar buna bənzər heç bir şey törədə bilmədilər. Onların ovsunlamağı Allah adamını nə qorxuya sala bildi, nə də məğlub etdi, çünki Müqəddəs Xaçın köməyilə onların qüvvələri buxovlandı və caduları da qapalı qaldı.

Bundan sonra müqəddəs qanunları təbliğ edən yepiskop hunlar knyazına və əyanlarına belə dedi: “ mən onların boş sözlərindən zərrə qədər də qorxmadım və dəhşətə də gəlmədim, çünki başqa kütbeyin adamları öz bütpərəstlik ovsunçuları ilə qorxutduqları kimi məni qorxuda bilməzlər və onlar Allah simasında həqiqi həyatdan məhrumdurlar. Mən nə sizin məbədlərinizdən, nə də görünüşü qabağında dəyişən yüksək ağaclarınızdan qorxmuram. Buna görə də mən qorxusuz, açıq – açığına, hamının gözü qabağında İsanın Müqəddəs Xaçına bel bağlayaraq ona biət edəcəyəm. Mən sizin qəlblərinizi tərəddüdlərdən və ağaclara ibadət etmək səhvindən azad edəcəyəm, çünki bu ağaclar özləri – özlüyündə nə şəri, nə xeyri əvəz edə bilməzdilər, nə onlara xidmət edənləri mükafatlandıra, nə də düşmənləri cəzalandıra bilməzlər. Mən sizin bu lal və kar

məbədlərinizi öz əlimlə parça – parça edib adamların ayaqları altına atandan sonra görərsiniz ki, mənim dediklərim həqiqətdir".

Bunu deyib yepiskop öz keşişlərinə əmr etdi ki, baltaları götürüb diz çöksünlər və Allaha Zəburun bu ayəsiylə yalvarsınlar: "Qoy Allah qalxsın və qoy Onun düşmənləri dağılsın və qoy Ona nifrət bəsləyənlər Onun gözündən yox olsunlar".[1] Sonra yepiskop Aspandiata həsr olunmuş ən hündür ağaacın gövdəsinə xaç işarəsini qoydu və keşişlər meşəliyə girərək ağacı kəsdilər. Yepiskop əmr etdi ki, onu Varaçan şəhərinə aparsınlar. O, burada mahir ustaları çağıraraq əmr etdi ki, ağac parçalarından gözəl xaç düzəltsinlər. Sonra ağacdan müxtəlif surətlər düzəldərək xaça bağladılar və gözəl naxışlar saldırıb hamarladılar. Sonra müxtəlif ikonalar düzəltdirib, onları xaça bərkitdilər. Xaçın aşağısındakı kiçik dördkünc ikitaylı qapısı olan oyuq düzəltdilər və üstünə zanbaq şəkli çəkdilər. Oyuğa içində İsa xaçının hissəciyi olan xaçvari gümüş sandıqca qoydular.

Xaçı düzəldib sahmana salandan sonra yepiskop onu tövbə ilə ibadətlər üçün çar sarayının şərq tərəfinə qoydurub dedi: " Bu həyatverən xaçın qabağında Allaha, sizin xaliqinizə ibadət edin. Siz öz nadanlığınıza görə əvvəllərbu ağaca ibadət edib, onun qabağında qurban verdiyiniz heyvanların ətini yeyib. Qanlarını içirdiniz. İndi isə bu xaça və görünməyən Allaha ibadət edin. Odur ağacların yerinə bütün dünyada Öz Xaçını yüksəldən. O, qurbanların qanı əvəzinə sizin günahlarınızın təmizlənməsi üçün öz qanını vermişdir. Mən

---

[1]İncil. Zəbur kitabı, 67, 2.

bilirəm ki, keçmişdə bütün işləri siz öz cəhalətinizə görə görürdünüz. Bundan sonra Allah bərəkətinin taxtına özünüz yaxınlaşın, bütpərəstliyin bütün ağır eyiblərini çiyinlərinizdən atın və şərəf nurunun libasını geyməyə layiq olun”.

Bütün bunları öz əyanları ilə birlikdə eşidən hunların mömin knyazı İl-ituerin Allaha sevgisi və qorxusu daha da artdı. O, gördü ki, cadugərlərin onları qorxutduğu əlamətlərin heç biri baş vermədi. İsrailin kəsdirdiyi ağaclar və sökdürdüyü məbədlər ona heç bir zərər vermədi, ona nə xəstəlik toxundu, nə də ölüm. Əksinə, yepiskopun üzü daha da nurlandı və o, İsaya xidmətində daha da möhkəm olub yepiskopun sözlərinə qulaq asırdılar.

Bundan sonra knyaz öz sarsılmaz hökmüylə əmr etdi ki, İblisə və şeytanlara qulluq edeən cadugərlər və ovsunçuları öz kahinləri ilə birlikdə tutub, əl – qollarını bağlasınlar və Allah adamı İsrailin yanına gətirsinlər. Yepiskop cadugərliyin bihudə qüvvətsizliyini camaata göstərmək üçün əmr etdi ki, onların bəzisini ana yolların kəsişdiyi yerlərdə yandırsınlar, bəzilərini də zindanlara salsınlar. Beləliklə də, bütün hunlar ölkəsi bihudə inamlardan azad olub, daha yüngül olan İsaya xidmət boyunduruğunu geydi. Yepiskop əmr etdi ki, bütpərəstlər bədənlərində gəzdirdiyi qızıl tilsimləri çıxarıb atsınlar. Özü isə bu tilsimləri əliylə əzib onlardan xaç düzəldirdi ki, bununla da hamının qarşısında möminliyini nümayiş etdirdi.

Bütün bu tədbirlər müqəddəs qırxgünlük pəhriz vaxtında

hunlar çarının nəhəng ordugahında görülüb və Allahın hökmüylə yepiskop İsrailin vasitəsiylə bunu hər tərəfə yayırdılar. Müqəddəs Pasxanın nurlu səhəri açılanda baş kahinlərin və cadugərlərin çoxu zəncirlənib zindana salınmışdı. Knyaz İl – ituerin razılığı ilə bütün şəhər əhlini meydana yığıdılar və burada məhkəmə təyin olundu. Hər iki tərəfə imkan verildi ki, camaatın qabağında öz sözünü desin. Birinci yepiskop başladı. Əlində İncili tutub o, oradan iqtibaslar gətirdi, kahinləri danlayıb qınadı. Xurafatın yazıq xadimləri kahinlər isə yepiskopun əlində olan Allah Xaçının qabağında utanmaqlarından yanıb tökülürdülər, əsdilər və hər şeydən ümidlərini kəsdilər. Bundan sonra onlar özlərini yamanladılar, öz günahlarını boyunlarına aldılar və həqiqi dini qəbul etdilər. Onlar öz ziyanlı cadu sümüklərini yepiskopa verdilər, o da bunları yandırıb onları dünyaya yeni gəlmiş insanlara çevirdi. Bütün bunları görən hunlar knyazının və onun xalqının İsa dininə olan məhəbbətləri daha da artdı. Onlar öz murdar ayinlərini atıb, başda knyaz və bütün əyanlarla birlikdə yepiskop tərəfindən çar sarayında qaldırılmış yeni Xaçın qabağında qurban kəsdilər. Keşişlər Xaçın qabağında olan qurbanlar haqqında bərəkət mahnıları oxumaq istədikləri vaxtda yepiskop knyaza dedi: “ Allaha olan sevgini bu gün burada izhar et ki, Onu sizlə barışdıraq. Bütün qanunsuzluğu ləğv et ki, gələcəkdə Allaha pərəstişə heç bir mane qalmasın. İndi də Müqəddəs Ruh bu kahinləri imtahan edir və siz də Səmavi atanız kimi kamil olun. Mənimlə gərək razılaşasınız ki, bu böyük Pasxa bayramında həmən Allaha inanmış kahinlərin əliylə

Dərkonand adlanan gurultulu heyvan kəllələri qəbiristanı yandırılmalıdır. Onlar oraya lənətlərlə gedib oranı yandırmalıdırlar. Yalnız bundan sonra onları xaç suyuna salıb xaçpərəst hesab etmək olar”.

Hunların mömin knyazı bunu eşidəndə elə o saat əmr etdi ki, məbədlər dağılsın. Yepiskop və knyaz Movses adlı ustanı və onunla birlikdə məbədləri dağıdıb yandırsınlar. Onlar da gedib məbədlərin hamısını yox etdilər. Yepiskop özü bütlər olan yerlə üzbəüz olan təpəyə qalxıb diz çökdü və Allaha dua etdi Elə o an bərk külək əsdi, od alışdı və məbəd içindəki kəllələrlə və dərilərlə birlikdə yanıb yox oldu. Sonra onlar böyük sevinclə şəhərə qayıtdılar və nurlu xaçı suya salıb xaçpərəst oldular. Həmin gün knyaz və əyanlar üçün ən böyük bayramların bayramına və məclislərin məclisinə çevrildi.

# QIRX ÜÇÜNCÜ FƏSİL

## Hunların böyük knyazı İl – ituer öz əyanları ilə məsləhətləşir ki, yepiskop İsrail onların yanında qalsın və ölkələrində katolikos kürsüsünü bərqərar etsin.

Hunların böyük knyazı ölkəsinin əyanlarını və zadəganlarını yığıb bəyan etdi: “ Biz həmişə nadanlıq zülmətinə qərq olmuşduq və buna görə də Kainatın ədalət nurunu görə bilmirdik. İndi isə Rəbbimiz İsa öz mərhəməti sayəsində bizə həmən yepiskopu

göndərdi ki, o, bizi həyata aparsın. O. öz sözləri və əməlləri ilə bizi pozğunluğumuza görə danlayıb bizə bütün varlığın xaliqi olan Allahı və Onun möcüzəli qüvvəsini dərk etməyi öyrətdi və mən özüm də öz ağlımla buna həqiqətən inandım. Beləliklə, biz hamımız yerlə göylərin Xaliqinə inam bağladıq. Gəlin bu dinə inana bütün ölkələri, o cümlədən böyük Bizans imperiyasını misal kimi götürək. Deyirlər onların Konstantinopol şəhərini bina edən Konstantin adlı çarları var idi. Deyirlər ki, imperiyasında xaçpərəst olanlardan birincisi özü idi. O, o qədər mömin idi ki,ona Allahın mələyi xidmət edirdi və özünün bu inamıyla bütün düşmənlərinə qalib gələrdi. Deməli, əgər bu xaçpərəst dininin vasitəsilə belə şöhrət qazanmaq və qalib gəlmək mümkünsə, onda biz nə üçün Canlı Allaha inanmağa gecikirik? Budur, Allah ehkamlarını öyrədən yepiskop İsrail aramızdadır. Gəlin ondan xahiş edək ki, o, bizim ölkəmizdə qalıb bizi maarifləndirsi".

Onlar hamısı bu məsləhəti bəyəndilər və knyaz yepiskop İsrailin yanına tarxan rütbəsi[232] olan Ovçu adlı əyanı və Çatkasar adlı[233] yataq ağasını göndərdi.

Yepiskopun yanına gəldikdə onlar əyanların fikri barəsində danışıb ona hunların böyük knyazının bu sözlərini çatdırdılar: " Atamız! Biz Xilaskarımızı sənin vasitənlə dərk etdik və Ona inam bağlayıb həmişə Müqəddəs Üç Uqnuma sitayiş edəcəyik. İndi səndən acizanə rica edirik ki, sən bizim yepiskopumuz və müəllimimiz olub, bu Vaçaqan şəhərində katolikos kürsüsünü bərqərar edəsəb. Və mən İl – ituer, səninlə Allah adına sazişə girib, xaçpərəstliyi qəbul

etməyən bütün cadugərləri və sehrbazları yandırıb külə döndərəcəyəm. Və kim mənim olkəmdə bütpərəst qalıb bütlərə qurban gətirməkdən əl çəkməzsə, mən onu qılıncdan keçirib məhv edəcəyəm”.

Yepiskop onlara belə cavab verdi:” Albaniyanın böyük patriarxı Yeliazarın icazəsi olmadan mən heç bir şey edə bilmərəm. Bu işdə ixtiyar yalnız onun əlindədir. Axı mənim öz dindarlar dairəm var və mənə Allah tərəfindən tapşırılan dindarları necə atıb gedim? Sizin qayğınıza isə həzrət İsanın özü qalıb, öz mərhəmətilə inamınıza görə sizə bir dini başçı verər və o da İsa Zəburu ilə sizə xidmət edər”.

Lakin bu iki elçi yepiskopun yanına ikinci və üçüncü dəfə gəlib xahişlərini təkrar etdilər. Belə vəziyyətə düşən yepiskop dedi: “ Onda Allahın izniylə öz ölkəmə mömin övladım Albaniya knyazı Varaz – Tiridatın və müqədəs katolikosun yanına qayıdana qədər məni gözləyin. Və əgər Allah – təala buyursa, o vaxt Onun Özü sizin xahişinizi terinə yetirər. Sizi vəd olunan şərəfdən kim məhrum edə bilər? Siz məni işgəncələrə və ölümcül hala salsanız belə mən bunu özümə şərəf və şöhrət hesab edib Allah simasında sevinərəm. Öz niyyətiniz haqqında isə siz yazılı surətdə bütün Albaniya xalqına və xüsusən katolikos Yeliazara xəbər verin, çünki həzrət İsanın qardaşı müqəddəs Yelisey vaxtından bu ana qədər Allah şəhəri Qüdsdən gələn bu kürsü bizim Şimal – Şərq ölkəmizə bəxş olunub. Sizin ölkə isə bizim ölkəylə həmsərhəddir və bütün mənim həmdinlərimin, keşişlərin, qardaş və yoldaşlarımın razılığı olmadan mən bunu necə

edə bilərəm? Axı bu məsələ çox yeni olsa da, onun əhəmiyyəti çox böyükdür!"

Bütün bunları yepiskopdan eşidəndən sonra onlar onun xahişini yerinə yetirdilər və böyük hörmətlə öz ölkəsinə göndərdilər.

# QIRX DÖRDÜNCÜ FƏSİL

## Böyük Kolmankın yepiskopu İsrailin Hunlar ölkəsindən qayıtması. Onun ardınca iki zadəgan gəlir və xahiş edirlər ki, o, hunların rəhbəri olsun.

Hunların böyük və mömin knyazı İl –ituer ölkəsinin iki zadəganını – Xursanın il – tiqinini[234] və Çat Xəzəri hazırlayıb Müqəddəs İsrailin ardınca göndərir ki, onlar Albaniyaya gəlib dostluq təklifləri və xahişi ilə İsraili hunlar ölkəsinə başçı kimi təsdiq etsinlər. Göndərdikləri risalənin mətni belədir: "Sizin göndərdiyiniz Allah adamı yepiskop İsraili görüb qarşıladıq və onun vasitəsilə səni, Albaniyanın böyük katolikosu müqəddəs Yeliazarı və səni, Albaniyanın müstəqil knyazı, bizim istəkli qardaşımız Varaz – Tiridatı salamlayırıq. Siz bizdən cismani xahiş edirdiniz, biz isə öz mənəvi aləmimizdə onun simasında Allah surətini gördük və onun müqəddəs həyatında və bizə Allah tərəfindən izhar edilən möcüzələrdə öz Xaliqimizi dərk edib ruhumuza əmin – amanlıq qidasını əldə etdik. İndi sizdən xahiş edirik ki, siz İsrailin özünə icazə

verəsiniz ki, o, bizim yepiskopumuz və dini başçımız olsun.Biz onun vasitəçiliyi ilə əbədi xilasa nail olarıq və bununla da aramızda sarsılmaz dostluq möhkəmlənər. Allahla salamat qalınız!”

# QIRX BEŞİNCİ FƏSİL

## Hunlar knyazının ermənilərə yazdığı eyni məzmunlu məktub

“ Erməniyyənin yepiskopu müqəddəs Sahaqa[235] və erməni sərkərdəsi knyaz Qriqorasalamlar!

Əzəldən nadanlıq zülmətinə və dumanlara qərq olmuş bizim cədlərimiz sanki qəflət yuxusunda idilər. Lakin dünyaya Nicat gəldi: Ulu Allah yer üzünə İsa kimi gəldi. Biz bunu çox anlaşılmaz bir surətdə, sizin torpağa və Albaniya ölkəsinə basqınlarımız zamanı öz qulaqlarımızla eşitmişdik və bizim də qəlblərimizə səxavətli rəqabətin ruhu daxil olmuşdu. İndi bizim Rəbbimiz İsanın kəlamı yerinə yetirildi  və bizim şimal ölkəmizdə Onun Zəburu bəyan oldu və biz hər bir şeyi təkcə gözəl bir ərdən, Böyük Kolmankın yepiskopu İsraildən öyrəndik.

Artıq sizin yanınıza gələnlərdən və aramızda möcüzələr baş verməkdən danışanlardan hər şeyi öyrəndikdən sonra siz də yaxşılıq göstərib bizim xahişimiz yerə salınmasın deyə, bu ərin bizə

yepiskopluğa göndərilməsinə kömək edin. Biz bilirik ki, siz onun həmkarısınız və xeyirxah xaçpərəst olduğunuz üçün sizdən xahiş edirik ki, bizim mənəvi istəyimiz yerinə yetirilsin, çünki onun bizim aramızda olması bizi həmdin edər və vəhşi qəbilələrin qoşunlarının sizin tərəfə basqınları kəsilər. Əlvida!”

Elçilər Albaniyanı keçib ermənilərin yanına gələndə onlara hunlar ölkəsində Allah-təala İsrailin əliylə nələr etdiyindən danışıb hunların böyük knyazının məktubunu verdilər. Ermənilər elçiləri sevinclə qəbul edib onlara aşağıdakı cavabı verdilər.

# QIRX ALTINCI FƏSİL

## Hunların məktubuna cavab

“ Erməni katolikosu Sahaqdan, bütün dindarlardan, erməni knyazı Qriqordan və bütün kilsəmizin xadimlərindən Allah adından salamlar!

Bizə təsvir edilən sizin, Allah tərəfindən həyatverici xilasınıza, Allahın bu sonsuz səxavətinə görə biz ona öz təşəkkürlərimizi bəyan edirik. Siz Allahın dinini yenicə qəbul etmiş bəndələrin məktubunu aldıq. Məktubdan başqa ölkələrdəki kimi, sizin də ölkənizdə Allahı dərketmə işığının parıldamasına vadar edən Xaliqin mərhəmətindən xəbərdar olduq. Buna görə biz insansevər allaha yenidən şükür etdik ki, O, sizin atalarınız və cədlərinizi əvvəlki fani dininizdən ayırıb Öz müqəddəs adıyla tanış etdi və siz də Xaliqimizin həqiqi pərəstişkarları oldunuz. Məktubdan və elçilərdən

yepiskop İsrailin sizi xaçpərəstliyə necə döndərməsini öyrəndikdə biz gördük ki, Allahın adı bütün kainatı doldurub. Biz cismən bir – birimizdən uzaqda olsaq da, indi bizə elə gəlir ki, möhkəm dostluq vasitəsilə siz elə bil ki, gözümüzün önündəsiniz.

O ki qaldı yepiskop İsrailin sizə göndərilməsi məsələsinə, deməliyik ki, bu çox mürəkkəb məsələdir, çünki dindarlar öz dini başçılarından ayrı ola bilməzlər. Amma iş ondadır ki, İsraili bizim dini idarəmiz təyin etməyib. O, Albaniya katolikosluğunun sərəncamındadır. Biz istəyirik ki, o, həmişə sizinlə olsun, lakin bu barədə qərarı çıxarmaq üçün müstəsna hüquq yalnız Albaniya patriarxı katolikos Yeliazarın ixtiyarındadır və bu məsələ onun şəxsi işidir. Buna görə insanlara həyat verən Canlı Allaha inanın. Odur yaradan, Odur ölümə məhkum edən və Odur diriləndən!Qoy Müqəddəs Ruhun bu bərəkəti sizi onun qorxusundan və Onun təliminin hifzində saxlasın! Var olun!”

Erməniyyədən Albaniyaya qayıdan Xursanın il – tiqini və Çat Xəzər ölkə paytaxtı Bərdə şəhərinə gəldikdə katolikos Yeliazarvə knyaz Varaz – Tiridatla görüşüb yenədə xahiş etdilər ki, yepiskop İsraili buraxmaq istəməyib dedilər: “ İsrail ona Allah tərəfindən tapşırılan dindarları qoyub sizə gedə bilməz. Lakin biz ona iki ölkə arasında gediş – gəlişə, özü də mümkün qədər sizdə tez –tez olmasına icazə veririk ki, sizi İsa dinində möhkəm edib, aramızdakı bərqərar edilən sarsılmaz dostluğu saxlasın. Buna biz razıyıq, çünki İsrail aramızda vasitəçi olub, ədavətlərə son qoyub ki, dostluqla əmin

– amanlıq çiçək açsın”.

Bu qərarı eşidən elçilər təəccüb edib narazı qaldılar, lakin istəmədən ona razılıq verib, dedilər: “ Bu halda qoy İsrail bizə getməyi təxirə salmasın ki, bizim imanımızın onun qoyduğu kökləri qırılmasın, qoy bizi yetimlər kimi atmasın, çünki biz başqa müəllimə nə qulaq asacağıq, nə də tabe olacağıq”.

Alicənab xasiyyətinə və təbiətinə görə yepiskop İsrail könüllü olaraq hunların yanına gedərək hər iki ölkəyə xoşbəxtlik gətirir və bağlanan müqaviləyə əsasən xaçpərəst dinini yeni qəbul etmiş xalqa öz köməyini əsirgəmirdi.

# QIRX YEDDİNCİ FƏSİL

## Böyük Kolmank yepiskopu Davudun İovan Mayraqomluya[236] ikonalar və təsvirlər barəsində verdiyi sualı

Katolikos Uxtanes və ondan sonra Yeliazar Albaniya patriarxlığının idarə etdikləri dövrdə çox yerlərdə həm alimlər, həm nadanlar, bizanslılar və ermənilər arasında əmələ gələn nizamsızlıq, təriqətçilik və mübahisələr Albaniya ölkəsinə heç toxunulmamışdı. Amma albanlara da xəbər çatdı ki, bəziləri ikonalara əhəmiyyət vermir, bəziləri xaçı suya salmır, başqaları ermənilərin qriqoryanlıqda işlənən duzu rədd edir, başqaları isə toy zamanı

kilsəyə gedib başlarına tac qoymurdular və bütün bunların səbəbi guya keşişlərin yer üzündən yox olmasındadır.

Bununla əlaqədar Böyük Kolmankın yepiskopu Davud məktubla erməni bilikli rahibi olan İovana müraciət edib ondan bütün bunların səbəbini soruşdu. O da Davuda təfsilatla aşağıdakılardan xəbər verdi:” Bu ikonalara sitayiş etməyə zidd olan küfr havarilərdən sonra dünyaya gəlib və birinci dəfə bizanslılar arasında olub. Bununla əlaqədar olaraq Qeysəriyyədə böyük dini qurultay çağırılmışdı və orada qəbul olan qərarla ikonaları Allah evində ( kilsədə) göstərməyə icazə verilmişdi. Bundan sonra ikona çəkən rəssamlar lovğalanaraq bəyan etdilər ki, onların sənəti kilsənin başqa sənətlərindən üstündür.Onlar deyirdilər: “ Bizim sənətimiz işıqdır, çünki onu hamı; qoca da gənc də görür.Müqəddəs Kitabı isə oxuyan çox azdır”.Elə bu andan iğtişaşlar başlandı və buna görə də ikinci qurultay çağırıldı. Məsələni müzakirə edib kitab yazanlara, oxuyanlara və təfsirçilərə bəraət qazandırıb, onların rütbələrini rəssamlardan yuxarı qoydular. O vaxtdan erməni katolikosu Movsesə qədər bu nifaq salan küfr başını qaldırmırdı. Movsessin vaxtında erməni kilsəsi ikiyə parçalandı və Movseslə “ baş filosof” kimi tanınan Ərzurum yepiskopu Teodoros arasında böyük bir mübarizə başlandı.Biz, Movsesin tərəfdarları, bizanslıların bütün təriqətlərini pisləyirdik.

Movses öz tərəfdarlarını toplayıb əmr etdi ki, Xalkedon qurultayına tabe olan[237] bizanslılarla heç bir əlaqə saxlamasınlar,

çünki onların bütün əməlləri saxtadır və buna görə də onlardan heç nə - nə kitab, nə ikona nə də ki, qaxımış cəsəd qəbul edilməlidir.

Bu halda Teodoros da öz tərəfindən Ərzurumda,o tərəfdə olan erməni yepiskoplarını yığıb onlara dedi: " Biz gərək özümüzə katolikos seçək!" Onlar da İohan adlı birisini dəvət edib, onu katolikos seçib, Xalkedon qərarlarına tabe oldular. [238] Xoşbəxt Enosdan baçqa heç kəs qriqoryanlığa inam gətirmədi. Enos onlardan ayrılıb katolikos Movsesin yanına gəlir və sevinclə qarşılanır.

Movsesin katolikos kürsüsü isə Dəbil şəhərində idi. Bizans ermənilәri isə İohanın katolikosluq kürsüsünü də Dəbilin yaxınlığında Avanda yerləşdirdilər. Hər iki katolikosluq arasında daim münaqişələr baş verirdi, çünki Movses İohanın təyinatlarını tanımaq istəmirdi, İohan da Movsesin.

Bu əhvalatdan sonra İesu adlı keşiş və onunla birlikdə Movsesin tərəfdarları olan Faddey və Qriqor Dəbildən çıxıb getdilər və Sotk vilayətinə gəlib bir sovməəyə girib tərki – dünya oldular. Burada onlar vaizliyə başladılar: " Kilsələrdə olan ikonaları sındıran və dünyəvi işlərlə məşğul olan keşişlərlə təmasda olmayın", - deyirdilər.

Bu vilayətdə toqquşmalar başlandı və bu haqda xəbərlər Movsesə çatdı. O da onlara yazdı ki, ikisi də dərhal qayıtsın.Lakin onlar bu əmrə tabe olmayıb qaldıqları yeri tərk edib sizin tərəfə getdilər və indi qaldıqları yer Arsax vilayəti oldu.

Movses agah adamlardan bu iki nəfərin işlərindən soruşdu,

onlar da cavab verdilər ki, bunun səbəbi bizanslıların yanılmalarındadır. Bundan sonra onlar bir məktub yazdılar və tələb etdilər ki, kilsələrdə olan ikonaları heç kəs xarab etməsin.[239]

Katolikos Movsesin ölümündən, Xosrov şahın Erməniyyənin yenidən fəthindən və ölkənin birləşməsindən sonra onlar katolikos kürsüsündə doğruçu və layiq adamı, Abrahamı oturtdular. O, bundan əvvəl Xalkedon qurultayını lənətləndirdi və yalnız bundan sonra katolikos seçildi. Lakin ikonalara sitayiş etməyə zidd olanlar Albaniyada qalaraq sizin ölkənizə fitnə saldılar. Belə vəziyyətdə Girdıman sahibi məktubda adı çəkilən bu üç nəfəri tutdurub zəncirlədi və əmr etdi ki, onları Erməniyyəyə qaytarsınlar. Onları mənim qabağıma gətirəndə biz soruşduq: “ Hansı səbəbə görə siz əsl Allahı saymırsınız?” Onlar cavab verdilər: “ O səbəbə görə ki, bu haqda ehkamlarda heç bir şey deyilməyib, bu isə cürbəcür törədilmişlərə ibadət edən bütpərəstlərə aid olan məsələlərdir. Biz ikonalara ona görə ibadət etmirik ki, Müqəddəs Kitabda onlardan söhbət getmir”.

Onda biz Musanın məbədinə olan divar naxışları və Süleymanın kilsəsində olan heykəlləri onların yadına saldıq və dedik ki, biz də öz kilsələrimizi onlar kimi bəzəyirik.

Bütün bunları və çoxlu başqa şeyləri onlara dedikdən sonra biz onların səhvlərini düzəltdik.

# QIRX SƏKKİZİNCİ FƏSİL

## Qüds şəhərində tikilmiş kilsələrin və sayı barəsində sən burada həqiqi məlumat taparsan

Qayanın içində yonulmuş bir yarım qucaq ölçüdə bizim Xilaskarımız İsanın[1] tabutu həyatverici qəbrin üstündəki günbəzlərdən ortadakının mərkəzindən bir qədər yanadır. Hündürlüyü yüz dirsək və eni yüz dirsək olan kilsə sütunlar üstə olan günbəzlə örtülür. Cəmisi on iki sütun yuxarıda və on iki sütun aşağıdadır. Yuxarı təbəqədə İsanın nizəsi, süngəri və qızılla işlənmiş camı yerləşir. “ Xaçın əldə edilməsi” sovməəsi adlanan əsas kilsə “Dirilmə” kilsəsindən iyirmi dirsəklik məsafədə yerləşir və onun yuxarısında və aşağısında altmış beş sütunu vardır.

Adəm məqbərəsi adlanan müqəddəs Cülcül kilsəsi Dirilmə kilsəsindən on addımlıqdadır. Onun üstündəki səcdəgahdır ki, o da üzərində İsanın çarmıxa çəkildiyi qayadır.

Müqəddəs Sihyon kilsəsi Dirilmə kilsəsindən iki yüz dirsək məsafədədir. Onun uzunluğu yüz dirsək və enliyi yetmiş dirsəkdir. Üstü səksən sütunlu tağla örtülüb. Onun üst təbəqəsi yoxdur və o tirlərlə örtülüb. Tavanından həyarverənin ( İsanın) başına qoyulan tikanlı çələng asılıb. Sağ tərəfdən kilsənin kiçik şam otağı və Xilaskarın gizli şamını təsvir edən naxışlı taxta günbəzi var. Oradaca, Sihyonun yuxarı təbəqəsində şam masası durur ki, indi onun üzərində ibadət keçirilir. Müqəddəs Sihyon İsanı mühakimə edən “Qavvata” adlı Pilatın məhkəməsindən sağdadır və orada bu günə

[1] Bax: İncil. Matfeydən, XXVII, 60.

kimi üstündə İsanın ayaq izləri qalan daş var ki, onun üstündə İsa Pilatın qabağında durmuşdu. Bundan aşağıda ləyən var ki, onun içində İsa öz şagirdlərinin ayaqlarını yuyurdu. Sihyondan solda Rəbbimiz İsa salındığı zindan var. Oradaca bir səcdəgah var ki, üstündə ibadət keçirilir.

Şəhərin kənarında bir yer var ki, orada bir yəhudi müqəddəs Bakirənin tabutundan tutub onu basdırmağa qoymurdu. Orada dörd mərmər sütun üzərində günbəz tikilib və onların üstündə bürünc xaçlar var. Oradan Hefsiman dərəsində olan Bakirənin müqəddəs qəbrinə iki yüz əlli daş pilləkən qurulub. Yenə oradan İsanın üstündən səmalara yüksələn Eleon dağının zirvəsinə səkkiz yüz daş pilləkən aparır.

Səmalara yüksəldiyi yerdə də, Dirilmə kilsəsində olduğu kimi uzunluöu yüz dirsək və eni yüz dirsək gözəl günbəzvari tikinti qurulub. Oradan Urdun çay, Hor və bir çox vilayət görünür.

Beyt Lahm kilsəsi Dirilmə kilsəsindən iki yüz iyirmi fərsənglik məsafədədir. Kilsənin ölçüləri belədir: uzunluğu iki yüz dirsək, eni də yüz dirsəkdir. Onun doxsan mərmər sütunu və daş qübbəsi var. Oradaca İbrahim dəfni üçün aldığı ikiqat mağara var. Onun aşağısında müqəddəs mağara və axur var, orada da ibadət keçirilir.

Kilsədən sağda sovməə var Onun içində çar İrod[240] tərəfindən öldürülmüş körpələrin sümükləri var.

Beyt Lahmdan altı yüz metrlikdə Urdun çayından şərqdə,

meşəlikdə iki kilsə var. Bunlarda da ibadət mərasimi keçirilir.

Urdun çayı ki, onun sularında xilaskarımızın xaçı suya salınıb, Qüds şəhərindən şərqdə olub ondan beş fərsəng aralıdır. Orada qoşaçatılı damı olan xaçvari şəkildə kilsə tikilib. Onun içində üç səcdəgah var ki, burada ibadət keçirilir.

Eleon dağı Qüdsdən şərqdədir.

# QIRX DOQQUZUNCU FƏSİL

## Albanlar tərəfindən Qüds şəhərində tikilən monastırların ( vənglərin) adları. Bu məlumatı biz Xoşbəxt Anastasiusun Bəhram Mamikonyana yazdığı məktubundan öyrənmişik.

Zeytun ( Eleon) dağının şərq tərəfində yerləşən Pand vəngini Albaniyalı Panon adlı bir rahib tikmişdir.[241] İndi oranı Albaniyalı Petros adlı bir keşiş dolandırır.

Qırx şəhidə həsr edilmiş Mruv vəngi birincinin yaxınlığındadır. İndi vəng ərəblərin əlindədir.

Həzrət Davudun bürcü yanında olan Müqəddəs İsa anasının adına tikilmiş Bərdə vəngi. İndi vəngi Şamxordan olan Məryəm adlı bir qadın saxlayır. Vəngin yarısı ərəblərin əlindədir.

Elə o tərəfdə Klankatuk  vəngi. İndi onun yarısı Əbülkami adlı birisinin, biri də - Zərişadlı İbrahim oğlu Teodoros adlı xaçpərəst

ərəbin əlindədir. Digər yarısı bir kinli ərəbdədir.

İsa anasının (Məryəmin) adına tikilmiş Arsax vəngi Müqəddəs Stefanın vəngindən cənubdadır. İndi tamamilə ərəblərin əlindədir.

Müqəddəs Qriqorun adına tikilmiş Amaras vəngi. İndi onu Qriqorik adlı bir qadın saxlayır, yarısı da bir ərəbin əlindədir.

Ərəblərin əlində olan üç başqa alban vənglərinin adları məlum deyil. Bazar tərəfdə olan Araveank vəngin yanında bir vəng də var. O da ərəblərin əlindədir.

Qüds şəhərinin baş keşişləri paxıllıqlarına görə albanlarla ermənilərə öz vənglərinə yardım etməyi qadağan edirdilər, baxmayaraq ki, onların sayı yüzdən yuxarı idi. Erməni knyazları bunun üçün Bizans imperatoru Yustiana yeddi kendinar (talant), yəni yetmiş min daheqan verib bütün vəngləri Qüds keşişlərinin zorakılığından xilas etdilər. Lakin sonralar bizim qayğımızın olmaması nəticəsində bütün vənglərimiz xaraba qaldı.

Albanlar tarixinin İkinci kitabı burada bitdi.

# Ü Ç Ü N C Ü K İ T A B

## BİRİNCİ FƏSİL

### Albaniya katolikosu mənsəbinə qalxmış Bakur adlı birisi haqqında

Albaniya katolikosu müqəddəs Yeliazarın[1] vəfatından sonra, vaxtilə Girdıman yepiskopu olmuş, Xalkedon diofizit təriqətinə mənsub olan Nerses adlanan Bakur Albaniya knyazı Varaz – Tiridatın arvadı, həmin təriqətin tərəfdarı olan Albaniya çariçası Sparama ilə gizli razılaşmaya gəlib hökmranlıq şöhrətpərəstliyi naminə onunla belə qərara gəldi: “Əgər sən məni Albaniya katolikosluğuna seçdirsən, mən bütün Albaniyaya Xalkedon təriqətini qəbul etdirərəm”.

Ona qulaq asıb zərərli təriqətin tərəfdarı olan bu qadın Albaniya yepiskopları və əyanlarını dilə tutdu və onların hamısını onun xahişində heç bir xəyanət görməyərək dediyinə razı oldular. Yalniz Müqəddəs Ruhla təlqin edilmiş Böyük Arranın yepiskopu İovel böyük məclisə toplanmış yepiskopların hüzurunda Nersesdən tələb etdi ki, o, möhürü ilə təsdiq edilmiş Xalkedon qurultayını və papaz Levi lənət edən fərmanını[2] təqdim etsin. Şərq ölkəsinin

məclisi kilsə qanunu əsasında bu fərmanı alıb Nersesi bir səslə Albaniya müqəddəs kürsüsünə layiq gördü.[3] Yepiskop İovel isə bu lənətlə dolu fərmanı götürüb özündə saxlayırdı. Bundan sonra o, on dörd il yaşadı və sonra da öldü.[4]

Bundan sonra Nerses vaxtı münasib sayaraq öz niyyətini həyata keçirmək üçün Böyük Arran vilayətinə gedib, orada özünə vəng keşişi Zəkəriyanın simasında həmfikir tapır.Ona yepiskopluğu vəd edərək ondan öz fərmanını istədi. Zəkəriya da Nersesin məclisə verdiyi fərmanını ona qaytardı. Nerses də fərmanı yandırıb Zəkəriyanı Böyük Arrana yepiskop təyin etdi.

Zəkəriyanın simasında özünə dosy taparaq , çoxdan bəri gizlətdiyi məsləkinə qayıtdı. Onun tərəfdarı olan Məlikə Sparama Nersesə yardım etdi, onun və onun tərəfini saxlayan əyanların köməyilə o, kilsələrin çoxunun, səcdəgahlarının sökdürdü. O, kilsənin Xalkedon qərarlarına zidd olan keşişləri təqib edib ölkədən qovurdu. Hamıdan qabaq isə xəzərlərin və hunların çoxunu xaçpərəstliyə döndərən Böyük Kolmankın ecazkar yepiskopu İsraili və onunla birlikdə Girdımanın yepiskopu Yeliazarı qovdurdu.

Lakin bəzi yepiskoplar onun əleyhinə oldu. Bunların arasında Qəbələini yepiskopu Yovhannes, Amarasın yepiskopu Simeon və öz əyanları ilə birlikdə Albaniyanın böyük knyazı Şero[5] var idi. Onların hamısı keşişlərin əksəriyyətilə kilsə qurultayını çağırıb orada Nersesi və onun küfr saçan yoldaşlarını lənətlədilər.

# İKİNCİ FƏSİL

## Albaniya kilsə qurultayının erməni katolikosu İlyaya[6] məktubu

"Erməni katolikosu İlyaya Albaniyanın kilsə qurultayından ehtiram!

Atalarımız sizin atalarla birlikdə öz canlarının xilası haqqında düşünərək bir mənsəbə bağlı idilər. Bizim ölkəmiz son vaxtlaradək bütün kainatı zay edən murdar Xalkedon küfründən kənar idi. Allah - təalın dözümünə görə bu küfr hər tərəfə yayıldı.

İndi, bizim həmişə xeyirxah keşiş saydığımız Nerses canavara dönüb İsanın şüurlu dindarlarını parçalamağa başladı. Buna görə biz sən, zati – müqəddəsə xəbər göndəririk ki, sən buyurub bizə gələsən və bizim yaramızı sağaldasan. Allah adı ilə salamat qal!"

# ÜÇÜNCÜ FƏSİL

## Erməni katolikosu İlyanın əmirəlmöminin Əbdülməlikə söylənilən barədə məktubu

“Dünya fatehi əmirəlmöminin Abdulla Əbdülməlikə erməni katolikosu İlyadan.

Hakimi – mütləq Allahın hökmü ilə bizim ölkə itaətlə sizin hakimiyyətininizə tabedir. Biz və Albanlar vahid İsa dininə etiqad edirik. Bərdə taxtında oturan indiki Albaniya katolikosu Bizans imperatoru ilə sazişə girib, öz ibadətlərində onun adını çəkir və ölkəni məcbur edir ki, hamı dini etiqadda ona qoşulsun.

İndi qoy bu sizə məlum olsun ki, bu məsələni diqqətinizdən kənar etməyiniz, çünki bu bədəfkarlıqda onun bir əyan kimi qadın həmfikiri də vardır. Böyük hökmdar, siz öz hökmünüzlə əmr buyurun ki, onlar Allaha qarşı işlədikləri günahlarına görə müstəhəqq olduqları cəzaya çatsınlar”.

# DÖRDÜNCÜ FƏSİL

## Əmirəlmöminin Əbdülməlikin erməni katolikosu İlyanın məktubuna cavabı

“ Ey Allah xadimi, ermənilərin katolikosu İlya! Sənin səmimi məktubunu oxudum və sənin yanına öz sədaqətli nökərimi böyük qoşunla birlikdə göndərirəm. Əmr etdik ki, bizim hökmranlığımıza qarşı qiyam edən albanlar arasında sizin dininizə uyğun dəyişiklik edilsin. Bizim hökmümüzü nökərimiz Bərdədə, sənin gözünün qabağında icra edəcəkdir. O, Nersesi və bədəfkarlıqda onunla həmfikir olan qadını zəncirləyib sarayıma gətirəcək və onlar elə mühakimə ediləcəklər ki, bütün qiyamçılara nümunə olsun”.

# BEŞİNCİ FƏSİL

## Erməni katolikosu İlyanın Bərdəyə gəlməsi və Nersesin cəzalandırılması. Albaniya kilsə qurultayı. Onun yerinə baş dyakon Simeonu seçir

Erməni katolikosu yola düşüb Albaniyanın paytaxtı böyük Bərdə şəhərinə gəlir. O, baş kilsədə oturub əmr etdi ki, Nersesi onun yanına gətirsinlər. Lakin Nerses gizləndiyi üçün onu tapa bilmirdilər. Belə vəziyyətdə Albaniyanın mömin knyazı Şero onun yaxın məsləkdaşlarını tutub onlardan tələb etdi ki, Nersesi onun hüzuruna gətirsinlər. Bu murdarı geniş məhkəməyə gətirib İlyanın qabağında dayandırdılar. Özünə bəraət qazandıra bilmədiyi üçün onu ağır işgəncələrə saldılar. Bundan sonra onu Sparama ilə ayaq – ayağa zəncirləyib uzaq qərib ölkəyə göndərməyə hazırladılar. Lakin o,

səkkiz gün heç bir şey yemədiyi üçün vəfat etdi. Ölüm ərəfəsində o xahiş etdi ki, onu zəncirli basdırsınlar. O, özüylə məlikə Sparamanın bədbəxtliyinin səbəbkarı olan knyaz Şeronu lənətləndirdi, çünki hesab edirdi ki, bütün bunlar Şero ilə Sparamanın arasında hakimiyyət uğrunda əmələ gəlmiş mübarizənin nəticəsidir.[8]

Nerses katolikos kürsüsünü paklıqda on dörd il yarım tutmuş, mürtəd kimi də üç il yarım katolikos olub və bu vaxt o, son anlarda gələn şeytana bənzəyirdi.

Bütün bu işlər düzələndən sonra həmən kilsə qurultayında katolikosluğa xeyirxah və müqəddəs bir ər olan Simeon seçilmişdi. O. ölkəni Nersesin törətdiyi iğtişaşlardan qurtarıb azmış kilsəyə həqiqi dinə aid çoxlu qaydalar vəsiyyət etdi. O, bədbəxt Nersesin bütün küfrlə dolu əsərlərini sandıqlara qoyub öz yay iqamətgahı Bərdəkür yaxınlığında Tərtər çayına atdırdı.

Simeon katolikos kürsüsünü il yarım tutmuşdu.[9]

# ALTINCI FƏSİL

## Alban və erməni kilsələrinin birliyi və möhkəm ittifaqı naminə erməni katolikosu İlyanın Alban kilsə qurultayının iştirakçılarından tələb etdiyi imzalar

“Səxavətdən zəhləsi gedən və insan nəslinin xilas olunmasının düşməni olan İblis, çoxlu və istədiyi şeylərdə sadəlövh

adamları öz tələsinə salaraq kilsə övladları ilə mübarizədə və seçkin adamların azdırılmasında bütün qərəzli niyyətlərini öz anadangəlmə təbiətinə uyğun yerinə yetirir və bu barədə havari belə deyib:" Düşmənimiz iblis nərə çəkən şir kimi gəzib, udmaq üçün adam axtarır".[1]

Allaha üsyan edənin şəri bizi əzəldən həyat ağacından və Cənnətin xoş zövqündən uzaq salıb, çünki əvvəldən günaha batan İblis indi də axmaq, iradəsiz, sadəlövh və zəmanənin təsiri altında beyinlərinə pozğunluq xalı düşən adamları yoldan edir ki, onların üzərində İsa şöhrətinin nuru heç vaxt parıldamasın.

İblisin amansızcasına aldatdığı və azıb bütlərə ibadət etdirdiyi insanları itirdiyi üçün indi həmən şeyi ağılsız adamların əliylə edib Allah kilsəsini yeni moizələr və natəmiz vasitələrlə parçalayıb əmanətlə birlikdə faizini də almaq istəyir.

Elə buna görə Müqəddəs Ruhun iltifatı sayəsində Albaniyanın dini rəhbərliyinə seçilmiş, sonralar hiylə yolu ilə mürtəd olub canlarımızı yoldan çıxaran təkəbbürlü Nersesin fəaliyyəti nəticəsində Nestorun və Maksimin şərli küfrünün acı kökü meydana gəldi. O, öz dəyərsiz əlləriylə havarilərin risalələrini təbliğ edən və onları öz təmiz əlləriylə kilsələrimizdə təsdiq edən atalarımızın xilasedici vəsiyyətlərini dağıdıb xaçpərəst dininin qeyrətli yepiskoplarını qovdururdu. Bəziləri barəsində böhtan yayıb başqa ölkələrə qaçırır, bəzilərini isə dərdə salıb, qan uddururdu, gözəl

[1]İncil. Havari Pyotrun Birinci risaləsi, V, 8.

yepiskopluqları xarabaya çevirib tərki – dünya zahidlərin yaşayışını pozdururdu. Beləliklə o, İsanın müqəddəs cisminin pərəstişkarlarını pərən – pərən saldı.Onun hiyləsi ilə bütün Sihyon oğulları karıxıb aldanmışlat. İyeremiya oxşamasında deyildiyi kimi: “ Könlümüzün sevinci sona yetdi, elliklə oxuduğumuz mahnılar şikayətlərə döndü”,[1] müqəddəsliyimizin məbədi murdar edildi.

Lakin gəlin indi Xilaskar Allahı tərənnüm və Ona şükür edək ki, o, insanlar düşməninə tamamilə müvafiq olmasına mane oldu və zəifliyimizi görərək mərhəmətlə oldu və xalqımıza yazığı gələrək səni, ey ermənilərin katolikosu müqəddəs Qriqorun kürsüsündə əyləşən İlya və səninlə birlikdə Xorxorunik yepiskopu Simeonu, Amatunik yepiskopu Sarkisi, Rotok yepiskopu Sarkisi və keşiş Yovhanesi bizə göndərdi. Sən öz məsləkdaşlarınla bizim paytaxtımız Bərdəyə gəlib aramızda olan şəri xaric etdin. Ata – babalarımızın ənənələrinə uyğun olaraq, siz bizim katolikosluq taxtımıza müqəddəs ərin sayəsində yeni həyat verdiniz və biz hamımız bunun şahidiyik. Buna görə də biz hamımız – Albaniyananın katolikosu Simeon, Qəbələnin yepiskopu Yovhan, Hoşun yepiskopu Simeon, Amarasın yepiskopu Sahaq. Nersmehr vənginin özlərini küfrdən saxlayan zahidləri ilə birlikdə təsərrüfat müdiri Kşik, Givt vənginin keşişi, Katar vənginin keşişi, müqəddəs Yusif vənginin keşişi, Kalankatuk vənginin rahibi Davud, Tuqrakert vənginin rahibi Pyotr,Alakob vənginin rahibi Poğos və həmçinin İsasevən Albaniyanın knyazı

[1] İncil. İyeremiyanın oxşaması, V, 15.

Şero, Albaniyanın sipəhsaları Cavaqoy, knyaz Vardan və onun qardaşı Qaqik, Bab –e Qrahateyan, Vahtanq –e Varazmaneyan, çar nəslindən olan Batrik –e Karoyan, Vahan –e Varaz –Yohaneyan, Teodoros Anastaseyan, Rostom –e Varazkoyeyan, çar nəslindən olan Zərmehr –e Varaz Kürdəkeyan, Məhəmməd –e Şeroyan[10] və bütün bu ölkənin əyanları yekdilliklə, yepiskop və əhali ilə birlikdə əzəldən müqəddəs Yelisey tərəfindən əsası qoyulmuş, sonralar da müqəddəs Qriqori tərəfindən təsdiq edilmiş indiyə qədər qüsursuz olan dinimizi təsdiq edirik.

İndi isə biz bütün əvvəlki və sonrakı dönükləri və aralarında olan Yevnomiusu və onun müəllimi Ariya, Valentinusu, Apollinariusu, Diodorusu, Manini, Markianı, Yevtixini, Nestoru, Teodrou, Xalkedon qurultayını, papaz Levin risaləsini,Maksimi və onun şagirdlərini lənətləndiririk. Bunlarla birlikdə diofizit təliminin davamçısı olan bizim bədbəxt Nersesi və onun ardıcıllarını lənətləndiririk. Biz bu qaydanı Allah qabağında və sənin hüzurunda təsis edirik ki, gələcəkdə heç kəs bizim atalarımızın qoyduqları ənənələrdən uzaqlaşmasın. Əgər gələcəkdə bi9zim dinimizə hansı bir xələl gətirən adam meydana çıxarsa, qoy onda müqəddəs Üç Uqnumum və bizim camaatımızın lənətinə məruz qalıb, Müqəddəs Ruhun mərhəmətindən məhrum olsun və heç vaxt ona Cənnət əbədiyyəti nəsib olmasın.

Həmçinin bizim katolikosların seçilməsi haqqında. Əvvəllər bu təyinat Qüds şəhərindən gəlirdi və belə hal müqəddəs Qriqorinin

vaxtına qədər davam edirdi. Bunsan sonra bu günə qədər katolikosu öz yepiskoplarımız seçirlər. İndi isə bu seçkinin naşılıqla və etinasızlıqla keçirilməsi üzündən bizim ölkəmiz təfriqata məruz qalır, biz Allah qabağında və sənin hüzurunda belə qərara gəldik ki, Albaniyanın katolikosu müqəddəs Qriqorinin kürsüsü tərəfindən seçiləndə bizim ölkənin razılığı olmalıdır. Erməni katolikosluğuna seçilmə qaydası isə Albaniya katolikosluq kürsüsünün sərfəsi olmalıdır, çünki Albaniya kürsüsü siz ermənilərin kürsüsündən daha uca və yaşlıdır.[11]

Qoy heç kəs bu qaydanın şərtlərinin əleyhinə çıxmağa cəsarət etməsin. Əgər kimsə bunu etsə, bu seçilmə qanunsuz olub, hər iki tərəfin katolikos seçkiləri etibarsız hesab olunacaqdır. O kəslər ki, bu qanunun qaydalarına Allahdan qorxub tabe olacaqlar, onlar müqəddəs Üç Uqnumun və Allahın bütün xaçpərəst bəndələrinin xeyir – duasını qazanacaqlar. Şayət, kimsə buna zidd olub həqiqəti pozarsa, o, kimliyinə baxmayaraq. Allah hüzurunda cavabdeh olacaqdır.

Bu sənəd hər iki tərəfin razılığı və Allahın vasitəçiliyi naminə ərəblərin səksən beşinci və ermənilərin yüz qırx səkkizinci ilinin *İrodis* ayında tərtib olunub, yuxarıda adları çəkilənlərin arzuları ilə möhürləriylə təsdiq olunmuşdur”.[12]

# YEDDİNCİ FƏSİL

## Erməni katolikosu İlyanın albanlara göndərdiyi razılaşmanın məzmunu

“Küfrlü Nerses din məsələsində Albaniyada həddindən artıq qarışıqlıq saldı və adamların bir çoxunu Xalkedon küfrü ilə xəstələndirib bununla yepiskop, keşiş və rahibləri özünün namərd şərinin təhlükəsinə məruz qoydu. Bundan xəbər tutaraq, mən, erməni katolikosu İlya, öz yepiskoplarımla birlikdə Albaniyanıpn və sizin məşhur şəhəriniz olan Bərdəyə gəldik. Yanıma dini və dünyəvi rəislər gəlib mənə bir məktub göstərdilər ki, onun əsasında Nersesi lənətləndirib Albaniya katolikosluğundan kənar etdilər. Buna baxmayaraq o, katolikos kürsüsünü istibdadla saxlamaqda qalırdı. İndi yepiskoplar və bütün kilsə xadimləri onu yenidən yazılı surətdə lənətləndirib bunu öz möhürləriylə təsdiq etdilər. Onlar qərara gəldilər ki, Allahın köməyilə mənimlə birlikdə ata – babalarının dini üstündə möhkəm dayanıb murdar Xalkedon küfrünün tərəfdarları və Nersesin şərli təlimilə heç bir əlaqədə olmayacaqlar.

Əgər onlar bu şərtlərin və müqəddəs ataların vəsiyyətlərinin üstündə dursalar, onda onları qəbul edib öz dini müəllimlərimiz kimi sevin. Lakin bunlardan biri, istər katolikos olsun, istərsə də yepiskop, bu şərtləri pozarsa, onda onun sizin üzərinizdə heç bir haqqı yoxdur. Siz hər gün öz kilsələrinizdə olub daima Allaha dua etməlisiniz. Qoy sizi Allah və mömin müəllimlər idarə etsinlər. Sizin sakitliyiniz üçün mən bu razılaşmanı müqəddəs keşişlərə - Nersmehr vənginin təsərrüfat müdiri Kşika və Yusif vənginin keşişi Qriqora verdim.

Mən, erməni katolikosu İlya, mənim yepiskoplarımla birlikdə Albaniya dini qurultayı iştirakçılarından ittifaq haq1qında imzalar toplayıb bu razılaşmanı sizə verdim ki, heç kəs onun şərtlərini poza bilməsin. Hər iki sənədi öz möhürümlə təsdiq edib onları şəxsən Kşika verdim ki, o, Nersmehr vəngində saxlasın".

# SƏKKİZİNCİ FƏSİL

## Əmirəlmöminin Əbdülməlikin xadiminin Albaniya knyazlarının rütbələri əsasında düzəltdiyi siyahı. Bu siyahı xəlifə divanına verilir

Bərdə kilsə qurultayından tələb etdik ki, bizə müqəddəs din barəsində bəyannamə versinlər və orada yazılı surətdə həqiqətlə diofizitlərin yalanı arasında fərqi və müdrik əllamələrin etirazlarını görə bilək. Biz hər şeyi dürüst bildik. Birinci mən, Albaniya knyazı Şero, sonra Albaniyanın baş sipəhsaları cavanko sonra çar nəslindən olan Vardan və onun qardaşı Qavik[13], Vahtanq –e Varazmaneyan (onların cədləri Mehranilər soyundan olan Vardan Kaç idi. Albaniya çarı Vaçaqanın dövründə o, Aquen kilsə qurultayında sədrlik edirdi. O. Girdımana köçmüşdü); sonra çar nəslindən olan Patrik –s Karoyan. Bu da həmən çar Vaçaqanın icazəsiylə Ağbəd vilayətinə köçmüşdü. Bu kitabın lazımi yerlərində adları çəkilən Cəsur Vaçaqan

və Vaçe onun cədləri idilər;[14] Köçüb Qəbələdə və Koqtda məskun olan Atropatena knyazlarından Bab-e Hrateyan, İran Mədainindən Kambeçana köçən Yaqubilər məzhəbinə mənsub olan Vahan –e Varaz – Yohaneyan; İranın İstəhr vilayətindən Uti vilayətinin Kalankatuk kəndinə köçən Rustam –e Varazköyan; Dəyləmdə yaşayan, sonra oranı tərk edib Albaniyada çarın bəxş etdiyi torpaqlarda yaşayan Dəyləm hakiminin oğulları Zərmehr –e Varaz-Kürdəkeyan və Məhəmməd –e Şiruyan.

Bütün bu adamlar əmirəlmöminin Əbdülməlikin divanına verilən siyahıda yazılmışdır və əgər onlardan kimsə İsanın iki təbiətinə ibadət edərlərsə. Onlar əsir alınıb qılıncdan keçiriləcəklər.

Beləliklə, Albaniyanın bütün kilsələrində əmin – amanlıq yarandı.

# DOQQUZUNCU FƏSİL

## Nersesi devirəndən sonra Albaniya katolikosu Simeonun təsbit edilmiş qanunları

“Bu qanunlar[15] Albaniya katolikosu Simeon katolikosluq kürsüsünə oturandan sonra kilsə qanunlarını pozan Nersesin ittihamı üçün çağırılmış kilsə qurultayında təsdiq edilmişlər, bu da həqiqi din yoluna qayıtmaq zərurətindən doğmuşdu.

Xilaskar, insansevər və qüdrətli Allahın Öz mərhəməti və

böyük məhəbbəti sayəsində bizə rəhmi gəlib bizi dindarlarımız və müqəddəs və havari köklü Alban kilsəsinə nəzarətçi və rəhbər təyin etdi. Bu ilahi və böyük şərəf bizim yaxşılıq etməyimizə və ya ləyaqətimizə görə yox, yalnız Onun böyük mərhəməti sayəsində bizə nəsib oldu. O, belə buyurdu və belə Öz mərhəmətini göstərdi. İsa adından müqəddəs Havari dediyi kimi, " Beləliklə, özünüzə və üzərinizə sizi Müqəddəs Ruh nəzarətçi qoyduğu bütün dindarlar sürüsünə diqqət edin və Öz qanı bahasına Öz əllərinə aldığı Allahın kilsəsini otarın". [1] Bundan başqa Allah – təala Musaya keşişlər barəsində Öz vəsiyyətini buyuranda dedi: " Səni bütün Mənim xalqımın üzərinə başçı və nəzarətçi təyin edəcəyəm və sən Mənim sözümə qulaq asıb Mənim adımdan onları inandıracaqsan". Həmin qayda ilə Allah – təala bizə başqa havarilərin vasitəsilə xəbərdarlıq edir: " Mən qanunpozana "Ölümlə öləcəksən!" deyəndə, sən isə qanunpozanı, - yaşasın – deyə, onu onu qanunpozan yolundan çəkindirmək üçün inandırmazsansa, i vaxr həmin qanunpozan öz qanun pozmağında öləcək və Mən də onun qanını sənin əlindən tələb edəcəyəöm".[2]Allahdan bu cür qorxunc və vəlvələyə salan vəsiyyət almışıq. Bu vəsiyyətlə: " Günahları bağışlamaq və insanları günah buxovundan azad etmək üçün Mən sizə ixtiyar verdim". Bu ixtiyarı, namusu və havari kürsüsünü biz özü – özlüyümüzdə və güclə əldə etməmişi, Bunu Xaliq və hər şeyi Xəlq edən Allah buyurub bizi təyin etdi ki, Onun iradasilə bu yerdə onun sürüsünü otaraq.

---

[1] İncil. Havarilərin əməlləri, XX, 28.
[2] İncil. İyezekiilin kitabı, III, 17-18.

Buna görə, ey mənim sevimli və nəcib qardaşlarım, İsanın seçkin şagirdləri və onun vəsiyyətlərinin asi qulları bizim üçün şox vacib və lazımdır ki, bir Allaha Onun istədiyi ləzzətli meyvələri gətirək və havarilərə, yəni İsaya isnad edərək yaradaq, qızıl, gümüş və qiymətli qaş – daş, yəni hər cür yaxşılıq və xoş niyyətli işlər görək ki, Onun, Xilaskarımızın hüzuruna gəldiyimiz vaxt solmayan şöhrət çələnginə layiq olaq.

Beləliklə, Müqəddəs Ruhun bərəkəti və onun vəsiyyətləri ilə özümüzə yaxşılıq seçək və yamanlayan şəri rədd edən və peyğəmbərlər, havarilər və müəllimlər vasitəsilə bizə əmr edən Allahın mərhəmətilə biz ən əvvəl Allahı sevib Onun vəsiyyətlərinə əməl etməliyik.

Biz mömin və müqəddəs atalarımızdan aldığımıza  möhkəm və sarsılmaz olub bel bağlamalıyıq. Biz həmçinin müqəddəs kilsənin nizamlarına riayət etməli, pak keşiş və xadimlərin köməyilə kilsəni tərənnüm etməli, bir – birimizi, necə ki, özümüz – özümüzü sevməli və qanunlar əsasında dinc mənəvi həyat sürməliyik və nalayiq və hərbi adamlara kilsə hakimiyyətini ələ keçirmələrinə icazə verməməliyik.

Heç kəsin ixtiyarı yoxdur ki, kilsə üzərində hakimiyyəti bic və ya ziyankara, qatil və ya oğruya, yalançı və ya yalançı şahidə, əziyyət verənə və ya xəsisə,soyğunçuya və daha pis hərbçi atlılara və ya zalıma versin və belə adamlaran heç kəs nə çörək, nə də pay verməlidir. Çünki ilahi qanunlara əsasən xalqın öz günahlarından

xilas olmaq naminə Allah evinə gətirdiyi malı yalnız keşişlər xərcləyə bilərlər. Hər nə gətirilsə keşişlərindir, çünki onlar gecə - gündüz Allaha ibadət edib Ondan əmin – amanlığı, yer üzündə sülhü, günahların bağışlanmasını və canların və bədənlərin gümrahlığını istəyirlər. Nalayiq adamlar və hərbiçilər heç vaxt kilsə üzərində hakim ola bilməzlər, əks təqdirdə Allahın qəzəbi həm ölkəni , həm də sizin özünüzü tutar. Çünki Şərəfin Rəbib Musaya sovqat qablarını tapşıranda demişdi: “ Pak və təmiz keşişlərin Levinin nəslindən seç, lakin İsrailin başqa qəbiləsindən nə hərbçi, nə layiqsiz cinayətkarı, nə də ləkələnmiş adamı götürmə. Necə ki, Qanunlar tələb edir: “Qoy layiq olmayan Mənim səcdəgahımın önündə durub gətirilən payı yeməyə cəsarət etməsin”. [1] Həyasız keşişlər mirasdan kənar edilməlidir. Qara camaatdan heç kəs nə kilsə mərasiminə, nə dini ayinlərə, nə də ki, keşişlərin olduğu yerə yaxınlaşa bilməz. Əgər birisi bunlara yaxınlaşmağa cəsarət edərsə onda o, Korey, Dafan və Aviron kimi aralanmış yerin uçurumundan qərq olar.[2] Və ya rütubətli Allah xidmətinə çatmadıqları halda bunu etməyə cəsarət edən Oza[3] və çoxlu başqaları kimi cəzalandırılacaqlar. Axı sovqat qabları və keşişlər yeni və müqəddəs kilsənin xadimləri üçün nümunədir və nalayiq adamlar və ya hərbçilər bunlara yaxın gələ bilməzlər. Bu əmri Xilasedicinin əmrilə müqəddəs havarilər daha da möhkəmləndirdilər: “ Müqəddəs Ruha və bizə belə qərara gəlmək

---

[1]Bax: İncil. Xuruc, XXIX, 33; Əqram, I, 52; III, 5-10 və s.
[2] Bax: İncil. Əqram, XVI.
[3] Yenə orada. İkinci Çarlıq kitabı, VI, 3-8.

lazım gəlir: nə hərbçi , nə də nalayiq adam kilsəni özünə tabe etməyə cəsarət etməsin. Əgər kimsə cəsarət etsə, qoy o lənətdirilsin”.

Buna müqabil olaraq bizim müqəddəs atalarımız qərara gəldilər ki: “ Heç kəs Allah kilsəsini nalayiq adamların və ya hərbçilərin əlinə verməyə cəsarət etməsin və ya mal kimi sata bilsin və ya knyazlara və onları tərbiyə edənlərə bağışlasın. Məhz belə keşişlər də nəzir olan şeyi və ya çörəyi öz nalayiq qardaş və oğullarına verə bilməzlər, kilsə mirasını sata bilməzlər və əgər keşişlərin özləri, onların qardaşları və ya oğulları nalayiq olsalar, qoy onlar da mirasdan məhrum olsunlar. Yox, əgər kimsə buna cəsarət edərsə, onda qoy bu adam lənətə məruz qalsın”.

Allahdan və Onun vəsiyyətlərindən biz belə əmr almışıq və buna görə də Onun əleyhinə gedə bilmərik. Bu gün dünya əhli məhz bu, kilsəyə and vəsiyyətlərinə uyğun dolanır və öz şəxsi mülklərini (kəndlərini) satanda onlar qəbalərində göstərirlər ki, bu mülk kilsədən və kilsə torpağından ayrıdır. Allah kilsələri azad olub heç kimin hakimiyyətinə tabe deyil. Onlar yalnıpz yepiskoplara və onlardan sonra pak mömin və müqəddəs keşişlərə tabedir,nalayiq hərbçilərə yox. Gələcəkdə bu qanunu heç kəs poza bilməz, çünki kilsənin azadlığını nalayiqlərin əlinə vermək Allah vəsiyyətlərinin əleyhinə çəxmaq, canın və bədənin həlakı deməkdir.

Bu barədə mən çoxlu şikayətlər eşidirəm. Deyirlər ki, çox yerlərdə öz günahlı işlərinə görə heç kilsəyə daxil olmağa belə layiq olmayan hərbçilər nəinki kilsənin payını və çörəyini yeyirlər, hətta

Allah kilsələrini xadimlərilə birlikdə tamamilə özlərinə tabe ediblər. Belə bir hal barəsində mənə Nersmehr vənginin keşişi Allahsevənin ata Kşik yazır: Albaniya kntazı Varaz – Tiridatı öz canının xilası üçün keçiriləcək ibadətlərə görə Müqəddəs Ruh vənginə kiçik bir kənd bağışladı. İndi isə Pusan – Beh adlı bir hərbçi, pozğun bir adam bir kağız təqdim edib ki, guya Albaniyanın knyazı bu kilsəni bütün xadimlərilə birlikdə ona, özünün tərbiyəçisinə bağışlayıb.

Bu barədə, əziz qardaşlarım, deməliyəm ki, müqəddəs Ruhun buyruğu ilə Pusan – Beh bu kilsəyə sahib ola bilməz. Kilsə üzərində hakimiyyət yalnız təmiz və pak keşişlərin əlində olar bilər, Pusan – Behin isə bunun üçün nə Allahdan, nə də bizdən icazəsi yoxdur.

Beləliklə, mən, Allahın izniylə Albaniyanın katolikosu Semeon, Allahın vəsiyyətləri və qanunlarına uyğun əmr edirəm ki, kilsələri yalnız Allahdan ədalətli və mömin keşişləri idarə etsin, o keşişləri ki, murdar Nersesin küfrlərini qəbul etməyiblər. Hərbçilərə və başqa adamlara kilsə üzərində ağalıq etməyə icazə verilmir və bunların heç bir nəziri və payı güclə almağa ixtiyarları yoxdur. Kim buna cəsarət etsə Allah tərəfindən və bizim tərəfdən cəzasını alacaq. Və əgər kimsə Allah buyruğu və qanunlarına əsasən kilsə haqqında tərtib edilmiş sənəd yox, mülki və dünyəvi qanunlar əsasında yazılmış sənədləri təqdim edərsə, bu sənəd qeyri – qanuni olub etibarsızdır və heç kəs də onu qanuni hesab etməməlidir, çünki Allah – təala kilsənin qeydinə qalmağı hərbiçilərə və nalayiq adamlara yox, yepiskop və keşişlərə tapşırmışdır.

İndi də siz, mənim sevimli və müqəddəs kürsülərə sahib olan yepiskop qardaşlarım, bu Allahın qanunlarına hərəniz öz dairənizdə riayət edib Allah kilsəsinə əziyyət verməyə heç kəsə icazə verməyin və keşişlərin alçalmasına imkan verməyib və elə edin ki, Allah –təala bizimlə barışıb Öz mərhəmətiylə bizi bütün iztirablardan uzaq etsin. Zira Allah buyurub:"İncinizi donuzların qabağına atmayınvə müqəddəs şeyinizi itlərə verməyin".[1] Beləliklə, ən müqəddəs şeyə xidməti Allah ən təmiz keşişlərə tapşırır, nalayiq adamlara yox.

İndi mən hamınıza vəsiyyət edirəm: Allah vəsiyyətlərinə riayət edin və daim mərhəmətli Allaha şükür edin ki, diofizit və murdar Nersesdən intiqam aldı, aramızdan onun şərli təliminin köklərini yox etdi və kilsəmizdə dincliyin köklərini saldırdı. Buna görə kilsə ehtiyaclarının qayğısına qalın, çünki biz hamımız qiyamət günündə Onun hüzuruna gəlib, xalqın yerinə və özümüzün adından cavab verməliyik.Müqəddəs Ruh sizə kömək etsin! Amin!"

# ONUNCU FƏSİL

[1]İncil. Matfeydən, VII, 6.

## Albaniya knyazı Varaz – Tiridatdan vergilərin tələbi. O, bizanslıların yanına gedib öz oğullarını girov qoyub ölkəsinə qayıdır. Simeondan sonra Albaniya katolikosluq kürsüsünü Mikayıl tutur.

İran şahlığı tamamilə tənəzzülə uğradığından və Cənubi taciklər (ərəblər) qəbiləsinin qüvvətlənməsindən sonra, onun qoyduğu vergilər bütün dünya üçün[16], xüsusən Şərq ölkələri üçün çox ağır oldu. Knyaz Varaz – Tiridat vergini üç millətə verirdi – xəzərlərə, taciklərə (ərəblərə) və romalılara (bizanslılara).[17.] Lakin ən ağır boyunduruq romalılar tərəfindən idi, çünki Varaz – Tiridat üç oğlu ilə birlikdə imperator tərəfindən çar paytaxtı Konstantinopolda saxlanmışdı.

Knyaz oğullarını orada girov qoyub vətənə qayıtmaq istəyəndə xəstələndi və orada qaldı. Deyilənə görə, oranın ab – havası oraya yazda gələn xaricilər üçün zərəli olur. Xaricdən gələn adam o saat xəstələnir, onun saçı və saqqalı tökülürdü. Varaz – Tiridatın orada qalması uzandı. Elə oldu ki, günlərin bir günündə romalıların imperatoru öz daş – qaşlarını seçib ayıranda, yadına Albaniyanın knyazı düşdü və bu onu çağırtdırıb daşları ona göstərdi.O isə məqamdan istifadə edib dedi: “ Mənim evimdə bu daşlardan daha qiymətliləri var. Mən onları sənə bağışlayardım, çünki sən, ey Allahın seçkini, bunlara sahib olmağa daha layiqsən”.

Bu, Varaz – Tiridatın romalılar ölkəsində qaldığı beşinci ili idi[18] və həmin imperatora dediyi sözlərinə görə ondan xilas olub öz

ölkəsinə qayıtdı. Bundan sonra o, Şərq ölkəsini Taciklərə (ərəblərə) təslim edib vergiləri də yalnız onlara göndərirdi.

Həmin Varaz – Tiridatın hakimiyyəti dövründə Albaniyada dəhşətli aclıq oldu və adamlar bu haqda belə bir əfsanə qoşmuşlar:“Mən Şakaşen vilayətindəki Kaku çölündə gizlənmiş bir darıyam. Yanımdan bir çox müştəri keçirdi, amma mənə əhəmiyyət verməyib almaq istəmirdilər. İndi isə yaxşı günlər günlər gəldi, çünki padşahlıq mənim Aclıq adlı qardaşımdadır. İndi mən knyaz Varaz – Tiridatın və katolikos Yeliazarın[19] daim yemək masalarındayam. Məni yeyəni isə qan aparırdı. Onları təqsirləndirməyin!”

Albaniya knyazı Varaz – Tiridatın Qaqik və Vardan adlı oğulları əvvəl romalıların əlində girov saxlanırdılar, sonra isə imperator qəzəblənib onları on iki il həbsdə saxladı. Bunun səbəbi onda idi ki, ataları Şərq ölkəsini ərəblərə təslim etmişdi. Romalılar imperatoru Yustianın ölümündən sonra onun yerinə gələn erməni mənşəli Bardanes Filipikos[20] xatırladı ki, zülmətli zindanda qalanlar var. O əmr etdi ki, onları dözülməz əzablardan xilas etsinlər. Lakin onların gözləri zülmətdə o qədər ağır vəziyyətə düşmüşdü ki, onları işığa çox ehtiyatla çıxarırdılar. İmperator onlara hədiyyələr verib vətənlərinə göndərdi. Qaqika isə əlavə olaraq Kainatın məşəli olan həyatverici xaçın hissəciyini bağışladı. Vətənə qayıdan kimi Qaqik bu böyük hədiyyəni Albaniya katolikosu Mikayıla verdi və onun əmrilə albanlar Allah xaçını dikəltdilər. Onun üzərində belə bir yazı var idi: “ Rəbbimiz İsa, bu xaçın üstündə bizim xilas olmağımız

naminə könüllü çəkdiyin əziyyəti yadına sal! Səndən qorxanlara bu verdiyin xaçı qəbul et! Mənim, Albaniya katolikosu Mikayılın günahlarını bağışla, ölkəmiz Albaniyaya rəhmin gəlsin və bizi bütün məşəqqətlərdən xilas et ki, Sənin zühurun günündə biz Sənin sağ qolunda oturmağa layiq olaq. Bundan başqa dua edirəm ki, bəndən Qaqikin, onun bacısı Məryəmin və böyük zərgər Varazonun[21] günahları bağışlansın".

# ON BİRİNCİ FƏSİL

## Albaniya katolikosu Mikayıl yaxın qohhumların evlənməsinin qadağan edilməsi üçün qurultay çağırır

Albaniyanın katolikos kürsüsünü Simeondan sonra otuz beş il ərzində müqəddəs Mikayıl tutmuşdu. Onun katolikosluğunda Albaniya knyazları arasında yaxın qohumlar arasında evlənmə baş vermişdi: Varazmanın nəvəsi Vaxtanq oğlu Varazo həmin Varazmanın nəvəsi olan Vardanuhi ilə evləndi. Katolikos Mikayıl onları kilsədən uzaqlaşdıraraq dedi:"Bunu etməyə ixtiyarınız yoxdur, çünki hər ikiniz bir babanın nəvələrisiniz!"

Lakin Varazo öz xətərli niyyətinə nail olmaq üçün gürcülər katolikosu Taliyaya müraciət etdi və ondan bu nigaha xeyir – dua istədi. Və bu haqsız Talila belə qərara gəlir: "Əgər siz mənim məzhəbimdənsizsə, onda xoşbəxt olun. Lakin albanların adətlərinə

razısınızsa, onda özünüz bilərsiniz”.

Belə vəziyyətdə Albaniyanın katolikosu Mikayıl öz kilsəsinin qurultayını çağırır və məclisə ermənilərin məşhur olan Makenos vənginin keşişi Solomonu da dəvət edir. Hamılıqla Şamxorun Berd vəngində toplaşıb, onlar yekdilliklə Varazonun nəslini lənətləndirdilər. Elə həmin vaxt onun evinə ərəblər basqın edib bir oğlunu anasının qucağında parçaladılar, ikinci oğlunu isə mindiyi atın yəhərindən salıb ayaqları ilə öldürdülər.

Qurultay iştirakçıları gürcülər katolikosu Talilaya məktub göndərdilər: “ Nəyə görə sən, Antakiyada toplaşmış[22] və Samosatlı Paveli[23] kilsədən kənar etmiş müqəddəs havarilərin şagirdlərinin qəbul etdikləri qanunları pozursan? Axı onlar “ heç kəs özünə qohumlarından arvad almasın” adlı qanunu qəbul ediblər. Bu haqda müqəddəs Afanasinin[24] də “ bu evlənmə yox, pozğunluqdur” hökmü var. Yenə bu barədə müqəddəs Vasilinin[25] də fikri var. Buna görə də biz, burada din naminə toplaşanlar, səni bütün dönüklərlə birlikdə lənətləyib, ədalətli hakim İsanı isə tərənnüm edirik!”

# ON İKİNCİ FƏSİL

## Albaniya katolikosu Mikayılın – Zaxariyyanın dilinin tutulması, milad və xaçı suyasalma günü

**məsələlərində İsanın iki təbiətinə inananların (diofizitlərin) əleyhinə apardığı araşdırmalar**

Musa peyğəmbər İsrail oğulları üçün ilin yeddinci – tişrin ayında üç bayram təyin etmiş: ayın birində - Kərənay bayramı[1],ayın onunda – Təmizlənmə bayramı[2]və on beşində - Ağac budaqları[26] bayramı.[3] Zaxariyyanın dilinin tutulması həmin ayın on yeddisindən iyirmi ikisinə qədər çəkdi. Sonra o, öz evinə getdi və arvadı Yelizaveta hamilə olub, Lukanın dediyinə görə “ beş ay bunu gizlətdi”, “ altıncı ayda isə Cəbrayıl Allah adından bakirə Məryəmin yanına göndərilmişdir”[4].

İndi gəlin baxaq, hansı ay altıncı ola bilər? Təqvimə baxıb müəyyən etdik ki, *tişrin* ayının iyirmi ikisi Roma təqvimilə oktyabr ayının doqquzuna düşür. Bu ayın onundan başlayıb altı ay sayıb aprel ayının yeddisinə düşərik və bu da mələk dediyi kimi, “Yelizavetanın hamilə olmasının altıncı ayı idi”[5] Bakirə Məryəmin xəbərdar olması yəhudi *nisan* ayının on ikisinə düşür. Bu gündən yanvarın beşinədək 270 gün təşkil edir, bu da doqquz aydır. Bundan sonra da İsanın miladıdır.

Bu barədə müəllimlərimizin başqa fikirlərinə də malikik. Milad, Zühur və Xəbərdar olunma kilsə tərəfindən bir bayram kimi keçirilir, çünki bu vahid Allahın miladıdır və bu barədə

---

[1] İncil. Musanın üçüncü kitabı, XXIII, 24.
[2] Yenə orada, XXIII, 27.
[3] Yenə orada, XXIII, 34.
[4] Yenə orada, Lukadan, I, 24, 26.
[5] İncil. Havari İsayyanın kitabı, II, 3.

müəllimlərimizdən biri deyir:

“Kəlamın üç miladı var. Biri - ruhlanma vasitəsilə, ikincisi – təcəssüm və xaçaçuran, bu da birlikdə bir miladdır və üçüncüsü – canlanma vasitəsilədir”.

Nikeya kilsə qurultayında[27] iştirak edən Qüds şəhərinin yepiskopu Mark xaçaçuran haqqında ermənilərə belə vəsiyyət etmişdi: “Biz Miladı və Xaçaçuranı bir gündə bayram edirik”.

Və necə ki, ölümlə dəfn canlanmasız natamam olur, elə də Zəbur əvvəl çarmıxla dəfn haqqında bəhs edib, yalnız sonra Canlamadan söhbət açır. Bu barədə ilahiyyatçı belə deyir: “İndi Milad bayramıdır, çünki Allah miladıyla insan sifətində gəlib”

Kirillə qədər Qüdsdə qırx iki yepiskop var idi. Bunların hamısı və bunlardan sonrakılar ta yepiskop Yuvenaladək [28] Canlanma və Zühur bayramını yanvarın altısına keçirirdilər.İsanın Canlanmasından Yuvenaladək dörd yüz il keçir.

Davud və Yaqubun haqqında bəhsdə deyilir ki, başqa şəhərlərdə Milad günü dekabrın iyirmi beşində keçirilir. O, şəhərlərdə bunu xaçpərəstliyin sünnət olunmuş yəhudilərindən yox, bütpərəstlikdən dönmüş olması ilə izah edirlər. Bütpərəstlikdə onlar adəti üzrə günəşin doğmasını bu gündə bayram edirlər və buna görə də bu bayramdan imtina etmək istəmədilər. Buna görə də havarilər onlarla razı olub İsanın Miladını həmin günə təyin etdilər. O adamlar ki, xaçpərəstliyi sünnət olunandan sonra qəbul ediblər, onlar Miladı hər yerdə yanvarın yanvarın altısında keçirirlər.Bunu bizim

cədlərimizə belə çatdırıblar. İndi biz də bu günədək belə edirik, çünki İsaya bu haqda deyir: " Sihyondan qanun çıxar, Qüdsdən isə Allah kəlamı".[1]

# ON ÜÇÜNCÜ FƏSİL

## Ermənilərin üsyanı və Məhəmmədin Erməniyyəyə gəlməsi, Göyçənin (Sevanın) alınması və Məhəmmədin ölümü

Erməni təqviminin 146-cı ilində Məhəmməd Erməniyyəyə gəlir və sonra tələsik Albaniyanl keçib Çolaya daxil olur.[29] Ermənilər üsyan edib və Bizansdan köməklərinə gələn çoxlu qoşunla birlikdə ərəbləri Dəbildə mühasirəyə salıb, onlardan altımış iki min nəfər qırdılar.[30] Həmin ildə müqəddəs Qriqorinin nəsli kəsildi.[31]

Məhəmməd ibn Mərvan Çoladan qayıtdı və üç il ərzində su ilə əhatə olunmuş adada yerləşən Sevan qalasını mühasirə etdi və nəhayət, onu aldı və orada kimə rast gəldisə, hamını qılıncdan keçirtdi. Oradan Erməniyyəyə keçib o, Bizans və erməni qoşunlarını məğlub etdi. Əsir edə bilmədiyi bütün erməni başçılarını ciddi andlarla başdan çıxartdı, yalan və xəyanətlə onları bir yerə topladı. Onları Naxçıvana gətirərək o, 800 nəfəri kilsədə bağlatdırdı və diri – diri yandırdı. Bu yolla da o, 400 başqa nəfəri Baş kilsədə yandırdı, qalanını isə qılıncdan keçirtdi.[32] Bunların tələf olmasının səbəbi onda

---

[1]Yenə orada, I, 36.

idi ki, onlar hamısı yollarını azmışlar, katolikosu təhqir edir, keşişləri və rahibləri incidirdilər. Ermənilər məğlub olmalarına baxmayaraq, Rəbbimiz Məhəmmədi cəzasız qoymadı. Suriyaya gəldikdə o, ağır və xəstəliyə düçar oldu və yeddi ay əzab çəkərək öldü.[33] Onu üç dəfə dəfn etdilər, lakin hər dəfə torpaq onun nəşini qəbul etməyib bayıra atırdı. Belə olduqda onlar bir it tutub onun cəsədinə bağladılar və yalnız bundan sonra torpaq onu özünə qəbul etdi.

Bundan sonra ərəblər Albaniya knyazı Şeronu və onun əyanlarını əvvəlcə Tarona, oradan da Suriyaya apardılar. Bu əhvalat erməni təqvimi ilə yüz əlli üçüncü ildə baş vermişdi.[34] Bir il sonra Şirakın hakimini də Suriyaya apardılar.

İki il sonra ərəblərin knyazı Mərvan[35] Gilana hücum etdi, lakin vilayətinə daxil ola bilmədi.

Xəzərlər xaqanı 80 min qoşunu ilə hücuma keçib Albaniyanı zəbt etdi. Bu hadisə erməni təqviminin 158-ci ilində olub.[36]

Bundan iki il sonra Albaniyaya Əbdüləziz gəldi və Bərdədə dayandı.[37] Orada onun yanına iki əyan – Manuk və Mirdəzad qardaşlarını gətirdilər. Xaşpərəst olduqlarına görə onlara çoxlu əziyyət verdilər. Manuk İsanın şəhidlik çələnginə layiq oldu və onun qiymətli qaxımış cəsədi Bərdənin Böyük kilsəsi olan Müqəddəs Qriqori adına kilsəyə qoyuldu. Lakin onun Mirdəzad adlı qardaşı işgəncələrə tab gətirə bilməyib izdihamlı məclisin qabağında Rəbbimiz İsadan üz döndərdi. Sonralar o, peşman oldu və dönüklüyünü acı göz yaşları ilə təmizlədi. Qalan ömrünü o, öz göz

yaşlarını günahının yuyulmasına sərf edib törətdiyi günahını təmizləməyə çalışırdı. Ürəyinin dərinliyindən çıxan ah – zarıyla o, hər şeyi Bilənə üz döndərib inildəyirdi və ömrünün son anınadək kədərin içində idi. Ona rəhmli Allahın yazığı gəldi. O, onu şəhidlərinin arasına qəbul etdi və onun ölüm saatında adamlar əcaib möcüzələrin şahidləri oldular.

Həmin ildə Əbdüləziz ibn Hatim Kür çayını keçmişdi. Üç ildən sonra Məsləmə ibn Əbdülməlik gəlib Dərbəndi talan etdi və sonra da xəzərlərin torpaqlarına hücuma keçdi. Lakin o, yardım almadığına üçün silahlanmış ordusunu və hətta kənizlərini orada qoyub qayıtdı. Onun arxasını öz ordusu ilə cəsur və fəal knyaz, mahir ox atan, Albaniyanın knyazı arranşah Vaçaqan qoruyurdu. Xəzərlər onu təqib etdilər, lakin məğlub olub qaçdılar. Məsləmə, beləliklə, xilas olub İberiyaya yola düşdü.[38]

Erməni təqviminin 174-cü ilinin yayında[39] iribuynuzlu heyvanların arasında dabaq xəstəliyi baş verdi, qışında isə Xaris ibn Əmr ət Tai adamları, mal –qaranı və torpaqları siyahıya alıb ölkəyə ağır vergilər qoydurdu[40] , Həmin vaxt Ametduk Albaniya knyazı Cavanşiri öldürdü.[41] Həmin ildə Ermənıyyə knyazı Smbat vəfat etdi.

Erməni təqviminin 175-ci ilində[42] böyük aclıq oldu.

Növbəti üç il keçəndən sonra Cərrah ikinci dəfə Axbaz ölkəsindən keçib xəzərlərə hücum etdi.[43] Növbəti ildə Xəzər xaqanının oğlu Cərrahı öldürüb Dzaqiki əsir aldı.[44]

Ermənilərin təqvimi ilə 180- ci ildə[45] Məsləmə Dərbəndi

ərəblərin adına bərpa etdi.Ərəblər Şərq ölkəsi katolikosunun sarayını dağıtmadılar və bu saray indiyə qədər qalmaqdadır.

# ON DÖRDÜNCÜ FƏSİL

## Yepiskop Stepannosun bizanslılara səfəri və Şərq ölkəsinə tapılmayan kitabların gətirilməsi. Onun vəfatı və Allahın cəzası.

Elə bu zaman gənc yaşlı, lakin savadlı və müqəddəs Kitabın mahir şərhçisi Sünikli Stepannos yaşayırdı.[46] Bir dəfə o, erməni diofizitləri başçısı Smbatla mübahisəyə girişdi, lakin onu inandıra bilməyib bizanslıların yanına getdi. Orada Stepannos bir xaçpərəst zahidlə tanış olub şagird kimi onun yanında qaldı. Amma həmin Smbat Bizans imperatoruna[47] xəbər verdi ki, "Stepannos adlı bir dönük buradan sənin ölkənə gedib filan zahidin yanında qalır". İmperator çox qəzəbləndi və Stepannosu öz sarayına çağırtdırdı. Zahid ona məsləhət gördü ki, o, özünü imperatora yurdsuz bir yetim kimi təqdim etsin. Bunu eşidə Stepannos ona dedi: " Mən səndən

xahiş edirəm ki, mənim üçün kitab sandıqlarını açsınlar".

Orada Stepannos qızılı işlənmiş cildli din haqqında kitab tapır və onu imperatora təqdim edir.Kitabla taniş olduqdan sonra imperator Stepannosu Romaya göndərir ki, orada həqiqi dinə aid üç başqa kitabı gətirsin və bu kitablara isnadən o, öz ölkəsini həqiqi dinə çevirsin. Amma Stepannos bu kitabları götürüb imperatorun əmrinə baxmayaraq Konstantinopola yox, Dəbil şəhərinə gedir ki, bu kitabların əsasında orada camaata dərs versin. Burada onu Sünik knyazları Babgenlə Kürdoyun xahişilə Sünikin yepiskopluğuna seçdilər. Lakin bir il yepiskop olduqdan sonra onu Mozu əyalətində öldürdülər. Deyirlər ki, onu öldürən şəhvətli qadın olub. Stepannosun cənazəsini Ərkəzən kəndinin sovməəsinə gətirdilər, sonra da Tanahat vənginə apardılar.

Bəxtiyar Stepannosun Romadan bu üç dini kitabı gətirməsi Sünikin yepiskopluğunu yerli kilsənin üçüncü dərəcəsinə qaldırmışdı.

Stepannosun ölümündən sonra o, Nuh adlı bir zahidin yuxusuna girdi. Stepannos ətəyi dolu qanla Xilaskarın qabağında durub deyirdi: "İlahi buna bax və qoy Sənin ədalətli hökmün icra olunsun!" Zahid vilayət əhalisini Allahın qəzəbi haqqında xəbərdarlıq edib hamıdan tələb edirdi ki, səylə ibadət etsinlər. Birdən Mozu əyalətinə səmalardan dəhşətli zülmət endi. Qırx gün kəsilmədən yer əsdi və on minə yaxın adam yerin içində yox oldu. Buna görə buranın adını "Fəryad dərəsi" qoydular ("Vayos dzor")[48].

# ON BEŞİNCİ FƏSİL

## Stepannosun kitablarında İlion şəhərinin dağılması və Roma şəhərinin tikilməsi barəsində hekayə tapılıb

İlion şəhəri[49] Adil Abdanın vaxtında belə alınmışdı. Bu şəhər Avropada Axey ölkəsində olub Peloponesə yaxın və Makedoniyadan qərbdə idi. O zaman hələ yunanların çarları yox idi və ölkəni knyazlar idarə edirdilər. İlion elə böyük şəhər idi ki, yer üzündə onun tayı- bərabəri yox idi.

O zaman şəhər knyazlarından olan bir gənc əyləncə üçün Makedoniyanın şərqində yerləşən Fessalonika şəhərinə gedir və onu şəhər əyanları qəbul edir. Burada o, bir əyanın qızına vurulur və onu şirnikləndirərək İliona qaçır.

Qızın ata – anası bunu bilən kimi bu barədə İlion sakinlərinə xəbər verirlər, lakin onlardan çox kobud cavab alırlar. Onların cavabı Fessalonika camaatının hüzurunda oxundu və hamını intiqam hissi bürüdü. Bütün ətrafda yaşayanlar köməyə çağırıldı. Onlar böyük

qoşun toplayıb on beş il ərzində İlionla müharibədə oldular və bütün ölkəni dağıtdılar. Onlar şəhəri ala bilməyib, hiyləyə əl atdılar və İliona nümayəndələrini göndərib barışıqdan söhbət açdılar: "İlionun ilahiləri çox əzəmətlidir, buna görə də qüvvələrimiz zəiflədi. Gəlin gələcək naminə sülh bağlayaq, aramızda dostluq yaradaq və İlion ilahilərinə nəzir gətirək".

İlion camaatı onlara inandı. Fessaloniklilər isə ağacdan iki min içi boş at timsalları hazırlayıb içlərinə qırx minə yaxın silahlı döyüşçü yerləşdirdilər. Atlara qızıl və gümüşdən üz çəkərək onları arabalara yükləyib bu məhvedici hədiyyələri şəhər qapılarına çatdırdılar. Burada carçı xəbər verdi: " Budur, İlion ilahilərinə hədiyyələr gəlib!"

Bu atların hündürlüyü doqquz dirsək idi və onları şəhər qapılarından keçirmək mümkün olmadı. Buna görə şəhər divarının bir hissəsini sökməli oldular.

Təyin olunan vaxtda döyüşçülər atların içindən çıxıb divar yarığından şəhərə girərək bütün qoca və gəncləri qılıncdan keçirdilər. Qadınları isə əsir edib öz gəmilərinə apardılar ki, Asiyadan ölkələrinə qayıtsınlar. Amma qəflətən şərq küləyi əsdi və gəmiləri 2500 mil kənara aparıb İtaliya adlanan özgə ölkənin sahilinə çatdırdı. Buradan onlar öz ölkələrinə qayıtmaq istəyəndə əsir aparılan qadınlar gəmilərin hamısını yandırdılar. Fessaloniklilər məcbur olub bu yerlərdə qaldılar və əsir qadınlarla evləndilər. İllər keçəndən sonra onlar öz aralarından Romul adlı birisini başçı seçdilər. O, dəniz

sahilindən 25 mil kənarda bir şəhər saldırdı və ona Roma deyib öz adını verdi. Beləliklə də, romalılar xalq kimi dünyaya gəldi.

Bu əhvalat İlionun alınmasından 441 il sonra baş vermişdi. Bundan qırx dörd il sonra Filipp Romada çar oldu.

Romanın salınmasından min il sonra imperator Konstantin[50] öz taxtını oradan Bizantiona köçürdü. İndi bu şəhərin adı Konstantinopoldur.[51]

# ON ALTINCI FƏSİL

## Erməni təqviminin 200-cü ilindən sonra Albaniyada cərəyan edən hadisələr

O illərdə kobud və rəhmsiz cənub xalqının zülmü yer üzünün hər tərəfinə yayılıb atəş kimi bəşəriyyətin bütün gözəlliyini və şöhrətini yandırmışdı. Müqəddəs Yaqubun dediyi kimi: “ Budur, hakim qapıda durub” [1] , dəhşətli saat, amansız və ədalətli gün yaxınlaşır. Beləliklə, vəhşiləşmiş Həcər oğulları, İsmayıl nəsli ( ərəblər) yer üzünün bütün sərvətlərinə malik oldu, dənizlər də, quru da Dəccəl sələflərinə tabe oldu.

Albaniyamızda da böyük mərhumiyyətlər baş verdi, çünki ərəbləralban knyazlarının qohumlar arasında olan murdar nigahları üzündən paytaxt şəhəri olan Bərdəni əllərindən almışdılar. Öz

[1] İncil. Yaqubun risaləsi, V. 9.

iqamətgahlarını Suriyanın Diməşq şəhərində saldıqları kimi, buraya da, Albaniyanın Bərdə şəhərinə onlar öz hakimlərinin valisini təyin etdilər ki, o, ölkəmizin şirəsini sovurub aparsın.

Bu valilərdən birisi Diməşqdən Bərdəyə gəlir və əldən düşmüş ermənilər onun yanına öz katolikosları İsayla birlikdə onun yepiskoplarını göndərirlər.[52] Yuxarıda haqqında yazdığımız kimi Allahın qəzəbinə düçar olan xatun Vardanuhi[53] onun gəlməyini eşidib İsayanın yanına gedib xahiş etdi ki, onun çəkdiyi ağır əzablarına rəhmi gəlsin, çünki özü Allahın acı piyaləsindən lazımınca dadmışdır. Erməni katolikosu qadının göz yaşlarına güzəştə gedərək onun evinə gəlib bütün gecəni dua etdi ki, Allah onu keçmiş katolikosların lənətlərindən xilas etsin.

Elə o vaxt Albaniyanın katolikosu Solomon[54] öz yepiskopları ilə məsləhətləşib qadını sələflərinin lənətlərindən azad etdi  və onun dərdindən heç bir əlamət qalmadı.

Varazman oğlu Varaz – Tiridata isə Allah ömür bəxş etdi. Lakin onun oğlu Stepannos vaxtsız öldü[55], onun qardaşı Varazman isə azıb Kür çayında boğuldu və onun məzarı Kür oldu. Onun varisi qardaşı Cavanşirik oldu. Bu haqda danışmaq daha yetər.

Erməni təqvimi ilə 270-ci ilin sonunda[56] ərəblərin seçmə döyüşçüləri gizlicə Bərdədən çıxıb Amaras vilayətini qarət etdilər. Min nəfərə qədər əsir alıb Böyük Arranın Şikarkar məntəqəsində möhkəmləndilər. O vaxt cəsur və əzəmətli *arranşah* knyaz Səhl ibn Smbat[57]  igid qardaşları ilə birlikdə öz qoşunu ilə səhərçağı ərəblərə

hücum etdi. Onlardan çoxunu qılıncdan keçirib qalanını qaçırtdılar, əsirləri isə şirlərin dişlərindən çıxarıb azad etdilər.

Yenə də həmin ildə dünyanı dağıdan *avaranşan* ( qarətçi) adı ilə məşhur olan ərəb Savada (ibn Əbdülhəmid əl- Cəhhafi) Erməniyyəyə basqın edərək bütün ölkəni ölkəni qarət etdi, sonrada Sünikə qayıdıb Sqük vilayətinin Şalat kəndinin yanında olan qalada möhkəmləndi. Onda Sünik hökmdarı Vasak İrandan Babəki çağırdı və onunla birlikdə ərəbləri məğlub edib qaçmağa məcbur etdi. Sünikin hökmdarı elə həmən il vəfat etdi, Babək isə onu qızı ilə evləndi.

Həmin ildə Filippin oğlu knyaz Nerseh alban knyazı Stepannosun oğlu Varaz – Tiridatı öldürdü, onun oğlunu isə anasının qucağında xəncərlə vurub[58] bütün şeylərini qarət etdi. Həmin Varaz – Tiridat Albaniyada nəsildən – nəsilə hökmdarlıq edən Mehranilər sülaləsindən idi. O, Albaniyanın birinci knyazı Varaz – Qriqordan sonra səkkizinci hökmran idi.

Bundan sonra Baqk vilayəti[59] kafir Babəkin əleyhinə üsyan etdi. O isə İrandan gəlib ölkəni zəbt və talan etdi. Baqkın qadın və uşaqlarını qılıncdan keçirtdi.

Sonrakı ildə Babək Qeqarkunik vilayətinə[60] gəlib on beş minədək əhalini qılıncdan keçirib böyük Makenos monastırını yandırdı. Burada ancaq bir dəyirmandan başqa heç bir şey qalmadı. Bu zaman erməni təqviminin iki yüz yetmiş altıncı ili idi.[61]

İki ildən sonra Babək Məhəmməd ibn Humayd ət Tusini

məğlub edib yüz əlli minlik ordusunu qovdurdu.[62] Sonrakı ildə Babək İbrahim ibn əl- Leys ibn Fəzli darmadağın etdi.[63]

Yenə həmin ildə Davon və Şapuh adlı xainlər dostluq və sülh bəhanəsiylə gələrək baylakanlıları məğlub edən Babəki çağıran və Əbüləsəd adlanan Stepannosu öldürdülər. Baylakanlılar Bercor vilayətinin  və Ureas, Kərnəkəş, Həkkəri və Tapat kəndlərinin əhalisini qılınc və nizələrdən keçirtmişlər. Amma bunlar yenə də Babəkin əleyhinə üsyan qaldırdılar və döyüşdə ona müqavimət göstərdilər. Onlar Qoroz qalasında möhkəmlənərək on iki ay ərzində yuxarı Vaykunik, Bercor, Sisakan, Haband, Amaras, Bazqank, Mehank və Tsri vilayətlərini[64] əllərində saxladılar.

Əbüləsədin yaxınları onun qatillərini yaxalayıb ölənədək işgəncə verdilər. Əbüləsədin bacısı oğlu Əbu Musa adlanan sülhsevər İsa həmin vilayətləri ələ keçirtdi və hamısında hökmranlıq etdi.

Həmin ildə Babək İrandan gələrək Arazı keçib Amaras vilayətində düşərgə saldı. O, sülh danışığı apararaq onları tabe olmağa çağırdı. Bəziləri vaxt keçirmək üçün zahirən tövbə etdilər, lakin sonra onu aldadıb yenidən üsyan qaldırdılar. Babək oradan ölkəsi Atropatenaya qayıtdı. Amarasda isə öz məşhur sərkərdəsi Rüstəmlə bir ordu qoyub getdi və ona əmr etdi ki, qaladakılarla müharibə etməyib onları xoşluqla itaətə çağırsın. Rüstəm isə Babəkin əmrinə əməl etməyib qaladakılara hücum etdi. Bunu görən qala döyüşçüləri özlərini İsanın qüvvəsinə tapşırıb əllərinə xaçları və müqəddəslərin qaxımış cəsədlərini alaraq hücuma keçdilər və ağır

döyüşdə İran ordusunu darmadağın etdilər.

Deyirlər ki, elə həmin vaxt Amarasın yepiskopu olan Serob adlı birisi bizanslıların yanına gedib imperatordan müqəddəslərin cəsədlərindən hissəcik istədi və bu, ona bəxş olundu.

# ON YEDDİNCİ FƏSİL

## Ərəblərin knyazı Məmun Bizansa yürüş edir. Lakin məğlubiyyətə uğrayır. Bu və başqa əhvalatlat haqqında qısa məlumat

Erməni təqviminin iki yüz səksəninci ili idi ki, ərəb Məmun bizanslılara hücum etmək qərarına gəlmişdi.[65] O, yüz gəmi hazərladaraq, onlara yüz min seçkin döyüşçü mindirib dənizə çıxdı ki, böyük Konstantinopol şəhərini mühasirəyə alsın. Bundan xəbər tutan bizanslılar da dənizə çıxıb döyüşçülərini üzbəüz sahilə endirərək İsa xaçının düşmənlərini mühasirəyə aldılar və cəsarətlə hücuma keçərək ərəbləri darmadağın etdilər, Məmunun özünü də öldürdülər.[66] Bundan sonra bizanslılar yenidən dənizə çıxdılar və gəmilərdə qalan ərəblərin hamısını qılıncdan keçirib, gəmilərin özlərini də yandırıb batırdılar. Ərəblərə bu ağır zərbəni yalnız həyatverici İsa xaçının böyüı qüvvəsinin köməyilə endirmək mümkün oldu.

Bu hadisədən üç il sonra ( əl- Həsən ibn Əli) əl – Bəzqisi adlı

bir gənc oğlan düşdü və o, İsaya inandığına görə əzab - əziyyətə salınıb, qırxgünlük pəhriz günlərində Pasxa bayramı ərəfəsində kimi vəfat etdi. Onun cəsədi öz nursaçan parıltısı ilə ilə düşmənləri o qədər qorxutdu ki, onlar onu gecə yarısında basdırdılar. Xaçpərəstlərdən heç biri onun basdırıldığı yeri bilmədi , bunu yalnız onu şəhidlik çələnginə Layiq Görən bilirdi.

Növbəti ildə[68] qırx gün ərzində ərzində bərk yağışlar yağdıvə Kür çayı həddindən artıq qalxaraq daşdı, öz suyu ilə on beş fərsənglik[1] sahəni basdı. O vaxt Xəzər dənizindən eybəcər və dağ boyda əjdaha balıq çıxdı və balıqçıların ovladığı balıqları udub, onları dənizdən çıxartdıqları balıqdan məhrum etdi. Onda balıqçılar bir yerə toplaşıb qılınclarla balığın quyruq tərəfini o qədər yardılar ki, balıq öldü. Kürün suları da balığı çıxdığı yerə, dənizə apardı. Bundan sonra balıqçılar üçün balıq ovu asan oldu, çünki balıqlar sanki zindandan azad oldular.

Həmən ildə erməni katolikosu David vəfat etdi[69] O, müqəddəs Qriqorinin pəncəsini oğurlayanları lənətləmişdi. Bunu edənlər də bunlar idi: Əbdülməlik ibn Cahabonu qılıncla vurdular və kənizdən doğulan Əbdüllaşurla ərəb Əbucəfər onların ikisini də Bərdəyə gətirib diri – diri dərilərini soydular.

Əmirəlmöminin məhkəməsi barəsində biz bunları bildik: xəlifədən saöda murtanın[70]( polisin) başçısı otururdu, o da cəlladların başqasından məqamca daha yüksək idi. Solunda isə hakimlə xəzinə

---

[1] B i r f ə r s ə n g – 6 – 7 km.

əmiri oturub, hökm çıxarır və bütün ölkədən gələn vergiləri qəbul edirdilər. Onlar hər gün səhər saat doqquzda camaatı qəbul edir, ertəsi gün isə şikayətlər üzrə hökm çıxarırdılar.

Erməni təqviminin iki yüz səksən altıncı ilində[71] Bağdaddan qəflətən on iki min atlı qoşun çıxıb Albaniya ölkəsinə basqın etdi. Çar nəsli Mehranilərdən olan Səhl ibn Smbat köməyinə böyük şəhid Qriqorisi çağırıb aciz quşlara şığıyan qartal kimi onların üzərinə hücuma keçib darmadağın etdi və çöllərə saldı. Elə həmin ildə həmin knyaz – Səhl ibn Smbat ölkələri dağıdıb ölümsaçan, qaniçən və yırtıcı qiyamçı Babəki tutdu və onu əmirəlmöminin ixtiyarına verdi. Öz səyinə görə o, xəlifədən böyük mükafat aldı, Erməniyyəyə, İberiya və Albaniya üzərində ali hakimiyyət ona verildi və o, bu ölkələrdə çar kimi hakimlik etdi.[72]

Erməni təqviminin iki yüz səksən yeddinci ilində[73] əmirəlmöminin İbrahim nəhəng ordu ilə Bizans ölkəsinə hücum etdi və qılıncının gücü ilə böyük Amoriya şəhərini zəbt etməklə oradan qayıdanda şəhər əhalisini əsir apardı. Bu, Əbu Sahaq idi.[74]

Həmin ildə Erməniyyənin, İberiyanın və Albaniyanın hakimi olmuş hökmdarlar ağası Yovhannes Buxarxudatın vasitəçiliyi ilə bu üç ölkə üçün xəlifə dərgahından aman istədi.[75]

Yenə həmin ildə xəzərlər tərəfdən sərçədən çox iri çəyirtkələrin basqını oldu və Albanita ölkəsinin zəmilərini talan etd

İki il keçəndən sonra[76] böyük bəlalar gətirən sərt qış oldu. Çoxlu mal – qara qırıldı və çobanlar həlak oldu. Elə həmin vaxt

beyləqanlılar[77] gəldilər və Sünik, Tsri və Amaras vilayətlərini talan etdilər. Əbu Musa adlanan İsa onların əleyhinə çıxıb darmadağın etdi.[78]

Bundan iki il sonra[79] amansız və qəddar insan Xalq Patqos[80] gəldi. O, elə həmin il öldürüldü[81] . Sonra onun oğlu ( Məhəmməd) gəldi və ölkəmizi qılınc gücü ilə alıb, çoxlu kilsə yandırdı və əhalini əsir alıb Bağdada qayıtdı.[82] Sonra o, xəlifənin əmrilə oradan yenə qayıtdı və xəzinə hesabına erməni təqviminin iki yüz doxsan beşinci ilində Arşakaşen vilayətində Gəncə şəhərini saldırdı.[83] Sonra o, Sünik vilayətinə getdi. Baqk vilayətinin əhalisini əsir etdi və sonra Alahec dairəsinin Arkunaget kəndinə gəlib əmr etdi ki, burada olan müqəddəs Qriqori adına kilsəni yandırsınlar. Ancaq elə bu vaxt möcüzə baş verdi: hamının gözü qabağında kilsədən ağ atlı birisi çıxıb Məhəmmədin düşərgəsinə hücum edərək onun özünü və əsgərlərini təşvişə saldı və hamısını qaçırdı. Onlar Qoyun Buynuzu adlı dağa yetişəndə bərk tufan qopdu. Oradan yalnız atlılar xilas ola bildilər, amma yüklü olanların hamısı qayalıqlarda həlak oldu. Əsir aparılanların hamısı Allaha şükür edib xilas olundular.

Erməni təqviminin üç yüzüncü ilinin axırında[84] Allah tərəfindən qabaqcadan erməni və Albaniya knyazlarının alınlarına yazılmış cəzaları yerinə yetirildi. O il onların hamısı ərəblər tərəfindən tutulub zəncirlənmiş halda evlərindən çıxarılaraq zorla Bağdada aparıldılar.[85] Orada dinsizlər onları işgəncələrə və əzab - əziyyətə salaraq öz dinlərindən üz döndərməyə məcbur etdilər.

Onların çoxu orada özlərini həlak etdi və müqəddəs dinin xəzinəsini əldəyməz saxlayaraq ölməzliyin yerinə ölümü qəbul etdilər. Xoşbəxtlik Şapuh Arsruni ilə başqa bir seçkin əyan ölümü lüzumsuz həyatdan üstün tutub həyatlarını şəhid kimi bitirdilər. Ərəblərin hökmdarı əmr etdi ki, onları zəncirləyib diri – diri Fərat çayına atsınlar. Elə o andan onları suya atdıqları yerdən çay üzərində məşələ bənzər işıq saçılmağa başladı. Bundan qəzəblənən xəlifə əmr etdi ki, bir neçə adam çayın dibinə baş vursun və orada batırılanların sümüklərini çıxarıb yandırsınlar. Amma adamlar suya girən kimi işıq yox olurdu, sudan çıxandan sonra işıq yenə saçırdı. Belə halda xəlifə aysorlar yepiskopu Cəfəri çağırıb ona əmr etdi ki, o, sümükləri tapsın. Yepiskop çayın sahilinə gəlib öz adamlarını suya saldı. Onlar sümükləri tapıb yepiskopa verdilər, o da sümükləri öz kilsəsinə aparıb basdırdı və basdırdığı günün tarixini qeydə aldı.

Həmin ildə Böyük Arran vilayətində arası kəsilməyən yağəşlar başlandı və sel gəlib iki çayın birləşdiyi yerdə olan Dəstəkert kəndini basdı, sürülərini Qafqaz yaylaqlarına gətirən çobanların səkkiz yüz çadırını apardı.

Elə həmin ildə Vay – Vay dərədsində ( Zəngəzurda) knyaz Supan vəfat etdi.[86]

Ertəsi ildə[87] Qafqaza Buğa əl – Kəbir gəldi və Tiflis şəhərində İshaq İsmailini[88] öldürdü. Üç ilə qədər Buğa Ermənyyəni əlində saxlayıb axırda knyazları və arvadlarını yığıb Bağdada apardı. Dördüncü ildə Məhəmməd ibn Xalid gəldi[89] və knyaz Vasaq Qəbur

vəfat etdi.[90]

Erməni təqviminin üç yüz on səkkizinci ilində[91] Dəbildə dəhşətli zəlzələ baş verdi. Zəlzələ bütün il davam etdi və Cəhənnəmə yüz iyirmi min nəfər vasil oldu.

İnsana verilən nəsihətlərdən biri də budur.[1]

# ON SƏKKİZİNCİ FƏSİL

## Şeyxin oğlu, erməni və alban qoşunları tərəfindən Bərdənin mühasirəsi. Samuil özbaşına katolikosluğu qəbul edib Dəbilə gedir

İsa ibn Şeyx[92] ilə onun Bərdədəki naibi Emenik adlanan Əbdülvahid oğlu Məhəmmədin[93] arasına dava düşəndə İsa ibn Şeyx Suriyadan qoşun gətirib knyaz Aşotun[94] və Albaniya knyazlarının əsgərləriylə birlikdə Bərdədə olan qoşunlar üzərinə hücum etdi. Lakin mühasirədə olanlar mətanətlə on üç ay müqavimət göstərdilər.

Həmin vaxtda Albaniya katolikosu Yevsep vəfat etdi.[95] Albaniya knyazlarının yeni katolikosun seçilməsinə isə vaxtları yox idi. Onda Böyük Kolmank vilayətinin yepiskopu Samuil Filosof adlanan keşiş İsmayılla əlbir olaraq özbaşına öz yepiskopluğunu ona verdi, özü isə təyin etdiyi yepiskop tərəfindən katolikosluğa təsdiq edildi. Bu haqda xəbər orduya çatdı və bu, Albaniya knyazlarının

[1] Bax: İncil. Korinflilərə birinci risalə, X, 11.

narazılığına səbəb oldu. Knyazlardan biri bu barədə xəbəri erməni katolikosu Qeorqa[96] çatdırdı. O da bu barədə Erməniyyə knyazına yazıb xahiş etdi ki, albanlara bu məsələdə kömək edib işin sakitliklə həll olunmasına vasitəçilik etsin. İsmayıl bu fərasətlə Albaniyanın sərkərdə və knyazlarının razılığını aldı və bu da ermənilərin lənət oxumaqlarına səbəb oldu. Erməni knyazı Aşot tələb etdi ki, albanlar müqəddəs Qriqorinin qoyduğu qaydaya riayət edib, katolikosluq təyinatını ermənilərdən alsınlar, lakin elə bu vaxt albanlar özləri Samuilin və İsmayılın hərəkətləri ilə razı oldular. Erməni knyazı bu haqda katolikosları Qeorqa yazdı və o da istəmədən bütün albanların razılığına qoşulub Samuili yola verdi. Öz bildiyini edən Samuil Dəbilə getdi və burada Qeorq tərəfindən məcburi ikinci dəfə katolikosluğa təsdiq edildi. Bu əhvalat erməni təqviminin üç yüz iyirmi altıncı ilində olmuşdur.[97]

Həmən knyaz Aşot yepiskop Solomonun və katolikos Qeorqun köməyi ilə Sünikdə çoxdan ləğv olunmuş qriqoryanlıq təriqətini yenidən bərpa etməyə nail ola bildi.

Elə bu vaxt Aşot Baqratuni ermənilər knyazı taxtına bərqərar olundu.[98]

Erməni təqviminin üç yüz qırx ikinci ilində[99] ərəblər Erməniyyəyə gəldilər. Ölkəni tutub ağır vergilər qoydular və katolikos Qeorqu zəncirləyib Bərdəyə apardılar.

Bundan sonra mömin knyaz Hammam tənəzzül etmiş Albaniya çarlığını bərpa etdi,[100] necə ki, Aşot Baqratuni bunu

Ermәniyyәdә etmişdi. Bu iki hadisә eyni vaxtda olmuşdu. Hәmin Hammama bu hәyatın faniliyi eşqinә öz qardaşının qanının tökülmәsinin banisi idi vә Allaha qarşı olan öz böyük günahlarını yumaq üçün kilsәlәr, bütün kasıb vә ehtiyacları olanları üçün böyük işlәr görürdü. O, çoxlu pul verib ermәni katolikosu Qeorqu günahlı Sacikin[101] zindanından xilas edib, ona böyük hörmәtlәr göstәrdi vә әmin – amanlıqla ermәnilәrә qaytardı.

Dörd ildәn sonra, yeni il günü Pasxa bayramı ilә bir günә düşәndә[102], Albaniyanın yerli knyazı Әbu Әli[103] öz doğma qardaşı Smbatın әliylә öldürüldü. Bu da onun bütün qohumlarını böyük dәrdә saldı.

Elә hәmәn ildә Aşot Baqratunin oğlu ermәni çarı Smbat öz ordusunu qaldırıb Suriya torpaqlarına basqın etdi. Lakin әrәblәrin әks – hücumu onu geriyә, Ermәniyyәyә qaçmağa mәcbur edәrәk onun әmәliyyatını heçә çıxardı. Bu hadisәlәr zamanı ermәni knyazı Aşot vә onun ordusunun bir hissәsi hәlak oldu.[104]

Elә hәmin vaxt Vaspurakanın böyük knyazı Әbumәrvan öz әsgәrlәri tәrәfindәn öldürüldü.[105] Yenә hәmin ildә әrәblәr ikinci dәfә ermәni torpağına gәldilәr vә bunların әmrilә onun xadimi Bәrdәdәn çıxıb Ermәniyyәyә hәrәkәt etdi. O, hәyasız vә allahsız bir adam idi. Haraya gәlirdisә o, Allah kilsәlәrini qarәt edir, harada İsa xaçını görürdüsә onu parça – parça edirdi. O, Ermәniyyәyә çatan kimi çar Smbat qaçqın әyanların arvad – uşağını әsir aldı vә müqәddәs kitabları, kilsә avadanlığını, xaçları vә çoxlu qiymәtli şeylәri götürüb

özüylə apardı.

Bundan sonra o, İberiyaya basqın etdi. Burada onun əleyhinə iki igid İberiya sərkərdəsi – knyaz Qeorq və onun qardaşı Areves çıxdılar, lakin onların hər ikisi onun əlindən əzablı ölümə düçar oldular.[106]

Sonra erməni katolikosu Qeorq və Sünik knyazı Aşot öldülər və onlar üçün ağıçə qadınlar bu sözləri deyirdilər: “Qoy insanlar nə qədər dünyada var, belə il heç vaxt yer üzünə gəlməsin!”

Bütün bunlar erməni təqviminin üç yüz qırx altıncı ilində olub.[107]

Lakin bu, ermənilərin qismətinə düşən bəla və əzabların başlanğıcı idi, çünki bir azdan sonra Allah tərəfindən ermənilərin alnına yazılmış bütün bəlalar çar Smbata nəsib oldu Allah – təalanın qüvvəsi onu tərk etdi, özünün və ermənilərin həlak yolu ilə gedib vəhşiyəbənzər insan yox, it xasiyyətli bir ərəb knyazının yanına öz könlü ilə gəldi və o da Smbatı tutub çarmıxa çəkdirdi. O zamanlar bütün ermənilər arasında ağlaşma və ah- zar baş verdi və ölkələri də dağıldı.

Bu erməni təqviminin üç yüz altmış üçüncü ilində olmuşdur.[108]

Smbatın ölümünün intiqamını yalnız Allah istədi. İnsafsız ərəb Erməniyyədən gedib Suriyaya gəldi və oranı tutmaq istədi, lakin ərəb knyazının əlinə düşdü və onu diri – diri yerə basdırdılar. [109]

Bu dövrlər keçəndən sonra ərəblər haldan düşdülər və onların

yerinə dəyləmilər adlanan başqa bir xalq gəldi. Onların Salar adlanan tanınmış rəhbərləri öz hakimiyyətini uzaqlara yayaraq Albaniyanı, İranı və Ermənıiyyəni zəbt etdi. Bərdəyə gələrək şəhəri öz əlinə aldı. [110]

Elə həmin vaxt şimaldan Ruzik adlanan əcaib və yabançı xalqın üç minə qədər nümayəndəsi tufan kimi geniş Xəzər dənizini aşaraq qəflətən Albaniya paytaxtı olan Bərdəyə çatdılar və şəhər də onlara heç bir müqavimət göstərə bilmədi. Onlar əhalini qılıncdan keçirərək istədikləri var – dövləti mənimsədilər. Saların özü onları mühasirə etdi, lakin heç bir ziyan gətirə bilmədi, çünki onlar güclü və yenilməz idilər. Şəhər qadınları hiylə işlədib Ruziklərə ölüm piyaləsindən içirtmək istədilər, lakin onlar xəyanətdən xəbərdar olub qadınlarla uşaqları amansızcasına məhv etdilər.

Altı ay Bərdədə qaldıqdan sonra onlar şəhəri dağıdıb boşaltdılar və hamıdan gizli böyük və müxtəlif qənimətlə öz ölkələrinə qayıtdılar.

# ON DOQQUZUNCU FƏSİL

## Albaniya hökmdarlarının adlar siyahısının qısa təkrarı

Biz dürüst bilirik ki, Mehranilər sülaləsinin nümayəndələri erməni arvadlarını alaraq qohum olub bir yerdə Şərq ölkəsini idarə

edirdilər.

Biz yuxarıda qeyd etdik ki[112], Albaniyada Cəsur Vaçaqandan Mömin Vaçaqana qədər on çar olub. Onlardan təkcə Mömin Vaçaqan Şərq ölkəsində ildə olan günlər miqdarında kilsə tikdirib. Onun vəfatından sonra nəsilləri zəiflədi. İrandan Sasani nəslinin bir qolu olan Mehranilər gəlib Albaniya knyazları arasında yer tutdular.

Onların atadan oğula adları budur:

Mehr, Armayel, Vard, İgid Vardan (İsaya inanan yox, Girdıman qalasını saldıran), onun oğlu Vard. Vard Albaniyanın birinci knyazını, Varaz – Qriqoru dünyaya gətirdi. Varaz – Qriqor dünyaya dörd oğul gətirdi. Varaz – Peroju, Cavanşiri, Yezad – Xosrovu və Varazmanı.[113] Onların nəsillərindən biz yalnız ermənilərə tanış olan böyük oğulların adlarını çəkəcəyik. Bunlar aşağıdakılardır: Varaz – Peroj[114], Varaz – Tiridat[115], Vardan[116], Amansız Hersehdir ki, dindar adamların saçlarını dartıb ayaqlarına buxov saladırdı və buna görə də çoxları istidən və təngnəfəslikdən ölürdü. Elə bu niyyətlə də Nerseh xaçın kəndindən keçərək Suriyaya getdi. Bazar günü idi. O, öz yoldaşlarından ayrılıb təkbaşına müqəddəs xaça xidmət edən keşiş Simeonun yanına getdi və adını gizlədərək başqaları ilə birlikdə ibadətdə oldu. Lakin xoşbəxt Simeon ona müraciət edərək dedi: “ Sən kimsən? Allah sənin mürtəd olduğunu mənə açdı. İndi də sənin oğulların sənin görünməmiş və eşidilməmiş cinayətlərinin əsasını əllərinə alıb təqib olunanların canlarını almaq niyyətindədirlər. Məgər sən Suriyaya gedən və Şərq

ölkəsində kilsəslərə ziyan verdiyin kimi oranı da bədnam etmək fikrində olan Nerseh deyilsənmi? Budur, sən o ölkəyə getmək istəyirsən, lakin sən daha heç zaman öz atalarının vətənini açıq gözlərinlə görə bilməyəcəksən!”

Nerseh keşişin ayaqlarına yıxıldı, lakin heç bir cavab ala bilməyib təkbaşına yoluna davam etdi. Orada, keşiş Simeon dediyi kimi, Nerseh öldü və onun cansız bədənini vətəninə apardılar.

Nersehin oğlu Qaqik idi, Qaqikin oğlu da Stepannos idi, bunun bacısı da Aprasamin idi.

Bu Varaz – Tiridatı və onun oğlu Stepannosu onların qohumları olan Filipp oğlu Nerseh Daduyi – Vəng adlı dərədə öldürülmüşdü[117].O zaman bu bəladan sonra öldürülən knyazın arvadı ər mərdliyi ilə sağ qalan Sparam adlı qızını götürüb gecənin qorxulu yolunu qət edərək xaçın qalasında gizləndi. O, öz evinin namusu barəsində düşünərək Sparamı, Qeqam vilayətini zəbt edən Sünikin hakimi Səhl oğlu Adarnersehə[118] ərə verdi.

Onun Adarnerseh adlı oğlu ağıllı qadına rast gəldi və Allah qorxusu ilə onlar öz həyatlarını möminliklə keçirib öz ölkələrində hamının istəkliləri olmuşdular.

Həmin Adarnerseh Handu adlı qala tikdirdi, öz sarayını isə çar hamamları olan Vayyunik kəndində bina etdi. Gələcəkdə onu başqa knyazlarla birlikdə İrana apardılar və o, orada bir çox il keçirdi.[119]

Xanım Sparam isə gözəl işlərini artırıb Sodk vilayətində

Noravank monastırını tikdirib ona çoxlu vəsait sərf etdi və çox gözəl bəzətdirdi.

Elə bu vaxt Adarnerseh ərəb əsarətindən qayıtdı və bir qədər ömür sürüb vəfat etdi. Onun iki oğlu var idi: Qriqor və Abuset Qriqor.Qriqor Havaxalası qalasını tikib öz hakimiyyətini ətrafa yaydı. Qriqorun beş oğlu var idi. Onların böyüyü Əbu Əli[120] öz qohumunun əliylə öldürüldü. İkinci oğlu Sevada adlanan Sahaq igid və bacarıqlı olduğu üçün Girdıman və Parisos vilayətlərini özünə tabe etdi və quldurları ram edərək Coraygetin ağası oldu. O, maarifin tərəfdarı idi və öz evində müəllim saxlayırdı. Erməni çarı Smbat dəfələrlə onunla döyüşürdü, lakin onu özünə tabe edə bilmədi.[121]

Sevadanın iki oğlu var idi – Qriqor və Davud. Qriqor dünyaya İşxan adlanan Sevadanı və Adarnersehi gətirdi. İşxan dünyaya dörd oğul gətirdi: Yovhannesi, Qriqoru, Adarnersehi və Filippi. Allah – təala İşxanın böyük oğlu Senekərim adlanan Yovhannesi seçib onu çarlığa layiq gördü.[122] Allah – təalanın buyruğu ilə Senekərimin vasitəsilə çoxdan yox olmuş çarlığı bərpa etdirdi. İran şahı onu təmtəraqlı və qiymətli hədiyyələrlə təltif etdi və ona öz atasının tacını və atını göndərdi.

Elə həmin il Davud adlı Yunan magistir və allahsevər ərə gözəl tac və çar əbasını göndərib, ona hörmət göstərdi və katolikos onun çarlığına öz razılığını verdi.

# İYİRMİNCİ FƏSİL

## Albaniya katolikoslarının adları və əməlləri

Katolikosların adları haqqında da dəqiq siyahı tutmaq lazım və düzgün olardı. Amma nəzərə alsaq ki, əzəldən bir – birinin ardıncagələn bizim ruhani rəhbərlərimizin əməllərini və adlarını saxlayan sənədlər yandırılıb məhv edilmiş və onların vəsiyyətləri, əşyaları və məqbərələri haradadır – bizə məlum deyil və tapılmayıblar, biz burada bu məsələylə maraqlananlar üçün çoxluqdan məlum olan, gəlib bizə çatan azacığı izah edəcəyik.

Aramızda maarifin birinci yayanı müqəddəs Havvari Faddeyin şagirdi Müqəddəs Yelisey idi. O, Qüds şəhərində Müqəddəs Yaqubdan xeyir – dua almışdır. Yelisey üç ölkənin – Çola, Lpinkin və Albaniyanın maarifçisi idi Albaniyada da şəhidlik çələnginə layiq görülmüşdü.

Müqəddəs Şunpakişo – Qüdsdən şərq ölkəsinə gələn katolikos,

Katolikos Matteos,

Katolikos Sahaq,

Katolikos Movses,

Katolikos Pand,

Katolikos Lazar.

Müqəddəs Qriqoriya qədərki dövrdə katolikos kim olub bəlli deyil. Parfiya mənşəli Qriqoris həmin kürsüdə ikiqat şöhrətlə oturmuşdu.

Katolikos Zəkəriya,

Katolikos Davud,

Katolikos Yohvan. O, hunların yepiskopu olmuşdur.

Katolikos Yeremiya,

Katolikos Abas. O, erməni təqviminin başlanğıcında katolikos kürsüsünü Çoladan Bərdəyə köçürmüşdür. O, Böyük Arran yepiskopluğundan çağırılıb qırx dörd il ərzində katolikos olmuşdur. Onun vaxtında adəti üzrə məktubların üzərində "Albaniyanın, Lpinkin və Çolanın katolikosu" yazırdılar. Dəbil kilsə qurultayından ona yazdılar ki, o, gərək İsanın ilahi və insani təbiətlərinin birliyini qəbul edib " Müqəddəs Allah" sözlərinə "Ölməz və çarmıxa çəkilmiş" sözlərini əlavə etsin. Çünki bunu onlar Konstantinopol patriarxı Prokldan öyrəniblər. Axı müqəddəs Üç Uqnum Efes kilsə qurultayında iki yüz müqəddəs keşişlərlə təyin edilmiş, sonra Mesopotamiya yepiskopu Yaqubun vasitəçiliyi ilə imperator Anastasinin hüzuruna gəlmiş, İskəndəriyyə patriarxı Timofey və Antikiyalı Pyotr onu təsdiq etmişlər. Onların hamısı şərtləşdilər ki, provaslav dindarlar da "Çarmıxa çəkilmiş Ölməz" deməlidirlər. Amma bizim ölkədə Abbasa qədər heç kəs bunu demirdi. Ölkəmizdə küfr olmadığı üçün bu məsələyə baxmağa ehtiyac yox idi. Sonralar erməni katolikosu Yezrın vaxtında[123], onun yanına Girdıman yepiskopu Stepannos getdi və onunla təmasda olandan sonra Girdıman və Arsax bu məsələyə müsbət yanaşdılar.

Katolikos Viro otuz dörd il kürsüdə oturub. O, erməni, gürcü və alban əsirlərini xəzərlərin əlindən qurtardı. O, şah Xosrovdan

xahiş etmişdi ki, bu ölkənin hakimlərinə məktub yazanda onların ünvanları belə yazılsın: “ Girdıman hökmranı və Albaniya knyazına” və bunu indiyədək tətbiq edirlər.

Katolikos Zəkəriya. Bu müqəddəs insan on yeddi il kürsüdə oturub. O, böyük şəhər Bərdə üçün zəmanət verdi və öz duaları ilə çoxunu əsirlikdən qurtardı. Ermənilərin razılığı olmadan o, Vartanes adlı keşişi Sünikin yepiskopluğuna təyin etdi.

Katolikos Yovhan iyirmi beş il kürsüdə oturdu. Katolikos seçiləndən qabaq o, Amarasın yepiskopu idi.

Katolikos Uxtanes on iki il kürsüdə oturdu. O, qohumları ilə evlənən alban knyazlarını lənətlədi və onlar ölümə məhkum olundular.

Katolikos Yeliazar altı il kürsüdə oturdu. O, Şəki kilsə dairəsindən idi. O, Mesrobun Gişdə gizlətdiyi Müqəddəs xaçı əldə etdi. Onun hissəciyini götürüb qiyməti yüz iyirmi qızıl deheqan olan sandıqçaya qoyub üstündə “ Bu Yeliazara məxsusdur” sözlərini yazdırdı. O əmr etdi ki, Gişdə xaç bayramını keçirsinlər.

Katolikos Nerses Girdıman kilsə dairəsindəndir. Katolikos kürsüsündə on yeddi il oturdu. Günahlı məfkurəyə malik olub, Xalkedon küfrünü qəbul etməklə Albaniya ölkəsini çaşdırmaq istədi. Cismən və ruhən lənətlənərək, albanlar və ermənilər tərəfindən Allah Oğlunun şərəfindən məhrum edilib kafirlərə hazırlanan ölümə məhkum olundu.

Katolikos Simeon il yarım kürsüdə oturub. O. Albaniya

ölkəsini Nersesin qiyamından qurtarıb yeddi qanunu təsis etdi.

Katolikos Mikayıl otuz beş il kürsüdə oturub. O, Şəkidə kiçik keşiş idi. O, Makenos monastırı keşişi Solomonu dəvət edib baba – nənələri bir olan qohumları ilə evlənən Albaniya əyanlarını lənətlədi və bunların hamısı Allahın qəzəbinə keçib yox oldular. Bunlarla birlikdə qohumları ilə evlənməyi icazə verən gürcü katolikosu Talila da lənətləndirildi.

Katolikos Anastas dörd il kürsüdə oturdu.

Katolikos Yovsep on yeddi il kürsüdə oturdu. Onun katolikosluğunun beşinci ilində erməni təqviminin iki yüzüncü ili tamam oldu.[124] O, Amaras yepiskopluğundan seçilmişdir.

Katolikos Davud dörd il kürsüdə oturub Onu da Amaras yepiskopluğundan seçmişdilər. O, kilsənin torpaqlarını və var – dövlətini dağıtdı və canilərin ona verdikləri zəhəri içib öldü.

Katolikos Davud doqquz il kürsüdə oturdu. O, Böyük Kolmank kilsə dairəsindən seçilmişdi. O, Dəstəkert və Səhmanaxaç kəndlərini dinsizlərə satmışdı. Katolikos Matte il yarım kürsüdə oturdu. O, Qəbələ yepiskopluğundan seçilmişdi. Katolikos Movses iki il kürsüdə oturdu. Katolikos Aharon iki il kürsüdə oturdu.

Katolikos Solomon yarım il kürsüdə oturdu. Katolikos Teodoros dörd il kürsüdə oturdu. O, Girdıman yepiskopluğundan idi.

Katolikos Solomon in bir il yarım kürsüdə oturdu. Katolikos Yovhanies iyirmi beş il kürsüdə oturdu. Katolikosun iqamətgahını Bərdədən Bərdə kürə - katolikosların yay iqamətgahlarını köçürən o

idi. Katolikos Movses yarım il kürsüdə oturdu. Katolikos Davud iyirmi səkkiz il kürsüdə oturdu. O, Qəbələ yepiskopluğundan seçilmişdi. O, Şəki hökmdarının  qanunsuz nigahına xeyir – dua vermişdi. Hökmdarın qardaşı ondan soruşmuşdu: “ Ağam, haradan gəlirsən?” O, cavab vermişdi: “ Qardaşımın evindən”. Onda knyaz Davuda belə demişdi: “ Qoy sənin xeyir – dua verən dilin qurusun və heç vaxt dillənməsin! Qoy sənin sağ əlin qurusun!” Bunu deyən kimi dililə əli qurudu və o, ölümünə qədər sağalmadı. Katolikos Yovses iyirmi beş il kürsüdə oturdu. Böyük Kolmank yepiskopluğundan seçilmişdi. Onun katolikosluq dövrünün üçüncü ilində erməni təqviminin üç yüzüncü ili tamam oldu.[125] Katolikos Samuel on yeddi il kürsüdə oturdu. Böyük Kolmank yepiskopluğundan idi. O katolikosluğu özü mənimsəmişdi, sonra erməni katolikosu Qeorq tərəfindən devrilmiş, sonra da yenidən seçilmişdi. Katolikos Yovhan səkkiz il yarım kürsüdə oturdu. O, Ermənıyyədə saray keşişi idi. Qeorq əsir olanda, o, Qeorqun icazəsi olmadan Albaniyaya getdi və burada katolikos seçildi. Albaniya knyazları pul verib Qeorqu azad etdikdən sonra[126], o, əvvəlcə Yovhanı katolikos adından məhrum etdi. Lakin Alban knyazlarının xahişi ilə qədirbilən Qeorq onun ikinci dəfə təyinatını təsdiq etdi. Katolikos Simeon iyirmi bir il kürsüdə oturdu. O da Ermənıyyədə saray keşişi olub və Müqəddəs xaç adına monastırı daha yaxşı bəzədi.Katolikos Davud alrı il kürsüdə oturdu. O, Parisos vənginin keşişi idi. Katolikos Sahaq on səkkiz il kürsüdə oturdu. O, Böyük Kolmank yepiskopluğundan idi.

Katolikos Qaqik on dörd il kürsüdə oturdu. O, Girdıman yepiskopluğundan idi. Onun katolikosluq dövrünün dördüncü ilində erməni təqviminin dörd yüzüncü ili tamam oldu.[127]

Katolikos Davud yeddi il kürsüdə oturdu. O, Qəbələ yepiskopluğundan idi.

Katolikos Davud altı il kürsüdə oturub. Onu katolikosluğa erməni katolikosu Ananiya təqdim etmişdi.

Katolikos Petros on səkkiz il kürsüdə oturub. O, Girdıman yepiskopluğundan idi.

Katolikos Movses altı il kürsüdə oturdu. O, Parisos vənginin baş keşişi idi.

## QEYDLƏR VƏ ŞƏRHLƏR[1]

### BİRİNCİ KİTAB

1) Söhbət erməni çarı II Tiqrandan (e.ə. 95–55-ci illər) gedir. Hansı qırx dörd çardan deyilir – məlum deyil, çünki II Tiqran Artaşesilər sülaləsinin dördüncü çarıdır.

2) İranda hökm sürən Parfiya Arşakilərinin birinci çarı I Arşak idi (e.ə. 248–215-ci illər), axırıncısı (29-cu) Artavazd olub (226–227-ci illər). IV Artaban (213–227-ci illər) 28-ci idi.

3) *İstəhr* – İranın Fars vilayətində, Murğab çayının vadisində, Persepolisin şimalında yerləşən şəhər idi. Sasanilər İstəhrdən gəlmişlər və bu şəhər onların dini mərkəzi idi.

4) *I Ərdəşir* (224–240-cı illər) – Sasanilər sülaləsinin banisi, Sasanın nəvəsi, Papakın kiçik oğludur. 224-cü il aprelin 28-də IV Artabanın ordusunu məğlub edib, Arşakilərin paytaxtı Ktesifonu (Mədain) alır.

Sasanilər sülaləsi 651-ci ilə, ərəblərin istilasına qədər hökm sürmüşdür.

5) Mətndə Valarş gedir. Bu qarışıqlığı erməni tarixçisi Movses Xorenli salıb. O, erməni çarı I Tiridata Parfiya çarı Valarşın (I Vologezin) adını verir. Valarş (I Vologez) 50–76-cı illərdə çar olub.

6) *Hunan* (*Hunarakert*) – Xram çayının Kürlə qovuşduğu yerdə ilk orta əsrlərdə yerləşən qala və şəhər adıdır.

7) *Cəsur I Vaçaqan* – Alban Arşakilər sülaləsinin banisi. Onun çarlıq dövrü fars Parfyan çarlıq dövrü ilə eynidir – eramızın birinci əsrinin ikinci yarısının əvvəli.

8) Nəzərdə İsa (İisus) peyğəmbər tutulur.

9) *Faddey* (*Levvey*) – İsanın 12 əsas havarilərindən (apostollarından) biridir. (Simon, Andrey, Yakov Zaved, İoann, Filip, Varfolomey, Foma, Matfey, Yakov Alfey, Faddey, Simon Kanana və İuda). Bax: Əhdi Cədid. Matfeydən, X.

10) İrandan müasir Maku vilayətinin hüdudları daxilində idi: Əyridağın cənub-şərqində, Ağçay vadisində. Ş. Smbatyan Artazı Naxçıvandan şərqdə yerləşdirir.

11) Artaşesilər sülaləsinin 21-ci çarı Sanatruk 115–116-cı illərdə hökmranlıq edirdi.

[1] Üçüncü fəsildən başlanır.

12) İsa peyğəmbər.

13) Maskut müasir Müşkürlə eyniləşdirilir. Müşkür mahalı Samur çayının cənubunda, Yalama və Belbelə çaylarının arasında yerləşirdi (bax: П.Бутков, I, s.94; В.Минорски. Hüdud, s.455-456).

14) Çola. İkinci kitabın 41-ci fəslində: "Dərbənd yaxınlığında olan Çola"; Uxtanesdə (122): "Çola Dərbənddir". V.Kotoviçə görə (Древности Дагестана, с.188-189 və 317 səh. xəritədə) Çola (Çoqa) Rubas çayının və Bilicinin yanında olan Torpaqqala adlanan xarabalığın yerində idi.

15) Srxarn (Saxarn) Z.Yampolskiyə görə (к изучению) "müasir Ağdaşın yanında yerləşən kiçicik Suxarn-qala idi".

16) Z.Yampolski (Yenə orada): "Gis (müasir Kiş) Şəkidən şimalda yerləşən kəndin adıdır".

17) Bu ola bilsin ki, Samur çayın dərəsidir.

18) Qomenki Gişdən şimalda yerləşən Qelmets kəndi ilə eyniləşdirmək olar.

19) Urekan kəndini Gişdən şimalda olan İxrek kəndilə, ya Samur çayın dərəsində yerləşən Xruk kəndilə və ya Axtı şəhərindən şimalda olan Kurax kəndilə eyniləşdirmək mümkündür.

20) 487-510-cu illərdə çarlıq edib.

21) Cəsur I Vaçaqanın və onun xələfi I Vaçenin çarlıq illərini dürüst demək çətindir. I Vaçenin xələfi Urnayr 313-371-ci illərdə çarlıq edib.

Urnayrın xələfləri – çarlar II Vaçaqanın, Mehravanın, Satoyun və Asayın çarlıq illəri də qeyri-müəyyəndir. Çar Yesvagen 444-cü ilə qədər taxtda idi. II Vaçe 444-463-cü illər arasında çar idi. II Vaçe taxtdan əl çəkir, bundan sonra ölkəni İran mərzbanları idarə edir və Albaniyada çar olmayıb. 487-ci ildə çar taxtına II Vaçenin bacısı oğlu (şah Yezdəgirdin oğlu) Mömin III Vaçaqan keçir və o, 510-cu ilə qədər ölkəni idarə edir.

22) 454-484-cü illərdə şahlıq edib.

23) Buraya Ş.Smbatyan mənbədə olmayan və "erməni çarı Trdata" sözlərini əlavə edir.

24) Söhbət erməni çarı II Artavazddan gedir. (e.ə. 55-34-cü illərdə çarlıq edib) E.ə. 34-cü ildə Roma sərkərdəsi Mark Antoniy (e.ə. 83-30-cu illər) II Artavazdı və onun ailəsini əsir alır. Xilas olan təkcə onun böyük oğlu Artakses olub.

25) Burada VIII əsrdə yaşamış "erməni tarixşünaslığının atası" Moisey Xorenli nəzərdə tutulur.

26) *II Artavazdın oğlu Artakses* (*Ş. Smbatyanda-Artaşes*) – e.ə. 34-20-ci illərdə çar olub. Ş.Smbatyanın gətirdiyi tarixlər heç bir cədvəllərə uyğun gəlmir.

27) *Yervand* – erməni knyazı. Artaksesin müasiri.

28) Ş.Smbatyan albanların yerinə yalanlar uydurur, öz qeydində isə yazır: "все рукописи здесъ имеют алуанцы".

29) Çar tərəfindən təyin olunan vilayət hakimləri (qubernatorlar) naharar adını daşıyırdılar. Sonralar bu vəzifə sahibləri öz vəzifələrini irsi edib, atadan oğula verilmə hüququnu alırlar. Beləliklə, vilayətlərin inzibati hakimlərindən həqiqi feodallara (knyazlara) dönüb, vilayət torpaqlarının sahiblərinə dönürlər. Naharar istilahı parfyan dilindən iqtibasdır: *naharar–nahvadar* – "əvvəl (birinciliyi) saxlayan şəxs; birinci yer; rəis (başçı)". Bax: Ф.Мамедова. "История албан" с.108–116.

Ş.Smbatyan "Şərqin nahararları" əvəzinə "erməni nahararları" işlədir.

30) Erməni çarı III Tiridat 298–330-cu illərdə çarlıq edirdi. Babası I Xosrov (atası yox) 215-ci ildə Roma imperatoru Karakalla tərəfindən əsir alınıb Romaya aparılmışdı və orada da vəfat edib.

31) Basil (basillər) və ya barsil (barsillər) haqqında geniş məlumat almaq üçün *Y.Cəfərovun* "Hunlar və Azərbaycan" kitabına bax (Bakı, 1985, rus dilində).

32) Əfsanəyə görə, Xosrovu Sasani şahı I Ərdəşirin təhrikiylə müqəddəs Qriqorinin atası parfiyalı Amak öldürüb. Bax: *İovannes Drasxanakertli.* Tarix, s.62–63.

33) Bax: İncil. Xuruc, II, 1–10.

34) Bax: İncil. Xuruc. II; Quran, VII (Əraf).

35) Bax: İncil. Əhdi Cədid, Müqəddəs Pavelin Efeslilərə öyüdü, VI, 5–6; Müqəddəs Pavelin Koloslılara öyüdü, III, 22.

36) Deyilənə görə, Artaşat çar Artaşesin əmri ilə salınmış şəhər idi. Araz çayının sahilində olan bu şəhər sasani şahı II Şapurun (309–379) vaxtında dağıdılmışdır.

37) Bunlar haqqında məlumat Aqafinqelin "Tarix"indədir.

38) müqayisə üçün bax: Əhdi Cədid, İoanndan, XI, 43.

39) Bu Albaniyada xristianlığın ikinci dəfə yayılmasıdır. Birinci dəfə burada xristianlığı İsanın havarisi Faddey yaymışdı.

40) Albaniyanın Haband vilayəti və Amaras şəhəri üçün P.Göyüşovun "Amaras–Ağ Oğlan" adlı kitabına müraciət edilsin.

41) Türkiyənin indiki Muş vilayəti.

42) Priçastiye.

43) İusik 341–345-ci illərdə ermənilərin katolikosu idi.

44) Qriqoris albanların katolikosu idi. 337 və ya 338-ci ildə vəfat etmişdir.

45) Alban kilsəsinin müstəqilliyi və qədimliyi haqqında ən dolğun məlumat üçün bax: F.Məmmədovanın "Qafqaz Albaniyasının siyasi tarixi" kitabının dördüncü fəslinə.

46) Zaxariyya İudeya çarı Böyük I İrodun vaxtında yaşayırdı. (çarlıq illəri e.ə. 37-44-cü illər) Bax: İncil. Əhdi Cədid, Lukadan, I fəsil. Pantaleon imperator Maksimilianın (285-305-ci illər) vaxtında öldürülüb.

47) *Nikomediya* – Mərmərə dənizinin şərq sahilində yerləşən şəhərdir. E.ə. 262-ci ildə Vifiniya kralı I Nikomed tərəfindən təsis olunmuşdur. Müasir adı İzmitdir.

48) *Tsri* – F.Məmmədovaya görə bu şəhər Qəbələdən cənubda idi. Y.Cəfərovun "Город Цри" məqaləsinə də bax.

49) Maskutlar haqqında bax: Джафаров Ю.Р. "Ранние гунны на Кавказе". Maskutlar cənubi Dağıstanda və onunla həmsərhəd olan Azərbaycan rayonlarında yaşayırlar. Bax: Алиев И.Г., Асланов Г. Племена сармато-массагето-аланского круга в Азербайджане.

50) Sanesan (Sanatruk) haqqında daha təfsilatlı məlumat üçün bax: *Trever* K.V, s.188-197; Ф.Мамедова. Политическая история, с.172 və sonrakılar.

51) Qriqoris 337-ci ildə öldürülmüşdür.

52) Amaras haqqında bax: Rəşid Göyüşov. Amaras-Ağ Oğlan. Bakı, 1975.

53) Hunlar haqqında bax: Ю.Р.Джафаров. Гунны и Азербайджан. Баку, 1985.

54) "Naharar" istilahı üçün bax 29-cu qeydə.

55) Ərgeslər kimlərdir – müəyyən etmək çətindir.

56) *Çilblər* (*Silvlər*) – Qafqaz dağlarının şərq yamaclarında, Dağıstan ərazisində yaşayırdılar. Mətndə ərgeslər gənc çilbə: "Axı, sən bizim ölkənin adamısan!" deyirlər. Demək, ərgeslər və Dağıstanda yaşayan tayfalardan idilər.

57) 444-463-cü illərdə.

58) 487-510-cu illər.

59) Burada müəllif Qüdsü mərkəz hesab edərək, Şimal deyərək Qafqazı nəzərə alır. Şimalda yaşayan şərq xalqları deyəndə Albaniya nəzərdə tutulur. Erməni ixtiraçıları isə tarixə yeni məfhum gətirirlər. Onlar "Yer üzünün axırları" əvəzinə "ölkənin (yəni Erməniyyənin – *Z.B.*) ucqarları" işlədir və "Şimalın bəzi şərq xalqları" əvəzinə "ölkənin (yenə də Erməniyyənin – *Z.B.*) şimal-şərq hissəsi" işlədirlər ki, hökmən Alban ölkəsini Erməniyyənin şimal-şərq əyalətinə çevirmək məqsədilə saxta niyyətlərini saxlamaqdadır.

60) Bizans imperatoru Konstantin 306-337-ci illərdə hökm sürürdü.

61) Albaniyada xristian dinini dövlət dini kimi çar Urnayr 313-cü ildə elan etmişdi.

62) II Şapur 309-379-cu illərdə şahlıq edirdi. Bacısının adı Asay idi.

63) Barsil (basil)lər haqqında son mülahizələrə dair bax: Ю.Р.Джафаров. Гунны и Азербайджан, с.15-20.

64) Bu müharibə təxminən IV əsrin birinci onilliyində olub.

65) Smbatyan cümləni təhrif edib yazır: "və onun ermənilərə müqaviməti".

66) Qarqar çölü Mil düzüdür.

67) Smbatyan burada haşiyə verib yazır. (s.186): "Alban knyazlarının orduları, Erməniyyənin digər vilayətlər knyazlarının orduları kimi müharibə zamanı erməni sərkərdəsinin ümumi rəhbərliyi altında idi".

Yəni Albaniya Erməniyyənin bir vilayəti imiş!

68) II Şapur 309-379-cu illərdə şahlıq edib.

69) III Trdat təxminən 330-cu ildə ölüb.

70) İndiki Beyləqan.

71) Smbatyan erməni tarixçilərinə xas olan asanlıqla Albaniyanın Paytakaran (Kaspiana) vilayətini mənimsəyib Erməniyyənin şərq hüdudlarını Xəzər dənizinə qədər uzadır.(s.186)

72) Söhbət Bizans imperatoru Böyük Konstantindən (337-361-ci illər) gedir.

73) Söhbət katoliklərdən gedir. Bəs niyə Smbatyan bu mühüm məsələni unudur və "katolik" sözünü mətndən çıxarır?

74) Erməni çarı Tiran 338-345-ci illərdə hakim olub.

75) Erməni çarı II Arşak 345-368-ci illərdə hakim olub.

76) Pap 368-374-cü illərdə çar olub.

77) Kiçik Asiyada Qara və Mərmər dənizləri sahillərində yerləşən qədim dövlətin adıdır. Vifiniyanın paytaxtı Nikeya (indiki İznik, Türkiyə) olub.

78) Burada yəqin ki, yunanlar nəzərə alınır.

79) Axitofel İzrail çarı Davudun (e.ə. 1004-965-ci illər) məşvərətçisi idi. E.ə. 964-cü ildə Davudun əleyhinə sui-qəsd hazırladı. Axitofel Avessalomun məşvərətçisi olur və yeni ağasına elə məsləhətlər verir ki, çar Davud biabır olsun. Məsləhətin biri Davudu öldürmək idi. Bu isə qəbul olunmadı və buna görə Axitofel öz evinə gedib özünü asır. Bax: İncil.

İkinci Çarlıq, XV-XVII.

80) Bu Dzirav döyüşü 371-ci ildə olub.

81) Əlavə məlumat üçün bax: N.Adons. Yustinian dövründə Erməniyyə, s.273-277.

82) *Nahararlar* –feodal əyanlar, knyazlar. 29-cu qeydə bax.

83) Söhbət şah sarayında olan bargahdan gedir.

84) *Möbədlər möbədi* – zərdüştlərin baş kahini.

85) Burada pəhləvanlar deyildikdə əsilzadələr nəzərdə tutulur.

86) *Azadlar* – feodallaşan əyanlar nəsli.

87) *Çola keçidi* – Dərbənd keçididir.

88) Xəzərlərin şah II Şapurun vaxtında Albaniyaya ("bizim ölkəyə") basqını haqqında başqa mənbələrdə məlumat yoxdur.

89) Keşiş Smbatyan burada (s.196) haşiyə verib yazır ki, Sünik Ermoniyyənin vilayətidir, özü Nuh əyyamından. Baxmayaraq ki, orta əsr erməni tarixçisi Sebeos bildirir: hələ İran mərzbanı Surenin 571-ci ildə öldürülməsindən əvvəl, "Sünik torpağının hakimi Vahan üsyan edib ermənilərdən ayrıldı və İran şahı Xosrovdan xahiş etdi ki, Sünik torpağının divanını Dvindən (Dəbildən) Paytakaran (Beyləqan) şəhərinə köçürülsün və onların şəhərini də Atropatena hüdudlarına daxil etsin ki, ermənilərin adı onların üzərindən götürülsün. Bu əmr yerinə yetirildi" (Bax: История епископа Себеоса, с.28-29; N.Adons. Yustinianın dövründə Ermoniyyə, s.220-221). Sünikin Smbatyan tərəfindən mənimsənilməsinin ziddinə, hətta Baqrat Ulubabyan da çıxır. O, öz yazılarında Vahanı xain və mürtəd adlandırır.

90) Hopoqur şəxs adı olmamalıdır. Hopoqurlar xalqdır. Bunlar haqda Y.Cəfərovun "Hunlar və Azərbaycan" əsərinə bax.

91 Yezdəgird 439-457-ci illərdə şahlıq edib. Favst Bizanslıya görə (V. 42) bu əhvalat 379-cu ildə vaqe olub və bu vaxt Babik "cavan oğlan" idi. Həmin il *hori* ayının biri oktyabr ayına düşürdü.

92) Vardan və onun məsləkdaşlarının əhvalatı 451-ci ildə baş vermişdi. Erməni tarixi 552-ci ildə başlanır, yəni yüz iyirmi yox, yüz bir il təşkil edir.

93) Burada xaçpərəst dünyasının ən şərqində olan ölkədən, yəni Albaniyadan söhbət gedir.

94) Erməni müəllifi A.Perixanyan (s.126-127) yazır: "Мог ли Маштоц выступать в качестве изобретателя грузинской и албанской письменностей? На этот вопрос заранее можно дать отрицательный ответ. Моштоц не знал ни грузинского, ни албанского языков и сообщению Корюна о том, что он, Маштоц, там, на месте, собрал сведения о звуковом составе этих языков, не следует придавать большого значения".

Bu baxımdan, Koryunun "Maştosun həyatı" adlı əsərinin 14-18-ci fəsilləri və xüsusən, bu fəsillərə yazılan şərhlər başdan-ayağa uydurmalardan ibarətdir. Mesrob Maştots, göründüyü kimi, nəinki albanlara, yaxud gürcülərə əlifbalar yaratmayıb, hətta ermənilərin öz əlifbaları həbəş (amxar) əlifbasından törəmədir. Bax: Д.В.Олдерогге. Из истории, с.207-217.

95) Keşiş Smbatyan müəllifin mətnini təhrif edərək belə tərcümə edir: "Ermoniyyə qayıdıb Şərq ölkəsinə, Uti vilayətinə gedir" Başa düşmür ki, burada müəllif "Şərq ölkəsi" deyəndə xaçpərəst dünyasının ən şərqdəki ölkəsini, yəni Albaniyanı nəzərdə tutur. Smbatyana görə elə çıxır ki, Albaniya Ermoniyyənin şərq vilayətidir.

96) Makedoniyalı İskəndər e.ə. 336-cı ildən 323-cü il iyunun 10-dək hökmranlıq edirdi. İskəndərin Qafqaza gəlməsi əfsanədir.

97) Albaniyada yaşayan xalq və qəbilələr haqqında K.V.Treverin kitabına bax.

98) *Varaz Firuz* (*Peroz-Peroj*) – Albaniya böyük knyazı Cavanşirin (637–680) qardaşı və knyaz I Varaz-Tiridatın (680–699) atası idi.

99) Albaniya çarı Arsvagen 424–444-cü illərdə hökmranlıq edib.

100) İmperator II Fedosiy 408–450-ci illərdə hökmranlıq edib.

101) Vramşapux 388–414-cü illərdə çarlıq edirdi.

102) İran şahı I Yezdəgird 399–421-ci illərdə hökmranlıq edirdi.

103) Smbatyan qeyd edir ki, knyaz Vasaq ermənilərə xainlik edib.

104) Bu haqda əlavə bax: Koryun. Maştosun hal-tərcüməsi. Yerevan, 1962, s.106–108.

105) 428-ci ildə imperator II Feodosiy Nestoru Konstantinopol patriarxı vəzifəsinə seçir. Həmin Nestor israr edirdi ki, Məryəmi "Allah anası" adlandırmaq düz deyil, çünki o, Allahı yox, sadəcə insanı doğmuşdur; İsa – insandır və o, yalnız ilahiyyat məskəni və insan tayfasının xilas vasitəsi idi və s.431-ci ildə Efesdə (müasir Türkiyənin cənubunda şəhər) iki yüz yepiskop toplaşıb Nestoru küfrdə təqsirləndirib, onu patriarx kürsüsündən devirib, dönük kimi məhkum və Misirə sürgün edirlər. Orada da Nestor ölür.

106) II Yezdəgird 439–457-ci illərdə şahlıq edib.

107) Erməni katolikosu Sahaq 439-cu il sentyabrın 7-də ölüb.

108) Maştots 440-cı il fevralın 17-də vəfat etdi. Bax: *Koryun,* s.116–121.

109) Erməni çarı Şapuh 416–420-ci illərdə hökmranlıq edib.

110) Rosmosok Tubal etnik istilahlar haqqında bax: *K.V.Trever*, s.226–229.

111) Bu haqda bax: *K. V.Trever*, s.211 və 227.

112) Teofil hun sərkərdəsinin xaçpərəst olduqdan sonrakı adıdır.

113) Mətndə z o m a k a t a k k a m u r c i n gedir: z o m – "çay keçidi, körpü", k a t a k – "oxşar, oxşarlıq". Şaxnazaryan bunu n a v a k a m u r c – "müvəqqəti körpü, ponton" kimi verir.

114) Bu yerdən başlayaraq "uzatdılar" sözünə qədər olan mətn Yegişenin əsərindən iqtibasdır. (III, 44, 45).

115) Bizans imperatoru II Kiçik Feodosi 408–450-ci illərdə hakim olub.

116) İmperator Markian 450–457-ci illərdə hakim olub.

117) Erməni sərkərdəsi Vardan 391-ci ildə anadan olub. Ordusu ilə 450-ci ilə qədər İran şahına xidmət edirdi. İrandan qayıdaraq Sasanilər əleyhinə üsyan hazırlamağa başladı.

118) Vasak 441–451-ci illərdə Sünikin İran şahı tərəfindən təyin olunmuş mərzbanı idi.

119) Buradan "qəbul etdilər"ə qədər olan mətn Yegişədən iqtibasdır (III, 56–63).

120) Xalxal Qazax mahalında Ağstafaçayın sahilində idi.

121) Balasakanın başqa adı Paytakarandır (müasir Baylakan, Beyləqan və ona həmsərhəd rayonların ərazisi).

122) III Hürmüzd (457-459-cu illər) və Firuz (459-484-cü illər).

123) Alban çarı II Vaçe 444-463-cü illərdə hökmranlıq edib, 463-cü ildə taxtdan əl çəkir.

124) Bu üsyan 457-ci ildən 463-cü ilə qədər uzanmışdı.

125) *Haylantürk* – opoqurlar haqqında Y.Cəfərovun "Hunlar və Azərbaycan" kitabına bax. Ulubabyan adlı birisi hesab edir ki, haylandur kelt (Şotlandiya) sözüdür və mənası "dağ əhli" deməkdir.

126) Daryal keçididir

127) Arahezli Givt 461-478-ci illərdə ermənilərin papası olub.

128) Burada Daniyalın kitabında (bax: İncil. Daniyal, III, 15-25) keçən üç yəhudi gənclərdən – Sedrax, Misax və Avdenaqo – söhbət gedir. Babil çarı II Navuxodonosor (e.ə. 605-562) qızıl bütə sitayişi rədd etdiklərinə görə onların qızmar sobaya atılmasını əmr etdi. Lakin bu üç oğlan sobada yanmadı və bu möcüzəni görən çar bütün xalq və qəbilələrə əmr edir ki, Sedrax, Misax və Avdenaqonun Allahına sitayiş etsinlər.

129) *Kadiks* – İspaniyada şəhərdir.

130) Alban çarı Mömin III Vaçaqan 487-510-cu illərdə şahlıq edib

131) Firuz 459-484-cü illərdə şahlıq edib.

132) İran şahı Firuzun eftalit tayfaları ilə müharibəsi 484-cü ildə şahın ölümü və ordusunun məğlubiyyəti ilə nəticələndi. Bu barədə bax: K.V.Trever, s.217-225; Y.Cəfərov, s.70.

133) Valarş (Balaş) Firuz şahın qardaşı idi və o, 484-488-ci illərdə şahlıq edib.

134) İsanın şagirdlərindən biri Pyotr (on iki havarilərindən biri) İsanın çətin anlarında ondan üz döndərdi, amma buna baxmayaraq sonradan havarilərin rəhbəri Səmalar Çarlığının kilikdarı oldu. Bax: İncil. Əhdi Cədid, Matfeydən, XXVI, 74,75; Markdan, XIV, 29; İoanndan, XIII, 38.

135) Bu yerdə Smbatyan "çoxlu başqa ölkələrin" yerinə "çoxlu başqaları üçün" tərcümə edir. Ç. Dovsetdə də "çoxlu başqa ölkələrin" gedir.

136) Bax 47-ci qeydə.

137) Bax 56-cı qeydə.

138) Bu haqda 10-cu fəslə bax.

139) İohan Madakuni 478-490-cı illərdə katolikos olub.

140) Mətndə "aqelun" sözü işlənir.

141) Bax 26-cı fəslə.

142) Roma imperatoru I Konstantin 306-337-ci illərdə hökmran olub.

143) İzrail çarları Saul və Davud (Süleymanın atası) e.ə. 1020-965-ci və 1004-965-ci illərdə hökmranlıq ediblər. 144) Aquen Albaniyanın Böyük Arran vilayətində idi. Qanunlar haqqında bax: K.V.Trever, s.295-296; Z.M.Bünyadov, s.59-70; Ф.Мамедова "История албан", с.153-175 (başqa müəlliflər haqda da bu kitaba bax).

Keşiş Smbatyan həmin qanunları ermənilərə aid edir.

145) Aquen məclisi 488-ci il yanvarın 26-da (13 mareri) çağırılmışdır.

146) *Kalankatuk* (ərəb mənbələrində Kalkatus) – Tərtər çayının sol sahilində, Bərdədən 9 fərsəng (55 km) aralı.

147) Mətndə "varlı adam" t u a n i k kimi verilir. Farsca "təvan" olub, mənası – "qüvvə, güc, qüdrət, bacarıq", pəhləvi "tuvanik" dən (qüvvətli, varlı, dövlətli) götürmədir.

148) İlk ərəb dövründə İranda sasanilərdən qalmış həcm ölçüsü cərib 29,5 litrə və ya 22, 825 kq buğdaya bərabər idi. Bax: V.Hins, s.46-47. Ç.Dovset (s.51) cəribi "buşel" kimi verir. Bir buşel isə 36,3 litrə bərabərdir. Smbatyan cəribi 9,729 qrama bərabər edir və bu hesabla varlı keşişə ildə təxminən 39 qram buğda verir.

149) Girdıman haqqında bax Z.Bünyadovun Albanika III məqaləsinə.

150) Alban katolikosu Abbasın kilsə taxtında oturması 44 il olub (552-596-cı illər)

151) Smbatyan "bu Albaniya kilsəsinin" yerinə təkcə "Albaniya" yazır

152) Navasard ayı iyulun 11-də başlanıb avqustun 10-da bitir.

153) Smbatyan buraya mətndə olmayan "Ermənjyyəni" əlavə edir.

## İKİNCİ KİTAB

1) Xəzərlərin Azərbaycana basqınları haqqında bax: Z.Bünyadov. Azərbaycan VIII-IX əsrlərdə.

2) Söhbət İran şahı I Xosrov Ənuşirəvandan gedir. 531-579-cu illərdə hökmranlıq edib.

3) Mətndə "Xosrovun padşahlığının ikinci ilində" gedir. Lakin erməni təqviminin birinci ili 551-ci ildə başlanır. Buna görə söhbət Xosrovun iyirminci ilindən getməlidir.

4) Müqayisə üçün Dərbəndin qırx müsəlman şəhidlərini yada salmaq vacibdir.

5) Smbatyan mətnin "Bu sözləri qələmə alan..." dan "Amin" sözünə qədər olan mühüm parçanı çap etdiyi kitaba heç salmayıb. Bu da erməni keşişinin qəsdindən başqa bir şey deyil.

6) İovannes 557-574-cü illərdə katolikos olub. Bu dövrdə Ermənіyyəni İran mərzbanı idarə edirdi.

7) *Nestor* (*Nestoriy*) – Kesariya (müasir Qeysəriyyə) şəhərindən olan məşhur küfr elan edən yepiskop. 428-ci ildə o, camaat qarşısında elan etdi ki, pak və bakirə Məryəmi Allah anası yox, Xristos (İsa) anası adlandırmaq lazımdır, çünki Allahın anası ola bilməz. Bu çıxış küfr kimi qiymətləndirildi. Nestorun ardıcılları dəhşətli təqiblərə məruz qalıb İrana qaçdılar və burada böyük hörmətlə qarşılanıb dövlətin xüsusi himayəsinə alındılar.

8) IV Ümumkilsə qurultayı 451-ci ildə Xalkedon şəhərində Bizans imperatoru Markian (450-457-ci illər) dövründə toplaşıb işini oktyabrın 8-dən noyabrın 1-dək davam etdirdi. İclaslarda keşiş Yevtixinin "Xristosa (İsaya) kamil Allah və kamil insan kimi etiqad etmək lazımdır" küfrü lənətləmişdi. Qurultay "Hərçənd Xristos iki mahiyyətdən və ya təbiətdən doğulubsa o, hər ikisində qalmaqda deyil" düsturuna zidd olduqları üçün monofizitlərə lənət oxudu.

9) I Ümumkilsə qurultayı 325-ci il 4 və 5 iyulunda Nikeya şəhərində toplanmışdı. Qurultayda 318 yepiskop iştirak edirdi. Bunların 316-cı keşiş Ariyin küfrünü lənətlədi. Ariy deyirdi: "Əgər Ata Oğulu (İsanı) doğubsa, onda doğulmuş özlüyündə varlığın əvvəlinə malikdir; buna görə elə bir vaxt var idi ki, Oğul yox idi və O, öz mahiyyətini olmamadan alıb".

Ariy və onun məsləkdaşları dindarları yoldan etdikləri üçün təqib olundular.

10) II Ümumkilsə qurultayı Konstantinopolda 381-ci ildə yalnız Şərq ölkələri kilsələrinin 150 yepiskoplarının iştirakı ilə keçirildi.

11) III Ümumkilsə qurultayı 431-ci il iyunun 22-də Efes şəhərində keçirildi. Burada Nestorun küfrü lənətlənmiş. Onun əsas rəqibi olan Aleksanriya yepiskopu Kirillin 150 tərəfdarı, Nestorun isə 16 tərəfdarı var idi. Qurultay qərara gəldi ki, "İsanın simasında bölünməz və bitişməmiş iki mahiyyət – ilahi və insani – birləşib". Kafir Nestor isə əvvəlcə Antakiya civarında yerləşən Yevpreniya vənginə, sonra Petra şəhərinə (Urudun), sonra da Misrin İbis vahəsinə sürgün edilmişdi.

12) *Cümlay okə surb hayrapetk* – "cəmi 668 müqəddəs patriarx". Burada "cumlay" ərəb "cümlə"sindən gəlir ki, bu da yəqin ki, erməni dilinin tərkibində ən qədim ərəb sözüdür.

13) Bax 9-cu qeydə.

14) III əsrin kafiri Samosatlı Pavel 260-262-ci illər arasında Antakiyada yepiskop idi. O, öz kilsə dairəsində qədim kilsə nəğmələrini və Xilasedici İsanı tərənnüm edən nəğmələri ləğv edib bunların yerinə öz şərəfinə mahnılar oxutdurur, vaizlik edəndə kilsə kafedrasında ədəbsiz bədən hərəkətləri və işarələrinə yol verərək kilsədə olanları ona əl çalmağa məcbur edirdi. Din

xadimləri deyirdilər ki, Pavel "Dinin qaydalarından uzaqlaşıb səmalardan enmiş Allah Oğlunu tanımırdı və camaata öyrədirdi ki, İsa dünyaya yer üzündə gəlmişdir. O deyirdi ki, İsa sadəcə bir insan idi. Pavelin bu təlimini rədd etmək üçün Antakiyada üç ümumkilsə qurultayı çağırılmışdır (264, 267 və 269-cu illərdə). Sonuncu qurultay Paveli yepiskopluqdan məhrum etmiş, onun təlimi isə küfr hesab olunmuşdur.

15) Mani və ya Manes III əsrdə xüsusi dualistik dininin – Maniheyliyin banisi idi. Maninin vətəni Mesopotamiya idi (214-cü ildə doğulub). Onun əsl adı Surayk ibn Fətəkə idi, amma Mani (ruh, əql) adı ilə tanınır. 277-ci ildə şah I Bəhrəmin əmri ilə başı kəsilib, gönündən müqəvva düzəldilmişdi.

16) Şərqi Roma imperatoru Markian Flaviy (450-457-ci illər) 451-ci ildə Xalkedonda IV Ümumkilsə qurultayını çağırmışdır.

17) Bax 7-ci qeydə.

18) Kilsə tarixçisi Feodorit IV əsrin 80 və 90-cı illərində Antakiyada anadan olmuşdur. 423-cü ildən Fərat sahilində yerləşən Kirrosun yepiskopu idi. Xalkedon qurultayının iştirakçısı olub. Nestor tərəfdarları ilə monofizitlərin aralarında gedən mübahisədə iştirak edirdi.

Monofizit küfrü V əsrdə meydana gəlib. Banisi yepiskop Yevtix idi (378-ci ildə anadan olub) Onun küfrü ondan ibarət idi ki, o deyirdi "İsada bir mahiyyət tanımaq lazımdır, iki yox". 488-ci ildə kilsə Yevtixi bu küfrə görə lənətləyib. Ermənilər monofizitdir.

19) Roma papazı I Levin İsanın iki mahiyyəti (diofizit) haqqında risaləsi var. Albanlar diofizit idilər.

20) Erməni təqviminin birinci nahancı (visokos, dördilliyi) 1-4-cü illəri. 18-ci nahancı isə 69-72-ci illəri əhatə edir. Buna görə 18-ci nahancın birinci ili erməni təqviminin 69-cu ilinə düşür, bu isə miladi 620-621-ci ilə bərabərdir. II Xosrovun (590-627-ci illər) şahlığının otuz beşinci ili 625-ci ilə düşür, bu da erməni təqviminin 19-cu nahancın birinci ilinə, yəni 73-cü ilə düşür. İsanın zühuru mehekan ayında olub, həmin zühurun birinci illiyi erməni təqviminin 5-ci ilin I mehekanına düşür, bu da 625-ci ilin 6 yanvarına bərabərdir. 625-ci il isə II Xosrovun şahlıq dövrünün 35-ci ilidir. Bax: Ç.Dovset, s.76.

21) Saekulumnovumun 43-ci ili.

22) Yeni eramızın 57-ci ilində. Görün keşiş Smbatyan bu cümləni necə tərcümə edir: "Был сорок третий год греческого летоисчисления, когда просветились армяне (приняв христианскую) веру, на 270 лет раньше просвещения Албании". 174-cü haşiyəsində keşiş yazır: "Даты обращения в христианство армян и албанцев, приведенные в начале этой главы искажены и не соответствуют действительной хронологии". Soruşmaq

ayıb olmasın, ay keşiş: "Niyə?" İndi də ermənilərin baş keşişi albanların xristianlığı qəbul etdikləri ili mənimsəyib özləri üçün bayram keçirir.

Sonra Albaniyada xaçpərəstliyi havari (apostol) Yelisey yayıb. Ona görə də Alban kilsəsinə apostol kilsəsi də deyilir. Halbuki ermənilərə xaçpərəstliyi Qriqori, yəni Yeliseyin şagirdinin şagirdi gətirib. Ona görə də erməni dini qriqorian dinidir və havariyə (apostola) heç yandan bağlılığı yoxdur.

23) Babıgen 490-516-cı illərdə katolikos olub.

24) Dvin kilsə qurultayı. 506-cı ildə olmuşdu.

25) Bizans imperatoru Zenon 474-491-ci illərdə hakimiyyətdə olub. I Anastasiy isə 491-518-ci illərdə. İkisi də monofizit küfrünün tərəfdarları idi. Papaz 607-615-ci illərdə katolikos olub.

26) Abraham 607-615-ci illərdə katolikos olub.

27) Gürcülər erməni monofizitliyindən 608-609-cu illərdə ayrıldılar. Gürcü və alban kilsələrinin erməni kilsəsiylə mübahisələri haqqında bax İ.A.Cavaxovun əsərinin 433-536-cı səhifələrinə. Gürcü katolikosu Kürion haqqında N.Akineanın "Kürion" adlı məqaləsinə bax. Həmçinin bax: Драсханакертси, s.81-82.

28) Bax: Risalələr kitabı, s.193-194.

29) Həmin məsələ Abrahamın risaləsində belə deyilir: "bizdən qabaq katolikosluq rütbəsi Albaniyada təsis olunub (yarajaqoyn k'an zmez kaçealk'n yastiçani kat'ulikosut'ean Aluans) Bax. Risalələr kitabı, s.188-195.

Keşiş Smbatyan iki yazılı mənbənin bu aydın izahatına heç cür razı olmayıb, bu məsələni qarışdırmaq və öz xeyrinə izah etmək üçün uzun-uzadı 179 №-li haşiyə yazır (bax: s.216-220).

30) *Mtsxeta* və *Manqlisi* – Gürcüstanda şəhərlərdir.

31) Smbatyan "ermənilərin Alban arxiyepiskopunu tabe etmək təşəbbüsləri" kimi tərcümə edir.

32) *Markian* 450-457-ci illərdə Bizans imperatoru idi.

33) *Pulheriya* (493-543) – Bizans imperatoru Arkadinin qızıdır.

34) Keşiş İovan əksinə Xalkedonda qəbul edilən qərarların əleyhdarı idi.

35) Solomon 791-792-ci illərdə erməni katolikosu olub.

36) Göylərdəki mələikələr rütbələri üçün Mxitar Qoşun "Qanunnaməsinə" bax (rusca tərcüməsi, s.120-121).

37) Bunlar dördü də İsanın şagirdləri, havarilərdir.

38) Erməni katolikosları Qeysəriyyədə təyin olunurdular.

39) Bizans imperatoru I Yustinianın hakimiyyət dövrü 525-565-ci illərdə olub. Drasxanakertliyə görə (s.68), həmin qaxımış cəsədi Efesdən Konstantinopola aparan I Böyük Konstantinin (306-337-ci illər) oğlu II Konstant (337-361-ci illər) olub. 40) Bu 504-cü ildə bağlanan İran-Bizans müqaviləsi əsasında oldu.

41) Movses 574-604-cü illərdə ermənilərin katolikosu idi.

42) Bu İohan 557-574-cü illərdə katolikos idi.

43) Erməni müəllifi Sebeos yazır: "Sünik (Zəngəzur) torpağının hakimi Vahan üsyan edib ermənilərdən ayrıldı və İran şahı Xosrovdan xahiş etdi ki, Sünik torpağının arxivini (divanını – Z. B.) Dvindən Paytaxtı Arran (Beyləqan) şəhərinə köçürsün və onların şəhəri də Atropatena hüdudlarına daxil edilsin ki, erməni adı onların üzərindən götürülsün. Bu əmr yerinə yetirildi" (bax: Sebeosun tarixi, s.28-29; Adons, s.220, 223).

44) Abraham 607-615-ci illərdə katolikos olub.

45) Bax: Cavaxov İ. "VII əsrin əvvəlində Gürcü kilsəsinin erməni kilsəsindən ayrılma tarixi"nə (rus dilində)

46) Erməni orta əsr müəllifi Uxtanes (s.122) yazır ki, bütün bu məlumatı o, "Albanlar tarixi"ndən (i patmut, ene Aluanits) və ya Alban tarixçilərindən (i patmaqratsn Aluanits) götürüb.

47) Keşiş Smbatyan cümləni belə tərcümə edir. "Они (иверцы? – *З.Б.*) отбились от Армении, чтобы не подчиняться ничьей власти".

48) Bu haqda Üçüncü kitabın ikinci və sonrakı fəsillərinə bax.

49) Bu barədə Stepannos Oribelyanın "Sünik tarixi" əsərinin XXV fəslinə bax.

50) Nadav və Aviud Harunun oğulları idilər. Öz buxurdanlarına yad odu və ətri qoyub Allahın hüzuruna O, əmr etmədiyi yad odunu gətirdilər. Allah tərəfindən od çıxıb onları yandırdı. Bax: İncil. Musanın üçüncü kitabı. X, 1-2: Musanın dördüncü kitabı, III, 4; XXVI, 61.

51) Lut Nuh oğlu Samın nəslindən olan Aranın oğlu idi. Bax: İncil. Kövn, XI, 10-27; XIX, 1-25.

52) Bax 20-ci qeydə.

53) Bax: İncil. 2-ci Salnamə, XXXVI, 22-23. Əhəməni şahı II Kuruş e.ə. 559-530-cu illərdə hakimiyyətdə olub.

54) Bizans imperatoru İrakli 610-641-ci illərdə hakimiyyətdə olub.

55) İran şahı II Xosrov Pərviz 590-628-ci illərdə şahlıq edib.

56) Sasani ordusu Qüds şəhərini 614-cü ildə aldı.

57) *Aravel k'an z Antiok k'alak* – Bu şəhəri Mədainin yaxınlığında II Xosrov deyil, I Xosrov (531-579) tikmişdir. Bax: "Sebeosun tarixi" kitabına.

58) Bizans orduları Qeysəriyyədə toplaşdılar (bax: Sebeos. XXVI fəsil)

59) Eger torpaqları laz və acarların torpaqlarıdır.

60) İmperator İraklinin 622-ci il səfəri haqqında bax: Манандян. Маршруты персидских походов, с.132-146.

61) Arsruni (III, 3) və Sebeos (XXVI) yazırlar: *i Qancakn Atrpatakani* (Atropatenanın Gəncəki).

62) İrakli Gəncəkdə atəşpərəstlərin ən böyük piri olan Vşnasp pirini dağıdır. Bax: В.Минорски, c.248-251.

63) İrakli Albaniyada 623-624-cü illərin qışını keçirib.

64) Zaxariyya 630-645-ci illərdə katolikos olub.

65) Böyük Kalankatuk kəndi Tərtər çayının yanında idi. Ərəb coğrafiyaşünaslarının əsərlərində Kalkatus adlanır və Bərdə-Dəbil ticarət yolunda (Bərdədən Kalkatusa 9 fərsəx. Kalkatusdan Mətrisə-13 fərsəx) yerləşirdi. (bax; əl-İstəxri, s.193; İbn Hovkəl, s.251; Əl-Müqəddəsi, s.382; əl-İdrisi, c.324) M. Barxudaryan (Albaniya tarixi, 1902, s.31) yazır: İndiki dövrdə (1902-ci ildə) bir neçə müsəlman ailəsi Kalankatuk kəndinin xarabalığında yaşayır. Bu kənd də dağılmış Divtakan kəndi ilə və əhalisi olmayan Matalis kəndinin arasında, Tərtər çayının sol sahilində Qarı körpüsünün yanında yerləşir".

66) Fəsildəki hadisələr haqqında bax: Z.M.Bünyadov. Azərbaycan VIII-IX əsrlərdə.

67) Bu ya Şəhrivaraz, ya da Şahin idi (bax: Sebeos, XXVI).

68) İrakli Salbanon şəhərini aldığı zaman Şəhrivaraz məğlub olmuşdur. Bax: Feofan, s.311.

69) Bu basqın ola bilsin 626-cı il yayın əvvəlində olub, çünki İrakli ilə xəzərlər arasında ittifaq 626-cı ilin yazında bağlanıb ("Xosrovun şahlığının otuz altıncı ilində").

70) N.Bayns (Avar qəflətinin tarixi, s.121) yazır ki, bu iki sərkərdə – Şəhrivaraz və Şahin Qərbdə yalnız 626-cı ilin yayınadək qalmışlar. Həmin vaxt Şahin İraklinin qardaşı Teodor tərəfindən məğlub edilib öldürülmüşdür (bax: Feofan, s.315). Buna görə Xosrovun bu məktubu 626-cı ilin yayının ilk günlərində, yəni onun qoşunlarının məğlubiyyət xəbəri Mədainə çatmamışdan qabaq yazılmışdır.

71) Xəzərlər adı ilə bağlı olan xalqlar haqqında məlumat üçün bax: П.К.Коковтсев. Еврейско-Хазарская преписка в X веке. Л., 1932.

72) 628-ci il.

73) Burada xəzərlərin hökmdarının adı çəkilir.

74) C e b u  və  X a q a n – türk ünvanıdır. Onların müfəssəl izahı üçün bax: Z.Bünyadov. Azərbaycan VII-IX əsrlərdə s.45; Ç.Dovset, s.83; P.Qolden. Xəzər stadiz, s.187-190, №26 Həmin əsərlərdə istifadə edilmiş mənbə və ədəbiyyatın adları da çəkilir.

75) Keşiş Smbatyan "Albanlar ölkəsinə" əvəzinə " Aluvank" yazır.

76) Bax: Feofan, s.315.

77) Yəni 625-ci ilin iyunundan 626-cı ilin iyununadək. Ola bilsin 626-cı ilin yayında.

78) Yəni yuxarıda qeyd olunduğu kimi 626-cı ilin yayında.

79) Xəzərlər arasında IX əsrədək Şad Xaqandan sonra ikinci hökmran sayılırdı. IX əsrdə Şad Bək'lə əvəz olunur. Bax: P. Qolden, s.206-208, №36 Ç.Dovset, c. 83, qeyd 4.

80) Əlyazmalarda turkann, turuakann, turakann kimi gedir. Qədim türk sözüdür: turğağ – qarovul, növbətçi.

81) Bu döyüş 627-ci ilin yayında olub. Sebeos (XXVII) və Arsruni (II, 3, s.95) Qubad tərəfindən öldürülən qardaşlarının sayını 40 göstərir.

82) Bu əhvalat 628-ci ilin yayında olub. Sebeos (XXVII) və Arsruni (II, 3, s.95) Qubad tərəfindən öldürülən qardaşlarının sayını 40 göstərir.

83) Bax: Feofan, c. 325-326.

84) Yenə orada.

85) *Katak-i hindukan* – hindlilər evi.

86) Arsrunidə (II, 3): açin zna i daxlic kimi verilib, yəni "onlar onu ayaqyoluna gətirdilər".

87) Şah olandan sonra II Qubad Şiruya adını qəbul edir. O, şahlıq taxtında təxminən 8 ay oturub.

88) Yəni ərəblərə.

89) IV Hörmüzd 579-590-cı illərdə şahlıq edib. Hörmüzdlə Bindoy, Bistam və Bəhram. Çubin və sonralar II Xosrov arasında mübarizə haqqında bax: Feofan, s.263-266; Asruni, II 86; Sebeos, s.29-37; Təbəri, 1. 989-994; Dinəvəri, s.85-89.

90) Bax: Feofan, s.266.

91) Alban Mehraniləri sülaləsinin banisi sayılan bu Mehran Sebeosun (s.28-31) Mehran Mehrevandakı deyilmi, yəni Mehran nəslindən olub I Xosrovun dövründə yaşayan və Vardan Mamikonyanla vuruşan Bəhram Mehrevandak Çubinin qohumu deyilmi? (Bax: Təbəri, I, 1000; Dinəvəri, s.91-96). Əgər belədirsə, onda Moisey Kalankatuklu II Xosrovu I Xosrovla qarışdırır. Moisey belə zənn edir ki, Mehran Sasan nəslindəndir və bunu bir neçə yerdə təsdiq edir. Bax: 123-cü qeydə.

92) Mehranilər İran mütləqiyyətinin yeddi böyük nəslindən biri idi (bax: A.Kristensen, s.103-110). Bu nəslin nümayəndələrinin ehtimal ki, Azərbaycanın cənubunda torpaqları var idi. (müqayisə et: N.Adons, s.440-441, I) Bunlar Mehranilər sülaləsi olaraq alban Arşakilərinin yerini tutdular.

93) Keşiş Smbatyan yazır ki, (s.203-204, haşiyə 90) Ermənıyyədə Girdıman vilayəti heç olmayıb. Bax mənim Albanika III adlı məqaləmə.

94) M.Barxudaryan (Albanlar tarixi, I, s.90, haşiyə 3 və 91) Mehravanı Ağsuda görür.

95) M.Kalankatuklu Cəsur Vardanı 448-ci ildə olan Aquen dini qurultayın iştirakçısı kimi göstərir (bax yuxarıda) və "Girdımanın hakimi" adlandırır və deyir ki, "Girdıman qalasını tikən o deyil" Burada açıq-aşkar anlaşılmazlıq var və bəlkə də bu, III kitabın müəllifinin ayrı şəxs olduğundan gəlir.

96) Bax birinci kitabın 15-ci fəslinin sonuna. Bu, Aran sülaləsinin adı olub.

97) Bu haqda bax mənim Şəki adlı məqaləmə.

98) Gürcü salnamələrində o, Varaz-Qaqel kimi adlanır.

99) Bu hadisə 628-ci ildə olmuşdur, çünki Viro həbsdən bu il azad olunmuşdur. (bax 14-cü fəslə) Varaz-Qriqoru isə birinci dəfə xaçaçuranpərəstliyə çevirən imperator İrakli olmuşdur.

100) Bax mənim "Albaniya katolikosu Viroyun fəaliyyəti haqqında (596-630-cu illər)" məqaləmə, s.15-20.

101) Bu üsyan 603-cü ildə, Xosrovun Bizansa hücumu vaxtında olub.

102) Bax: Sebeos, s.45.

103) Söhbət xəzərlərdən gedir.

104) Yəqin ki, 629-cu ilin yazında, X fəsildə deyilən "gələn ildə".

105) Burada deyəsən müəllif özü də olub.

106) Mətndə saloyü gedir. N.Marra görə, bu, xəzərlərin rus dilindən götürdükləri ən qədim salo (Piy, yağ, iç yağı) sözüdür. Bax: По поводу русского слово "сало", s.67-113.

107) Belə müraciət iranlıların Orta Asiya türklərinə müraciətindən gəlir (türklərin "beq'i" iranlıların "boğa'sından"). Afşinin məhkəməsində müəyyən olundu ki, o, özünə ərəblərin "ilah əl-alihat" qarşılığı ilə müraciətlə icazə verirdi. Bax: Təbəri, III, s.1310-11.

108) Müəllifin sözləridir..

109) *Tit Flavi Vespasian* – 69-79-cu illərdə Roma imperatoru olub. 68-ci ildə imperator Neron onu İudeyada baş verən üsyanı yatırmağa göndərmişdi. 69-cu ildə o, imperator elan edilir və 66-cı ildən 73-cü ilədək davam edən İudeya müharibəsində baş sərkərdə olan Tit adlı oğlu Qüds şəhərinin (70-ci ilin sentyabrı) alıb talan edib, məşhur Qüds məbədini dağıdır. Saysız-hesabsız qənimətlərdən başqa romalılar yüz mindən artıq əsir yəhudi apardılar. Tit Sezar Vespasian Avqust 79-cu ilin iyun ayından 81-ci il sentyabrın 13-dək imperator olub.

110) İrakli 610-641-ci illərdə şah olub; I Yezr 630-641-ci illərdə katolikos olub; Sünikin knyazı Qriqor təxminən 640-cı ildə vəfat edib; Varaz-Qriqor 628-ci ilə qədər Albaniya çarı olub; Muşeq (düzü – Mjej) Qnuni Bizansın Erməniyyədə valisi olub (630-635-ci illər); III Yezdəgird 632-652-ci illərdə şah olub.

111) Nəzərdə ərəblər tutulur.

112) Burada anlaşılmazlıq var. Sonuncu VI Selevk Epifan Nikanor e.ə. 95-ci ildə vəfat etmişdir. İsanın özü də, havarisi Andrey də hələ dünyada yox idilər.

113) E.Bruksa görə (s.95), Yovsep Qüdsü təxminən 660-cı ildə ziyarət etmişdi.

114) İran şahı III Ərdəşirin hakimiyyətinin ikinci ili 629-cu il iyunun 19-da başlanıb 630-cu il aprelin 27-də, onun öldürülməsi günündə qurtarıb.

115) *Didrahm* – Bizans qızıl puludur, vəzni təxminən 6,8 qramdır.

116) *Çorpan* (Çolpan – zəhra ulduzu) və *Tarxan* terminləri haqqında bax: *P.Qolden*, s.176-177.

117) Sebeosa görə (28-ci fəsil), Şəhrivaraz Xosrovun məğlubiyyətindən sonra Qərbdə qalıb bizanslılarla sülh bağlayır, çünki onun ordusu Xalkedon şəhərində mühasirədə qalmış idi.(bax: Feofan, s.323-324). Buna görə də heç cürə ola bilməz idi ki, o, bu vaxt "Fələstin ölkəsini öz əlində saxlayırdı". 630-cu ildə iki ay ərzində Şəhrivaraz İran şahı kimi tanınırdı.

118) Yəni xəzərləri.

119) "Südəmər" deyəndə Xəzər şahzadəsi Şad nəzərdə tutla bilər, amma əslində söhbət yeddi yaşında İran şahı elan olunmuş III Ərdəşirdən gedə bilər.

120) Öz kitabında havari İyeremiya belə deyir (I, 13-14): "Allah-təala məndən soruşdu: "Sən nə görürsən?". Mən dedim: "Küləklə odu alışdırmış qaynar qazanı görürəm və üzünü də şimal tərəfdən görürəm". Allah-təala da dedi: "Bu yer üzünün bütün sakinlərinin fəlakəti şimaldan başlanacaq". Müəllif İncilin bu kəlamını xəzərlərlə eyniləşdirir.

121) *III Yezdəgird* (632-652-ci illər) – II Xosrovun nəvəsi idi.

122) Həcər İbrahim peyğəmbərin arvadı Saranın qulluqçusu idi. Onun İbrahimdən İsmayıl adlı oğlu oldu. Bu da ərəblərin (ermənilər dedikləri – İsmayıllıların) ulu cəddi hesab olunur. Ərəblərə həcərlilər də deyilirdi.

123) Sasanın oğlu Ərdəşir Papakan Sasanilər sülaləsinin banisidir. Bu yenə sübut edir ki, Albaniyada çarlıq edən Mehranilərin mənşəyi Sasanilərlə bağlıdır. Bax: 91 və 92-ci qeydlərə.

124) Vardana görə (s.86), Albaniya knyazı Cavanşir və onun bacısı, erməni hakimi Qriqor Mamikonyanın arvadı, albanlar adından Qriqordan müqəddəs Qriqorinin çənəsini istəmişlər. M.Kalankatuklu qeyd edir ki, (41-ci fəsil), müqəddəs Qriqorinin çənəsi Albaniyaya I Varaz-Tiridatın-Cavanşirin qardaşı oğlu zamanı gətirilmişdir.

125) Bax: *Sebeos*, s.119.

126) İraqda əl-Batixa (Bataqlıq") və ən-Nəcəf gölüdür.

127) Qadisiyyə döyüşünün nə ayı, nə də ili düz deyil. Müxtəlif mənbələrdə bu döyüş üçün 635-və 638-ci illər göstərilir və məhz bu dövrdə İsanın Mövludu (6 yanvar) Meheqan ayına düşür. Təbəri və İbn əl-Əsir bu döyüş üçün hicri 15 ilin axırlarını (638-ci ilin yanvarı) göstərirlər.

128) Rus tərcüməsində "10 min piyada" gedir.

129) Bax: *Sebeos*, s.119; *Bəlazuri*, s.255-262.

130) Mədain ərəblər tərəfindən 637-ci ildə mühasirə edilmişdi. Yezdəgirdin "səkkizinci ili" isə 639-cu ilə düşür.

131) *Dastakert* və *Beklal* – İran şahlarının Mədaindən şimal-qərbdə yerləşən iki qalası idi (bax: *Feofan*, s.320-321).

132) Söhbət 642-ci ildə baş verən Nəhavənd döyüşündən gedir.

133) Söhbət Rəhilədən olan Yaqubun birinci oğlu Yusifdən gedir. Qardaşları Yusifi qul kimi Misirdə satdılar. Lakin Yusif ağlına və qabiliyyətinə görə Misirdə böyük hörmətə malik olub Firondan sonra ölkədə ikinci adam oldu. Uzun illər çəkən ayrılıqdan sonra, Yusif öz atasını pirani qoca kimi gördü. Bax: İncil. Kövn, XXX; Quran, Yusif surəsi.

134) Ehtimal, bu gürcü knyazı Atrnersehdir ki, Cuanşerə görə (XV, s.97), Xəzər xaqanı Zibel ilə birlikdə Tiflisin mühasirəsini davam etdirib şəhəri imperator İraklidən qəbul etdi. Qeyd edilir ki, o, 41-ci *mtavar* olaraq 619-cu ildən 639-cuılədək hökmranlıq etmişdir (M.Brosse. Gürcü salnaməsi, I, s.229-231). "İrakli qalanın (Tiflisin) mühasirəsini xaqan Cibquya və Adarnasa tapşırdı; sonra Adarnası Gürcüstan çarı təyin etdi" (M.Canaşvili. Известия... s.23-24). Atrnersehin adı VII əsrin başlanğıcında gürcü knyazı kimi "Məktublar kitabında" çəkilir (s.133, 138, 169). Onun "Roma imperiyasından üç titulu (ünvanı) var idi". Kürion (s.165) deyir ki, onun "çarlar çarı titulu bizanslıların canişini tituluna oxşayır". Bax habelə Atrnerseh hivpata aid olan M.Brosse tərəfindən kəşf edilən yazılar (Gürcüstana arxeoloji səyahət haqda hesabatlar, s.48-50; *Gürcü salnaməsi*, I, s.232). Atrnerseh dövründə "Altıncı ümumdünya kilsə qurultayı Kartaliniya, Kaxetiya, Şəki, Şirvan, Svanetiya, Çərkəz, Osetiya ilə birlikdə bütün dağlıq vilayəti, bütün Yuxarı Gürcüstanı və Samsxeni Msxeta patriarxına tabe etdi.

Gürcüstan katolikosu Qara dənizdən Dərbəndə qədər bütün xalqlar və ölkə çarlarının tacqoyma mərasimini keçirir və keşişlərinə rütbə verir" (*Gürcü salnaməsi*, I, s.236; M.Canaşvili, s.25-26). Əgər Atrnersehin çarlıq ixtiyarı alması düz 639-cu ilə təsadüf edirsə, onda Cavanşirin iranlılardan uzaqlaşıb getməsi Mədain döyüşündən sonra (637-ci il) və Nəhavənd döyüşündən əvvəl (642-ci il) ola bilərdi.

135) Yezdəgirdin hakimiyyətinin 20-ci ili h.31 (24.VIII.651-11.VIII.652) -ci il təsadüf edir. Deməli, Cavanşirin hakimiyyətinin birinci ili 637/8-ci ilə düşür.

136) Albanlar, habelə gürcülər və süniklilər 654-cü ildə Ermәniyyәni ərəblərə təslim edən Teodor Rştuninin tərəfdarları kimi qeyd edilirdilər. (*bax: Sebeos,* 151-155). Cavanşirin atası əmələ gəlmiş vəziyyəti yaxşı başa düşürdü və onun qəbul etdiyi qərar yeganə düzgün qərar idi. Cavanşir isə, görəcəyimiz kimi, Muşeq Mamikonyana və imperator II Konstanta (641-668-ci illər) tərəf meyl göstərdi. Albaniya xalqına gəldikdə isə, Bizans imperiyasına möhkəm müqavimət göstərdiyinə görə Cavanşirin müttəfiqi adlananlar bu xalqı amansızcasına qarət etdilər (*bax: Sebeos,* s.155: "II Konstant öz qoşununun bir hissəsini İberiyaya, Albaniyaya və Sünikə göndərdi ki, onların (Rştuni ilə) ittifaqını pozsun. Bizans qoşunları onların ölkələrini qarət etdi və tapdıqları hər şeyi talan edərək öz imperatorlarının yanına qayıtdı).

137) Birinci xəlifə Əbu Bəkr 632-634-cü illərdə hakimiyyətdə olub.

138) Ömər ibn əl-Xəttab 634-644-cü illərdə xəlifə olub.

139) Osman ibn Əffan 644-656-cı illərdə xəlifə olub.

140) Osmandan sonra xəlifə Əli ibn Əbutalib olmuşdur (656-661-ci illər). Adı çəkilən Abdulla isə xəlifə Ömər ibn əl-Xəttabın oğludur. Osmanın öldürülməsindən sonra Əli xəlifəliyi Abdullaya təklif etdi, lakin o, bu təklifi qətiyyətlə rədd etdi. Abdulla 693-cu ildə Məkkədə 84 yaşında vəfat edib.

141) Əməvilər sülaləsinin banisi Müaviyə ibn Əbu Sufyan 661-680-cı illərdə xəlifə olub.

142) I Yəzid ibn Müaviyə 680-683-cü illərdə xəlifə olub.

143) I Yəziddən sonra bir il (683-cü ildə) xəlifə II Müaviyə və I Mərvan (683-685-ci illər) olublar. Mətndə onlar yoxdur.

144) Həccac ibn Yusif (661-714) – Əbdülməlik (685-705-ci illər) və I Valid (705-715-ci illər) xəlifələrin dövründə məşhur dövlət adamı.

145) On il.

146) Süleyman 715-717-ci illərdə xəlifə olub.

147) Ömər ibn Əbdüləziz 717-720-ci illərdə xəlifə olub.

148) II Yəzid 720-724-cü illərdə xəlifə olub.

149) Hişam 724-743-cü illərdə xəlifə olub.

150) II Valid 743-cü il fevralın 6-da öldürülüb.

151) II Mərvan Əməvilər sülaləsinin sonuncu xəlifəsi (744-750-ci illər). Ondan qabaq 744-cü ildə iki xəlifə olub: III Yəzid və İbrahim. O, Abbasi sərkərdəsi Əbu Avi ilə döyüşdə 750-ci il avqustun 5-də öldürülmüşdür.

152) Abbasilər sülaləsinin banisi Əbülabbas Abdulla əs-Səffah 750-754-cü illərdə xəlifə olub.

153) Əbu Müslim Xorasani (digər adı Əbdürrəhman ibn Müslim, 719-755-ci illər; sikkələrində də bu adla zikr olunur, amma bəziləri bu adı sonradan aldığını deyirlər). Sərdar və hakim olub. Xorasandakı dini və siyasi hərə-

katın başına keçərək Əməviləri devirmiş və Abbasiləri taxta çıxarmışdır. Lakin Abbasilər tərəfindən 755-ci il fevralın 13-də öldürülmüşdür.

154) *Əl-Mansur Əbu Cəfər Abdulla* – ikinci Abbasi xəlifəsi (754-775-ci illər) 775-ci ildə Məkkəyə həccə gedərkən ölmüşdür.

155) *Əl-Mehdi Əbu Abdulla* – üçüncü Abbasi xəlifəsi, 775-785-ci illərdə xəlifə olub.

156) *Musa Hadi Əbu Məhəmməd* – dördüncü Abbasi xəlifəsi – 785-ci il avqustun 4-dən 786-cı il sentyabr ayınadək xəlifə oldu.

157) *Harun ər-Rəşid* – Abbasilər sülaləsinin beşinci, ən məşhur xəlifəsi. 786-cı ildən 809-cu il martın 24-dək (ölümünə qədər) xəlifə olub.

158) *Amin* – altıncı Abbasi xəlifəsi (809-813-cü illər).

159) *Məmun* – yeddinci Abbasi xəlifəsi 813-833-cü illərdə hökmranlıq edib.

160) Xəlifə Mehdinin oğlu Məmun 817-ci il martın 24-də Həzrət Əli tərəfdarlarından Əli ər-Rizan özünə xələf təyin edəndə, Abbasilər tərəfdarları arasında qarışıqlıq oldu və bunlar 817-ci il iyulun 24-də Məmunun əmisi İbrahimi əl-Mübarək adı ilə xəlifə elan etdilər. Lakin 819-cu ilin iyulunda o, xəlifəlikdən imtina etdi.

161) Erməni 280-ci ili 831-832-ci illərə təsadüf edir.

162) Bizans imperiyasının özündə çox nadir hallarda verilən bu rütbə haqqında bax: Feofan, s.380.

163) Smbatyan "Şərqin" yerinə "Şərq ölkəsi" yazır.

164) İmperator II Konstansın Cavanşirə verdiyi hüquqların ziddinə xəlifə Osman 654-cü ildə Teodoros Rştuniyə "Erməniyyə, Albaniya və Sünik üzərində Qafqaz dağları və Çola darvazasınadək hakimiyyət verdi" (Sebeos, s.159) Lakin Sebeosa görə, bu zaman xəlifə I Müaviyə (661-680-ci illər) imiş.

165) İraklinin Yevdokiyadan olan böyük oğlu Konstantin qəflətən 641-ci ildə öldü və taxtda cəmi üç ay (103 gün) oturdu. Buna görə mətn a m s e r i s (üç il) yerinə a m i s s e r i s (üç ay) oxunmalıdır.

166) Erməni təqviminin 80-ci ili 631-ci il iyunun 22-də başlanıb 632-ci il iyunun 20-də bitdi. Bu vaxt imperator İrakli hələ hakimiyyətdə idi.

167) II Konstans (II Konstant və ya III Konstantin) 641-668-ci illərdə imperator olub. Amma 31-ci fəsildə onun hakimiyyətinin "otuzuncu ilindən" bəhs olunur.

168) Hicri 25-ci ildə (28. X. 645-16. X. 646) Misrin İskəndəriyyə şəhərində yaşayan bizanslılar imperator Konstansa məktub yazıb şəhəri ərəblərdən almaq üçün təhrik etdilər. Konstantinopoldan gəmilərlə böyük ordu göndərildi və şəhər yenə də bizanslıların əlinə keçir. Amma Əmr ibn əl-Asın

qoşunları tezliklə burada olan Bizans qüvvələrini ağır döyüşdə məğlub edib, yenə də İskəndəriyyəyə sahib oldular.

169) II Konstansın hakimiyyətinin 19-cu ili 659/ 660-cı ilə düşür. Erməni təqviminin 111-ci ili 662/663-cü ilə düşür. Nerses 642-ci ildə katolikos seçilib.

179) Bu Zvartnosdur.

171) Bu əfsanə haqqında bax: Xaçaturyanın "Erməni arxitekturası" adlı əsərinə (Paris, I, 1948, s.80).

172) Orta əsr Azərbaycanın cənubunda bir kənd. Həmçinin bax: M.V.Krivov. II Konstantın Zaqafqaziyaya az məlum yürüşü haqqında, s.153-155.

173) Bax: 19-cu fəslə. Deməli, Cavanşirin birinci evliliyi 638-ci ildən 659-cu ilədək davam etdi.

174) 656-661-ci illərdə ərəblər tərəfindən təyin edilmiş Erməniyyə valisi.

175) Uxtanes 670-682-ci illərdə Albaniyanın katolikosu olub.

176) *Sihyan* – Qüds şəhərində məşhur məhəllənin adıdır. Burada eyni adlı kilsə var.

177) Ola bilsin 661/662-ci ildə.

178) Ola bilsin 661/662-ci ildən 663/664-cü ilədək.

179) Erməni təqviminin 112-ci il arats ayının on biri 663-cü il noyabrın 21-nə düşür.

180) Bir az sonra Cavanşir xəlifəyə tabe olacaq (bax: 30-cu fəslə)

181) Bu, Cavanşirin üçüncü arvadıdır. Birincisi 659-cu ildə vəfat edib(bax: 183-cü qeydə) 665-ci ildə o, Hun çarının qızını alır (bax: 29-cu fəslə).

182) Ola bilsin 663-cü ilin noyabrından 664-cü ilin noyabrına və ya dekabrınadək.

183) *Dzmernayin eqanaki hasarakut' ivn* – "qış mövsümünün ortası" 664-cü il, 21 dekabr.

184) Mətndə bu söz d a v i l şəklində gedir, bu da ərəbcə t a x v i l – "çek, qəbz" deməkdir. Lakin burada daha uyğun və d a v i l ə yaxın olan yenə də ərəbcə a q a v i l – pakt, müahidə, müqavilədir.

185) Yəni 664/665-ci ildə.

186) Hedeonun tikanlı kolu – burada söhbət yetmiş qardaşını öldürmüş və Sihəmdə çar seçilmiş Hedeonun Sihəmli kənizindən doğulmuş oğlu Avimelehdən gedir. Bu haqda bax: İncil. İsrail hakimlərinin kitabı IX.

187) Burada Bizans imperiyası nəzərdə tutulur.

188) Əməvilər xilafətin paytaxtını Məkkədən Diməşqə 667/668-ci ildə köçürüblər.

189) Yəni xəlifə I Müaviyə.

190) Ərəblərin 662-682-ci illərdə Erməniyyədəki valisi.

191) I Anastas 661-667-ci illərdə katolikos olub.

192) 667-670-ci illərdə.

193) Konstansın hakimiyyətinin 30-cu ili 670/671-ci ilə düşməlidir, lakin o, 668-ci ildə Siciliyada edam edilmişdi. Bizanslıların elçiləri k u b i k u l a r i Andreasın başçılığı ilə (Feofan, s.348-350) 667-ci ildə Konstansın ölümündən bir il qabaq, Diməşqə, erməni qiyamçısı Soboriusa (Şapuha) qarşı xəlifədən kömək istəmək məqsədilə gəlmişdi. Soborius da öz tərəfindən elçi Sergiosu (Sarkisi) xəlifə I Muaviyanın yanına göndərib, bizanslılardan bac tələb etdi. Təhqir olunmuş Andreas Diməşqi tərk etdi və öz vəzifəsini yerinə yetirməkdə müvəffəqiyyət qazanan Serqios üçün pusqu düzəldir. Çox ehtimal, Cavanşir danışıqlarda iştirak edirdi. Bizə belə gəlir ki, 667-ci il Cavanşirin danışıqlarında iştirak edirdi. Bizə belə gəlir ki, 667-ci il Cavanşirin Diməşqə ilk və ehtimal, yeganə səfəri olmuşdur.

194) *Teodoros* – yunanca "Allah töhfəsi" deməkdir.

195) Uxtanes Albaniyanın katolikosu 670-682-ci illərdə olub.

196) Smbatyan həmişəki kimi "Şərqin" əvəzinə "Ermənіyyənin şərqdəki vilayəti" ("Восточный край") yazır.

197) Havarilər İsa səmalara köçəndən sonra onu otuz quruşa satan İudanın yerinə havarilər sırasına Matfiyi seçdilər. Bax: İncil. Əhdi Cədid, Müqəddəs havarilərin əməlləri, I, 26.

198) Yelizarın katolikosluğu 682-688-ci illərə düşür. Lakin 39-cu fəsildə Hunların 681-ci il iyunun 9-u ilə dekabrın 23-ü arasında Albaniyaya hücumları vaxtında katolikos rütbəli Yeliazar knyaz Varaz-Tiridat tərəfindən hunlara elçi kimi göndərilir. Cavanşir 680-cı ilin sentyabrın və 681-ci ilin iyunu arasında vəfat edib (bax: 38-ci fəsil, qeyd 221)

Buna görə onun katolikosluq vaxtı bəlkə altı il yox, yeddi il çəkib – 681-688-ci illər.

199) Təxminən 680-ci il.

200) 680-683-cü illərdə erməni təqviminə görə yeni il iyunun 9-na düşürdü. Bax: E.Dülauriyer. Xronoloji, s.10-11.

201) 680-ci ildə bu bayram sentyabrın 11-i və 17-si arasında, ola bilsin ayın 16-da olub.

202) Cavanşirin ölümü Alp İl-itverin basqınından qabaq – 681-ci ilin iyun ayının 9-u ilə dekabr ayının 23-ü arasında və çox güman, 680-ci ilin sentyabrından sonra olub (bax: 208-ci qeydə və 38-ci fəslə)

203) Zənnimcə, Dəvdağın alban şairi olması məsələsi şübhəlidir. Əlbəttə, o, ağını yazaraq alban əlifbasının bütün 52 hərfindən istifadə edib, bu da sübut edir ki, o, alban dilini əla bilirdi. Erməni əlifbasının isə 36 hərfi var idi və var.

204) Smbatyan burada mətndən kənara çıxır və özfəaliyyətə keçərək: "Он сочинил этот плач о благодетельном Джеваншире строфами, (начинаю-

шимися с букв) по порядку (армянского) алфавита". Akroşer (akrostix) – "sətirlərin baş hərfləri bir söz və ya cümlə əmələ gətirən şeir" (Rusca-azərbaycanca lüğət. 3-cü nəşri, I cild, Bakı, 1971. s.25).

205) "Dəvdək qəsidəsinin bir neçə bəndi vaxtı ilə şair Mikayıl Rzaquluzadə tərəfindən tərcümə olunmuşdur. Həmin tərcümənin 4-5 bəndi "Azərbaycan ədəbiyyatı tarixi"nin I cildində iqtibas da edilir. Lakin qəsidə bütövlükdə ilk dəfədir ki, tərcümə olunur. Qeyd etməliyəm ki, şair Xəlil Rza həmin əsərin tərcüməsi üzərində uzun müddət işləmişdir. O, Dəvdaq qəsidəsinin formasını, vəznini, məzmununu və ruhunu diqqətlə öyrəndikdən sonra tərcüməyə başlamışdır. Dəvdəkin qəsidəsinin rus dilində mövcud olan bütün tərcümələrini tutuşdurmuş və onları prof. Ziya Bünyadovun Azərb. SSR EA "Xəbərlər"ində çap etdirdiyi (1961, №4, s.6-9) variantla bir daha yoxlamışdır. Beləliklə də, o, müəyyən mənada əsəri elmi-tənqidi mətn əsasında tərcümə etmişdir". Bax: Q.Voroşil. Azərbaycan şairi Dəvdək, Ulduz. Bakı, 1971, s.34-39.

206) *Havari İsayya İudeyada* – Oziya, İoafam, Axaz və Yezekiya adlı çarların hakimiyyəti dövründə yaşamışdır (e.ə. 785-715-ci illərdə). Bax: İncil. İsayyanın kitabı. I, II fəsillər.

207) Bax 211-ci qeydə.

208) Söhbət xəlifə I Müaviyədən gedir.

209) Təbəriyə gölü Fələstindədir.

210) Xəzərlər nəzərdə tutulur.

211) Varaz-Tiridat Albaniya taxtını xəzərlərin 681-ci ilin yayındakı basqınından və keşiş İsrailin hicri 62-ci ildəki elçiliyindən və Yeliazarın katolikosluğu vaxtında (680-ci və ya 681-ci ildən 688-ci ilə qədər. Bax: 208-ci qeydə), ehtimal ki, 681-ci ildə tutmuşdur.

212) Asoqik (s.72) xəzərlərin bu basqınını erməni təqviminin 130-cu ilinə aid edir. (681-ci il iyun ayının 9-u daxil olmaqla). Bu basqın İsrailin elçiliyi ərəfəsində, yəni 681-ci il dekabrın 23-dən qabaq olmuşdur. Bax: yuxarıdakı qeydə.

213) Alp İlituer (Alp el Təbər) şəxs adı haqqında bax: P.Qolden, I, s.147-150.

214) Bax: 212-ci qeydə.

215) III Sahak ermənilər katolikosu taxtında 679-702-ci illərdə oturmuşdu.

216) Söhbət Qriqor Mamikonyandan gedir (662/663-685-ci illər).

217) Nerses 642-661-ci illərdə ermənilər katolikosu olmuşdur.

218) Vardan bu barədə yazır (s.86): "Deyirlər ki, müqəddəs Qriqorun qaxımış cəsədini Erməniyyəyə Konstantinopola elçiliyə gedən Qriqor Mamikonyan gətirib. Bu cəsədi ona bir adlı-sanlı şəxs vermişdi, knyaz da bu qiymətsiz xəzinəni hamıdan gizli olaraq gəmidə aparmışdı. Cavanşirin və Qriqorun

arvadı olan onun bacısının xahişi ilə müqəddəs Qriqorun çənəsini Albaniya ölkəsinə verdi". Deməli, Cavanşirin bacısının adı Yelena idi.

219) Smbatyan "Albaniya vilayətindən" yazır.

220) Vardan yazır (s.87): "Bəziləri deyir ki, Qriqorun bütün cəsədi Tordəndən gətirilmişdir və Albaniya knyazı Varaz-Tiridatın əmri ilə İsrail adlı birisi gedib Qriqorun çənəsini yalvarıb almışdı. Çənəni götürüb, onu Qlxoy Vəngdə yerləşdirdi".

221) Hicri 62-ci il 681-ci il sentyabrın 20-də başlanıb 682-ci il sentyabrın 9-da bitir (bax: 208-ci qeydə).

222) Nə S.Yeremyan, nə də Ş.Smbatyan Alban elçiliyinin yola düşməsi tarixini (684-cü il) düz göstərmirlər. Moiseyin yazdığı hicri (mətndə ərəblərin) 62-ci ilindəki hadisə, yəni İsrailin səfərə çıxması erməni təqviminə görə 130-cu il mehekanın 18-də olub, bu da 681-ci ilin 23 dekabrına düşür. Lpink şəhərinə mehekanın 29-da, yəni 682-ci il yanvarın 3-də gəldilər. Xaçaçuran (Kreşeniya, boqoyavleniye) bayramı Areq ayının 2-də – 682-ci il yanvarın 6-da olub. Deməli, İsrail və onu müşayiət edənlər. Lpink şəhərində üç gün qalıblar. Elçilik haqqında bax: S.Q.Yeremyan. O posolğstve, s.129-155; J.Kulakovski, s.186; D.M.Danlop s.59; N.Akinyan, s.324-320; Y.Cəfərov. Tsri şəhəri və Çilblər ölkəsi, s.71 və sonrakı.

223) Çilblər haqqında bax: Y.Cəfərovun göstərilən məqaləsinə.

224) Bax: Birinci kitabın 10-cu fəslinə.

225) 682-ci ildə Pəhriz fevralın 8-də başlanıb.

226) Varaçan şəhərinin yerləşməsi haqqında bax: V.Q.Kotoviç. "О местонахождении городов Варачана, Беленджера и Таргу" adlı məqaləsi. Bu haqda mülahizələr həmin məqalədədir.

227) S.T.Yeremyana görə, Bərdədən Varaçana İsrailin səfəri 51 gün çəkmişdir (s.134). V.F.Minorskiyə və Y.Cəfərova görə 47 gün, Ç.Dovsetə görə isə altı həftə çəkmişdir (s.155, qeyd 3).

İsrailin getdiyi yol haqqında mülahizələr üçün bax: Y.Cəfərovun göstərilən məqaləsinə.

228) Strabonda (XI, 6, 8) deyilir: "Onlar (masagetlər) yalnız Günəşi ilahi bilir və ona at qurban verirlər". Pəhləvan dilində xvar – günəşdir. Orta-qıpçaq və ərəb-fars dillərində *x* və *h q* hərfi vasitəsilə işlənir. Bax: *T.Halasi Kun*. Türk dili və tarixi haqqında araşdırmalar, I, 49 və sonrakılar. Fars və erməni dillərində **xur** sözünün mənası belədir: farsca – xur, xvar, xarena – günəş, od (bax: И.М.Оранскu. Введение в иранскую филологию, с.57), ermənicə – görünməyən, maddi olmayan od (bax: Н.О.Емин. Очерк религии и верований языческих армян, с.27, 51). Bax: Ziya Bünyadov. Azərbaycan VII-IX əsrlərdə s.224-225.

229) Markvarta isnadən N.Adons (Армения, с.447) yazır: "Bəzi işarələrə görə İranda atlı qoşunlar Spandiat nəslinin əlində idi. İran əfsanələrində Vistasp oğlu Spandiat bir çox xalqların üzərindəki qələbələri ilə məşhur idi. Alan darvazasının tikilməsi və Dəmir-qapı qalasının fəth edilməsi ona isnad edilir. Onun igidliyinə "Peykər-namə" adlı kitab həsr olunur".

230) İbn Fədlanın səyahətnaməsində (Kovalevskinin nəşri, s.344) yıltavar kimi verilir. Bunu K.Seqledi yiltavar kimi oxuyub bolqar-türk ünvanı hesab edir (bax: Bir bolqar-türk titulu, s.182-186). Bu barədə düşüncələr haqqında bax: P.Qoldenin əsərinə, s.147-150.

231) Qafqaz xalqları arasında olan at aini haqqında bax: R.Bleyxştaynerin əsərinə (alman dilində).

232) Tarxan haqqında mülahizələr üçün bax: E.Şavann. Sənədlər, s.19, qeyd 2; P.Qolden, s.210-213.

233) Bəlkə bu Çatkasar sonralar adı çəkilən və Kirakosdan keçən Cebu xaqanın oğlu Şad Xəzərdi? Bu barədə bax: P.Qolden, s.173-174.

234) Tiqin (teqin) haqqında bax: Abu-l-Qazi. Rodoslovnaə turkmen s.97, 127-ci qeyd; L.Qumilyov. Древние тюрки, s.53; P.Qolden, s.186-187.

"Hüdud əl-aləmə" görə Xursan Dərbəndlə Şirvanın arasında, Qafqaz dağları ilə üzbəüz yerləşir (Bax: В.Минорски, с.144-145, 411).

Ç.F.Dovsetdə "Xorasan"dır.

235) Bax: 226-cı qeydə.

236) İovan Mayraqomlu (VI əsrin sonu – VII əsrin əvvəllərində yaşayıb) – xaçpərəstlikdə məşhur təriqətçi.

237) Bax 8-ci qeydə.

238) İohan Baqaranlı (611-ci ildə ölüb) 591-ci ildə bu xalkedonçu katolikos seçilmişdir.

239) Bu məktub haqqında bax: N.Akinyan. Gürcü katolikosu Kivrion, s.38-39.

240) İudeya çarı I Böyük İrod e.ə. 37-4 illərdə hakim olub.

241) Smbatyan yazır: "Pand vəngi Qüdsdə olan ən zəngin erməni vənglərindən biri idi".

## ÜÇÜNCÜ KİTAB

1) Yeliazar 682-688-ci illərdə katolikos olub. Bax: İkinci kitabın 208-ci qeydinə.

2) Bax: İkinci kitabın 8 və 19-cu qeydlərinə.

3) Nerses 17 il yarım katolikos olub. Bax: 5-ci fəslə.

4) 701 və ya 702-ci ildə.

5) Deyəsən bu vaxt Varaz-Tiridat Konstantinopolda saxlanırdı (bax: 10-cu fəslə). Şeronun özü 705-ci ildə ərəblər tərəfindən Suriyaya aparılmışdı (bax 13-cü fəslə).

6) İlya 703-717-ci illərdə katolikos olub.

7) Bu məsələlər haqqında mənim "Azərbaycan VII-IX əsrlərdə" kitabımın 93-cü və sonrakı səhifələrinə bax.

8) Hələ İ.P.Petruşevski (О дохристианских верованиях крестян Нагорного Карабаха, с.8) haqlı olaraq göstərirdi ki, erməni kilsəsi Albaniyada "ölkənin erməniləşdirmək aləti olmuşdur. Onun rolu VIII əsrin başlanğıcından etibarən xüsusilə nəzərə çarpır, yəni o zamandan erməni monofizit katolikosu İlya xalkedonçu Albaniya katolikosu Nersesi (Bakuru) ərəb xəlifəsinin köməyi ilə devirmişdi və Albaniyada ruhanilər və knyazların bir hissəsini, Albaniya kilsəsinin erməni kilsəsindən müstəqilliyini qorumaq cəhdini əks etdirən xalkedonçuluq (pravoslav, yunanpərəst, gürcüpərəst) hərəkatı ermənipərəst monofizitlər tərəfindən yatırılmışdır".

N.Y.Marr da vaxtilə göstərmişdir ki, Albaniya ərəb xəlifələrinin köməyi ilə "Erməniyyənin antixalkedon kilsəsinin əlinə keçmişdir" (Arkaun, s.7).

Erməni katolikosluğu və nahararlarının mənafeyi hər dəfə tələb etdikdə erməni kilsəsi həmişə yadelli işğalçıların köməyinə əl atır, "Xaç bayrağı ilə öz yolu üzərində tarixi Albaniya və onun bir hissəsi olan Qarabağ (Arsax) xalqlarını yox edirdi" (bax: А.С.Вартапетов. К вопросу, с.9).

Smbatyan buna etiraz edərək yazır: "Прежде всего следует напомнить, что в исторической Албании в это время жили только армяне и уже поэтому суждения о каком-либо антогонизме между армянами и жителями исторической Албании не имеют под собой никакой почвы" (bax: Smbatyan, s.228-230, qeyd 26).

Erməni kilsəsi havarilər xaçpərəstliyindən dönük hesab olunub İsanın şagirdləri – havarilərdən yox (Albaniya kilsəsi kimi), bu şagirdlərin şagirdlərindən yox (gürcü kilsəsi kimi), yalnız üçüncü nəsildən xaçpərəstliyi qəbul etdikləri üçün indi öz kilsələrini mənimsəmə yolu ilə qədimləşdirirlər.

Bu əhvalatı 725-ci ildə vəfat edən erməni müəllifi İovannes Drasxanakertsi də təsdiq edir: "Böyük İlya katolikosunun vaxtında, o zaman Albaniyanın katolikosu olan Nerses özünü allahsızlıqla azdırıb şərli bir qiyama baş vurub özünə onunla razı olan o zamankı Albaniyanın məlikəsilə əlbir oldu. Birləşərək, onlar insana ibadət etdirən papaz Levin təlimini bütün ölkəyə qəbul etdirmək istəyirdilər. Bunu bilən ölkənin əyanları məsələni erməni katolikosuna çatdırdılar.

İlya öz hikmət və ürəyinin genişliyini işə qataraq ərəblərin Əmirəlmömini olan Ömərə (Əbdülməlik olmalıdır – *Z.B.*) məktub yazıb ərz etdi ki, "Alban-

lar ölkəsində bir yepiskop və onun kimi bir qadın (Sparama) vardır. Bunlar sənin böyük dövlətinə tabe olmaqdan boyun qaçırıb, oxuduğumuz dualarda sənin adını çəkmək məsələsində bizimlə (ermənilərlə – *Z.B.*) bir deyildirlər, əksinə, Bizans imperatorunun adını çəkib ölkəmizi onlara vermək fikrindədirlər. Əgər təcili surətdə onları aramızdan götürüb məhv etməsən, onlar vergi məsələsinə və digər işlərdə tez bir zamanda bizanslılar tərəfə keçərlər".

Bunu oxuyub Əmirəlmöminin katolikos İlyanın elçisinə hörmət etdi və xadimlərinin birini göndərib əmr etdi ki, dərhal həmin Nersesi böyük məlikə ilə birlikdə onun yanına gətirsinlər. O gedib hər ikisini tutur və zəncirə bağlayaraq dəvələrə mindirir və Əmirəlmöminin yanına aparır. Dönük Nersesin yerinə İlya başqa yepiskopu təyin edir. Nerses isə on dörd il katolikosluqdan sonra vəfat edir" (Erməniyyə tarixi, s.97; bax: Vardan, s.92).

9) 704-706-cı illərdə.

10 V.Minorski (Kavkazika IV, s.508, qeyd 6) hesab edir ki, bu İran izafələri nəsil mənsubiyyətini göstərirlər.

11) Bu cümlə Smbatyanın tərcüməsində yoxdur.

12) Tarixlər düzgün gəlmir. Hicri 85-ci il 704-cü il yanvarın 14-də başlanıb 705-ci il yanvarın 2-də bitir. Erməni təqviminin 148-ci ili 669-cu il iyunun 5-də başlanıb. 700-cü il iyunun 3-də bitir. Bu tarixdə İlya katolikos olmayıb. Onun katolikosluğu 703-717-ci illərdə olub.

Erməni 148-ci ilin Hrodis ayı 700-cü il aprelin 30-da başlanıb, may ayının 29-da bitir. Əgər Hicri 85-ci ilin Hrodis ayından söhbət getsə, bu da erməni təqviminin 152-ci ilinə düşür (başlanır 704-cü il aprelin 4-də və mayın 28-də bitir).

Bərdə kilsə qurultayı 704-cü ildə çağırılıb, çünki 704-cü ilin iyun ayında knyaz Şero Suriyaya aparılmışdır (bax: 13-cü fəslə).

13) Mehranilər soyundan olan Vardan və Qaqik Varaz-Tiridatın oğullarıdır. Bərdə kilsə qurultayı vaxtı onlar Konstantinopolda girov saxlanırdılar (bax: 10-cu fəslə).

14) Bax: Birinci kitabın 10-cu və 21-ci fəsillərinə.

15) Bu, 20-ci fəsildə sayları çəkilən "yeddi qanundur", amma mətndə buna oxşar bir şey yoxdur. Patkanyan mətni altıya bölür.

16) Smbatyan "bütün dünya üçün" yerinə "(erməni) ölkəsi üçün" tərcümə edir.

17) İmperator II Ustinian və xəlifə Əbdülməlik arasında təxminən 685-ci ildə bağlanılan sazişə görə Qafqaz ölkələrindən yığılan vergilər Xilafətlə Bizans imperiyası arasında bölünürdü. Bax: Q.Ostroqorski. Bizans dövlətinin tarixi, s.85.

18) Bir qədər aşağıda mətndən aydın olur ki, Varaz-Tiridatın iki oğlu – Qaqik və Vardan Konstantinopolda, Bardanesin imperator taxtına oturma-

sına qədər, yəni 699-cu ilin axırından 711-ci ilə qədər dustaq kimi saxlanırdı. Bunun da səbəbi ondan ibarət idi ki, ataları Varaz-Tiridat Albaniyanı ərəblərə təslim etmişdi. Və bu hadisə 699-cu ilin axırına düşür. Demək, Varaz-Tiridat və oğulları Bizantaya təxminən 694-cu ildə gəlmişlər. Əgər bu belədirsə, onda Varaz-Tiridat bizanslıların əlindən 699-cu ildə qurtarıb, gərək 704-cü ildə keçirilən Bərdə kilsə qurultayında iştirak edəydi. Amma bilindiyi kimi, bu qurultayda mülki hakimiyyəti knyaz Şero təmsil edirdi (bax 5-ci qeydə). Bəlkə Varaz-Tiridat arvadı Sparamanın kilsə tərəfindən alçalması vaxtında hakimiyyətdən məcburi kənar edilmişdir. Amma oğulları Qaqik və Vardan Konstantinopolda 699-cu ildən 711-ci ilədək qaldıqları halda, 704-cü ildə keçirilən Bərdə kilsə qurultayının qərarını necə imza etdikləri (bax 6-cı qeydə) aydın deyil.

19) Bu nağıl xronoloji baxımdan uyğunsuzdur, çünki katolikos Yeliazar 688-ci ildə vəfat edib. Bax: İkinci kitabın 208-ci qeydinə və üçüncü kitabın birinci qeydinə.

20) II Yustinian Rinotmetos 711-ci ilin dekabrında öldürülmüşdür.

Bardanes Filipikos 711-713-cü illərdə imperator olub.

21) Qəribədir ki, A.Y.Kakovkin adlı birisi, Erm. SSR EA Tarix-filoloji jurnalının 1987-ci il birinci nömrəsində (s.234-235) dərc etdiyi "Великий мастер золотого дела Варазо" adlı yazısında alban zərgəri Varazonu erməniyə çevirib və yazır: "Варазо, открывающий длинный список мастеров золотых и серебряных дел Армении". Bu dələduzluğa nə demək olar?

22) 269-cu ildə.

23) Samosatlı Pavel 260-cı ildən Antakiyanın yepiskopu idi. O, İsanın Allah mənşəli olmasını inkar edirdi. O deyirdi ki, Üç Uqnum (Allah Ata, Allah Oğul, Allah Müqəddəs Ruh) üç Allah yox, üç əsas kamillikdir ki, onların vasitəsi ilə də Allah insanlar qarşısında zühur etdi.

268-ci ildə Antakiyada toplaşan kilsə qurultayı Paveli pisləyib yepiskopluqdan kənar etdi.

24) Afanasi 296-373-cü illərdə İskəndəriyyənin yepiskopu idi. Ariyin bax: İkinci kitabın 9-cu qeydinə) qəddar düşməni idi.

25) Qeysəriyyəli Vasili və ya Böyük Vasili (329-379-cu illər). 370-ci ildən Qeysəriyyənin yepiskopu, xristian dininin böyük şəxslərindən sayılır.

26) Ağac budaqları (Kuşi) bayramı yəhudilərin ən böyük bayramıdır. Misir əsarətindən qurtarandan sonra İsrail oğulları yeddi gün müxtəlif ağacların budaqlarını qırıb onların altında qalırdılar (bax: İncil. Musanın üçüncü kitabı, XXIII, 39-44; Musanın beşinci kitabı, XVI, 16).

27) Bax: İkinci kitabın 9-cu qeydinə.

28) Yuvenal Qüdsün yepiskopu olub (421-ci ildən). 458-ci ildə vəfat edib.

29) 146-cı erməni ili 697-ci il iyunun 5-də başlanıb 698-ci il iyunun 4-də bitib. Feofan (s.366) bu hadisəni 693-cü ilə aid edir. Söhbət xəlifə Əbdülməlikin qardaşı Məhəmməd ibn Mərvandan gedir.

30) İbn Əsam əl-Kufi (s.12-13) bu barədə belə deyir: "Məhəmməd ibn Mərvan Übeydallah ibn Abi Şeyx əl-Əviyy adlı silahdaşını çağırıb ona on min Şam döyüşçülərindən tabe etdirib əmr etdi ki, O, Ermənіyyəyə basqın edib orada olan xəzərlərlə və allahsızların başqa nümayəndələri ilə hərbi əməliyyata girişsin. Übeydallah ibn Abi Şeyx də öz qoşunları ilə Ermәniyyə ölkəsinə daxil olur. Bundan xəbərdar olan ermənilər müsəlmanların əleyhinə yüz mindən artıq olan nəhəng bir qoşun çıxardırlar. Onlar müsəlmanların hamısını qırıb, heç birisini sağ qoymadılar və sonra da onların mallarına və silahlarına sahib oldular. Onlar müsəlmanların bütün mallarını əllərindən aldılar".

31) Burada nəsildən yox, müqəddəs Qriqorinin adına monastırın ərəblər tərəfindən qarət edilməsindən söhbət getməlidir.

32) İbn Əsam əl-Kufi (s.13-14) hadisəni belə izah edir: məğlubiyyətdən) xəbərdar olan Məhəmməd ibn Mərvan müsəlmanların başına gələndən çox kədərləndi. Lakin sonra o, qoşunlarını çağırıb 40 minlik ordusu ilə yürüşə çıxdı.

Qoşunları ilə Ermәniyyənin ortalarına çatanda onun qabağına bizans və ermənilərdən ibarət nəhəng qoşun çıxdı. Məhəmməd ibn Mərvan onun əleyhinə çıxan allahsızların nəhəng çoxluğu tərəfindən məğlub olub rüsvay ediləbiləcəyinə baxmayaraq, onlarla amansız döyüşə girişdi. Lakin edilə biləcəyinə baxmayaraq, onlarla amansız döyüşə girişdi. Lakin Allah-təala müşrikləri qaçmağa məcbur edib müsəlmanları isə Öz himayəsi ilə daha da sarsılmaz etdi. Müsəlmanlar onlardan saysız-hesabsız miqdarda qırıb əsir aldılar, onların mallarını və ölkələrini zəbt etdilər.

Bundan sonra Məhəmməd ibn Mərvan onların əyan və əsilzadələrini dəvət edib onlarla xeyirxah olmağını, istədiklərini təmin edəcəyini və arzu etdikləri adamı onlara hakim təyin edəcəyini vəd etdi. Onlar bu minvalla yola verməyə çalışdı və onlar ona inanıb onun təminatına arxayın oldular. Bundan sonra onlar Məhəmmədin yanına gəldilər və o, onlarla razılığa gəlib aralarında sülh müqaviləsini bağladı. Sonra Məhəmməd ibn Mərvan dedi: "Mən sizə inanıram, buna görə öz kilsələrinizə girib orada mənə and için ki, siz öz əhdinizi pozmayacaqsınız. Sonra mənə girovlarınızı təslim edib evlərinizə qayıda bilərsiniz". Onlar buna razı olub and içmək üçün kilsəyə daxil oldular. Onların kilsədə yığışmalarından xəbər alıb Məhəmməd əmr etdi ki, kilsə qapısını bağlansınlar. Qapıları mıxladılar, üstünə neft tökdülər və yandırdılar. Bu kilsələr indiyə qədər "yandırılmış" (Əl-muxtarika) adlanırlar.

Əl-Bəlazuri (s.205) və əl-Yaqubi (Tarix, s.324-325) yazırlar ki, erməni əyanları Xilat vilayətinin kilsələrində yandırılıb (fi kənais min ə'mal Xilat).

Bu məlumatlara əsasən Ermənіyyənin orta əsrlər tarixinin tədqiqatçıları-nın hamısı belə hesab edirlər ki, burada söhbət Arazüstü Naxçıvandan (Muxtar Respublikanın paytaxtından) gedir, bu da nəinki tarixi coğrafiyada (məsələn, bax: Aşxaraytsus), hətta Ermənіyyə və Azərbaycan orta əsr tarixçilərinin ümumi əsərlərində hər cür anlaşılmazlığa gətirib çıxarır (müxtəlif rütbəli müasir müəlliflərin çoxlu əsərlərini sadalamayaraq yalnız "Erməni xalqının tarixi" nəşrlərini və Azərbaycan tarixi" kitablarını qeyd etməklə kifayətləni-rəm. Birinci əsərdə Naxçıvan erməni şəhərləri sırasına daxil edilir, ikinci kitabda da Naxçıvan erməni şəhəri kimi təqdim olunur.)

Moisey Kalankatuklunun mətnində deyilir ki, Məhəmməd ibn Mərvan bizans-erməni qoşununu Ermənіyyə ərazisində, təqribən Naxçıvan yaxınlı-ğında məğlub etdi. Buna görə də burada söhbətin məhz hansı Naxçıvandan getdiyinin aydın edilməsi zəruridir.

Akademik İ.A.Orbeli 1912-1913-cü illərdə Türkiyə Ermənіyyəsi ərazi-sindəki epiqrafik abidələri tədqiq edərkən Qars vilayətinin Kağızman maha-lındakı bir neçə yaşayış məntəqəsində oldu, bunların arasında Baçavan, Ələm, Mren Naxçıvan da var idi (bax: Багаванская надпись, с.371 və sonrakı).

Orbelinin oxuduğu epiqrafik yazılar içərisində Kamsakaran knyazlarının fəaliyyəti ilə bağlı olan iki inşaat yazısı da vardır. Onlardan biri Naxçıvandakı kilsəyə aiddir. Orbeli onun tikilməsini VII əsrin sonuna aid edir (bax: Надпись о построении церкви в Нахичеване, с.430-433).

Orbeli Naxçıvandakı kilsənin qalıqlarını təsvir edərək yazır: "Qədim kilsədən yalnız şimal tərəfdəki divarın şimal-şərq küncünün aşağı hissəsi, qərb tərəfdəki divarın aşağı hissəsinin azacıq sahəsi qalmışdır. Naxçıvan məbədi xarabalıqlar içərisində qalmışdı, lakin sonradan camaat özlərinin dini ehtiyaclarını ödəmək üçün kilsəni tikmək qərarına gəldi. Bu məqsədlə əhali uçulmuş divarları sökərək, yalnız yuxarıda qeyd olunmuş hissələrə toxunma-dılar. O biri divarları yenidən özüldən tikdilər. Bu işlərə rəhbərlik edən bənna mənə xəbər verdi ki, məbədin daşlarında y a n ğ ı n  i z l ə r i var idi, onların üzü tökülmüşdü, buna görə də bütün daşları yenidən yonmaq lazım gəldi".

Gətirilmiş tutarlı dəlillər göstərir ki, burada söhbət məhz Məhəmməd ibn Mərvanın erməni əyanlarını yandırdığı məbəddən gedir. Bu məbəd Türkiyənin Qars vilayətinin Kağızman mahalında yerləşən Naxçıvan şəhərindədir.

Beləliklə, aydın olur ki, ərəb sərkərdəsinin mənbələrdə təsvir olunan əmə-liyyatının – bizans-erməni qoşunlarının darmadağın edilməsi, erməni əyanları-nın əsir edilib, Naxçıvandakı məbəddə yandırılması – bütün bunların Arazüstü Naxçıvan ilə heç bir əlaqəsi yoxdur. Bax: Z.M.Bünyadov. Azərbaycan Atabəyləri dövləti, s.191-193 və 194 (xəritə).

Baş kilsəyə xaçpərəstlər xram deyirlər, amma erməni yazarları Xramı nədənsə böyük hərflə yazıb kəndə çevirirlər.

33) Məhəmməd ibn Mərvan hicri 101-ci ildə vəfat edib (24.VII.719-11.VII.720).

34) 153-cü erməni ili 704-cü il iyunun 3-də başlanıb 705-ci il iyunun 2-də bitmişdi. Bax: 12 və 18-ci qeydlər.

35) Söhbət xəlifə Hişam ibn Əbdülməlik ibn Mərvan və sərkərdə Məsləmə ibn Əbdülməlik ibn Mərvanın əmisi oğulları, gələcək Əməvilər sülaləsinin axırıncı xəlifəsi II Mərvan ibn Məhəmməddən gedir (xəlifəlik illəri 744-750-ci illər).

36) 158-ci erməni ili 709-cü il iyunun 2-də başlanıb 710-ci il iyunun 1-də bitmişdi. İbn Əsəm əl-Kufi (s.14) yazır: "Bundan sonra Məhəmməd ibn Mərvan qardaşı oğlu Məsləmə ibn Əbdülməliki yanına çağırıb ona qoşunlarını həvalə edib əmr etdi ki, o, Dərbənd şəhərində olan xəzərlərlə müharibəyə getsin. Dərbənd şəhərində bu vaxt 80 mindən yuxarı xəzər var idi".

37) Söhbət ərəb sərkərdəsi Əbdüləziz ibn Hatim əl-Bəhilidən gedir. Onu xəlifə Ömər ibn Əbdüləziz (717-720-ci illər) Azərbaycana və Erməniyyəyə vali təyin etmişdi (İbn Əsəm əl-Kufi, s.16). Tarixlərdə uyğunsuzluq var.

38) Bu hadisələr haqqında bax: İbn Əsəm əl-Kufinin "Kitab əl-fütuh" əsəri (s.40 və sonrakılar).

39) 174-cü erməni ili 725-ci il mayın 29-da başlanıb. 726-cı il mayın 28-də bitmişdi.

40) Vergilər xəlifə II Yəzid dövründə təyin olunmuşdu (720-724-cü illərdə).

41) Tarixi uyğunsuzluq.

42) 175-ci erməni ili 726-cı il mayın 29-da başlanıb. 727-ci il mayın 28-də bitmişdi.

43) Cərrah ibn Abdullah əl-Həkəminin Xəzərlilər üzərinə ikinci yürüşü erməni təqviminin 178-ci ilində olub (28.V.279-27.V.730). Birinci yürüşü 722-ci ildə idi.

44) Hadisə 179-cu erməni ilində olub (28.V.730-27.V.731). Ərəb mənbələrində bu əhvalat hicri 112-ci ildə vaqe olub. (26.III.730-14.III.731) Xəzər xaqanının oğlunun adı Barsbəy idi. Ərəb ordularının Ərdəbil yaxınlığında olan Şəhrivar kəndinin yanında darmadağın edəndən sonra xəzərlər Azərbaycanı talan edib Diyarbəkirə və Mosula qədər irəlilədilər. Bax: İbn Əsəm əl-Kufi, s.22-25.

45) 180-cı erməni ili 731-ci il mayın 28-də başlanıb 732-ci il mayın 26-da bitmişdir. Məsləmə ibn Əbdülməlik xəzərlərin əleyhinə müharibəni hicri 113-cü ildə başlayıb (15.III.731-2.III.732-ci illər) Bax: İbn Əsəm əl-Kufi, s. 38 və sonrakılar.

46) Stepannos 688-735-ci illərdə yaşayıb.

Bu vaxt Bizans imperatoru III Lev idi (713-741-ci illər) Smbat isə xalkedonçu knyaz Smbat Baqratunidir.

48) "Stepannosun qissəsi"ndə belə yazılıb: "Hər tərəfdən fəryad və "vay, vay" səsləri gəlirdi və buna görə də bu yerə "Vayos dzor" ("Vay-vay dərəsi") adını veriblər" (Bax: Памятники армянской этнографии, I, Ереван, 1973, с.68).

Buna baxmayaraq, Kapansyan belə bir "ixtiraya" malik olub: "Vayos dzorda "vayı" bir etnik ad kimi düşünmək lazımdır, və "Vayların dərəsi" kimi tərcümə edilməlidir, yəni vay qəbiləsinin və ya xalqın dərəsi. Etnik vayı biz qədim biaydan, yəni öz adını tarixi Biayna, yəni Urartu-Xaldiyaya verən xalqdan götürürük. Əgər ilk **biay** erməni və ("Van" sözü) – köçübsə həmin b i a y erməni v a y ı kimi Vayos dzora köçüb. Sözsüz ki, biay qəbiləsi xald-urartlar Vanna gəldikdən qabaq mütləq yerli olmalıdır".

Bax: Qr. Kapansyan. "Историко лингвистическойе значение топонимики древней Армении, с.128-130) Maşallah Kapansyan!

49) Smbatyanda "Lion"dur.

50) I Konstantin 306-337-ci illərdə Roma imperatoru olub.

51) Bu, 330-cu il mayın 11-də olub.

52) İsayyanın katolikosluq dövrü qeyri-müəyyəndir. Asoqik bunu 772/3-cü ildən 785/6-cı ilə qədər müəyyən edir.

53) Bax: Üçüncü kitabın XI fəsli.

54) Bu ya katolikos I Solomon (782-ci ildə katolikos olub), ya da II Solomon idi (786-794-cü illər). Bunların ikisi də erməni katolikosu İsayya ilə həmdövr idilər.

55) Bunları Albaniyanın hakimləri olan Stepannos oğlu Varaz-Tiridatla və bunun oğlu Stepannosla qarışdırmamalı (bax: 19-cu fəslə) Albaniyanın hakimləri – Mehranilər sülaləsinin nümayəndələri üçün M.Brossenin əlavələrinə (s.480) bax.

56) Erməni 270-ci ili 821-ci il mayın 5-də başlanıb 822-ci il mayın 4-də bitib.

57) Səhl ibn Smbat haqqında "Azərbaycan VII-IX əsrlərdə" kitabının 176-181-ci səhifələrinə bax (mənbə və ədəbiyyat da oradadır.)

58) Bu əhvalat Dadoyi Vəng dərəsində olub. Bax: 19-cu fəslə və 17-ci qeydə.

59) Zəngəzurda.

60) Göyçə gölünün cənub sahili.

61) Erməni 276-cı ili 827-ci il mayın 4-də başlanıb 828-ci il mayın 2-də bitib.

62) Bax: Təbəri, III 1072.

63) Yenə orada; İbn əl-Əsir. VI, 143, 176. Bu, 830/1-ci ildə baş verib.

64) Bunların hamısı Qarabağın (Arsaxın) vilayətləri idi.

65) Erməni 280-ci ili 831-ci il mayın 5-də başlanıb. 832-ci il mayın 1-də bitmişdi. Xəlifə əl-Məmunun imperator Feofilla müharibəsi 830-cu ildən 833-cu ilədək davam etdi.

66) Xəlifə əl-Məmun 833-cü ildə qızdırmadan öldü. Müəllif burada hadisələri qarışdırır. Ərəblərin Konstantinopola hücumu 717-ci ildə Məsləmə ibn Əbdülməlikin başçılığı altında olub.

67) Smbatyan mətndə olmayan "Erməniyyəyə yürüş edib Naxçıvan şəhərinə gəlir" cümləsi ilə tərcümə edir. Əl-Həsən ibn Əli əl-Bəzğisi xəlifə əl-Məmun tərəfindən Erməniyyəyə vali təyin edilmişdir. (bax: əl-Bəlazuri, s.211)

68) Yəni əl-Bəzğisinin Naxçıvana gəldiyi 834/5-ci ildən bir il sonra 835/6-cı ildə.

69) David 806-835-ci illərdə katolikos olub.

70) *Şurta* (ərəbcə) – orta əsrlərdə şəhər polis idarəsi olub, rəhbəri – sahib əş-şurta idi.

71) Erməni 286-cı ili 837-ci il mayın 1-də başlanıb 838-ci il aprelin 30-da bitmişdi.

72) Səhl ibn Smbat haqqında ətraflı məlumat üçün "Azərbaycan VII-IX əsrlərdə" kitabımın 176-181-ci səh. bax (rusca: s.184-190).

73) Erməni 287-ci ili 838-ci il mayın 1-də başlanıb. 839-cu il aprelin 30-da bitmişdi.

74) *Əbu Sahaq* – xəlifə Əbu İshaq Məhəmməd əl-Mötəsimdir. Ərəb tarixçilərinə görə Amoriya şəhəri 838-ci il sentyabrın 23-də zəbt olunmuşdur. Ərəblərlə birlikdə şəhərin alınmasında ermənilər də iştirak etmişlər.

75) Ç.Dovset hesab edir ki, Buxaraxudatın vasitəçiliyinə əl atan Yovhannes 833-855-ci illərdə ermənilərin katolikosu Ovalı Yovhannes idi. Lakin T.İ.Ter-Qriqoryan yazır ki, bu, həmin Yovhannesdir ki, adı müqəddəs Yaqubun adına (Böyük Arran vilayəti) monastırının kitabəsində çəkilir. Kitabənin qaldığı mətni belədir: "Erməni təqviminin 302-ci ilində (853-cü il) Albaniya knyazı Yovhannesin vaxtında Böyük Arranın yepiskopu Solomon bu... tikdirdi..."

*Buxaraxudatlar* (*buxar-xudat*) – Buxara şəhərinin islamdan əvvəlki yerli türk hökmdarları sülaləsidir (bax: V.Bartold. Buxara, IV, s.378-379).

Mətndə adı çəkilən buxar-xudat xəlifələr əl-Məmunun və əl-Mötəsimin görkəmli sərkərdəsi Məhəmməd ibn Xalid Buxaraxudatdır. Məhəmməd ibn Xalid Babəkin əleyhinə muharibədə fəal iştirak edirdi. (bax: Dinəvəri, s.398).

Smbatyan buxar-xudatı oxuya bilməyib "üç ölkə – Bulxar, Xoyta, Patqos" tərcümə edir.

76) Yeni erməni təqviminin 289-cu ili (30.IV.840-29.IV.841).

77) Smbatyan "balkanlılar" yazır.

78) Əbu Musa haqqında ətraflı məlumat üçün "Azərbaycan VII-IX əsrlərdə" kitabımın 181-186-cı səhifələrinə bax.

79) Yeni erməni 291-ci il (30.IV.842-29.IV.843).

80) Söhbət Azərbaycanın, Arranın və Ermeniyyənin xəlifə tərəfindən təyin edilmiş valisi Xalid ibn Yəzid ibn Məzyəd Əş-Şeybanidən gedir. Onun haqqında ətraflı məlumat üçün "Azərbaycan VII-IX əsrlərdə" kitabımın 191-193-cü səhifələrinə bax.

*Padqos-padqospan-mərzpan* kimi vilayət rəisi, validir.

81) Başqa mənbələrə görə Xalid ibn Yəzid hicri 230 (844/5)-ci ildə öz əcəli ilə ölüb (*İbn Xəllikan*, IV, s.230-231; *əl-Yəqubi*, II, s.583).

Asoğiq (s.134-135) yazır ki, Xalid erməni 290-cı (30.IV.841-29.IV.842-ci illər) ilində Gürcüstana səfəri vaxtında öldürülüb. Gürcü salnaməsi (I, s.255) xəbər verir ki, Xalid Cavaxetidə 842/3-cü ildə öldürülüb.

82) Xalidin yerinə xəlifə əl-Vasiq onun oğlu Məhəmmədi 844/5-ci ildə Azərbaycana, Arrana və Ermeniyyəyə vali təyin edib Tiflis əmiri İshaq ibn İbrahimlə müharibəyə göndərir. Kitabımın 193-cü və sonrakı səhifələrinə bax.

83) Erməni təqviminin 295-ci ili (29.IV.846-28.IV.847), "Şirvan və Dərbənd tarixi"nin müəllifi bunu hicri 245-ci ilə aid edir (s.57).

84) Erməni təqviminin 300-cü ili – 28.IV.851-26.IV.852.

85) Bu il ərəb sərkərdəsi Buğa əl-Kəbir (Böyük Buğa) Qafqaza böyük hərbi yürüşünü başladı. Buğanı tutub əsir apardığı knyazlar bunlardır: İsa ibn İstifanus, Əbül Abbas əl-Vasi adlanan Sunbat ibn Aşot, Albaniya knyazı Müaviyə ibn Səhl ibn Smbat və Adarnerseh ibn İshaq əl-Xaçini (bax: *əl-Bəlazuri*, s.212; *Təbəri*, III, s.1416; İbn Miskaveyh, VII, s.548). Vardan (s.103) Buğanın hərəkətini təsvir edərək yazır: Buğa əl-Kəbir Sünik knyazlarından Vasaqı qardaşı Aşot ilə, Xaçın mahalından knyaz Adernersehi, Girdıman knyazı Ketriçi, Uti vilayətindən Stefanı və Albaniya knyazı Yesaini tutub, hamısını xəlifənin yanına göndərdi". Həmçinin bax: İovanes Drasxanakertsi, s.111-115.

86) *I Qriqor Supan* – Sünik knyazı Vasaqın nəvəsi. Onu öz əmisi oğlu Babgen öldürdü. Bax: İovanes Drasxanakertsi, s.105-107.

87) Yeni erməni təqviminin 301-ci ilində (852/3-cü il).

88) Söhbət Cəfərilər sülaləsindən olan Tiflis əmiri İshaq ibn İsmayıl ibn Şüəybdən gedir. Bax: S.Baratov. İstoriya Qruzii, s.13-14 və kitabımın 203-204-cü səhifələrinə.

89) Yeni 855-ci ildə Buğa gedəndən sonra Məhəmməd ibn Xalid üçüncü dəfə Ermeniyyəyə vali təyin olunur.

90) *Vasaq Qabur* – I Qriqor Supanın oğlu (təxminən 859-cu ildə ölüb).

91) Erməni 318-ci ili – 23.IV.869-22.IV.870. Zəlzələ 863-cü ildə olub.

92) İsa ibn Şeyx ibn Xalid Əş-Şeybani 870-884-cü illərdə Erməniyyənin valisi idi.

93) Söhbət Məhəmməd ibn Əbdülvahid əl-Yəmənidən gedir (bax: Arsruni, III, s.218).

94) I Aşot 861-ci ildən knyazlar knyazı, 886-890-cı illərdə Erməniyyə çarı olub.

95) Təxminən 875-ci ildə.

96) II Qeorq 877-892-ci illərdə katolikos olub.

97) Erməni 326-cı ili – 21.IV.877-20.IV.878-ci illər.

98) Bax: 94-cü qeyd. Aşot 890-cı ildə ölüb.

99) Erməni 342-ci ili 17.IV.893-16.IV.894-cü illərə bərabərdir.

100) Mənbələrdə Hammam "Şərqin böyük knyazı". "Albaniya çarı" kimi adlanır. Bu haqda "Azərbaycan VII-IX əsrlərdə" kitabımın 181-ci və 200-cü səhifələrinə bax.

101) Söhbət Məhəmməd Afşin ibn Əbussac Divdaddan gedir. Bax kitabımın 199-cu və sonrakı səhifələrinə.

102) Erməni 347-ci ilindən söhbət gedir (16.IV.898-15.IV.899-cu illər).

103) Qriqorun oğlu Xaçın knyazı Atrnersehin nəvəsidir. Bax: 19-cu fəslə.

104) Şeybani Əhməd ibn İsayla I Smbat arasında döyüşlər haqqında İovanes Drasxanakertsi tarixinin 34-cü fəslinə (s.135-139) bax.

105) Söhbət çar I Smbatın qardaşı oğlu Qaqik Əbumərvandan gedir.

106) Afşinin I Smbata hücumu haqqında kitabımın 200-cü və sonrakı səhifələrinə bax. Gürcü sərkərdələri və sacilərin Gürcüstandakı hərbi əməliyyatları haqqında kitabımın 203-cü və sonrakı səhifələrinə və İovanes Drasxanakertsi əsərinin 37-ci fəslinə bax.

107) Erməni 346-cı ili 16.IV.897-15.IV.898-ci illərə bərabərdir.

108) Erməni 363-cü ili 12.IV.914-11.IV.915-ci illərə bərabərdir. Kitabımın 204-205-ci səhifələrinə bax.

109) Yusif ibn Əbussac qərmətilər tərəfindən 927-ci ilin dekabrında öldürülüb. Təfsilata kitabımın 210-212-ci səhifələrinə bax.

110) Salarilər və dövlətlərinin banisi olan Salar Mərzuban ibn Məhəmməd haqqında ətraflı məlumat üçün bax: M.X.Şəriflinin "IX əsrin ikinci yarısı – IX əsrlərdə Azərbaycan feodal dövlətləri" kitabının 125-187-ci səhifələrinə.

111) Rusların Azərbaycana (Albaniyaya, Şirvana) basqınları haqqında kitabımın 206-cı səhifəsinə bax; M.X.Şəriflinin əsərində olan xüsusi "Rusların Xəzər sahili ölkələrinə və Bərdəyə gəlmələri" fəslinə (s.134-159) bax. Rusların 944-cü ildən sonrakı basqınları üçün V.Minorskinin "Рус в

Закавказье" məqaləsinə bax. Müəllifimiz rusların 944-cü ildəki basqınından bəhs edir.

112) Bax: Birinci kitabın 8-ci fəslinə.

113) Bax: İkinci kitabın 13-cü fəslinə.

114) Bax: İkinci kitabın 13-cü və 38-ci fəsillərinə.

115) Bax: İkinci kitabın 38-ci fəslinə.

116) Bax: Üçüncü kitabın 10-cu fəslinə.

117) Bax: Üçüncü kitabın 16-cı fəslinə və 55, 58-ci qeydlərə.

118) Adərnerse ibn İshaq əl-Xaçinin adı Təbəridə (III, s.1416) rast olunur.

119) Xaçın hökmdarı Atrnerseh Səhl ibn Smbatla və Yesan Əbu Musa ilə birlikdə Buğa əl-Kəbir tərəfindən 855-ci ildə Samirəyə aparılmışdır.

Bax: İovanes Drasxanakertsi, 26-cı fəsil.

120) 103-cü qeydə bax.

121) Stepannos Orbeliyanın "Sünik tarixində" (42-ci fəsil) Girdıman knyazı Sahaqın Albaniya knyazları Qriqor Yesai və Atrnersehlə birlikdə və Albaniya katolikosu Simeonun (902-923-cü illər) iştirakı ilə 906/7-ci ildə təsdiq etdikləri Tatev monastırının mülkü haqqında sənəddən bəhs edir.

122) Senekərim 1084/5-ci ilədək Sünikin çarı idi.

123) I Yezr 630-641-ci illərdə katolikos olub.

124) 23.V.751-21.V.752.

125) 28.IV.851-26.IV.852.

126) Bax: 18-ci fəsil.

127) 3.IV.951-I.IV.952.

Qafqaz Albaniyasının VII – X əsrlər dövrü tarixi haqqında əsas və yeganə mənbə Moisey Kalankatuklunun (Dasxuranlı) "Ağvan tarixi"dir.[1] Sonralar XII – XIII əsrlərdə baş verən hadisələr haqqında Vardan Arevelsinin, Kirakos Qandzakesinin, İbn əl – Əsirin və əl – İsfahaninin tarixi əsərləri məlumat verir. Albaniyanın XI əsr – XII əsrin əvvəlləri dövründəki tarixinə gəldikdə isə, qeyd etmək lazımdır ki, bu vaxtadək yerli məbbələrdə bu barədə məlumat yox idi.

Belə fərz edilirdi ki, həmin dövrün tarixi çoxlu ibrətli hekayə və təmsillərin, habelə məşhur "Qanunnamə"nin[2] müəllifi Mxitar Qoş tərəfindən yazılmalı idi. T. İ. Ter – Qriqoryan da göstərirdi ki, Mxitar Qoş M. Dasxuranlının bitirmiş olduğu dövrdən başlamaqla davam etdirmək istəmişdir. "Lakin Qoşun başladığı əsər öz orjinalındaca tamamlanmamış qaldı".[3] T. İ. Ter – Qriqoryan da göstərirdi ki, Mxitar Qoş M. Dasxuranlının yazdığı tarixi davam etdirməyə başlamış, lakin bu işi başa çatdırmamışdır.[4] 1901-ci ildə F. Alişan[5] tərəfindən nəşr edilmiş erməni mətni və 1958 –ci ildə Ç. F. Dovset[6]

---

[1] Patmut'ivn Aquanits arareal M. Kalankatuasvoy.
K.Şahnazaryanın nəşri, Paris. 1860; N.Eminin nəşri, Moskva, 1860; təkrar nəşri, Tiflis, 1912, Moisey Kalankatuklunun "Ağvan tarixi", ermənicədən tərcümə K.Patkanovundur. SPb, 1861.

[2] Mxitar Qoşun "Qanunnamə"si, Yerevan, 1954.

[3] Bazmavep. Venesiya, 1897, s.577-8, müqayisə et: T.Ter-Qriqoryan "Moisey Kalankatuklunun "Alban ölkəsi tarixi" haqqındakı məsələyə dair" Azərbaycan SSR EA Tarix İnstitutunun arxivi, inv. № 991, s.90; Z.İ.Yampolski. Qafqaz Albaniyası salnaməsinin öyrənilməsinə dair. "Azərbaycan SSR EA Xəbərləri", 1957, №9, s.150.

[4] T.Ter-Qriqoryan. Yenə orada, s.91. Kirakos Qandzakesi. Tarix, Bakı, 1946, s.261, qeyd 590.

[5] Q.Əlişan. Hayapatum. Venesiya, 1901, II, s.276-278, 338-353.

[6] The Albanian Chronicle of Mxitar Gos. – BSCOAS. XXI/3, pp. 475-490 (sonralar Ç.Dovset).

tərəfindən dərc olunmuş ingilis mətni nəzərə alınmazsa, demək olar ki, Mxitar Qoşun "Alban salnaməsi"nin mətni bu vaxta qədər dərc edilməmişdir.

Venesiyada San Lassaro mxitaristlərinin monastırında saxlanılan 1237 nömrəli və "Bizim Bzommar Ümmulilahə"nin uniat monastırında mühafizə olunan 8 nömrəli əlyazmalarının mətnlərini tutuşduraraq Ç. Dovset bu nəticəyə gəlmişdir ki, həmin əlyazmaları bu vaxta qədər ya itmiş, yaxud da heç yazılmamış hesab edilən Mxitar Qoşun "Alban salnaməsi" mətninin özüdür.[1]

1237 nömrəli əlyazmasının belə bir sonluğu vardır: "Bizi Qanunlar Kitabını ( Qanunnaməni – Z. B.) bu hissədə yarımçıq qoymağa məcbur edən Xilaskarımız İsaya və onunla birlikdə Ruhani Ataya və Müqəddəs Ruha eşq olsun! Lakin biz qısa sonluğu yazmaqdan qabaq "Qanunlar Kitabı" burada sona yetir" – dedikdə də bu, həmin kitabın sonu deyildi; biz, ehtimal ki, işimizi hissə - hissə davam etdirmək üçün fasilə verməyi qərara almışdıq. Həm də yazmağı elə davam etdirmək istəyirdik ki, bizdən başqa yazmaq, həmçinin nəyi isə əlavə etmək istəyənlərə mane olmayaq. Təsis olunmuş bütün qanunları yazmağa başladığımız ildə xaricdən deyil, ağır bir yük kimi üzərimizə düşən ölkə daxilindəki təqiblər üzündən bu salnamənin tərtib edilməsi işi dayandırıldısa da, biz həmin salnaməyə alban katolikoslarının siyahısını da daxil etməyi lazım bildik..."

[1] Ç. Dovset, s. 473- 474.

8 nömrəli əlyazmasının sonluğu belədir: “ “Biz Qanunlar Kitabı” ilə birlikdə öz əlyazmamıza burada yazılmağı müvafiq hesab etmədiyimiz kiçik salnamə də yazırıq... Biz patriarxların siyahısını (Moisey Dasxuranlının) Albanlar tarixinin axırından başlayıb (indiki) Albaniyaya qədər, həm də başqa hadisələrlə birlikdə, özü də gördüyümüz və haqqında eşitdiyimiz qaydada yazırıq...”

Mxitar Qoş 1130-cu ilə yaxın Gəncə şəhərində anadan olmuşdur. Onun müəllimi vardapet Yovhannes Tavuzski olmuşdur. Mxitar Qoş vardapet olduqdan sonra Kilikiyada təhsil almışdır. Gəncəyə qayıtdıqdan sonra Mxitar öz şöhrəti ilə şagirdlərini ətrafına cəlb etmişdir. Bu şagirdlərdən ikisi – Vardan Aravelsi və Vanakan Vardapet daha çox məşhur idi. Vanakanın şagirdi Kirakos Qandzakesinin “ruhani babası” olan Mxitar Qoş haqqında bildiyimiz məlumatın böyük bir hissəsi bizə ondan (Qandzakesidən) qalmışdır. Albaniya katolikosu III Stepannos (təxminən 1155- 1195 – illər) Mxitar Qoşu sevməyib, onu sıxışdırdığı üçün Mxitar Xaçına gedir və təxminən 1184-cü ildə Getik monastırında sakin olur. Mxitar zəlzələ nəticəsində monastır dağılana qədər orada qalır. Sonralar Xaçın knyazı Vaxtanqın və onun yaxın adamlarının köməyi ilə Mxitar Qoş Nor Getik monastırının əsasını qoyur və1213 –cü ildə elə orada da ölür.

Oxuculara təqdim etdiyimiz bu “ Salnamə”də Mxitar Qoş Albaniyada 1130-1162-ci illər ərzində, daha doğrusu, Səlcuqilərin hakimiyyəti dövründə baş vermiş hadisələrin təsvirini verir.

Haqqında danışdığımız illər uzun bir dövrü əhatə etməsə də, hər halda bu müddətdə Albaniyada çox mühüm hadisələr baş vermişdir.

970-ci ildən 1075-ci ilədək Şəddadilər hakimiyyəti altında olan Gəncəni "Salnamə" yazılan dövr ərəfəsində Səlcuq Məlikşah onların əlindən almışdı. 1093-cü ildə Gəncə sultan Börküyarığın qardaşı Məhəmmədin hakimiyyəti altına keçir. Sultan Səncərin hakimiyyəti dövründə (1118- 1157) Arranın paytaxtı olan Gəncə İraq sultanının tabeliyində idi. 1139-cü ildə, yəni zəlzələ baş verən il Gəncədə Azərbaycanın və Arranın əmiri Qara Sunqurun iqamətgahı yerləşirdi. Qara Sunqurdan sonra əmirlik Çavlıya keçdi ( 1140/1-1146). Sonradan Arranın hakimi Rəvvadi oldu.

"Salnamə" yarımçıq qalmışdır. Lakin onda verilən azacıq məlumat da həmin dövrü öyrənən tədqiqatçıya çox maraqlı material verir. "Salnamə" 1237 nömrəli əlyazması əsasında ingilis dilindən Azərbaycan dilinə tərcümə edilmişdir.

Mxitar Qoşun "Qanunnamə"sinin də taleyi Moisey Kalankatuklunun "Alban tarixi"nin taleyinə bənzəyir. Məlumdur ki, Mxitar Qoşun başlıca əsərinin adı "Datastanagirk", yəni "Qanunnamə"dir və onu müəllif təxminən 1184-cü ildə tərtib etmişdir. Lakin Qoşun bu əsərinin naşirləri, nədənsə, əlyazmasında olmayan " hayos" sözünü onun adına əlavə etmiş və beləliklə, Qoşun özünün heç bir zaman yazmadığı yeni qondarma ad: "Datastanagirk hayos", yəni "Erməni qanunnaməsi"adını uydurmuşlar.[1]

---

1

Məlum olduğu kimi, Qoş bu "Qanunnamə"ni " Alban çarlığı kilsələrinin nəcib rəhbəri" Albaniya katolikosu III Stepannosun dəfələrlə etdiyi xahişinə görə yazmışdır.[1] "Qanunnamə"yə heç bir sistem və istiqamət verən xətti olmayan Şərqi Roma imperiyasının qanunları ilə yanaşı Albaniya kilsə qanunları, "Musanın qanunları"[2] və erməni xalq adətləri daxil edilmişdir ki, bu da "Qanunnamə"nin erməni hüquqi sənədlərinə aid olduğunu əsla təsdiq etmir.

# A L B A N S A L N A M Ə S İ

Biz siyahıya həmçinin alban katolikoslarını da daxil etməyi lazım bildik. Burada onları yekunlaşdırıb, (aşağıda göstərdiyimiz qaydada) hamısının siyahısını əldə edə bilərik. Biz onların adını, əvəla, bu

1

2

prinsipə müvafiq olaraq yazırıq və digər tərəfdən siyahını elə tutarıq ki, alban sülaləsi haqqında tam hesabat verən Moisey Dasxuranlının yazmış olduğu tarixi davam etdirmək istəyən hər kəs buradan patriarxların siyahısını asanlıqla götürə bilsin. Həmin adam bu tarixdə yalnız tarixdə yalnız haqqında onun (Moiseyin) yazmış olduğu adamların adını tapa biləcəklər. Bu, çox faydalı bir siyahı olacaq, çünki o zamandan indiyə qədər ( bu barədə) heç kim yazmamışdır; ( ehtimal ki,) gələcəkdə kim isə ( bu haqda yazmaq) həvəsinə düşər.

Aşağıda həmin siyahını veririk:

Müqəddəs ata Yelisey – Qüds şəhərindən gəlmiş patriarx

Müqəddəs Şuphalişo,

Matte (os),

Sahak,

Karen[2],

Pand,

Lazar. O, Bəqaməckdə[3] Hazarapatı və müqəddəs Pantaleon kilsəsini tikdirmişdir. O, bunları Allah – təaladan ona vəhy gələndən sonra bina etmişdi.

Müqəddəs Yegişedən müqəddəs Qriqora qədər 300 il keçmişdir. Sonradan albanlar ermənilərin müqəddəs Qriqorisi xahiş edib istəmişdilər. Müqəddəs Qriqoris 15 yaşında patriarxlığa seçılmiş və katolikos olduğu zaman barbarlar tərəfindən öldürülmüşdür.[4] Bu, Roma tarixinin 101-ci ili idi ( eramızın 348-ci ili)[5].

Aşağıdakı göstərilənlər isə Çolada patriarx olanlar idi;

Zəkəriya[6],

Davud,

Müqəddəs İohann[7],

İyeremiya[8].

Lakin erməni təqviminin başlandığı ildə (11 iyul 552- 10 iyul 553 – cü il) onlar katolikosluq taxtını Bərdəyə köçürmüş və ona patriarx olaraq müqəddəs ata Abbası əyləşdirmişdilər. Abbas katolikosluğu 23 il idarə etmişdir. [9]

Qədim albanlarda məktubun ünvanını aşağıdakı qaydada yazmaq adəti vardı: "Albaniyanın, Lpinkin və Çolanın katolikosundan..."

Müqəddəs ata Viro, 33 il idarə etmişdir, müqəddəs ər, xeyirxahlıqda məşhur idi – erməni təqviminin 75- ci ili (23 iyun 626 – 22 iyun 627- ci il).[10]

Müqəddəs ata Zəkəriya, müqəddəs və nöqsansız ər, 17 il.[11]

Müqəddəs ata İohann, 25 il.[12]

Müqəddəs ata Uxtanes, 12 il.[13]

Müqəddəs ata Yeliazar, 6 il, o, Allah tərəfindən arxiepiskop rütbəsindən təyin edilmişdi – erməni təqviminin 137 – ci ili ( 7 iyun 668 - 6 iyun 689 – cu il).[14]

Müqəddəs ata Nerses, 15 il. O, Xalkedon küfrünün tərəfdarı idi.[15]

Müqəddəs ata Simeon, 1.5 il.[16]

Müqəddəs ata mikayıl, 35 il. Erməni təqviminin 190 – cı ili ( 25 may 741 – 24 may 742 – ci il).[17]

Müqəddəs ata Anastas, 4 il.[18]

Müqəddəs ata Yusif, 15 il.[19]

Müqəddəs ata Davud, 4 il.[20]

Digər bir müqəddəs ata Davud, 9 il. Erməni təqviminin 225 – ci ili ( 16 may 776 – 15 may 777 –ci il).[21]

Müqəddəs ata Matte (os), 1.5 il.[22]

Müqəddəs ata Harun, 2 il. [23]

Müqəddəs ata Movses, 1.5 il.[24]

Müqəddəs ata Solomon, 1/2 il.[25]

Müqəddəs ata Teodoros, 4 il. Erməni təqviminin 234 – cü ili ( 14 may 785 – 13 may 786 – cı il).[26]

Müqəddəs ata Solomon, 11 il.[27]

Müqəddəs ata Yovhannes, 25 il.[28]

Müqəddəs ata Movses, 1/2[29]

Müqəddəs ata Davud, 28 il.[30]

Müqəddəs ata Yovsep, 22 il.

Erməni təqviminin 327 – ci ili ( 21 aprel 878 – 20 aprel 879 –cu il).[31]

Müqəddəs ata Samuel, 15 il.[32]

Müqəddəs ata Yovhan, 8 il.[33]

Müqəddəs ata Simeon, 21 il.[34]

Müqəddəs ata Davud, 35 il. Erməni təqviminin 378 – ci ili ( 8 aprel 929 – 7 aprel 930 –cu il).[35]

Müqəddəs ata Sahak, 25 il.[36]

Müqəddəs ata Qaqik, 10 il.[37]

Müqəddəs ata Davud, 6 il.[38]

Müqəddəs ata Petros, 12 il.[39] O, hələ sağlığında taxtdan əl çəkmiş Və Parisosun rahibi olan müqəddəs ata Movsesi öz varisi təyin etmişdi.[40] Movsesdən sonra isə patriarxlıq taxtına mömin və müqəddəs ata Markos əyləşmişdi.[41]

Markosdan sonra patriarxlıq taxtını müqəddəs ata Yovsep[42], ondan sonra başqa bir müqəddəs ata Markos[43], daha sonra müqəddəs ata Stepannos[44] tutmuşdur, sonra da müqəddəs ata Yovhannes tuitmuşdur.[45]

Sonra Müqəddəs ata Stepannos gəlir. O, gənclik illərində katolikosluğa cəlb olunmuş və patriarx kimi il yarım çalışmışdır.[46] Onun ölümündən sonra Albaniya ölkəsi 8 il patriarxsız qalmış[47] və bu müddət ərzində orada katolikos olmamışdır. Həmin müddətdə Albaniyada başqa vilayətdə ruhanilik etməli olan adamları katolikos seçirdilər. Bu dövrdə müqəddəs yağın miqdarı o qədər azalmışdı ki, uşaqları adi su ilə xaç suyuna çəkir və üstünə cüzi miqdarda adi sirkə yaxırdılar.

Lakin 8 il keçdikdən sonra, daha doğrusu, erməni təqviminin 588 – ci ilində (15 fevral 1139 – 14 fevral 1140 – cı il) Erməniyyə katolikosu olan müqəddəs ata patriarx Qriqorisin nəslindən olan Ərzurum yepiskopu Sahak[48] – məşhur Davud vardapetin[49] şagirdi, ölkəmizin vardapeti Qriqorun təşəbbüsü ilə və onun xahişinə əməl

edərək öz adamları ilə birlikdə Erməniyyədən Albaniya ölkəsinə gəldi. İndi müqəddəs ata Sahak bu Albaniya ölkəsinə gəldikdə hamını çar Kurikenin oğlu çar Abbas Baqratuninin[50] evinə, öz yanına çağırtdırdı. O da hamını Tovuz adlanan qalada onun ətrafında topladı. Buraya ( aşağıdakı) müqəddəs ərlər və yepiskoplar cəm olundu: çar Abbasın qardaşı çar Davud, Kurikenin oğlu, onların qardaşı müqəddəs ata Stepannos[51], Davud vardapetin[52] şagirdi Sərkis vardapet; Gəncə arxiyepiskopu Qriqor; Sərkis vardapetin şagirdi yepiskop Sahak; Koqt vilayəti və Şamxor şəhərinin[53] yepiskopu Stepannos; Şəmirəməcor[54] yepiskopu Sərkis; Kabr[55] yepiskopu Manuel; Hamşi Vank[56] keşişi Sərkis. Bu yığıncağın başında Erməniyyə katolikosunun baş yepiskopu müqəddəs ata Sahak, habelə tərki – dünya və müqəddəs vardapet Sərkis dururdu.

Beləliklə, onlar gurultulu mərasim və təntənəli ibadə şəraiti rəhmətə getmiş Albaniya katolikosu müqəddəs ata Stepannosun qardaşı oğlu Qriqori Albaniya katolikosluğuna layiq gördülər.[57] Həmin məclis günü Tre ayında ( erməni təqviminin 27 Tre 588 –ci ili (11 iyun 1130 –cu il) İşıqlı Dirilmə günü), Müqəddəs Ruhun zühur günü ilə bir gtünə düşdü.

Bundan sonra nümayəndələrin hər biri öz evinə qayıtdı. Sonra İslaholma bayramı günündə (30 iyul 1139 – cu il) yenidən hamı Katolikosi Kar (Katolikos Qayası)adlı qayaya toplandı. Bu dəfə yuxarıda adlarını çəkdiyimiz yepiskoplar, vardapetlər, müqəddəs atalar, habelə başqa vardapet və ruhanilər əvvəlkindən çox gəlmişdi.

Həmin gün onlar daha iki yepiskop seçib, müqəddəs yağa xeyir – dua verdilər. Sonra müqəddəs yağı bol – bol bütün şəhərlərə payladılar. Onlar bu kilsə məclisini bayram edib, şənlikləri müqəddəs Ruhun Ucalması bayram gününədək (17 sentyabr 1139 – cu il) davam etdirib hamılıqla Allah şöhrətinə dua oxuyub sevindilər.

Areq ayında, bu ayın 18 – ci günündə, şənbə gününə açılan gecə ərzində, Müqəddəs Georgi bayramı günündə ( 30 sentyabr 1139 –cu il şənbə günü)[58] Allahın dünyaya qəzəbi tutdu. Yerin hiddəti və böyük dağıntılar dəhşətlə yayılaraq bu Albaniya torpağına da çatdı[59] , necə ki, deyilib: "(Allah) Yeri öz yerindən oynadır və onun rüknləri titrəyir"[1] və başqa yerdə də deyilib: " (Allah) Yerə gözünü dikir, o da titrəyir". [2] Bu zəlzələ nəticəsində bir çox yerlərdə ( şəhərlərdə), Parisos[60] və Xaçın[61] vilayətlərində istər düzən hissədə, istərsə də dağlarda çox yer dağıldı. Zəlzələdən paytaxt Gəncə şəhəri də əhalisi ilə birlikdə Cəhənnəmə vasil oldu.[62]

Dağlıq mahallarda bir çox qalalar və kəndlər əhalinin başına uçulub tökülən monastırlar və kilsələrlə birlikdə dağıldə.Viran olmuş binalar və qalaların altında saysız – hesabsız adam tələf oldu. Bu hadisə erməni təqviminin 588- ci ilində baş vermişdi.

Zəlzələnin baş verdiyi elə həmin gündə çar Davidin oğlu – Gürcüstan çarı Demetre[63] böyük bir qoşunla hərəkət edərək Arran vilayətinə gəldi. O, öz sərkərdəsi İvanenin başçılığı altındakı qoşunla paytaxt olan Gəncə şəhərinə çatdı. Onlar sağ qalmış şəhər əhalisi

---

[1] İncil. Əyyubun kitabı, IX, 6.
[2]Yenədə orada. Zəbur, 103, 32.

üzərinə amansızcasına və kobud surətdə hücum edərək, hamını qılıncdan keçirtdilər, ya da özlərinə qul etdilər. İşğalçılar əhəmiyyətli bir şəhər olan Gəncənin birdən – birə Cəhənnəmə çevrildiyini ( çünki burada qızıl yığınları insan cəsədləri ilə bir yerə qalanmışdı) gördülərsə də, əsla mərhəmət göstərmək istəmədilər. Qızıl və gümüş xəzinələrini qazıb çıxararaq özləri ilə apardılar. İşğalçılar öz basqınları və işgəncələri ilə (xalqa) zəlzələdən daha çox əzab verdilər. Zəlzələ zamanı bizim vardapetlərimiz Sərkis və Qriqor fəlakətin qəzəbinə dözə bilməyib, ömürlərini Allaha bağışladılar. Bir neçə gün keçdikdən sonra ərəb əmirlərindən farsca Cahandar kimi çağırılan Qara Sunqur adlanan birisi İran torpağından hərəkət edib, bu Arran vilayətinə gəldi və ölkəni bərpa edib möhkəmləndirməyə başladı. O, Gəncə şəhərinin dağılmış divarlarını bərpa edərək, şəhərin hüdudları daxilində sülh yaratdı. Bundan sonra o, gürcü çarının hakimiyyəti altında olan vilayətə yollanıb, onların əli ilə viran edilmiş öz vilayətlərinin intiqamını aldı.Qara Sunqur Gürcüstan ölkəsinə birinci və sonra ikinci dəfə həmlə edərək, onları dəhşətə gətirib tir – tir əsməyə məcbur etdi. Onların istehkamlarını ələ keçirib, özünə tabe etdi və oradan dağlıq Qeqam vilayətindən keçən yol ilə geri qayıtdı. Sonra o, Araz çayını keçib, Atrpatakan sərhədlərinə çatdı və erməni təqviminin 589 – cu ilində (15 fevral 1140 – 13 fevral 1141 – ci il) vəfat etdi.[64]

Onun (Qara Sunqurun) yaxın adamlarından olub, Gəncə şəhərinin əmiri təyin edilmiş Qutluq adlı birisi[65] həyasızlaşaraq,

sultana qarşı çıxıb, öz knyazlığının sərhədlərindən kənara doğru yürüş təşkil etdi. O, böyük bir ordu ilə Gəncədən çıxıb, Xudaharay dağlıq vilayətinə doğru hərəkət edərək, Katolikos Qayası və bunun yaxınlığındakı Karapetans Kar ( Karapet Qayası) adlanan qalalara yanaşdı. Qutluq hər iki qalanı uzun müddət mühasirədə saxlayıb, çox böyük çətinliklə ələ keçirtdi və dağıdıb yandırmaqla onları viran qoydu. Müqəddəs kilsələr isə erməni təqviminin 591 –ci ilində (14 fevral 1142 – 13 fevral 1143 – cü il) Katolikos Qayası qalasını tamamilə dağıdıb talan etdiyi vaxta qədər pozğunların ayaqları altında tapdaq olunurdu.

Nəticədə Qutluq üsyanı davam etdirərək bir neçə gün hakimiyyət sürdü. Lakin sonra İran ölkəsindən Çavlı adlı bir sipəhsalar gəldi.[66] O, başçılıq etdiyi ordusu ilə Qutluqun üsyan etmiş olduğu Gəncə şəhərinin lap darvazalarına yaxınlaşdı, şəhəri bir ay mühasirədə saxlayıb ələ keçirtdi və Qutluqu tutub, gözlərini çıxartdırdı. Çavlı ermənilərin 592 – ci ilində (14 fevral 1143 – 13 fevral 1144 –cü il) hamını özünə tabe etdi.

Elə həmən ildə çar oğlu yepiskop Stepannos Xalınça Kar (Xalınç qayası) qalasında vəfat etdi. Çavlı isə lovğalıq edib, Xaçın dairələrinə doğru hərəkət edərək, onların bütün qalalarını ələ keçirtdi, kilsələri dağıtdı, monastırı yerli – dibli yandırdı, adlı – sanlı adamları öldürdü, qoşunları əsir aldı və müxtəlif vasitələrlə hər şeyi dağıdıb məhv etdi.[67] Sonra o, buranı tərk edib, yenidən İran ölkəsinə qayıtdı.

Sonrakı ildə (1144 -1145) Çavlı yenidən bu Arran vilayətinə qayıtdı və tələsik surətdə, çar Abbasın möhkəmlənmiş olduğu Tovuz qalasına həmlə etdi. O, böyük səylə bu qalanı uzun müddət mühasirədə saxladı və nəhayət, ələ keçirtdi. Lakin çar Abbas 594 – cü ildə ( 13 fevral 1145 – 12 fevral 1146 – cı il) gürcü çarının yanına yollandı.[68] Elə həmin ildə Kurikenin oğlu çar Davud Masnaberd qalasında ömrünü Allaha bağışladı və onun yerinə oğlu Kurike keçdi.[69] Çavlı isə ikinci dəfə, Xaçına,Tancikə[70] və Adahaya doğru hərəkət etdi, çünki onun hələ birinci səfərdə ələ keçirmiş olduğu bu qalalar əlindən çıxmışdı: Belə ki, həmin qalaların Çavlının əlində olduğu bu qısa müddətdə meşələrdəki mağaralarda gizlənmiş əyanlar öz qalalarına qayıdıb, ərəblərə qarşı üsyan etmişdilər. Bundan qəzəblənən Çavlı intiqam almaq niyyəti ilə onlara qarşı yürüş etdi.

Çavlı qalaları ələ keçirə bilmədisə də, bütün vilayəti talan etdi. O, həmçının havari tərəfindən bina edilmiş Dadui Vank adlı müqəddəs monastırı[71] yerli – dibli yandırıb külə döndərdi. Sonra Çavlı Midiya ölkəsinə getdi və orada sultana qarşı üsyan edib, ermənilərin 595- ci ilində ( 13 fevral 1146 – 12 fevral 1147 – ci il) Zəngan şəhəri yaxınlığında əzabla öldürüldü. Böyük sülalədən və məşhur nəsildən olan Paxradin ( Fəxrəddin) adlı aşqa bir əmir Çavlı ordusuna və Çavlının idarəsi altında olan bütün vilayətlərə rəhbərliyi öz əlinə aldı. Sultanın əmri ilə Fəxrəddin bu Arran vilayətinə gəlib, onu bütünlüklə öz ixtiyarına keçirdi.

Lakin Fəxrəddin Gürcüstan çarına yamanlıq etmək arzusu ilə alışıb yanırdı və gürcü çarının idarəsi altında olan yerləri yandırıb külə döndərməklə hədələyirdi. Onun bu hədə - qorxusundan dəhşətə gələn ölkə monastırlarının rahibləri bütün dindarların xilası üçün Allaha yalvardılar. Allah – təala onların bu yalvar – yaxarını qəbul edib Gəncəni idarə etməyə başladığı vaxtdan bir neçə gün sonra Fəxrəddinin ömrünü əlindən aldı, yəni onu sultanın sülaləsindən olan Xazbek adlı əmirin qılıncı ilə öldürdü. Bu hadisə 596 – cı ildə (13 fevral 1147 – 12 fevral 1148 – ci il), 367 –ci Roma ilində və müsəlmanların 536 – cı ilində olmuşdur.[73]

Yunanların imperatoru Aleksinin nəvəsi Kalucanın oğlu Mixail idi. Gürcüstanın çarı Georq Baqratuninin nəvəsi, Davidin oğlu Demetri idi. İran ölkəsinin sultanı isə Məlikşahın nəvəsi Məhəmmədin oğlu Məsud idi.[74]

Parsın (Farsın) və Xujastanın ( Xuzistanın) Bzapay adlı əmiri Fəxrəddinin öldürüldüyünü eşidib, bunun sultanın əmri ilə edildiyini bilərək, ordu götürüb, sultanı hakimiyyətdən məhrum etmək məqsədilə ona qarşı hərəkət etdi. Xazbek isə öz ordusunu götürüb, sultanın köməyinə gəldi. Onların arasında şiddətli vuruşma oldu, ordular bir – birini qırıb tökdü. Döyüşdə Bzapay öldürüldü və böyük qarışıqlıq əmələ gəldi.[75]

Bundan sonra Ərgiş adlı[76]–əmir gəlib, sultanın heç bir göstərişi olmadan Gəncəni özünə tabe etmək istədi.Şəhərin rəisləri bundan xəbər tutub, onu şəhərə buraxmadılar. Rəislərin bu

hörmətsizliyindən qəzəblənən Ərgiş dağ mahallarına qalxıb üsyan edərək tərəkəmələrin qiyam başçılarına çevrilmiş adamları baçına topladı və onların köməyi ilə dağ mahallarında çoxlu dağıntılar törətdi və vilayəti ayrı – ayrı adamlar arasında böldü. Lakin Gəncə şəhərinə heç bir xəsarət yetirmədi ki, bəlkə bu yol ilə şəhəri ələ keçirsin. Şəhər əhalisi Demetre adlı Gürcüstan çarını köməyə çağırdı, çünki onun qızı sultanın hərəmi olcaqdı. Qızın adı Ruzuqan (Rusudan) idi. Ruzuqanın müqabilində sultan Gəncəni gürcülərə verməliydi. Buna görə də gürcü çarı öz ordusunu (köməyə) göndərdi. Qaçmağa üz qoyan Ərgiş İran torpağına qayıtdı. Bundan sonra isə sultan Məsud öz əmirlərindən Rəvvadi adlı birini[77] hakim olaraq Gəncə şəhərinə göndərdi. Gəncəyə gələn Rəvvadi vilayəti dağıtdıqları üçün tərəkəmələrdən intiqam almaq niyyətində idi. Lakin Rəvvadi tərəkəmələri məğlub edə bilmədi, çünki o, nə yüksək nəcabətli, nə də güclü idi. Buna görə də tərəkəmə başçıları ona həqarətlə baxırdılar. Onlar Rəvvadiyə qarşı üsyan qaldırdılar. Vilayətdəki qalaların heç də hamısı Rəvvadiyə tabe olmurdu. Rəvvadi də hərəkət edib onları mühasirəyə aldı, lakin heç birini ələ keçirə bilmədi. Tərəkəmələr çox böyük sahədə düzənləri və dağ mahallarını viran edib çəkildilər. Bundan qəzəblənən Rəvvadi tərəkəmələrin çoxlu varidatını talan edib aldı və beləliklə də onları özünə daha sərt düşmən etdi. Nəhayət, Rəvvadi sülh bağlayıb, tərəkəmələrlə dost oldu, hətta onlardan özünə arvad da aldı[78] və öz

qızını Herqanberd hakimi Azadinə (İzzədinə)[79] ərə verdi. Beləliklə də Rəvvadi vilayətdə sülhü bərqərar etdi.

Bundan sonra Caraberd vilayəti və onun qalalarının knyazı Daranın oğlu Tavqan (Şahin) təkəbbür göstərib Arranı tutmaq istədi. Lakin sultanın oğlanlarından Çahrşah[80] Tavqanın üzərinə yeridi, onun özünü və qayınatası Kavahan Berd[81] hakimi olan Vasakın oğlu knyaz Qriqoru ələ keçirdi. Sultanın oğlu Tavqanın üzərinə etdiyi həmlə ilə Desmanın oğlu Həsəndən intiqam aldı, çünki onun Smbat adlı qardaşını mənasız bir vuruşda o (Həsən) öldürmüşdür; bu vuruşun səbəbi isə o idi ki, onlar öz qızlarını dinsizlərə ərə vermişdilər. Bu səbəbə görə də Qriqor özünə qürrələnərək kürəkəni Tavqanın yanına getdi və Tavqan da onunla birlikdə yola düşüb, Herqanberd yaxınlığında Qayköy adlı dağda məskən saldılar. Əvvəlcə Rəvvadi tərəkəmələrin başçısı Qurbuqayın kürəkəninə qarşı durmuşdu; vaxtı ilə Tavqan onu və onunla birlikdə Tutəkeank[82] adlı başqa birisini sultana itaət etməyə çağırmışdı. Onlar Divaxur (Şeytan tövləsi) dağında durmuşdular və Tavqana tabe olmurdular. Buna görə də müharibə baş verdi və Tavqanın ordusu darmadağın edildi, özü də öldürüldü.

Onlar həmçinin Qriqoru və onunla birlikdə bir çox adlı- sanlı adamları da öldürdülər. Vilayətin xaçpərəstləri Qriqoru oradaca dəfn etdilər, bir il keçdikdən sonra isə oradan çıxarıb, Qandzasar monastırında[83] basdırdılar; Qriqorun sələfləri də həmin monastırda dəfn olunmuşdu. Onlar Çahrşahı tutub, Gəncə şəhərində Rəvadiyə

təslim etdilər, onu yalançı və xain hesab edib məsxərəyə və ümumun həqarətinə məruz qoydular və sonra azad buraxdılar.

Çahrşah əvvəllər Rəvvadinin talan etmiş olduğu tərəkəmələrin yanına yollandı. Onlar sevinib, Şahdağ dağının bütün türklərini topladılar və ona çar kimi pərəstiş etdilər. Çahrşah bütün dağ mahallarını tərəkəmələr arasında böldü, özü böyük bir ordu ilə Gəncə şəhərinə qədər hərəkət edib, şəhəri mühasirəyə aldı. Rəvvadi Gürcüstan çarının yanına adam göndərib, ondan hərbi yardım istədi. Çar da onun köməyinə böyük bir ordu göndərdi. Bundan xəbər tutunÇahrşah indi Bərdə adlanan Firuzabaddan cənuba doğru qaçdı və üsyan etmiş tərəkəmələrin arasında qaldı.

Bundan sonra Çarek qalasında[84] oturan Tapakarqanın nökəri Sevinc[85] əvvəllər onu öz qalasında mühasirədə saxlamış olduğu üçün Rəvadiyə qarşı kin bəslədiyindən Gəncə şəhərindən olan bir çox adamlarla ittifaqa girib, Naxçıvan şəhəri və vilayətinin hakimi Eltkuzun (Şəmsəddin İldəgizin)[86] yanına gəldi, onu da özü ilə götürüb hərəkət edərək, gəlib Gəncə şəhərini mühasirəyə saldı və bir ay sonra Çıraqbanlıq – Xaçaçuran günündə ( yanvarın 6- da) yerli əhalinin köməyi ilə şəhəri tutdu. Rəvvadi də şəhər əhalisinin rəyindən xəbərdar olub, könüllü surətdə Gəncəni təslim etdi. Lakin Eltkuz şəhər darvazalarına yaxınlaşdıqda əhali ona dedi: “ Əgər sən bizim düşmənimiz Çahrşahı məhv etməsən biz sənə tabe olmarıq”. Buna görə də Eltkuz tez yola düşüb Çahrşahı tutdu, onu ağacdan asıb qayıtdı və dediyimiz kimi şəhərə sahib oldu.

Rəvvadi Bəyabad şəhəri yaxınlığındakı öz doğma dairəsinə qayıtdı.[87] Eltkuz sultanın qadınlarından birini özünə arvad etmiş olduğundan, Məsudun ölümündən sonra öz arvadından olan Arslan şahı çar (sultan) elan etdi, özünə isə atabəy rütbəsini götürdü, çünki Eltkuz sultanın oğlanlarının atabəyi olan və onunla rəqabət aparan Xazbəyi öldürmüşdür. Beləliklə də, Eltkuz İran şahlığına sahib oldu, qüdrəti artdı və bütün böyük hakimləri məğlub edib, çoxunu özünə tabe etdi, üsyan etmiş tərəkəmələrin başçılarını məğlubiyyətə uğratdı.[88] Eltkuz Arran ölkəsindəki iğtişaşı yatırtdı, zalım ismayililər tayfasını sakitləşdirdi və beləliklə də, həmin tayfanın Alban ölkəsində tez – tez törətdiyi talanların qarşısı alındı.

Lakin Gürcüstan çarı və Xaçın knyazları ilə müharibə hələ bitməmişdi, çünki onlar fürsət tapıb xəlvəti Haru qalasını tutmuş və orada olanların hamısını qılıncdan keçirmişdilər.

Sonralar Gürcüstan çarı Demetre öldükdə onun yerinə oğlu David çarlıq etməyə başladı.[89] David öz tabeliyində olan erməni knyazlarına xüsusi ilə xeyirxah münasibət bəsləyən bir adam idi. O, knyaz Vaxramın oğlu, Tiflis şəhərinin hakimi Vasakı və onun Kürd və Sərkis adlı qardaşlarını səxavətlə mükafatlandırdı; David Baqratuninin oğlu çar Kivrikeni çağırıb sələflərinin onun (Davidin) əlindən almış olduqları malikanəni geri qaytarmağa vəd etdi. Beləliklə də, onu bəxşişlərlə yola saldı, həmçinin onunla yenidən görüşmək üçün sazişə gəldi. David bu niyyətdə idi ki, məşvərət edib, etiqad barəsində bütün həqiqəti öyrənsin və beləliklə də,

pravoslavlığa sitayiş etsin. Gürcüstan knyazları (Davidin) bu niyyətindən xəbər tutduqda on ları, hamıdan artıq isə Orbelian nəslini qəzəb bürüdü və onlar zəhər verib çar Davidi öldürdülər. Gürcüstan və Ermәniyyә ölkələrini ağır və sürəkli bir fəryad bürüdü. Onlar Davidin qardaşı Georgini onun yerinə çar etdilər.[90]

Georgi çarlığa keçdikdən sonra knyaz Vasakı həbs etdi, çünki şəhər hakimi olan Vasak Georgiyə qabaqlar Davidə göstərmiş olduğu qədər ehtiram göstərmirdi, xidmət və itaət etmirdi. Gürcüstanın başqa knyazları da Georgidən narazı idilər ( yaxud: Georgi həmin knyazlardan narazı idi).Knyaz Vasak qardaşı ilə birlikdə qaçıb, Ərzurum ( Feodosipol) şəhərinə getdi. Şəhər əmiri Saltuk onu sevinc və hörmətlə qəbul etdi, çünki vaxtı ilə Saltuk Ani şəhərini mühasirə edərkən gürcü ordusu tərəfindən məğlub edilib, Tiflisə, çar Demetrenin yanına gətirildikdə Vasak ona çoxlu xidmət göstərmişdi.[91] Buna görə də (Saltuk) ona hədiyyələr və çoxlu kənd verdi. Orada bir neçə ay qaldıqdan sonra Vasak vəfat etdi və şəhərdəki Ümmülilahə kilsəsində dəfn olundu. Onun bayrağı, şeypuru və hakimiyyəti qardaşı Kürdə verildi. Kürd də orada böyük hörmət sahibi idi.[92]

Georgi isə çar olduqdan və mövqeyini möhkəmləndirdikdən sonra saysız igidliklər göstərdi, çoxlu vilayətlərə soxulub, döyüşlərdə bir çox yerləri dağıtdı. O, yepiskop Barseqin və onun qardaşlarının – Magistros Həsənin oğlanlarının çağırışı ilə Ani şəhərini bir və ya iki dəfə tutdu. Lakin sonra onlar ona müqavimət göstərib, şəhəri vermək

istəmədilər. Belə olduqda Georgi güclə şəhəri aldı və onun talan olunmasını əmr etdi. O, ordudakı bütün kişiləri, habelə qadınları, keşişləri, rahibləri lüt soyundurub müqavimət göstərdikləri üçün[93] onları rüsvay etdi. Şəhərə vali təyin edib[94] və müəyyən miqdarda qoşun qoyub, oranı tərk etdi. Düşmən həmlələrindən təngə gəlmiş əhali Georgidən xahiş etdi ki, onların ixtiyarını fars nəslindən olan əvvəlki hakimə versin.[95] Bu minval ilə tez – tez əldən - ələ keçən şəhər və vilayət rahatlıq bilmirdi. Sonra Georgi şəhərin ixtiyarını öz sərkərdəsi İvaneyə verdi. Lakin şəhər öz əvvəlki hakimlərinə qaytarılmayınca sülh bərqərar olmadı.[96]

Bütün İran şahlığının knyazı olan Eltkuz isə bunları və onun (Georginin) gücünü görüb, öz ordusunu topladı və Qaq qalası[97] yaxınlığındakı düzənlikdə düşərgə saldı. O, Müqəddəs Sərkis monastırını yandırdı və buna görə də ordusuna böyük bədbəxtlik üz verdi,adamlarının çoxunu ilan çalıb öldürdü. Çar Georgi də çoxlu qoşun toplayıb gəldi və onun müqabilində mövqe tutub, döyüşə hazırlaşmağa başladı. Lakin Georginin sərkərdəsi Smbat Xalaquçeanın oğlu İvane bunu gizlində atabəyə və sultana xəbər verdi, çünki İvane onlarla müttəfiq idi və almış olduğu rüşvət onun gözlərini tutmuşdu.

Döyüş başlanacaq gündən əvvəlki gecə onlar bu sirdən hali olub, hələ vuruşma başlanmamış öz çadırlarını yığışdırıb buranı tərk etdilər.[98] Lakin onlar xristianlara qarşı bəslədikləri öz bəd niyyətlərindən əl çəkə bilmədilər. Gözlənilmədən Ani şəhərinin

